

AZƏRBAYCAN RESPUBLİKASININ PREZİDENTİ YANINDA
ALİ ATTESTASİYA KOMİSSİYASI

















https://doi.org/10.69682/arti.2024.91.6
https://archive.org/details/20230309_20230309_1112 – Internet Archive
https://journals.indexcopernicus.com/search/details?id=122986 – Index Copernicus
https://journalseeker.researchbib.com/view/issn/2409-8817 – Researchbib
https://www.slideshare.net/Humeyir/scientific-works-257022296?from_search=0 – SlideShare
https://www.calameo.com/books/0073359955276c2cd4d80 – Calameo
https://isindexing.com/isi/viewjournal.php – International Scientific Indexing
http://olddrji.lbp.world/Search.aspx?J=Scientific%20Works&S=0 – Directory of Research Journals Indexing

**ISSN 2409-8817 E-ISSN 3078-2813**

**AZƏRBAYCAN RESPUBLİKASI ELM VƏ TƏHSİL NAZİRLİYİ**
**AZƏRBAYCAN RESPUBLİKASININ TƏHSİL İNSTİTUTU**

# *ELMİ ƏSƏRLƏR*

**cild 91, № 6, 2024**

# *НАУЧНЫЕ ТРУДЫ*

**том 91, № 6, 2024**

# *SCIENTIFIC WORKS*

**volume 91, № 6, 2024**

**“Elmi əsərlər” 1934-cü ildən çıxır**
**İldə 6 nömrə nəşr olunur**
**Redaksiyanın ünvanı**:
Bakı şəhəri, Zərifə Əliyeva küçəsi, 96
Tel: 493-96-21, 493-30-06

*Azərbaycan Respublikasının Təhsil İnstitutu Elmi şurasının iclasının qərarı ilə nəşr edilir.*
*Təsisçi: Azərbaycan Respublikasının Təhsil İnstitutu*
*"Elmi əsərlər" məcmuəsi Azərbaycan Respublikası Ədliyyə Nazirliyinin*
*11 iyul 2002-ci il tarixli 23 №-li əmri ilə qeydə alınmışdır.*

*Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə*
*tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.*

*Публикуется решением Ученого Совета Института Образования Азербайджанской Республики*

*Учредитель: Институт Образования Азербайджанской Республики*
*Сборник «Научные труды» зарегистрирован приказом № 23 от 11 июля 2002 г.*
*Министерства Юстиции Азербайджанской Республики*

*«Научные труды» издается с 1934 года.*

*Периодичность издания: 6 номеров в год.*
*«Научные труды» включены в список публикаций, рекомендованных решением Высшей Аттестационной Комиссии при Президенте Азербайджанской Республики*

UOT 504.06

***İQLİM DƏYİŞİKLİYİ PROBLEMLƏRİNƏ HƏSR OLUNMUŞ COP29***
***COP29, ПОСВЯЩЕННАЯ ВОПРОСАМ ИЗМЕНЕНИЯ КЛИМАТА COP29***
***COP29 - DEDICATED TO CLIMATE CHANGE***

## BAKIDA KEÇİRİLƏN COP29-un LİDERLƏR SAMMİTİNİN 2024-cü il NOYABRIN 12-də AÇILIŞ MƏRASİMİNDƏ AZƏRBAYCAN RESPUBLİKASININ PREZİDENTİ İLHAM ƏLİYEVİN

## *Ç I X I Ş I*



Mən sizin hamınızı Azərbaycanda salamlayıram. Qonaqlarımızın çoxu Azərbaycana ilk dəfədir ki, səfər edir. Ümid edirəm ki, onların ölkəmizlə daha yaxından tanış olmaq, onun tarixini, ənənələrini və mədəniyyətini öyrənmək imkanı olacaqdır.

Mən COP29-a aparan yolda Azərbaycana verdiyi dəstəyə görə BMT-nin Baş katibi cənab Antonio Quterreşə və BMT-nin İqlim Dəyişmələri üzrə Çərçivə Konvensiyasının Katibliyinə təşəkkürümü bildirmək istərdim. Mən Birləşmiş Ərəb Əmirliklərinin Prezidenti, əziz qardaşım Əlahəzrət Şeyx Məhəmməd bin Zayed Əl Nəhyanı və onun bütün komandasını Dubayda COP28-də əldə olunmuş tarixi konsensus münasibətilə təbrik edirəm və Bakıda COP29 üçün hazırlıqlarda verdikləri dəstəyə görə minnətdaram.

Ötən ilin dekabrında təxminən 200 ölkənin yekdil qərarı ilə Azərbaycana COP29-a ev sahibliyi etmək şərəfi verildi. Biz bu qərarı ölkəmizə olan hörmətin əlaməti, beynəlxalq arenada oynadığımız fəal rolun dəyərləndirilməsi kimi görürük.

Azərbaycan Şimal ilə Cənub, Qərb ilə Şərqin qovuşduğu ölkədir və bu, təkcə coğrafiya ilə bağlı deyil. Biz müxtəlif beynəlxalq iştirakçılar arasında siyasi, mədəni, enerji, ticari və nəqliyyat körpülərini sala bilərik. Azərbaycanın başladığı meqalayihələr artıq Avrasiyanın enerji və daşımalar yollarını dəyişib və məhsuldar, çoxtərəfli əməkdaşlıq formatının qurulması ilə nəticələnib.

Azərbaycanın beynəlxalq səviyyədə tanınmış ərazisinin 20 faizinin Ermənistan tərəfindən 30 illik işğalına, etnik təmizləməyə və bir milyon azərbaycanlının öz doğma torpaqlarından qovulmasına baxmayaraq, biz özünü təmin edən iqtisadiyyata və müstəqil siyasətə malik güclü ölkəni

qura bildik. Dörd il öncə biz İkinci Qarabağ müharibəsində tarixi Qələbəni qeyd etdik.

Bir il əvvəl biz BMT-nin Nizamnaməsinə, beynəlxalq hüquqa və BMT-nin Təhlükəsizlik Şurasının 30 il kağız üzərində qalmış qətnamələrinə uyğun olaraq, suverenliyimizi tam bərpa etdik. Biz həmin qətnamələri özümüz icra etdik, beynəlxalq hüququ, ədaləti bərpa etdik və Ermənistanın işğalına son qoyduq. COP29-un sədri kimi Azərbaycan inkişaf etmiş və inkişaf edən ölkələr, Qlobal Cənub və Qlobal Şimal arasında ümumi anlaşmaya nail olmaq üçün əlindən gələni edəcək. Azərbaycan 120 ölkənin yekdil qərarı ilə dörd il ərzində, BMT-dən sonra ikinci beynəlxalq qurum olan Qoşulmama Hərəkatına uğurla sədrlik etdi.

Azərbaycan, həmçinin təxminən 60 ölkəni birləşdirən İslam Əməkdaşlıq Təşkilatının fəal üzvüdür. Avropa İttifaqının 10 üzvü ilə Azərbaycan sazişlər imzalayıb və Strateji tərəfdaşlıq haqqında bəyannamələr qəbul edib. Bütün bunlar bizə düşünməyə imkan verir ki, biz iqlim dəyişmələri məsələsində fərqli mühüm iştirakçılar arasında körpülərin salınmasında çox faydalı və yardımçı ola bilərik. Azərbaycan çoxtərəfliliyin tərəfdarıdır. Eyni zamanda, biz mədəniyyətlərarası dialoqda fəal rol oynayırıq.

BMT-nin Sivilizasiyalar Alyansı ilə birlikdə biz iki ildən bir Bakıda Mədəniyyətlərarası Forum təşkil edirik. Multikulturalizm bizim dövlət siyasətimizdir və həyat tərzimizdir. Azərbaycan xalqı etnik və dini mənsubiyyətindən asılı olmayaraq sülh və razılıq şəraitində bir ailə kimi yaşayır.

İndi isə mən Azərbaycanın Yaşıl gündəliyi haqqında bir neçə söz söyləmək istərdim. Bərpa olunan enerjidə texniki potensialımız quruda 135 giqavat və dənizdə isə 157 giqavat təşkil edir. Ötən il BƏƏ-nin Masdar şirkəti bir regionumuzda 230 meqavatlıq Günəş enerji stansiyasının açılışını etdi. Səudiyyə Ərəbistanının "Acwa Power" şirkəti isə hazırda 240 meqavatlıq külək enerjisi stansiyasını tikir.

COP29 çərçivəsində Birləşmiş Krallığın bp şirkəti ilə 240 meqavatlıq Günəş enerjisi stansiyasının dörd il əvvəl erməni işğalından azad edilmiş Cəbrayıl rayonunda tikilməsi ilə bağlı saziş imzalanacaq. Bu layihə sayəsində dünyanın ən iri neft və qaz terminallarından biri olan Səngəçal terminalında dekarbonlaşma təmin ediləcəkdir.

Biz 2030-cu ilə qədər təxminən altı giqavatlıq Günəş, külək və hidroenerji stansiyalarının tikilməsini planlaşdırırıq. Lakin bu, tam planlarımızın hamısı deyil, 10 giqavatlıq bərpaolunan enerji layihələri üzrə müqavilələr və anlaşma memorandumları imzalanıb.

Biz, həmçinin ixrac bazarlarına diqqət yetiririk və Xəzər dənizindən başlayaraq Qara dənizin dibi ilə enerji kabelinin çəkilməsini nəzərdə tutan digər mühüm enerji təhlükəsizliyi layihəsinin həyata keçirilməsi üçün tərəfdaşlarımızla fəal çalışırıq.

Bu, bizə Avropaya yaşıl enerjini ixrac etmək imkanı verəcək və bu kabelin texniki potensialı dörd giqavatdır. Yeri gəlmişkən, texniki-əsaslandırma işləri bu yaxınlarda bitəcək. Lakin yenə də bu, yalnız başlanğıcdır.

Yaşıl gündəliyimiz, həmçinin Azərbaycanın müxtəlif bölgələrini əhatə edir. Beləliklə, Azərbaycanın Naxçıvan, Qarabağ və Şərqi Zəngəzur regionları yaşıl enerji zonaları elan edilib və bu, ərazimizin, demək olar ki, dörddə bir hissəsidir.

İndi isə mən enerji təhlükəsizliyinin digər seqmenti haqqında bir neçə söz söyləmək istərdim. Bu da neft və qazla bağlıdır. Anlayıram ki, bu mövzu iqlim dəyişmələrinə aid konfransda o qədər də populyar deyil. Lakin bunsuz mənim şərhlərim tam olmazdı. Sadəcə, bir informasiya ilə başlamaq istərdim. Dünyada sənaye üsulu ilə ilk neft quyusu Azərbaycanda, Bakıda 1846-cı ildə qazılıb. O, buradan uzaq yerdə yerləşmir və həmin yerə 10-15 dəqiqəlik yoldur. Dənizdə ilk neft quyusu da Azərbaycan neftçiləri tərəfindən Xəzər dənizində XX əsrin ortalarında qazılmışdır. XIX əsrdə qlobal neft hasilatının yarısı Azərbaycanın payına düşürdü.

Əgər o vaxt bəzi Qərb siyasətçiləri və media bizi neft dövləti adlandırsaydı, bu, bəlkə də anlaşılan olardı. Lakin əgər onlar indi, yəni bu gün də bizi neft dövləti adlandırırlarsa, bu, ədalətsizlikdir və yalnız siyasi mədəniyyət və biliklərin çatışmamasından xəbər verir. Bu gün Azərbaycan qlobal neft hasilatında 0,7 faiz, qlobal qaz hasilatında isə 0,9 faiz paya malikdir. Amma dünyada bir nömrəli neft və qaz hasilatçısı olan, Azərbaycandan 30 qat artıq neft hasil edən ölkənin yalan xəbər mediası bizi neft dövləti adlandırır.

Yaxşı olardı ki, ən azı onlar özlərinə və Azərbaycandan 10 dəfə artıq neft hasil edən özlərinin qonşuluğundakı ölkəyə baxsınlar. Azərbaycanın qlobal qaz atılmalarındakı payı cəmi 0,1 faizdir. Mən bu rəqəmləri auditoriyamızın diqqətinə çatdırmalıyam, çünki Azərbaycan COP29-a ev sahibi seçildikdən dərhal sonra biz əlaqələndirilmiş və yaxşıca təşkil olunmuş qarayaxma və böhtan kampaniyasının hədəfinə çevrildik.

Qərbin yalan xəbər mediası, dırnaqarası müstəqil QHT-ləri və bəzi siyasətçiləri sanki ölkəmiz haqqında dezinformasiya və səhv məlumatın yayılmasında yarışa çıxıblar. Neftimizin olmasında bizi ittiham etmək bir növ Bakıda il ərzində 250-dən artıq günəşli günün olmasında bizi suçlamağa bənzəyir.

Ölkələrə qiymət başqa meyarlara görə verilməlidir. Məsələn, Azərbaycanda işsizliyin səviyyəsi 5,4 faiz, yoxsulluğun səviyyəsi 5,2 faizdir. Yaşıl gündəliyimizə gəldikdə, mən planlarımızı artıq təsvir etdim. Ölkələr öz xarici borcunu necə idarə edirlər? Azərbaycanın xarici borcu ÜDM-in cəmi 7,5 faizini təşkil edir.

Beləliklə, ölkə göstəricilərinin qiymətləndirilməsində əsas götürülməli bu və bir çox digər mühüm meyar bunlardır, Tanrının bəxş etdiyi təbii sərvətlər meyar kimi götürülməli deyil. Mən bir neçə ay bundan əvvəl söylədim: indi mənə hücum çəkmək istəyənlərin hamısı, – mən beynəlxalq medianı nəzərdə tuturam, – mənim yalnız Tanrının bəxş etdiyi hədiyyə sözlərimə iqtibas edirlər.

Bu gün isə mən bu auditoriyada, burada təkrar etmək istəyirəm: Bu, Tanrının bəxş etdiyi hədiyyədir. Hər bir təbii sərvət – istər neft, qaz, külək, günəş, qızıl, gümüş və mis – bunların hamısı təbii sərvətlərdir. Ölkələr onların olmasına görə günahlandırılmalı və bazarda onlara tələbatın olması səbəbindən onları bazara çıxardıqlarına görə suçlanmalı deyillər. İnsanlara onlar lazımdır. Bir sözlə, mesajım belədir. COP29-un sədri kimi, əlbəttə, biz yaşıl keçidin güclü carçısı olacağıq və bunu edirik, lakin, eyni zamanda, biz realist olmalıyıq.

Digər ittiham məsələsinə gəldikdə, iki il əvvəl Azərbaycan və Avropa Komissiyası enerji sahəsində strateji tərəfdaşlıq bəyannaməsinə imza atdılar. Lakin bu, bizim ideyamız deyildi. Bu, Avropa Komissiyasının təklifi idi. Avropa Komissiyasının sədri bu sənədi imzalamaq üçün iki il öncə Bakıya gəldi, çünki geosiyasi vəziyyətin dəyişməsi səbəbindən onlara bizim qaz lazım idi. Onlar bizdən yardım xahiş etdilər. Biz razılaşdıq. Əgər yardımımıza ehtiyac varsa, biz hər zaman kömək etməyə hazırıq. Dedik, yaxşı, biz enerji təhlükəsizliyində Avropaya kömək edəcəyik. İki il əvvəl həmin bəyannaməni imzalayanda qazımızı alan ölkələrin, yəni Avropa ölkələrinin sayı iki idi. İndi isə səkkiz ölkə alır.

Azərbaycan qazına çıxışı olan on ölkədən səkkizi Avropada yerləşir. Avropa Komissiyası, həmçinin bizdən xahiş edib ki, biz qaz təchizatını 2027-ci ilə qədər iki dəfə artıraq. Bu, Avropa Komissiyasının sədri və mənim tərəfimdən iki il öncə Bakıda imzalanmış bəyannamədə əks olunub. Əfsuslar olsun ki, ikili standartlar, digər ölkələrə dərslər vermək adəti və siyasi riyakarlıq bəzi qərb ölkələrindəki bir sıra siyasətçilər, dövlət nəzarətində olan QHT-lər, yalan xəbər mediası üçün fəaliyyət metoduna çevrilib.

Mənim sonuncu mesajım təxminən bir ildir ki, boykotu təşviq edən dairələrədir. Onlar əllərində olan bütün alətlərdən istifadə etdilər ki, Bakıda COP29-u boykot kampaniyası başlansın. Onlara pis xəbər var: bizim 196 ölkədən gəlmiş və qeydiyyatdan keçmiş 72 min iştirakçımız var. Onların sırasında 80 prezident, vitse-prezident və Baş nazirlər var. Beləliklə, dünya Bakıya toplaşıb və biz bütün dünyaya deyirik: Azərbaycana xoş gəlmisiniz!

**Mənbə**:
Bakıda COP29-un Liderlər Sammitinin açılış mərasimi keçirilib
https://president.az/az/articles/view/67281

* * *

*UOT 504.06*

# COP29 ÇƏRÇİVƏİNDƏ İNKİŞAF ETMƏKDƏ OLAN KİÇİK ADA DÖVLƏTLƏRİNİN SAMMİTİNDƏ AZƏRBAYCAN RESPUBLİKASININ PREZİDENTİ İLHAM ƏLİYEVİN

## *Ç I X I Ş I*

13 noyabr 2024

Mən Sammitin bütün iştirakçılarını salamlayıram. Azərbaycan COP29-a ev sahibi olduqdan sonra inkişaf edən kiçik ada dövlətləri ilə münasibətlərimiz yeni, daha yüksək səviyyəyə qalxıb. Kiçik ada dövlətlərinin səsi qlobal arenada eşidilməlidir. Mən inkişaf etmiş bütün ölkələrə, xüsusən də müstəmləkə keçmişi olan ölkələrə müraciət edirəm ki, kiçik ada dövlətlərinə maddi və texniki dəstək göstərsinlər ki, onlar ölkələrini iqlim dəyişmələrinin fəsadlarından qoruya bilsinlər. İqlim dəyişmələri hər bir ölkəyə, o cümlədən Azərbaycana təsir göstərir. Görürük ki, Xəzər dənizi ilbəil daha da dayazlaşır. Görürük ki, çaylarımızda daha az su, dağlarımızda daha az qar var. Əfsuslar ki, keçmişdə heç vaxt görmədiyimiz daşqınlar və kəskin yağışlar bu gün reallıqdır. Bir sözlə, hər bir ölkə təsirə məruz qalır, lakin kiçik ada dövlətləri üçün bu ekzistensial təhlükədir.

Azərbaycan kiçik ada dövlətlərinə özünün birmənalı dəstəyini nümayiş etdirir. Biz fəlakət qarşısında zəif olan bir sıra ölkələrə qasırğa, zəlzələ və daşqınların təsirini azaltmaq üçün yardım göstərmişik. Biz, həmçinin su təchizatı, qida təhlükəsizliyi və mədəni irsin bərpası layihələrinə dəstək vermişik. Ondan çox kiçik ada dövləti Azərbaycan universitetlərində təhsil almaq üçün tələbə təqaüdü proqramımızdan yararlanıb. Qoşulmama Hərəkatında dördillik sədrliyimiz dövründə biz 80-dən artıq ölkəyə, o cümlədən 20 kiçik ada dövlətinə maliyyə və humanitar yardım göstərmişik.

Həmin ölkələrin üzləşdiyi çağırışların aradan qaldırılması COP29-da Azərbaycanın göstərdiyi səylərin əsasını təşkil edir. Bu ilin mayında COP-la bağlı planlarını müzakirə etmək üçün Baham adalarının, Tonqanın və Tuvalunun rəhbərləri Azərbaycana səfər etdilər. Qəbul olunmuş Bakı Kommünikesində COP29-da mənalı nəticələrin əldə olunmasına çağırış edilir və əlçatan iqlim maliyyəsinin vacibliyi qeyd olunur. Bu ilin sentyabrında İtki və Zərərə Cavab Fondunun fəaliyyətə başlaması ilə bağlı Bakıda ciddi irəliləyiş əldə olunmuşdur. Hazırda proses ehtiyac duyan ölkələrə, xüsusən də kiçik ada dövlətlərinə maliyyənin verilməsi üçün tamamlanmalıdır. Bu yay Azərbaycan Tonqada Millətlər Birliyi ilə Birgə Bəyannamə imzaladı.

Biz Millətlər Birliyinin kiçik ada dövlətlərindəki birgə layihələrini dəstəkləmək üçün 10 milyon ABŞ dolları məbləğində vəsait ayırırıq. Ətraf mühitin monitorinqi və qiymətləndirilməsi üçün Azərbaycanın Kosmos Agentliyi – "Azərkosmos"dan peyk məlumatlarından istifadə etmək üçün Millətlər Birliyi ilə Anlaşma Memorandumu imzalanmışdır.

Hörmətli xanımlar və cənablar, fürsətdən istifadə edərək, mən beynəlxalq gündəlikdə mühüm məsələlərdən birini də qaldırmaq istəyirəm – neokolonializm və iqlim dəyişmələri. Fransa və Niderlandın xüsusən də Karib dənizi və Sakit Okean regionundakı dırnaqarası dəniz əraziləri iqlim dəyişmələrinin ən ciddi təsirinə məruz qalanlar sırasındadır. Artan dəniz səviyyəsi, kəskin hava şəraiti və biomüxtəlifliyin pozulması həmin regionlara ciddi təhlükə yaradır. Həmin icmaların səsi bir çox hallarda onların metropoliyalarındakı rejimləri tərəfindən susdurulur.

Yeni Kaledoniya, Fransa Polineziyası, Mayot, Vallis və Futuna, Korsika, Reunion, Qvadelupa, Martinika, Fransa Qvianası, Sen-Pyer və Mikelon, Sent-Mert və Sent Varfolomey kimi Fransa müstəmləkələrinin xalqları, eləcə də Niderlandın Aruba, Kurasao, Sənt-Maarten, Boneyr, Sent Yefstaxiy və Saba kimi müstəmləkələrinin xalqları, – gəlin, həmin ərazidəki xalqları alqışlayaq, – bu gün XXI əsrdə də müstəmləkə hakimiyyətindən əziyyət çəkirlər. Hazırda Fransa Polineziyası və Yeni Kaledoniya 1946-1947-ci illərdə BMT tərəfindən qeyri-özünü idarə edən ərazilər kimi tanınır. Bununla belə, onların dekolonizasiya prosesi hələ də yubanır.

1966-1996-cı illər ərzində Fransa Polineziyası Fransanın apardığı 193 nüvə sınağı səbəbindən ətraf mühitin ciddi pozulması ilə üzləşib. Fransa orada torpaq və suyun kəskin dərəcədə zəhərlənməsi və radiasiyasına görə məsuliyyət daşıyır. Radiasiya səviyyəsi 4900 faizi keçib. Əgər buna Fransanın Əlcəzairdə illər boyu işğalı zamanı həyata keçirdiyi 17 nüvə sınağını əlavə etsək, biz həmin ölkə tərəfindən planetin ekosisteminə hansı zərərin vurulduğunu görərik. Fransanın dırnaqarası dəniz ərazilərində törətdiyi cinayətlər siyahısı rejimin bu yaxınlarda insan hüquqları pozulmalarını qeyd etməsək, tam olmazdı. Prezident Makronun rejimi Yeni Kaledoniyada kanakların builki legitim etiraz aksiyasında 13 nəfərin həyatına son qoymuş, 169 nəfəri yaralamışdır. 1700 insan həbs edilmişdir. Həmçinin bu il Martinika və Qvadelupada etirazlar zamanı 38 nəfər həbs olunub. Bütün bunlarla yanaşı, Fransa nə Avropa Komissiyası, nə Avropa Parlamenti, nə də ki, Avropa Şurasının Parlament Assambleyası tərəfindən pislənildi. Bu, siyasi riyakarlıqdır. Siyasi korrupsiya rəmzinə çevrilmiş iki təsisat – Avropa Parlamenti və Avropa Şurası Parlament Assambleyası günahsız insanların qətlinə görə Prezident Makronun hökuməti ilə məsuliyyəti bölüşür. Fransadakı bütün siyası məhbuslar dərhal azad olunmalıdır.

Əgər Avropanın əsas diplomatı Cozep Borrell Avropanı bağ, dünyanın qalan hissəsini isə cəngəllik adlandırırsa, onda Avropa Parlamenti ilə Avropa Şurası Parlament Assambleyasından daha nə gözləmək olar?! Əgər biz cəngəllikiksə, onda bizdən kənar durun və işlərimizə qarışmayın. Azərbaycan Qoşulmama Hərəkatının sədri kimi kiçik ada dövlətlərinə dəstək verib, COP29-un sədri kimi onları dəstəkləyəcək və gələcəkdə dostlarımızı dəstəkləməkdə davam edəcək.

Çox sağ olun.

**Mənbə**:
COP29 çərçivəsində inkişaf etməkdə olan kiçik ada dövlətlərinin Sammitində İlham Əliyevin nitqi. 13 noyabr 2024-cü il. https://president.az/az/articles/view/67325

*UOT 37.0*

**BAŞ REDAKTORDAN**
**ОТ ГЛАВНОГО РЕДАКТОРА**
**FROM THE EDITOR-IN-CHIEF**

**AZƏRBAYCANIN ELM VƏ MƏDƏNİYYƏT XADİMLƏRİ**
**ДЕЯТЕЛИ НАУКИ И КУЛЬТУРЫ АЗЕРБАЙДЖАНА**
**SCIENTIFIC AND CULTURAL FIGURES OF AZERBAIJAN**

**Professor Zahid İbrahim oğlu Qaralov – 90**
**Профессор Захид Ибрагим оглы Гаралов – 90**
**Professor Zahid Ibrahim Garalov – 90**

*UOT 371*

**Akif Nurağa oğlu Abbasov**
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun elmi katibi,*
*pedaqogika elmləri doktoru, professor, Əməkdar müəllim*
https://orcid.org/0000-0002-9210-7141
https://doi.org/10.69682/arti.2024.91(6).10-14

# GÖRKƏMLİ İCTİMAİ XADİM, DƏYƏRLİ ALİM, XEYİRXAH İNSAN ZAHİD QARALOV

**Акиф Нурага оглу Аббасов**
*ученый секретарь Института Образования Азербайджанской Республики*
*доктор педагогических наук, профессор, Заслуженный учитель*

# ВЫДАЮЩИЙСЯ ОБЩЕСТВЕННЫЙ ДЕЯТЕЛЬ, ЦЕННЫЙ УЧЕНЫЙ, ДОБРЫЙ ЧЕЛОВЕК ЗАХИД ГАРАЛОВ

**Akif Nuragha Abbasov**
*scientific secretary of the Institute of Education of the Republic of Azerbaijan,*
*doctor of pedagogical sciences, professor, Honored teacher*

# OUTSTANDING PUBLIC FIGURE, VALUABLE SCIENTIST, KIND PERSON ZAHID GARALOV



**Xülasə**. Zahid Qaralov son dərəcə mənalı ömür yolu keçmişdir. Özünü ləyaqətli şəxsiyyət, pedaqoq, ictimai xadim, sədaqətli dost, yoldaş, nümunəvi valideyn, zəhmətkeş insan kimi təsdiq etmişdi.

Məqalədə alimin və ictimai xadimin həyat yolu, fəaliyyəti üzərində dayanılır, xidmətləri qeyd olunur.

***Açar sözlər***: *ictimai xadim, görkəmli alim, tərbiyəşünas alim, yaxşı yoldaş, fizikanın tədrisi metodikası*

**Аннотация**. Захид Гаралов прожил очень содержательную жизнь. Он проявил себя как достойная личность, педагог, общественный деятель, верный друг, товарищ, примерный родитель, трудолюбивый человек.

В статье рассмотрен жизненный путь и деятельность ученого и общественного деятеля, упомянуты его заслуги.

***Ключевые слова***: *общественный деятель, видный учёный, педагог, хороший друг, методика преподавания физик*

**Abstract.** Zahid Garalov lived a very meaningful life. He showed himself as a worthy person, teacher, public figure, loyal friend, comrade, exemplary parent, hardworking person.

The article examines the life and work of the scientist and public figure, and mentions his merits.

***Keywords***: *public figure, prominent scientist, teacher, good friend, physics teaching methods*

Zahid müəllimi 1975-ci ildən tanıyırdım. Tanıyırdım deyəndə... Onun barəsində keçmiş zamanda danışmaq qəlb ağrıdır, ürək sızıldadır. Zahid Qaralov xeyirxahlıq, təmənnasızlıq nümunəsi idi. Hansı sahədə fəaliyyət göstərirdisə, öz işini sevərək, ona bağlanaraq, vicdanla, ədalətlə çalışırdı. Hansı sahədə deyəndə... Borçalı mahalının Başkeçid (Dmanisi) rayonunun Ormeşən kəndində müəllim, məktəb direktoru; Gürşüstan Respublikası Başkeçid Rayon Komsomol Komitəsinin birinci katibi, Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutunun (hazırda Təhsil İnstitutu) direktoru, respublika Maarif nazirinin müavini; Yeni Azərbaycan Partiyası Səbail rayon təşkilatının sədri vəzifələrində uğurla fəaliyyət göstərmişdi.

İki çağırış Milli Məclisin deputatı və Regional məsələlər daimi komissiyasının sədri olmuşdu.

Ötən əsrin 90-cı illərində ölkəmizdə ağır siyasi vəziyyət yarananda Zahid Qaralov həyatını təhlükə qarşısında qoyaraq, qorxu-hürkü bilmədən “Heydər Əliyevi müdafiə komitəsi”nin sədri vəzifəsini öz öhdəsinə götürmüşdü.

Onun fədakarlığı Ümummilli Liderimiz Heydər Əliyev tərəfindən yüksək qiymətləndirilmişdi. Zahid Qaralovun 65 yaşı tamam olarkən Ulu Öndər məktub göndərərək onu təbrik etmişdi. Məktubda deyilirdi:

“Səni anadan olduğun gün münasibətilə təbrik edir, işlərində yeni uğurlar diləyirəm.

Mən səni dəyərli bir insan, yüksək səviyyəli alim-pedaqoq, yetkin siyasi xadim kimi tanıyıram. Yaxşı xatitimdədir, mən Naxçıvanda blokada şəraitində olarkən bir neçə dəfə yanıma gəldin. Müxtəlif məsələlər barədə fikir mübadiləsi apardıq. 1992-ci ilin avqustunda Səs” qəzetində “Heydər dağına kölgə salmaq olmaz!” başlıqlı seriya məqalələrini oxuyanda hiss etdim ki, sən çox cəsarətli bir ziyalısan”. Bunun ardınca “91-lər”in – mənə müraciət edənlərin sırasında da sənin imzanı gördüm. Mən bunları çox yüksək qiymətləndirirəm. Çünki o dövrdə mənim haqqımda böhtanlar yazırdılar. Mənim barəmdə müsbət fikir söyləyənləri hədələyirdilər. Sən onlardan çəkinmədin. Xalq sizlərin fikrini dəstəklədi, nəticəsi də müasir siyasi qüvvə olan Yeni Azərbaycan Partiyasının yaranması, xalqın istəyi ilə Heydər Əliyevin Azərbaycan Prezidenti seçilməsi, Azərbaycanın hərtərəfli böhrandan çıxarılması, köklü islahatların həyata keçirilməsi oldu. Biz həmişə bir yerdə olmuşuq. Bu gün də bir yerdəyik, gələcəkdə də bir yerdə olacağıq. Hələ qarşıda görüləcək işlərimiz çoxdur.

Bir daha səni təbrik edirəm. Sənə və ailənə xoşbəxtlik, səadət, sağlamlıq diləyirəm. Mənim səmimi salamlarımı bütün ailə üzvlərinizə çatdır, nəvələrini təbrik et. Qoy onlar həmişə səninlə bir yerdə olsunlar, xoşbəxt günlər görsünlər.

**Heydər Əliyev**

*Bakı şəhəri, 10 iyul 1999-cu il”.*

Zahid Qaralovun 80 illiyi münasibətilə “Müdrik müəllimimiz” adlı kitab ərsəyə gəlmişdi. Ulu Öndərin bir səhifədən ibarət həmin məktubu bu kitabda işıq üzü görmüşdü.

Kitabda dövlət və ictimai xadimlərinin, millət vəkillərinin, pedaqoqların, ziyalıların, müəllimlərin, dost-tanışının onunla bağlı xatirələri, ürək sözləri öz ifadəsini tapmışdı. Mənim də

ürək sözlərim dərc olunmuşdu. Öz yazımı aşağıdakı sözlərlə başlamışdım: "Mənim üçün professor Zahid Qaralov kimdir?

Zahid Qaralov yaxşı dost və yoldaş, güclü məntiqə, iti zəkaya, dərin təfəkkürə malik istedadlı alim, uzaqgörən siyasətçi, tanınmış ictimai xadim, yaxşı idarəetmə və təşkilatçılıq qabiliyyətinə sahib bir rəhbər işçi, öz inam və əqidəsindən dönməyən, ədalətli, prinsipial, tələbkar, məsuliyyətli, sözü bütöv, cəsarətli, ciddi, eyni zamanda kövrək, xeyirxah, səmimi, təvazökar bir insandır. Yaxşıların yaxşısıdır Zahid müəllim.

Mənim bir tədqiqatçı, bir alim kimi yetişməyimdə bu böyük insanın əvəzsiz rolu olub. Namizədlik dissertasiyamı müdafiə edəndən az sonra onun təkidi ilə doktorluq dissertasiya mövzusu götürmüşəm və qısa müddətdə onun elmi məsləhətçiliyi ilə müdafiə etmişəm. O zaman Zahid müəllim bizim dayaq yerimiz olub. Bizi ruhlandırıb.

Zahid müəllim hansı vəzifəni tutmasından asılı olmayaraq, vaxtilə birlikdə çalışdığı insanlarla, tanışları və yaxınları ilə dost, səmimi münasibətlərini həmişə saxlayıb. Müraciət edənlərə əlindən gələn köməyi, yaxşılığı edib. Harada olmasından, tutduğu vəzifədən asılı olmayaraq, üzərinə düşən bütün vəzifələri yüksək peşəkarlıqla, layiqincə yerinə yetirərək göstərilən etimadı daima doğrultmuş, dövlətimizin və xalqımızın etibarını qazanmışdır".

İndi isə, Zahid Qaralovun mənim haqqımda dediklərini diqqət mərkəzinə gətirim. ***60 yaşım olarkən Zahid Qaralov məni təbrik edərək yazmışdı:*** "Möhtərəm Akif müəllim! Anadan olmağınızın 60 illiyi ilə əlaqədar Sizi, bütün ailə üzvlərinizi səmimi qəlbdən təbrik edirəm, həyatda, yaradıcılıq işlərinizdə yeni uğurlar diləyirəm! Dünyada belə aksioma var: hər insan özünəməxsus, təkrarı olmayan bir dünyadır, onun ömrü bu mikrodünyanın həqiqi tarixidir. İnsan dünyasının qanun və qanunauyğunluqlarını, onun tarixinin inkişaf dinamikasını olduğu kimi öyrənmək, qiymətləndirmək, təqdim etmək bizim makrodünyamızın, bəşəriyyət tarixinin öyrənilməsi qədər çətin və mürəkkəbdir. Bunun nəticəsidir ki, şəxsiyyətlərin bir çoxunun tarixi öz həqiqi varlığı kimi təqdim olunmur, təhrif edilir. Belə vəziyyətin kütləviləşməsinin qarşısını almaq üçün ən asan və düzgün yol şəxsin tarixini onun özü və onunla birgə çalışan insanlar vaxtında yazsınlar.

Ömrünüzün 60 ilinin yarıdan çoxunu – 35 ilini eyni məkanda, eyni elmi mühitdə yaşayıb yaratmışıq. Bu müddətdə pedaqoji elmlərin yüksək pillələrinə tədricən yüksəlməyinizin bir neçə epizodunu xatırlamaqla, ömür yolunuzun əsas döngələrini olduğu kimi yığcam halda bildirməyi özümə borc bildim.

1975-ci ildə Maarif Nazirliyinin Pedaqogika İnstitutunda (indiki Təhsil Problemləri İnstitutu) elmi işlər üzrə direktor müavini, eyni zamanda institut ilk partiya təşkilatının katibi vəzifələrində işləyirdim, instituta işçilərin və aspirantların müsabiqə yolu ilə qəbulu komissiyalarına sədrlik edirdim. İnstitutun ştatı az olduğundan, elmi işçilərin seçimində keyfiyyətə, məhsuldarlığa xüsusi əhəmiyyət verirdik. Müsabiqədə iştirak edənlər arasında ixtisası üzrə savadlılar çox olsa da, yazı və tədqiqatçılıq qabiliyyətləri zəif olurdu, bunların müstəqil tədqiqat aparmaq səviyyəsinə çatdırılmasına çox vaxt sərf edilirdi. Ona görə də istəyirdik ki, həm yüksək biliyi, müəllimlik təcrübəsi olan, eyni zamanda tədqiqat aparmağa tez yiyələnə bilən kadrları seçək. Akif müəllimi instituta elmi işçi qəbul etdiyimiz il – 1975-ci ildə məktəblilərin tərbiyəsi problemi son dərəcə aktuallaşmışdı. Səbəbi Moskva, Leninqrad, Rostov və digər iri şəhər məktəblərində pozğunluğun getdikcə artması idi. Mənəvi, əxlaq, əmək, hüquq tərbiyəsi gözlənilən nəticəni vermirdi.

Akif müəllim institutda tələb olunan əsas keyfiyyətləri – tədqiqata dərin marağı, bu işi aparmaq və yazmaq bacarığı ilə seçildiyindən işçi yerini tuta bildi. Əmək qabiliyyəti, intizamlılığı və səliqəliliyi ilə seçildi, məktəblərlə əlaqələrini genişləndirdi, elmi işləri yüksək səviyyədə yerinə yetirdi.

1980-ci illərin əvvəllərində SSRİ rəhbərliyində ailə tərbiyəsindəki faciəli vəziyyət barədə ciddi narahatlıq yaranmışdı. Sov.İKP MK Siyasi Büronun qərarı ilə "Ailə" adında fənn orta ümumtəhsil məktəblərinin tədris planına daxil edilmişdi. SSRİ Pedaqoji Elmlər Akademiyası və SSRİ Təhsil Nazirliyi müttəfiq respublikaların müvafiq qurumlarını da cəlb etməklə, qərarın yerinə yetirilməsi üzrə kompleks tədbirlər planı hazırlayıb həyata keçirməyə başladı. İlk növbədə fənn proqramı və dərslik tərtib edildi. Göstəriş verildi ki, "Ailə" fənni üzrə proqram və dərslik milli dillərə tərcümə edilərək, 1985-ci ildən tədrisə başlanılsın. O vaxt mən Maarif nazirinin

müavini işləyir və bütün tədris-tərbiyə işlərinin təşkili məsələlərinə məsuliyyət daşıyırdım. Çox böyük həcmli “Семья” dərsliyini oxudum. Milli tərbiyə məzmunundan çox uzaq olan, Azərbaycan ailələrinə xas olmayan faktlarla doldurulmuş bu kitabın respublika məktəblərinə verilməsinin qeyri-mümkünlüyü qərarına gəldim. Respublika rəhbərliyi ilə məsləhətləşdim. Bir variant meydana çıxdı ki, həmin dərsliyin müəllifi ilə razılaşaq, kitabı yerli şəraitə uyğunlaşdıraq. Bu məqsədlə, respublika variantında bizdən də həmmüəlliflər olsun. Dərsliyin moskvalı müəllifi təklifimizdən qəti imtina etdi. Onda özümüzün müstəqil proqram və dərsliyimizin, metodik ədəbiyyatımızın hazırlanmasını vacib bildik. Sual meydana çıxdı: bu işi kimlər görə bilər?

Şəxsiyyətinə, elmi yaradıcılığına dərin hörmət bəslədiyim psixoloqumuz, professor Əbdül Əlizadə ilə Akif Abbasovun birgə müəllifliyi əsasında işimiz ləyaqətlə yerinə yetirildi. Baltikyanı respublikalar: Latviya, Litva və Estoniya da belə hərəkət etmişdi.

İnstitutumuzda o qədər də elmi əsası olmayan belə bir mövqe var idi ki, doktorluq dissertasiyası mövzusu o zaman təsdiq edilsin ki, elmlər namizədinin ən azı 10 il tədqiqat stajı olsun. Mən 1976-cı ildə direktor təyin olunan kimi ilk tədbirim bu zərərli çəpəri dağıtmaq oldu. Gənclərin elmlər namizədi diplomu alan vaxtdan doktorluq dissertasiyası üzərində işləmələrinə şərait yaradıldı. Bu tədbir gənc milli kadrların inkişafına güclü təsir göstərdi. Oqtay Rəcəbov, Fərahim Sadıqov və başqaları kimi, Akif müəllim də yeni şəraitdən səmərəli istifadə etdi.

Ali Attestasiya Komissiyasında pedaqoji-psixoloji elmlər üzrə ekspert komissiyasında Akif müəllimin doktorluq dissertasiyasına baxılarkən komissiya üzvlərindən biri təklif etdi ki, mənim bəzi suallarım var, mümkünsə müəllif özü müzakirədə iştirak etsin. Buna ciddi ehtiyacın olmamasına baxmayaraq məsələnin başqa məcraya düşə biləcəyi ehtimalını nəzərə alaraq, komissiya sədri kimi təklifi nəzərə aldım. Akif müəllimin komissiyadakı təmkinli cavabları, onun doktorluq elmi dərəcəsi alması işini xeyli sürətləndirdi.

Belə nümunələrin sayını artırmaq olar. Bunların hamısından ümumi bir nəticəyə gəlirik ki, Akif müəllimin elmi yaradıcılığı son 35 ildə yüksələn xətt üzrə gedib, hər dövrün tələbinə uyğun olan aktual problemləri tədqiq edib. Yaradıcılığını şaxələndirərək elm-mədəniyyətin bir-biri ilə əlaqəli sahələri üzrə dəyərli əsərlər yazıb.

1975-ci ildə kənd məktəbi müəllimliyindən gələrək, 1931-ci ildən fəaliyyətə başlamış pedaqoji-psixoloji elmlər mərkəzində kiçik elmi işçi vəzifəsinə başlamış, bu gün pedaqoji elmlər doktoru, professor, Beynəlxalq Pedaqoji və Sosial Elmlər Akademiyasının həqiqi üzvlüyü səviyyəsinə qədər yüksəlmiş bir milli ziyalı həyatı, həqiqətən inkişafda olan bir canlı tarixdir. 35 il əvvəl müəllimlərindən müstəqil elm yoluna çıxmaq köməyi diləyən və bu yolu öyrənib inamla irəliləyən azərbaycanlı ziyalısının bu gün elmə həvəsli insanların öz səviyyəsinə yüksəlməyə köməkçi-müəllim olan Akif Nurağa oğlu Abbasovdan yeni-yeni, dəyərli əsərlər gözləmək haqqını özümüzdə saxlayırıq!

Müstəqil, suveren Azərbaycanın yüksək ixtisaslı, mərifətli, həqiqi elm yaradıcılığı ilə məşğul olan milli kadrlara olan ehtiyac bu gün daha da artmışdır.

Dərin hörmətlə,

**Zahid Qaralov,**
*pedaqoji elmlər doktoru, professor,*
*Pedaqoji və Sosial Elmlər Akademiyasının*
*həqiqi üzvü, respublikanın Əməkdar müəllim*
*Bakı şəhəri, 15 dekabr 2010-ci il* (2, s. 77-84).

Zahid Qaralov həyat və fəaliyyətindən söz düşəndə deyərdi: “Mən çox sadə, adi həyat yaşamışam. Alimlərdən, ictimai-siyasi xadimlərdən, həyat hadisələrindən dərs almışam və bu dərsləri özümdən sonra gələnlərə doğru-düzgün ötürməyə çalışmışam, keçmişimizlə gələcəyimiz arasında möhkəm körpü yaratmışam. Heç kəsi incitməmişəm. Kimə nə etmişəmsə, bunu özümə borc bilib etmişəm. Heç kəs mənə borclu deyil. Təmtəraqlı məclisləri sevməmişəm. Heç vaxt var-dövlət toplamağa meyl göstərməmişəm. Ulu Öndər Heydər Əliyevin dediyi kimi, həyatda nəyə nail olmuşamsa, Allahıma, xalqıma və öz zəhmətimə minnətdaram. Mənim ən böyük dövlətim təmiz nəfsli, yüksək mənəviyyatlı, ağıllı övladlarım, qədirbilən tələbələrim, müxtəlif kollektivlərdə birgə çalışdığım gözəl insanlar, dostlarım, qohumlarım, Azərbaycan ziyalılarıdır”.

Bu etiraf onun necə gözəl bir insan, şəxsiyyət olmasını təsdiq edir.

Zahid Qaralov 1967-ci ildə namizədlik, 1994-cü ildə doktorluq dissertasiyalarını müdafiə etmiş, professor elmi adı almışdı. Yüzlərlə elmi

məqalənin və 50-dən artıq monoqrafiyanın, dərslik və dərs vəsaitinin müəllifi idi. Onun elmi rəhbərliyi və elmi məsləhətçiliyi ilə çoxsaylı elmlər namizədi və elmlər doktoru yetişmişdi.

O, Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasında Pedaqoji və psixoloji elmlər üzrə ekspert komissiyasının sədri olmuşdu.

"Şöhrət" və "Şərəf" ordenləri ilə təltif olunmuşdu.

Professor Zahid Qaralov Ümummilli Lider Heydər Əliyevin uğurlu və diqqətəlayiq fəaliyyətinə bir sıra kitablar həsr etmişdi. Diqqət yetirək: "Əbədiyyata gedən yollar (Heydər Əliyev barədə)", "Heydər Əliyevin elmi irsi" (2 cild), "Heydər Əliyev-Milli ləyaqət ölçüsü"

Zahid Qaralov fizikanın tədrisi metodikası üzrə pedaqogika elmləri doktoru idi. "Məktəblinin fizika lüğəti" (A.A. Abaszadə ilə), "Məktəbdə peşə oriyentasiyası üzrə iş", "Fizikanın tədrisində təlim və tərbiyənin vəhdəti", "IV-VIII siniflərdə əmək təlimi"(N. Quliyev və N. Şışkinlə ilə), "Fizika tədrisinin səmərəliliyinin artırılması yolları", "Fizika qanunlarının tədrisi" və s. kitabları qələmə almışdı.

O eyni zamanda görkəmli tərbiyəşünas alim kimi də tanınırdı. Onun "Məktəbdə əxlaq tərbiyəsi", "Məktəblilərin tərbiyə nəzəriyyəsi və təcrübəsi", "Təhsil sisteminə müasir baxış", 3 cildlik "Tərbiyə", *"İdeologiya və mənəviyyat",* "Məhəmməd Nəsirəddin Tusi: elm, saf əxlaq dünyasına açılan qapı" (2 cilddə), kitabları işıq üzü görmüşdü.

Professor Z.İ. Qaralov Ümumtəhsil məktəblərinin I-IV siniflər üçün riyaziyyat və həyat bilgisi dərsliklərinin müəllifi idi.

1934-cü i iyulun 10-da anadan olan Zahid İbrahim oğlu Qaralov 2015-ci il yanvar ayının 7-də dünyasını dəyişdi.

Fəqət dostları, yoldaşları, yetirmələri, zahidsevərlər üçün o, sağdır, yaşayır.

PS: Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev professor Zahid Qaralovun vəfatı münasibəti ilə başsağlığı vermişdir. Başsağlığında deyilirdi: "Tanınmış ictimai xadim, bacarıqlı maarif işçisi və xeyirxah insan Zahid İbrahim oğlu Qaralovun xatirəsi onu tanıyanların qəlbində həmişə yaşayacaqdır".

**Problemin aktuallığı**. Zahid Qaralov ictimai xadim, elmlər doktoru, professor idi. Onun həyat və fəaliyyətinin öyrənilməsi aktualdır.

**Problemin yeniliyi**. Professor Zahid Qaralovun ictimai xadim və görkəmli alim kimi fəaliyyəti araşdırılır.

**Problemin praktik əhəmiyyəti**. Məqalə gənc tədqiqatçılar üçün faydalı ola bilər.

**Ədəbiyyat**


1. Müdrik müəllimimiz. Zahid Qaralov – 80. Bakı, 2014.
2. Alim və yazıçı ömrü. Bakı: Mütərcim, 2010, -296 s.



**E-mail:** a.abbasov@arti.edu.az



**Redaksiyaya daxil olub**: 10.12.2024

*UOT 37.0*

***EKOLOJİ PROBLEMLƏRİN MÜMKÜN HƏLLİ YOLLARI***
***ВОЗМОЖНЫЕ РЕШЕНИЯ ГЛОБАЛЬНЫХ ЭКОЛОГИЧЕСКИХ ПРОБЛЕМ***
***POSSIBLE SOLUTIONS TO GLOBAL ECOLOGICAL PROBLEMS***

***Mələk Feruz qızı Kərimova***
*Xəzər Universiteti Psixologiya departamentinin koordinatoru, psixoloq*
*https://orcid.org/0000-0001-9156-962X*
*https://doi.org/10.69682/arti.2024.91(6).15-20*

***Mirsadiq Mirzamin oğlu Muxtarov***
*Xəzər Universiteti Psixologiya departamentinin assistenti, psixoloq*
*https://orcid.org/0009-0001-4200-0397*

# TƏBİİ ƏTRAF MÜHİT AMİLLƏRİNİN PSİXİ RİFAHLA QARŞILIQLI ƏLAQƏSİ

***Мелек Феруз гызы Керимова***
*Координатор кафедры психологии Университета Хазар, психолог*

***Мирсадыг Мирзамин оглы Мухтаров***
*ассистент департамента Психологии Университета Хазар, психолог*

# ВЗАИМОСВЯЗЬ ПРИРОДНЫХ ФАКТОРОВ ОКРУЖАЮЩЕЙ СРЕДЫ С ПСИХИЧЕСКИМ БЛАГОПОЛУЧИЕМ

***Malak Feruz Karimova***
*Coordinator of Khazar University Psychology Department, psychologist*

***Mirsadig Mirzamin Mukhtarov***
*Assistant of Khazar University Psychology Department, psychologist*

# RELATIONSHIP OF NATURAL ENVIRONMENTAL FACTORS WITH MENTAL WELL-BEING

**Xülasə.** Məqalədə təbii ətraf mühit faktorlarının psixi rifaha təsiri mövzusuna toxunulmuşdur. Ölkəmizdə keçiriləcək COP29 tədbirinin də məhz bu sahəyə xüsusi diqqət etməsi mahiyyətindən yola çıxaraq, məqalə müəllifləri tərəfindən beynəlxalq tədqiqat nəticələrinə əsaslanaraq bu sahədə olan araşdırmaları təhlil etmişdirlər. Məqalədə psixi rifahın yaxşılaşmasında təbii ətraf mühit amillərinin əhəmiyyəti diqqətə çatdırılır. Ekoloji şüurun formalaşması üçün şəxslərin özlərini böyük bir sistem parçası kimi düşünmələri istiqamətində təkliflər də məqalədə öz əksini tapmışdır. Məqalədə insanların təbiətlə təmasda olmasının onların psixoloji vəziyyətlərinə təsirindən yola çıxaraq naturopatik terapiyanın əhəmiyyəti üzərində dayanılmışdır.
***Açar sözlər:*** *psixi rifah; təbii ətraf mühit; urbanizasiya; naturopatik terapiya*

**Аннотация.** В статье рассматривается влияние природных факторов окружающей среды на психическое благополучие. Исходя из того, что на мероприятии COP29, которое пройдет в нашей стране, этой сфере уделяется особое внимание, авторы статьи проанализировали исследования в этой области на основе результатов международных исследований. В статье анализируется значение природных факторов окружающей среды в улучшении психического благополучия. Для формирования экологического сознания в статье также отражены предложения личности мыслить себя частью большой системы. В статье обращается внимание на значении натуропатии, основанной на влиянии контакта человека с природой на его психологическое состояние.

***Ключевые слова:*** *психическое здоровье; природная среда; урбанизация; натуропатическая терапия*

**Abstract.** The article discusses the influence of natural environmental factors on mental well-being. Considering that the COP29 event, which will be held in our country, pays special attention to this field, the authors of the article analyzed the research in this area based on international research results. The article analyzes the importance of natural environmental factors in improving mental well-being. For the formation of ecological consciousness, suggestions for individuals to view themselves as part of a larger system are also included in the article. The article focuses on the importance of naturopathic therapy, which is based on the impact of people's contact with nature on their psychological state

***Keywords:*** *mental health; natural environment; urbanization; naturopathic therapy*

Bakı şəhərində 2024-cü ilin 11-22 noyabr tarixlərində keçiriləcək COP29 tədbirinin əsas məqsədi qlobal istiləşməni 1,5°C səviyyəsində saxlamaq, ambisiyaları fəaliyyətə çevirmək, emissiyaları azaltmaq, iqlim dəyişmələrinə uyğunlaşmaq, habelə, cəmiyyətin ekoloji məsələlərə olan şüurluluğunun artırılmasıdır (COP29, 2024). Belə ki, bu şüura sahib olan şəxslər yaşıllaşmanın fiziki və mental faydalarını anlayaraq bu fəaliyyətlərə bilavasitə dəstək ola bilərlər. Bu məqalənin məqsədi fərdlərdəki fərqindəliyi artırmaq və təmiz təbii ətraf mühitin onların psixi rifahları üzərindəki təsirini öyrənməkdir.

1946-cı ildə Ümumdünya Səhiyyə Təşkilatı (ÜST) fiziki və sosial rifahla yanaşı, sağlamlığın üç əsas komponentindən biri kimi psixi rifah anlayışını da qeyd etmişdir. (World Health Organization, 1948). 2013-cü ildə ÜST psixi sağlamlıq haqqında fəaliyyət planını açıqladıqda psixi sağlamlıq haqqında tədqiqatları öz məqsədlərindən biri kimi müəyyənləşdirmişdir (World Health Organization, 2013). Bundan əlavə, 2015-ci ildə Birləşmiş Millətlər Təşkilatı psixi sağlamlıq və rifahın təşviqini sağlamlıq prioriteti kimi tanımışdır. (United Nations, 2018). Ümumdünya Səhiyyə Təşkilatına görə psixi sağlamlıq anlayışı fərdin öz potensialına çatmaq, stress yaradan amillərlə mübarizə aparmaq, məhsuldar işləmək və cəmiyyətə töhfə vermək bacarığı olaraq ifadə edilir (World Health Organization, 2014). Fərdin psixi sağlamlığında pozuntuya sahib olmaması onun psixi sağlamlığının yaxşı vəziyyətdə olmasını əks etdirmir.

Psixi sağlamlıq anlayışı insanın böyümə və inkişafı prosesində yaxşı əhval-ruhiyyə, uyğun şəxsiyyətlərarası münasibətlər, ətraf mühitə uyğunlaşma və. s kimi bir çox komponenti özündə ehtiva edir (Liao & Lian, 2019). Psixi sağlamlıq, sağlamlığın mühüm bir tərkib hissəsidir və fərdi xoşbəxtliyin, eləcə də cəmiyyətin harmoniya və sabitliyinin inkişafında əhəmiyyətli rol oynayır. Bu baxımdan, sağlamlığın qorunması və təşviqi, yalnız fərdi səviyyədə deyil, eyni zamanda sağlam cəmiyyətin formalaşması üçün də olduqca önəmlidir. Bununla belə, bütün dünyada insanların psixi sağlamlıq vəziyyəti elə də qənaətbəxş deyil. ÜST 2016-cı ildəki məlumatlarına əsasən beynəlxalq miqyasda nevropsixiatrik pozuntular əlilliyə səbəb olan üçüncü amildir (World Health Organization, 2018). Statistikalara əsasən qeyd edilir ki, dünyada təxminən hər 10 nəfərdən birində psixi sağlamlıq problemi vardır və dünyada hər il 10 milyondan çox insan intihara cəhd edir (Liu & Cui, 2013). Rəsmi statistikadakı rəqəmlərdən məlum olur ki, son illər Azərbaycanda ilk dəfə psixi xəstəlik diaqnozu qoyulmuş xəstələrin sayı xeyli artıb. Rəsmi statistikaya görə, 2022-ci ildə tibb müəssisələrində dispanser müşahidələri altında olan psixi xəstələrin ümumi sayı 113836 nəfər olub (Modern.az, 2023). 2016-cı il məlumatlarına görə isə Azərbaycan 183 ölkə arasında 100 min nəfərə düşən intihar hallarına görə 175-ci yerdədir (World Health Organization, 2021). Çində psixoloji problemlər və psixi xəstəliklərlə bağlı statistika göstərir ki, 16 milyon insan ağır psixi xəstəlikdən əziyyət çəkir (Ning et al., 2017). Bu problemlərin artması, fərdi inkişaf və sosial sabitlik üçün əsas maneələr yaradır. Buna görə də, bu çətinliklərin qarşısının alınması və müalicəsi olduqca vacibdir.

Psixi sağlamlıqla əlaqəli digər faktor isə şəhərlərin urbanizasiyasıdır. Urbanizasiya, əhalinin kəndlərdən şəhərlərə köçməsi və şəhər mühitlərinin inkişafı prosesidir. Belə ki, urbanizasiya 2050-ciilədək dünya əhalisinin 68%-nin şəhər mühitində yaşayacağını proqnozlaşdırır (United Nations, 2018). Şəhərlərdə əhalinin artması, təhsil və səhiyyə xidmətlərinə çıxışı artırır (Bertinelli & Black, 2004). Lakin, urbanizasiya prosesi eyni zamanda təbii ətraf mühitin pozulma-

sına səbəb ola bilər, bu da ekosistemlərin və insanların psixoloji sağlamlığına mənfi təsir göstərə bilər. Şəhər mühitində yaşıllıqların azalması və hava keyfiyyətinin pisləşməsi, psixi xəstəliklərin artmasına və insanların rifahının azalmasına yol aça bilər. Beləliklə, urbanizasiya prosesində, psixoloji problemlərin azaldılması və psixi xəstəliklərin müalicəsi üçün daha əlverişli mühit yaratmaqla yanaşı, ekoloji sağlamlığı da nəzərə almalıdır ki, bu, fərdi inkişaf və sosial sabitliyi təmin etsin.

Müasir ədəbiyyatlarda təbii mühitlər dedikdə insan tərəfindən nisbətən dəyişməz və ya pozulmayan mühitlər nəzərdə tutulur. (Johnson et al., 1997). Təbii mühit dedikdə ağaclar, kollar, qayalar, torpaq, qum və su ilə bitki örtüyü nəzərdə tutulur. Təbii mühitlərə işıq, radiasiya, yüklü ionlar, kimyəvi maddələr və mikroblar kimi atmosfer komponentləri daxildir. Təbii mühitlər adətən yalnız səhra əraziləri kimi müəyyən edilmir, bunlara insan müdaxilələri ilə dizayn edilən, yaxud dəstəklənən sahələr də daxil ola bilər. Şəhər şəraiti kontekstində bura bağlar, parklar, meşələr və sahilyanı ərazilər aiddir.

Sürətli qlobal urbanizasiya, biomüxtəlifliyin itirilməsi və ətraf mühitin deqradasiyasına baxmayaraq, artıq təbii mühitlərə psixoloji rifahın dəstəklənməsinə yönəlik "ekosistem xidməti" kimi baxılır (Schewenius, McPhearson, & Elmqvist, 2014). Bioloq Con Artur Tompson 1914-cü ildə Britaniya Tibb Assosiasiyasının illik yığıncağında etdiyi çıxışda bu arqumenti qeyd edərək, insanın təbii mühitlə təkamül əlaqələrinin modernləşmə nəticəsində pozulduğunu müdafiə etmişdir. Thompsonun fikrincə, fərdlər şəhər quruluşu mühitinin stress verici faktorları ilə mübarizə aparırlar (Thomson, 1914).

Tədqiqatlar yaşayış yerlərinin təbii mühitə yaxınlığı ilə psixi sağlamlıq arasında əlaqələri araşdırıb. Təbii mühitlərin insan sağlamlığına təsir göstərə bilməsi anlayışı Hippokratın fikirlərində əks olunub (Wear, 2008). Əslində, hələ 1950-ci illərdə təbii mühitin psixi sağlamlığa təsiri ilə bağlı tədqiqatlar artıq xarici ölkələrdə aparılmışdı. Nəticələrə əsasən təbii mühitin fərdlərdə stress, narahatlıq və depressiyanı azaltmaq üçün daha effektiv olduğu məlum idi (Xu & Wu, 2015).

Yeni aparılan bir meta-təhlil aşkar etdi ki, təbiətlə əlaqənin daha yüksək səviyyədə olması şəxslərin həyat məmnunluğu ilə müsbət əlaqələndirilir (Capaldi, Dopko, & Zelenski, 2014). Şəxslərdə şüurluluq (indiki anın və onunla əlaqəli düşüncələrin, emosiyaların və hisslərin dərk edilməsi) təbii mühitin sağlamlıqla əlaqəsini anlamada ilkin şərt kimi qeyd olunur (Zhang et al., 2014).

Digər bir tədqiqatda, yaşıl sahənin yüksək olduğu ərazilərdə yaşayan şəxslərdə klinik göstəricilərin aşağı olduğu qeyd olunub (Maas et al. 2009). Yaşayış yerlərinin su hövzələrinə yaxınlığının ümumi sağlamlıq və rifaha müsbət təsir göstərdiyini bildirilir (White et al., 2013). Hətta şəhər daxilində yaşıllıq sahələrinin çoxluğunun sakinlər arasında həyatdan məmnunluq və psixi sağlamlıqlarına müsbət təsiri olduğu qeyd edilir (Vemuri et al., 2011).

Hollandiyada aparılan tədqiqatda, yaşıllıq sahəsi aşağı olan ərazi sakinlərinin, evin yaxınlığında yaşıllıq sahəsinin daha yüksək olduğu sakinlərlə müqayisədə depressiya və təşviş pozuntusunun riskinin daha çox olduğu məlum olmuşdur. Az miqdarda yaşıllıq sahəsi olan ərazilərdə (evdən 1 km məsafədə 10%) yaşayanların depressiya riski 25% və təşviş pozuntusu riskinin 30% yaşıllıq ərazidə yaşayanlarla nisbətdə çox olduğu məlum oldu (Maas et al., 2009). Eynilə, Yeni Zelandiyada aparılan bir araşdırmada, evin yaxınlığında istifadə edilə bilən yaşıllıq sahəsinin hər 1% artımının fərdlərdəki narahatlıq və əhval pozuntularının müalicəsində 4% daha aşağı nisbəti ilə əlaqəli olduğunu müəyyən etmişdir (Nutsford et al., 2013).

Bundan əlavə, tədqiqatlara əsasən daha yüksək dərəcədə yaşıllıq sahəsi olan ərazilərə köçən fərdlərin (əvvəlki yaşayış yerləri ilə müqayisədə) psixi sağlamlıq səviyyələrinin daha da yaxşılaşması müəyyən edilmişdir (Alcock et al., 2014).

Bir sıra tədqiqatlarda isə yaşayış yerlərində yaşıllıq ərazilərinin çox olmasını sağlam hamiləliklərlə əlaqələndirdi (Laurent, Wu, Li, & Milesi, 2013). Kanadanın Vankuver şəhərində 64.000-dən çox doğuşun nəticələrinə dair son araşdırma göstərdi ki, yaşayış yerindən 100 metr məsafədə yaşıllıq ərazinin olması doğum çəkisinə və vaxtından əvvəl doğuş ehtimalının azalmasına təsir göstərir. Uşağın doğum çəkisi və vaxtından əvvəl doğuşu, hava çirkliliyi, səs küydən uzaq olma, ananın gəzməsi və evin parka yaxın olması kimi faktorlarla əlaqəli idi (Hystad et al.,

Gübrələrdən istifadə müsbət səmərəliliyi ilə yanaşı ekoloji problemlər də yaradır. Gübrələrdən istifadə torpağın deqradasiyasına səbəb olur, təbii münbitlik əsasən kimyəvi maddələrə əsaslanan münbitliklə əvəz olunur.

**Tədris prosesiondə ekoloji təhlükəsizliyin təbliğinin əhəmiyyəti**

İstehsalat sektorunun, nəqliyyatın, energetika, kənd təsərrüfatında sənayeləşmənin inkişafı antropogen təsirin kəskin artmasına səbəb olub. Hər il milyonlarla ton bərk və qaz halında olan tullantılar təbiətə atılır, milyard kubmetrlərlə çirkab sular su hövzələrinə axıdılır.

İnsanların məskunlaşdığı yerlər səslə, elektromaqnit sahələrlə və radioaktiv şüalanma ilə "çirkləndirilir", oksigen ehtiyatları tükənir, Yer kürəsinin ozon təbəqəsi dağılır.

Təbii mühitin çirklənməsi nəticəsində insanların sağlamlığı pisləşir, bitki və heyvanat aləmi məhv olur, materialların, bina və tikililərin dağılması sürətlənir. Ekoloji böhran təhlükəsi getdikcə reallaşır.

Ekoloji böhran – təbiət və ictimaiyyət arasında dinamik tarazlığın pozulması olub, təbii mühitin, həyatın varlığı və inkişafı üçün vacib olan şəraiti qoruması, maddələr və enerji mübadiləsi funksiyasının pozulması ilə təzahür edir.

Ətraf mühitin çirklənməsi riskinin aşağı salınmasında əsas vəzifələrdən biri əmtəə istehsalında, xidmətlərdə, texniki sistemlərin istismarında yeni, tullantısız texnoloji proseslərin yaradılıb tətbiq edilməsidir. Bununla yanaşı yaranan ekoloji böhran vəziyyətində insanların dəyişilmiş və çirklənmiş mühitin təsirindən qorunması qarşıda dayanan problemlərdən biridir. Bizim sağlamlığımız tənəffüs etdiyimiz havadan, qidalardan, işləyib yaşadığımız şəraitdən çox asılıdır.

Hava bizim yaşamamız üçün vacib komponentdir. İnsan 5 həftə qidasız, 5 sutka susuz, 5 dəqiqə havasız yaşaya bilər. Buna beşliklərin üçlüyü qanunu deyilir.

İnsanların təsərrüfat fəaliyyətləri nəticəsində hava mühiti müxtəlif maddələrlə çirklənmiş olur:(2)

- Müxtəlif qazlar, bunlar arasında karbon oksid daha çoxdur.
- Karbohidrat və turşu buxarları.
- Metallar, üzvi və qeyri-üzvi mənşəli müxtəlif tozlar. (1, 102)

Zəhərli maddələr, çirklənmiş hava insanların səhhətinə təsir edir ki, bu təsiri biz birdənbirə hiss etmirik. Buna misal olaraq karbon oksidi göstərmək olar. O, iysiz, rəngsiz və dadsız qaz olub yüksək dozalarda ağır nəticələrə gətirib çıxarır. Və ya civə buxarları bilavasitə tənəffüs edəndə hiss olunmasa da, mərkəzi sinir sisteminin və böyrəklərin işini pozur.

Avtomobil vasitələrinin havaya buraxdığı qurğuşun birləşmələri də insan sağlamlığına təsir edir, sinir pozğunluğuna, qanazlığına, yaddaşsızlıq və korluğa səbəb olur. Hava çirklənmələrinin ən ağır formalarından biri də turşulu yağışlardır. Kükürd birləşmələri atmosferdə toplanıb sulfat turşusu yaradır. Buna görə kimyəvi zavodlar, istilik stansiyalarının ətrafında olan rayonlara turşulu yağışlar yağır ki, nəticədə bitki örtüyü məhv olur, yeraltı və yerüstü sular çirklənir.

Mənzillərdə olan hava da insan sağlamlığı üçün az zərər törətmir. Tədqiqatçıların verdiyi məlumata görə mənzillərimizdə olan hava ümumi şəhər havasından 4-6 dəfə çirklidir, 8-10 dəfə toksikdir. Bəs bizim mənzillərimizi nə çirkləndirir?

Əlbəttə ki, qurğuşunlu boyalar, linoleum, sintetik liflərlə olan plastik xalçalar, yuyucu tozlar və s. Amma mənzillərimizdə olan çirkli havanın çox hissəsi müasir mebellərlə əlaqəlidir. Mebellərin ağac-yonğar lövhələrində çoxlu miqdarda yapışdırıcı vasitələrdən istifadə edilir. Bundan başqa polimerlər, boyalar, laklar da havanı toksiki kimyəvi maddələrlə çirkləndirir.

Otaq havasının çirklənməsi birbaşa səhhətimizə təsir etmir. Əvvəlcə özümüzü pis hiss edirik, sonra baş ağrıları, yuxusuzluq, əsəbilik, yorğunluq yaranır.(2)

Gündəlik həyatımızda havada olan toksik maddələrin zərərli təsirini necə zəiflədə bilərik? Bunun üçün bəzi qaydalara əməl etmək lazımdır. Hər şeydən öncə burnunuzla nəfəs almağı öyrənin. Burunun selikli qişasında çoxlu kirpikciklər olduğu üçün nəm şotka kimi zərərli tozların, mikrobların çox hissəsini özündə toplayır. Tez-tez burnunuzu təmizləyin. Avtomagistralların, zavodların yaxınlığında dərindən tənəffüs etməyin.

**Torpaqların çirklənməsi və qorunmasının şagirdlərə öyrədilməsi**

Təcrübələr göstərir ki, suvarma təsiri altında olan bütün ərazilərə – su hövzəsi, suvarma sistemi və ya tarlalar deqradasiyaya məruz qalır,

ona görə daim onların davamlılığına yönəldilən tədbirlərin aparılması nəzarət tələb edir.

Sudan effektsiz istifadənin bir çox səbəbləri var. Onlardan ən əsası sudan istifadə qiymətinin onun sosial qiymətindən çox aşağı olmasıdır. Bir çox ölkələrdə suvarma üçün istifadə olunan su pulsuzdur və ya suvarma sistemini saxlamaq üçün sərf olunan dəyərdən dəfələrlə azdır. Bunun nəticəsində su resursu qorunmur və dünyanın bir çox suvarma sistemində sudan hədsiz istifadə edilir.

Bitki üçün sudan tələb olunan qədər deyil, qeyri-mütənasib yüksək istifadə olunması əlverişsiz ekoloji problemlər yaradır, ərazini su basmasına və ya bataqlaşmaya səbəb olur. Bundan başqa, torpaqdan yuyulub aşağı qatlara aparılan duzlar qrunt suyunun tərkibindəki duzlarla birlikdə torpaq profili boyu qalxaraq əkinçilik üçün olduqca əlverişsiz proses sayılan – torpağın təkrar şorlaşmasına gətirib çıxarır.

Torpaq eroziyası təbii geomorfoloji proses olub yer relyefinin əmələ gəlməsində böyük rol oynayır. Təbii su eroziyası, adətən torpağın bütöv bitki örtüyü ilə mühafizə olunduğu landşaft zonalarında müşahidə olunur. Dünyada torpağın təbii su eroziyasının yayılması coğrafi zonallıq qanununa tabedir.(4)

Təbii külək eroziyası əsasən arid zonalarda (yarımsəhra və səhra) baş verir. Təbii eroziya prosesi zəif getdiyi üçün müşahidə olunmur, belə ərazilərdə torpaq əmələ gəlmə prosesi nəticəsində torpaq bərpa olunur. Eroziya prosesinin əmələ gəlməsinin və inkişafının əsas səbəbi kənd təsərrüfatı hesab olunur. İnsanın təsərrüfat fəaliyyətilə əlaqədar olaraq yamacların kənd təsərrüfatı bitkiləri altında istifadə olunması otlaq və örüşlərin intensiv otarılması, meşələrin məhv edilməsi torpağın yamac boyu şumlanması eroziya prosesinin güclənməsinə səbəb olur.

Eroziya prosesi dedikdə torpağın üst münbit qatının yağış və qar suları vasitəsilə yuyulub aparılması, həmçinin külək tərəfindən sovrulub dağılması başa düşülür. Deməli, torpaq eroziyasının əsas iki tipi ayrılır – su və külək eroziyası. Su eroziyası da, öz növbəsində, səthi və xətti eroziyasına bölünür. Torpaq eroziyası zamanı torpaqda azot, fosfor və kaliumun mənimsənilən formaları bir çox mikroelementlər (yod, mis, sink, kobalt, marqans, nikel, mo-libden) də azalır. Bununla da həm məhsuldarlıq, həm də kənd təsərrüfatı məhsulunun keyfiyyəti aşağı düşür. Eroziya zamanı yağmurların çox hissəsi yamaclardan axıb getdiyindən, həm də eroziyaya uğramış torpaqların fiziki xassələri pisləşdiyindən torpaq səthindən buxarlanmaya və transpirasiyaya çox su sərf olunur, bununla da torpaqda quraqlıq yaranır. Çox vaxt eroziya gedən rayonlarda baş verən quraqlığı "eroziya quraqlığı" adlandırırlar.

Torpağı çirkləndirən təkcə gübrələr deyil. İri zavodların ətrafında da torpaqlar çox çirklənir. Gəncə aliminium zavodunun ətrafında çoxlu çirklənmiş torpaq var. Zavodun borularından çıxan zəhərli maddələr yavaş-yavaş ətrafa çökür. Bu torpaqlarda heç nə bitmir. Bakının neft mədənlərində isə torpaqlar neftlə çirklənir. Son illər plastik qablardan çox istifadə olunması da torpaqların çirklənməsinə səbəb olur. Plastik tullantılar heç vaxt çürümür və daim torpaqda qalır.

Müşahidələr göstərir ki, ətraf mühiti çirkləndirən sənaye binalarının arasındakı məsafə normaya uyğun olmadıqda çirkləndirici maddələr binalararası boşluğa hopur və oradan yayılar. Ona görə də bu binalar layihələndirilərkən onlar arasındakı məsafə bina hündürlüyündən 8-10 dəfə çox götürülməlidir. Sənaye müəssisələrinin layihələndirilməsinə olan tələbata əsasən zərərli və iyli müəssisələrlə yaşayış binaları arasında sanitar-müdafiə zonaları dövlət standartlarına uyğun gəlməlidir. Bu zonaların ölçüləri istehsal müəssisələrinin gücündən, atmosferə atılan tullantıların xarakterindən asılıdır.(8)

**Problemin aktuallığı.** Yaradıcı müəllim müxtəlif təhsil metodlarından istifadə edərək şagirdlərdə ekoloji savadlılığı, təbiətə qarşı məsuliyyətli və mənəvi davranışı formalaşdıra və inkişaf etdirə bilər. Bu işdə müəllim və şagirdlərə kömək edə biləcək yeni elmi-metodik ədəbiyyatlar nəşr olunmalıdır. Yalnız coğrafiya və biologiya tədrisində verilən ekoloji biliklərlə kifayətlənməməli, şagirdlər məktəbdaxili, məktəbdənkənar ekoloji tədbirlərə cəlb edilməli, ekoloji problemlərin həllində iştirak etməli, yaşıllıqların salınması, bitki və heyvanların qorunub saxlanması, ümumiyyətlə təbiəti mühafizə və bərpa işlərinə cəlb olunmalıdırlar. Ekoloji tərbiyə işində Avropanın qabaqcıl metodlarının öyrənilməsi məqsədilə yaradıcı müəllimlərdən ibarət işçi qrupu yaradılıb, Avropada ixtisasartırma təlimlərinə cəlb edilməsi, həmin metodların orta məktəb təbiət elmlərinin tədrisində tətbiq edilməsi üçün ciddi tədbirlərin, xüsusilə ekoloji maarifləndirmənin həyata keçirilməsinin məqsədəuyğun olduğunu düşünürük.

**Problemin yeniliyi.** Müəllim şagirdlərin cavablarını ümumiləşdirərkən, səhvləri düzəldərkən

onları maraqlandıra biləcək elmi məlumatlardan istifadə edə bilər. Şagirdlərə noyabr ayında keçiriləcək BMT-nin İqlim Dəyişkənliyi üzrə COP-29 konfransının da məqsədi planetdə ekoloji sistemə, iqlimə insanlar tərəfindən edilən təhlükəli halların qarşısının alınmasıdır. Belə məlumatlara misal olaraq, ətraf təbiətin planetin sərvətlərindəki payını xarakterizə edən rəqəmləri, insanın təbiətlə genetik əlaqəsini təsdiq edən faktorları (qanın tərkibinin dəniz suyunun tərkibi ilə oxşarlığı, insanın heyvanlarla oxşarlığı, insanın təbii, urbanizə olunmuş və süni ekosistemlərə daxil olması və s.) göstərə bilərik.

**Problemin praktik əhəmiyyəti.** Tədqiqatda əks olunan məsələlər ölkədə ekoloji tarazlığı bərpa etmək üçün qəbul olunan dövlət proqramlarının və uğurlu ekoloji layihələrin hazırlanmasında istifadə oluna bilər.

**Ədəbiyyat:**


1. Babayeva, T.M. Sumqayıt sənaye zonası torpaqlarında ağır metalların toplanması və onların zəhərli təsirinin azaldılması üsulları / Doktorantların və gənc tədqiqatçıların XX respublika elmi konfransının materialları, -Bakı: - 2016, - s. 240-242.
2. Babayeva, T.M., Xəlilov, R.İ., Eldarova, H.E. Sumqayıt kimya müəssisələrinin ətraf mühitə təsiri// XXI əsrdə Ekologiya və torpaqşünaslıq elmlərinin aktual problemləri / III respublika elmi konfransının materialları. - Bakı: 7-8 may, -2014, -s.95-99.
3. Əhmədova, R.R., Aşurova, N.D., Babayeva, T.M. Sumqayıt sənaye zonasının ekoloji qiymətləndirilməsi / XXI əsrdə ekologiya və torpaqşünaslıq elmlərinin aktual problemləri. V respublika elmi konfransının materialları. -Bakı: - 2016, - s. 13-15.
4. Xəlilov, R.İ., Babayeva, T.M., Quliyeva, A.A., Ələsgərova, R.Ə. Sumqayıt Boru Prokat zavodunun şlak tullantısının ekosistemə təsirinin araşdırılması / Ekologiya və həyat fəaliyyətinin mühafizəsi üzrə ”Sənaye ili”nə həsr olunmuş VIII ənənəvi beynəlxalq elmi konfransının materialları. -Sumqayıt: - 2014,- s.262-263.
5. Qafarov P.M. Şagirdlərdə ekoloji təfəkkürün inkişafı / Pedaqoji Universitet xəbərləri, Bakı, .2009, № 3, s.72-75.
6. Məmmədov Q.Ş. Torpaqşünaslıq və torpaq coğrafiyasının əsasları. Bakı: Elm, 2007, 664 s.
7. Məmmədov Q.Ş., Məmmədova S.Z., Şabanov C.Ə. Torpağın eroziyası və mühafizəsi. . -Bakı: Elm, - 2009, -340 s.
8. Salmanov M.Ə. Təbiəti mühafizəyə aid bilik və bacarıqların formalaşdırılması // Kimya və biologiya tədrisi, 2009, № 4, -s.3-9.



**E-mail:** samayasalimova212@gmail.com



**Redaksiyaya daxil olub:** 27.11.2024

*UOT 371*

***AZƏRBAYCANIN TARİXİ MƏDƏNİYYƏT MƏRKƏZİ,***
***QARABAĞIN BAŞ TACI – ŞUŞA***
***ИСТОРИКО-КУЛЬТУРНЫЙ ЦЕНТР АЗЕРБАЙДЖАНА,***
***ГЛАВНАЯ КОРОНА КАРАБАХА – ШУША***
***THE HISTORICAL AND CULTURAL CENTER OF AZERBAIJAN,***
***THE CROWN JEWEL OF KARABAKH – SHUSHA***

***Sevda Hidayət qızı Axundova***
*Xəzər Universitetinin*
*fəlsəfə doktoru proqramı üzrə dissertantı*
*https://orcid.org/*0000-0001-9192-2307

# ŞUŞA TARİXİ ABİDƏLƏRİNİ VƏ ONUN İSLAM DÜNYASINDAKI ROLUNU ÖZÜNDƏ ƏKS ETDİRƏN TƏBLİĞAT MATERİALLARININ HAZIRLANMASI VƏ BEYNƏLXALQ SƏVİYYƏDƏ YAYIMLANMASI

***Севда Гидаят гызы Ахундова***
*диссертант по программе доктора философии*
*Университета Хазар*

# ПОДГОТОВКА И РАСПРОСТРАНЕНИЕ НА МЕЖДУНАРОДНОМ УРОВНЕ ПРОПАГАНДИСТСКИХ МАТЕРИАЛОВ, ОТРАЖАЮЩИХ ИСТОРИЧЕСКИЕ ПАМЯТНИКИ ШУШИ И ЕЕ РОЛЬ В ИСЛАМСКОМ МИРЕ

***Sevda Hidayat Akhundova***
*doctorial student in the program of doctor of philosophy*
*at Khazar University*

# PREPARATION AND DISTRIBUTION AT THE INTERNATIONAL LEVEL OF PROPAGANDA MATERIALS REFLECTING THE HISTORICAL MONUMENTS OF SHUSHA AND ITS ROLE IN THE ISLAMIC WORLD

**Xülasə.** Qafqazın sənət məbədi Şuşa bir çox üstün məziyyətləri, unikal xüsusiyyətləri ilə yanaşı, həm də tarixi abidələr məkanıdır. Bunu belə də dəyərləndirən Ümummilli Lider Heydər Əliyev qala-şəhərimizin Azərbaycan üçün müstəsna əhəmiyyətini vurğulayaraq demişdir: "Şuşasız Qarabağ, Qarabağsız isə Azərbaycan yoxdur". Məqalədə Şuşa tarixi abidələrini tədqiqinə nəzər salınır, İslam dünyasındakı rolunu özündə əks etdirən təbliğat materiallarının Azərbaycanın milli mədəni irsinin zənginləşdirilməsindəki rolundan bəhs edilir. Şuşa tarixi abidələrinin türk-islam mədəniyyətinin inkişafına təsirini əsaslandırarkən bu işdə müxtəlif nəşrlər, albomlar, məqalələr, kitablar araşdırılmışdır. Tədqiqatçı eyni zamanda Şuşa tarixi abidələrini öyrədilməsi imkanlarını da araşdırır, müxtəlif əsərlərdə istinad olaraq uyğun Şuşanın tarixi abidələrinin araşdırmışdır.

***Açar sözlər:*** *Qarabağ, Şuşa abidələri, elmi əsərlər, tədqiqat, İslam dünyası, təbliğat, təbliğat materialları*

**Аннотация.** Шуша – художественный храм Кавказа, обладающий многими выдающимися достоинствами и уникальными особенностями, а также место исторических памятников. Общенациональный лидер Гейдар Алиев, оценивший это, подчеркнул исключительную важность нашего города-крепости для Азербайджана и сказал: «Нет Карабаха без Шуши, и нет Азербайджана без Карабаха». В статье рассматривается изучение исторических памятников Шуши, обсуждается роль пропагандистских материалов, отражающих ее роль в исламском мире, в обогащении национального культурного наследия Азербайджана. В данном исследовании были рассмотрены различные публикации, альбомы, статьи и книги при обосновании влияния исторических памятников Шуши на развитие тюрко-исламской культуры. В то же время исследователь также изучает возможности

преподавания исторических памятников Шуши и исследует соответствующие исторические памятники Шуши в качестве ссылок в различных работах.
***Ключевые слова:*** *Карабах, памятники Шуши, научные труды, исследования, исламский мир, пропаганда, пропагандистские материалы*

**Abstract.** Shusha, the art temple of the Caucasus, has many outstanding merits and unique features, as well as a place of historical monuments. National Leader Heydar Aliyev, who appreciated this, emphasized the exceptional importance of our fortress-city for Azerbaijan and said: "There is no Karabakh without Shusha, and there is no Azerbaijan without Karabakh." The article examines the study of historical monuments of Shusha, the role of propaganda materials reflecting its role in the Islamic world in the enrichment of Azerbaijan's national cultural heritage is discussed. Various publications, albums, articles, and books were examined in this study while justifying the influence of Shusha historical monuments on the development of Turkish-Islamic culture. At the same time, the researcher also investigates the possibilities of teaching the historical monuments of Shusha, and researched the relevant historical monuments of Shusha as references in various works.
***Keywords:*** *Karabakh, monuments of Shusha, scientific works, research, Islamic world, propaganda, propaganda materials*

2020-ci il noyabrın 8-də Ali Baş Komandan cənab İlham Əliyevin rəhbərliyi ilə rəşadətli ordumuz tərəfindən tarixi, mədəni və strateji əhəmiyyətə malik, Qarabağın tacı olan Şuşa şəhərini işğalçılardan azad edilməsi Azərbaycanın Qarabağda başladığı və 44 gün ərzində aparılan Vətən müharibəsindəki uğurlu əks-hücum əməliyyatları sırasında ən mühüm tarixi hadisə və böyük hərbi qələbə oldu. Azərbaycanın hərbi-diplomatik uğurları, xüsusilə qədim Şuşa şəhərinin rəşadətli ordumuz tərəfindən işğaldan azad edilməsi müharibənin sonrakı gedişinə və taleyinə həlledici təsir göstərərək Zəfər günü kimi tariximizə yazıldı.

Azərbaycan Prezidenti, Müzəffər Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə rəşadətli Azərbaycan Ordusu 30 ildən artıq işğal altında olan torpaqlarımızı azad etmək üçün Vətən müharibəsinin 44 günü ərzində beynəlxalq hüquq prinsiplərini, xüsusilə BMT Nizamnaməsinin 51-ci maddəsini – öz ərazilərini azad etmək hüququnu əldə rəhbər tutub uğurlu və genişmiqyaslı əks-hücum əməliyyatları həyata keçirərək düşmənin bu illər ərzində yaratdığı "yenilməzlik" mifologiyasını dağıtmaqla yanaşı, yalan üzərində qurulmuş təbliğat maşınına ağır zərbə vurdu və bu da Ermənistanın təcavüzkar siyasətinin, eləcə də onun himayədarlarının ifşa olunması ilə nəticələndi. Dövlət başçısı İlham Əliyevin qətiyyətli və prinsipial mövqeyi hərb meydanında olduğu kimi, diplomatiya meydanında da uğurlarımızı şərtləndirdi.

**Əsas hissə.** Qeyd etmək lazımdır ki, sovet dövründə ümummilli lider Heydər Əliyev Azərbaycana rəhbərlik etdiyi zamanda (1969-1982) Qarabağa çox böyük diqqət və qayğı göstərmiş, eləcə də erməni iddiaları hər zaman iflasa uğramışdı. Heydər Əliyevin fəaliyyətinin mühüm əhəmiyyət daşıyan istiqamətlərindən biri məhz Qarabağda milli ruhun oyadılması olmuşdur. Ümummilli Lider Şuşaya zəngin tarixi abidə, Azərbaycan xalqının qəhrəmanlıq rəmzi kimi baxırdı. Ümummilli Lider 1970-ci illərdə Şuşa şəhərində Azərbaycan xalqının tarixi abidələrinin qorunmasına xüsusi qayğı göstərilməsi barədə xüsusi göstəriş vermişdi. Ulu Öndər, eyni zamanda, Şuşada aparılan tikinti-quruculuq işləri ilə də yaxından maraqlanmış, Azərbaycan poeziyasının klassikləri M.P. Vaqifin və Xurşidbanu Natəvanın yaşayıb-yaratdığı yerlərlə tanış olmuşdu.

Heydər Əliyevin bilavasitə təşəbbüsü və rəhbərliyi ilə Şuşa şəhərinin inkişaf etdirilməsi məqsədilə 1970-ci illərin ikinci yarısında bir neçə xüsusi qərar qəbul edildi. Həmin il qərarlara uyğun olaraq şəhərin keçmişdə tikilmiş binaları, tarixi abidələri bərpa edildi, yeni çoxmərtəbəli yaşayış binaları, böyük mehmanxana kompleksləri, ayrı-ayrı inzibati binalar tikildi. Bununla yanaşı, Şuşanın statusu qaldırılaraq ümumittifaq səviyyəli kurort şəhərinə çevrildi. Həmin qərarların yerinə yetirilməsinin böyük tarixi əhəmiyyəti var idi. Şəhərdə azərbaycanlılar üçün əlavə iş yerləri açılır, həyat səviyyəsi yaxşılaşır, azərbaycanlıların milli ruhu güclənirdi. Ölkənin müxtəlif yerlərindən Şuşaya istirahətə gələnlər, eyni zamanda, Azərbaycanın tarixi, mədəniyyəti və incəsənəti ilə yaxından tanış olurdular.

Şuşa ictimaiyyəti ilə keçirdiyi görüşdə Ümummilli Lider tövsiyə edərək demişdi: "Şuşa

abidələr şəhəridir. Diyarın zəngin tarixi ilə bağlı olan hər şeyi qorumaq, qədim tikintiləri bərpa etmək lazımdır”. Heydər Əliyevin bilavasitə səyləri nəticəsində, az sonra Şuşa şəhərini tarix-memarlıq qoruğu elan edən qərar qəbul olundu. Həmin illərdə ümummilli lider Heydər Əliyevin Şuşaya göstərdiyi diqqət və qayğı daha da artmış və geniş quruculuq işləri vüsət almışdı. Belə ki, görkəmli Azərbaycan şairi Molla Pənah Vaqifin məzarı üstündə 1980-1981-ci illərdə abidə, məqbərə tikilmiş və 1982-ci il yanvarın 14-də yağan güclü qarın altında Ümummilli Lider Şuşada şairin məqbərəsini böyük təntənə ilə açmışdı. (5)Onun M.P. Vaqifə bu münasibəti bir tərəfdən milli ədəbiyyata sevgisindən irəli gəlirdisə, digər tərəfdən diyarın tarixini, əhalisinin etnik mənsubiyyətini bir daha göstərməklə bağlı idi. Əslində, bu məqbərə, eyni zamanda, gözəl memarlıq abidəsi idi. Heydər Əliyev abidənin tikintisini böyük, əlamətdar hadisə hesab edirdi. Ümummilli Liderin M.P. Vaqifin məqbərəsinin açılışında söylədiyi nitq onun Qarabağa qayğısının göstəricisi idi. Bununla yanaşı, səfər zamanı Heydər Əliyev Şuşada Poeziya evini açaraq, Vaqif poeziya günlərində iştirak etdi.(2)

Bununla yanaşı, ümummilli lider Üzeyir bəy Hacıbəylinin və Bülbülün Şuşadakı ev-muzeylərindəki eksponatlarla tanış olmuş və onların qorunmasına dair tövsiyələrini vermişdi. Bu tarixi səfər zamanı Şuşadakı abidələrin bərpa işləri ilə maraqlanan Heydər Əliyev müvafiq göstərişlər verərək işlərin davam etdirilməsinə dair bir sıra təkliflərini də söyləmişdi. Ümummilli Liderin, eyni zamanda, Şuşa məscidinə getməsi bir tərəfdən, onun dini dəyərlərə olan ehtiramının və dərin bağlılığının göstəricisi idisə, digər tərəfdən azərbaycanlı əhalinin milli və dini dəyərlərə sahib çıxmalarının vacibliyinə olan nümunə idi. Ulu Öndər erməni millətçilərinin ona müxtəlif böhtanlar atdığı bir zamanda məscidə getməklə yerli əhaliyə dini inanclarını qorumağı da tövsiyə etmişdi.1982-ci il iyulun 29-dan avqustun 2-dək Qarabağa bir il içərisində ikinci dəfə səfər edən Heydər Əliyevin bilavasitə iştirakı ilə Şuşada şairə Xurşidbanu Natəvanın abidəsinin açılışı oldu. Bununla yanaşı, Ulu Öndər Üzeyir bəy Hacıbəylinin və Bülbülün Şuşadakı ev-muzeylərindəki eksponatlarla tanış olmuş və onların qorunmasına dair tövsiyələrini də vermişdi. Qeyd etmək lazımdır ki, bir ildə iki dəfə Şuşaya gedərkən ailəsi ilə birlikdə yanında elm, mədəniyyət və incəsənət adamlarının böyük bir qrupunu da aparmışdı. Bu addımı ilə Ümummilli Lider ziyalıları Dağlıq Qarabağa xüsusi diqqət yetirməyə istiqamətləndirir, Şuşaya tez-tez səfərə gəlmələrini tövsiyə edirdi.

Tarixi sənədlər göstərir ki, “Üç muşketyor” və “Qraf Monte Kristo” kimi klassik əsərlərin müəllifi olan məşhur yazıçı Aleksandr Düma 1858-ci ilin ortalarından 1859-cu ilin əvvəllərinə kimi Rusiya və Qafqazda olmuşdur. Qafqaza səfəri zamanı müəyyən müddət Azərbaycan ərazisinə səyahət etmiş, 1859-cu ilin aprel ayında isə Dümanın 3 clddən ibarət Qafqaz səyahətinin təəssüratları əsəri (fransızca: “İmpressions de Voyage: Le Caucase”) Parisdə çap olunmuşdur. Bakı məhəllələrinin birinin polismeysteri Piquliyevskinin evində qonaq olan Aleksandr Düma orada Qarabağ xanının qızı, məşhur şairə Xurşidbanu Natəvan və onun həyat yoldaşı knyaz Xasay Usmiyevlə tanış olur, onlar arasında səmimi dostluq münasibətləri yaranır. Fransız yazıçısı Düma Azərbaycan şairəsi Natəvanla şahmat oynayır. Oyunun nəticəsi isə çox yadda qalan olur. Belə ki, Natəvan Dümanı mat edir. Natəvan Dümaya qalib gələrkən o, Dümadan yaşca xeyli kiçik idi. Natəvanın cəmi 26, Dümanın isə 56 yaşı vardı. Qeyd etmək lazımdır ki, Heydər Əliyev Fondunun dəstəyi ilə 2016-cı il fevralın 18-də Belçika Krallığının Vaterlo şəhərində görkəmli Azərbaycan şairəsi Xurşidbanu Natəvanın abidəsinin açılışı olmuş və abidənin özülündə Xurşidbanu Natəvanın Qarabağ şahzadəsi olması barədə məlumat vardır.(6)

**Şuşa mağara düşərgəsi – qədim yaşayış məskəni kimi.** Azərbaycanın Qarabağ ərazisində aparılan kompleks arxeoloji tədqiqatlar nəticəsində uzaq keçmişimizə aid zəngin maddi mədəniyyət nümunələri aşkar olunmuşdur. Dünya əhəmiyyətli arxeoloji abidə olan Azıx mağara düşərgəsi Xocavənd rayonunun Azıx kəndində, Tuğ çökəkliyində, Quruçayın sol sahilində dəniz səviyyəsindən 900 metr, çayın müasir yatağından 100-120 metr yüksəklikdə yerləşir. 1968-ci ilin iyun ayında Azərbaycanın arxeoloq alimi M.M. Hüseynovun rəhbərliyi altında Paleolit arxeoloji ekspedisiyası Azıx mağara düşərgəsinin V təbəqəsinin III layında daş məmulatı və heyvan sümükləri ilə bərabər qədim insana məxsus 350-400 min il yaşı olan alt çənə sümüyü aşkar etdi.

Bu baxımdan, davamlı aparılan elmi tədqiqatlar zamanı Azərbaycanın Qarabağ ərazisində ən qədim ibtidai insanların uzun müddət məskən salıb, bu ərazidə formalaşması elmi əsaslarla sübuta yetirilmişdir. Tarixə nəzər salsaq, görərik ki, qədim Şuşa şəhəri də zəngin və şanlı tarixi keçmişə malikdir. Şuşa ətrafındakı qədim yaşayış yerləri, o cümlədən məşhur Cıdır düzündəki Şuşa mağarası (Üçmıx dağında) bu ərazinin Azərbaycanda ən qədim insan düşərgələrindən biri olduğunu sübut edir. Şuşa ərazisində qədim insanların 200-250 min il bundan əvvəl yaşamağa başlamaları və bu diyarın qədim sivilizasiya mərkəzlərindən biri olması elmi əsaslarla sübuta yetirilmişdir.

1971-1975-ci illərdə Azərbaycanın arxeoloq alimi M.M. Hüseynovun rəhbərliyi altında Mil-Qarabağ arxeoloji ekspedisiyası Qarabağın dağlıq hissəsində paleolit düşərgələrini aşkar etmək məqsədilə arxeoloji tədqiqat işləri aparmışdır. Aparılan arxeoloji qazıntılar nəticəsində Şuşa şəhəri yaxınlığında, Cıdır düzünün aşağı hissəsində paleolit mədəniyyətinə aid qədim insan düşərgəsi aşkar olunmuşdur. Paleolit mədəniyyətinə aid daş məmulatı içərisində 4 ədəd kobud çapma aləti, 5 ədəd qaşov tipli alət, 2 ədəd mustye və levallua itiucluları və 6 ədəd qəlpə tapılmışdır. Düşərgənin daş məmulatı içərisində 7 ədəd istehsal tullantısı da qeydə alınmışdır. Bu isə düşərgənin qədim sakinlərinin əmək alətlərini mağarada hazırladıqlarını göstərir. (2)

Düşərgə Şuşa şəhərinin ərazisində olduğu üçün ona Şuşa mağarası adı verilmişdir. Mağara Daşaltı çayının sol sahilində, dəniz səviyyəsindən 1500 metr yüksəklikdə, çayın müasir yatağından isə 80 metr hündürlükdə yerləşir. Düşərgənin eni 20, uzunluğu 100, hündürlüyü isə 7 metrə bərabərdir. Şuşa mağarasında aparılan tədqiqatlar zamanı çöküntülərdə 5 təbəqə müəyyən olunmuşdur. Deməli, qədim Şuşa ərazisində olan mağara düşərgəsində ibtidai insanlar 200-250 min il bundan əvvəl məskunlaşmağa başlamışlar. Düşərgədə aparılan arxeoloji qazıntılar zamanı daş məmulatı ilə yanaşı, ovlanmış heyvan sümükləri də tapılmışdır. Bu da düşərgədə yaşayan qədim insanların ovçuluqla məşğul olmalarını göstərir. Maraqlıdır ki, Şuşa mağarasının qabağında və ətraf ərazilərdə antik dövrə aid qala divarlarının qalıqları aşkar olunmuşdur. Bəzi yazılı tarixi mənbələrdə də Şuşa şəhəri ərazisində qədim insanların yaşamasına dair məlumatlar vardır.

İngilis səyyah və alimləri C. Morye və R. Burter Şuşanın qədimliyi ilə bağlı dəyərli fikirlər söyləmişlər. C. Moryenin fikrincə, Şuşa hələ eradan əvvəl insan məskəni olmuşdur. Tarixi mənbələrdə Şuşanın hətta XIII əsrdə də Azərbaycanın məşhur şəhərlərindən biri olması haqqında faktlar vardır.(3)

Azərbaycan Prezidenti, Ali Baş Komandan İlham Əliyevin prinsipial mövqeyi, səsləndirdiyi tutarlı dəlillər və əsaslı fikirlər döyüş –meydanında Azərbaycan Ordusunun əldə etdiyi qələbələr diplomatiya meydanında da uğurlara çevrildi və ölkəmizin İkinci Qarabağ müharibəsindəki hərbi-diplomatik Qələbəsini şərtləndirdi. Heç şübhəsiz ki, bütün bunlar Azərbaycanın böyük hərbi-diplomatik uğuru və beynəlxalq birliyin Azərbaycana olan inamının, etimadının təzahürü, ölkəmizin, xüsusilə dövlət başçısının qlobal miqyasda olan nüfuzunun göstəricisidir.

Azərbaycan Prezidenti İlham Əliyev hər zaman bəyan edib ki, Azərbaycanın mövqeyində hər hansı bir dəyişiklik yoxdur, ola da bilməz, çünki biz həm tarixi ədalətə, eyni zamanda, beynəlxalq hüquqa əsaslanırıq. “Azərbaycanın ərazi bütövlüyü istənilən digər ölkənin ərazi bütövlüyü kimi eyni dəyərə malikdir” fikrini bütün dünyaya bəyan edən Prezident İlham Əliyev dəfələrlə bildirib ki, heç vaxt Azərbaycan torpağında ikinci erməni dövlətinin yaranmasına icazə verilməyəcək, işğal edilmiş bütün torpaqlar işğalçılardan azad olunmalı, Azərbaycan vətəndaşları öz doğma yurdlarına qayıtmalıdırlar.

Azərbaycanın milli və dövlətçilik maraqlarını daim üstün tutan Prezident, Ali Baş Komandan İlham Əliyev 2020-ci il noyabrın 8-də Şuşa şəhərinin azad olunması münasibətilə xalqa müraciətində deyib: “İyirmi səkkiz il yarım işğal altında olan Şuşa azad edildi! Şuşa indi azaddır! Biz Şuşaya qayıtmışıq! Biz bu tarixi Qələbəni döyüş meydanında qazandıq. 2020-ci il noyabrın 8-i Azərbaycan tarixində əbədi qalacaqdır. Bu tarix əbədi yaşayacaq. Bu, bizim şanlı Qələbəmizin, Zəfərimizin günüdür!”

Azərbaycan Prezidentinin dekabrın 3-də imzaladığı Sərəncama əsasən noyabrın 8-i bayram günləri sırasına daxil edildi və hər il ölkəmizdə Zəfər Günü kimi təntənəli şəkildə qeyd ediləcək. Azərbaycan Respublikasında Zəfər Gününün təsis edilməsi haqqında Prezidentin Sərəncamında vurğulanır ki, Azərbaycanın hərbi sahədə qazandığı qələbələr, xüsusilə Şuşanın

düşmən əsarətindən qurtarılması müharibənin taleyində həlledici rol oynadı, Ermənistanın öz məğlubiyyətini etiraf etməsi və kapitulyasiyası ilə nəticələndi, Ermənistanı Kəlbəcər, Ağdam və Laçın rayonlarını Azərbaycana qaytarmağa məcbur etdi. Azərbaycan xalqının əzmi və iradəsi, iqtisadi gücü, müasir ordu quruculuğu və xalq-iqtidar birliyi ölkəmizin qələbəsini təmin edən mühüm amillər oldu. Ulu əcdadlarımızın zəngin dövlətçilik və hərb tarixindən ilhamlanan Azərbaycan xalqı daha bir şanlı qəhrəmanlıq salnaməsi yazaraq özünün qalib xalq olduğunu bütün dünyaya sübut etdi və düşmən üzərində tarixi zəfər çaldı.

2021-ci il yanvarın 14-də Şuşaya səfər edən Azərbaycan Prezidenti İlham Əliyev son dəfə 39 il bundan əvvəl ümummilli lider Heydər Əliyevin şəhərə tarixi və unudulmaz səfəri zamanı gəldiyini diqqətə çatdıraraq bildirdi ki, qəhrəman Azərbaycan Ordusu mükəmməl hərbi əməliyyat keçirərək cəsarət, rəşadət, qəhrəmanlıq, güc, milli ruh nümayiş etdirərək Şuşanı işğalçılardan azad etmişlər və uzun fasilədən sonra noyabrın 8-də Şuşada Azərbaycan bayrağı qaldırılmışdır: "Biz buraya qalib kimi gəlmişik, bayrağı da qaldırmışıq, azad edilmiş bütün torpaqlarda Azərbaycan bayrağı dalğalanır. Döyüşə-döyüşə gəlmişik. Heç kim bu torpaqları bizə elə-belə verməyib. Heç bir danışıqlar heç bir əhəmiyyətə malik deyildi. Biz gördük ki, ancaq öz gücümüzlə öz torpaqlarımızı azad etməliyik və bunu etdik".

Şuşaya səfəri zamanı Azərbaycan Prezidenti İlham Əliyev bildirib ki, Şuşa işğaldan azad olunandan sonra şəhərin, bütün tarixi binaların bərpa edilməsi prosesinə start verilib. Ermənistanın Azərbaycan torpaqlarını, o cümlədən Şuşanı işğal etməsi nəticəsində tarixi, mədəni abidələrimiz dağıdılıb, ev muzeyləri qarət edilib. Onların arasında Xurşidbanu Natəvanın, Üzeyir Hacıbəylinin, Bülbülün Şuşadakı büstləri də var. Güllələnmiş bu büstlər erməni vandalizminin şahidləridir. Prezident İlham Əliyev qeyd etmişdi ki, ərazi bütövlüyümüz bərpa edildikdən sonra Bülbülün, Natəvanın, Üzeyir Hacıbəylinin büstləri yenə də Şuşada qoyulacaq. Azərbaycan Prezidentinin bu sözləri artıq reallığa çevrilib. Həmin dahi şəxsiyyətlərin büstləri Şuşada yenidən əvvəlki yerlərinə qoyuldu.

Azərbaycan Prezidenti İlham Əliyev qeyd edib ki, ermənilərin bütün cəhdlərinə baxmayaraq, onlar Şuşanı dünyaya erməni şəhəri kimi təqdim edə bilməmiş, 28 il ərzində buna çalışmış lakin nail ola bilməmişlər. Ancaq Şuşa ermənilər tərəfindən dağıdılsa da, əyilmədi, əsirlikdə olsa da, öz ləyaqətini itirmədi, erməniləşdirmə cəhdlərinə məruz qalsa da, Azərbaycan ruhunu qoruyub saxlaya bildi.

**Şuşanın əsl tarixi siması, ənənələri və qədim mədəni abidələri bərpa edilir.** Prezident cənab İlham Əliyev bildirib ki, Şuşanın Azərbaycan tarixində xüsusi yeri var və Şuşanın bərpası, dirçəlməsi hamımızın işidir: "Əlbəttə ki, bütün işlər planlı şəkildə aparılmalıdır, Şuşanın tarixi siması saxlanılmalıdır, Şuşaya yad olan hər hansı bir tikiliyə yol verməк olmaz". Dövlət başçısı bildirmişdir ki, mütəxəssislər, memarlar, tarixçilər, şuşalılar özləri deyəcəklər ki, bu şəhəri necə görmək istəyirlər, çünki bu, onların şəhəridir. Şuşanın əsl tarixi simasının və qədim mədəni abidələrinin bərpası Azərbaycan memarlıq üslubunu əks etdirməli, çox zəngin mədəni həyat olmalı və Şuşada yaşayacaq soydaşlarımız da, bütün işlər görüləndən sonra oraya qayıtmalıdırlar: "Biz hamımız istəyirik ki, dağıdılmış şəhərlər tezliklə bərpa edilsin, amma, eyni zamanda, elə olsun ki, bu, oraya qayıdacaq insanların rahatlığını təmin etsin və müasir, güclü Azərbaycanın gücünü bütün dünyaya göstərsin".

2021-ci il martın 16-da işğaldan azad ediləndən sonra Şuşaya ikinci dəfə səfər edən Prezident İlham Əliyev M.P. Vaqifin məqbərəsinin bərpa işləri ilə tanış oldu. Bərpa işlərini Azərbaycanın Birinci vitse-prezidenti Mehriban xanım Əliyevanın rəhbərlik etdiyi Heydər Əliyev Fondu öz vəsaiti hesabına icra edir. 1992-ci ildə ermənilər Şuşanı işğal edərkən bu abidəni də vəhşicəsinə dağıdıblar. Bu baxımdan, layihənin icrası zamanı məqbərənin əvvəlki vəziyyətinin bərpasına xüsusi diqqət yetiriləcəkdir. Bununla yanaşı, Şuşada Molla Pənah Vaqifin büstünün bərpası layihəsi də Heydər Əliyev Fondu tərəfindən icra olunacadır. Səfər zamanı Prezident İlham Əliyev diqqətə çatdırdı ki, artıq bərpa, quruculuq işlərinə başlanmış, infrastruktur layihələrinə start verilmişdir.

Azərbaycan Prezidenti bəyan edib ki, Şuşa Azərbaycan dövlətinin mədəniyyət paytaxtı kimi dünyanın ən gözəl şəhərlərindən birinə çevriləcəkdir: "Əslində, həmişə belə olub. Sadəcə

olaraq, mənfur düşmən bütün tarixi abidələrimizi dağıdıb. Amma biz bərpa edəcəyik. Onların əsl simasını qaytaracağıq. Azərbaycan xalqı Şuşada bundan sonra əbədi yaşayacaqdır".

**Problemin aktuallığı.** Artıq dördüncü ildir ki, azad edilmiş Qarabağ və Şərqi Zəngəzurda nəhəng təmir-bərpa-quruculuq işləri həyata keçirilir, keçmiş məcburi köçkünlər doğma yurdlarına qayıdırlar. Bu prosesin bir qolu da əzəmətli keçmişimizin izlərini, nişanələrini yaşadan maddi-mədəni irs nümunələrinin, tarixi abidələrimizin bərpasıdır. Çünki ermənilər 30 illik işğal dövründə təkcə dinc əhaliyə qarşı soyqırımı törətməmişlər, həm də əsrarəngiz təbiətə – flora və faunaya divan tutmuş, məscidləri, mədəniyyət abidələrini, müqəddəs ziyarətgahları, tanınmış şəxsiyyətlərin ev-muzeylərini barbarcasına çapıbtalamışlar. Bir yandan söküb-dağıdıblar, digər tərəfdən, "humanist" cildinə girərək "bərpa"sı üçün beynəlxalq fondlara müraciət ediblər. Məhz "Şuşanın bərpası"ndan ötrü Ermənistan hakimiyyəti 2000-ci ildə İrəvan şəhərində "Shousi" mədəniyyət fondu və "Şuşi" nəşriyyat evi yaratmışdı. Həmin fond Şuşanın "dünya ermənilərinin dini və mədəniyyət mərkəzi" kimi inkişaf etdirilməsi layihəsini irəli sürmüşdü. Şuşada tarixi abidələrlə bağlı aparılan monitorinqin mədəni dəyərlər üzrə tədqiqatçı-eksperti, Azərbaycan Memarlar İttifaqı İdarə Heyətinin üzvü Faiq İsmayılov deyir ki, ermənilər bu "layihə" çərçivəsində 350 hektarlıq qoruq zonasındakı 300 tarixi və mədəniyyət abidəsini, 550 qədim yaşayış binasını sökərək şəhərin landşaftına ciddi zərər vurmuşlar. Çünki məqsədləri "Shousi" mədəniyyət fondunun xətti ilə şəhərdəki tarixi binaları və abidələri erməniləşdirmək idi. Ermənistanın Arxitektura və İnşaat Universitetinin tələbələri Şuşada 220 binanın memarlıq quruluşunun sxemlərini çəkmiş və divarlarının ölçülərini götürüb "bərpa" üçün hazırlamışlar. Hayastanın nazirlər kabinetində isə konsepsiya bəyənilərək icrasına hər il 30 milyon dram vəsait ayrılırdı.

**Problemin yeniliyi.** Şuşa şəhərinin Azərbaycan üçün müstəsna əhəmiyyət kəsb etdiyini bildirən Azərbaycan Prezident cənab İlham Əliyev qeyd etmişdir ki, yarıdağılmış tarixi abidələrimizin bərpasında çox həssas olmalı, ancaq biz o tarixi abidələrimizin əsl simasını bərpa etməliyik. Vaxt itirmədən, ancaq, eyni zamanda, tələsmədən Şuşanın ilkin simasının, tarixi simasının bərpa edilməli olduğunu bildirən Azərbaycan Prezidenti Şuşa şəhərini Azərbaycan mədəniyyətinin paytaxtı elan edərək demişdir: "Şuşa şəhəri buna layiqdir. Hesab edirəm ki, nəinki Azərbaycanın, bölgənin mədəni paytaxtı sayıla bilər. Şuşanın mədəni həyatı zəngin olmalıdır". Bununla yanaşı dövlət başçısı vaxtilə Vaqif poeziya günlərinin ənənəvi olaraq keçirildiyini vurğulayaraq diqqətə çatdırmışdır ki, Şuşada Vaqif poeziya günləri bərpa edilməlidir, "Xarı bülbül" festivalı bərpa olunmalıdır.

**Problemin praktik əhəmiyyəti.** Bir vaxtlar "Qafqazın sənət məbədi", "Azərbaycan musiqisinin beşiyi" və "Şərqin konservatoriyası" adlandırılan, Azərbaycanın ictimai-siyasi həyatında mühüm xidmətləri olan bir sıra görkəmli xadimlərin vətəni, eləcə də tarixi mədəniyyət mərkəzi və Qarabağın baş tacı olan Şuşa şəhəri artıq işğaldan azad edilmişdir. Bu baxımdan, strateji əhəmiyyətli Şuşanın Azərbaycan tarixində xüsusi yerinin olduğunu vurğulayan Azərbaycan Prezidenti bildirib: "Bu, bizim qədim, tarixi şəhərimizdir. Əsrlər boyu azərbaycanlılar Şuşada yaşayıb, qurub, yaradıb. Şuşa nəinki Azərbaycanın, bütün Qafqazın incisidir. Ancaq mənfur düşmən Şuşanı işğal altında saxlamaqla bizim mədəni irsimizə böyük zərbə vurdu, bizim tarixi abidələrimizi dağıtdı, bizim məscidlərimizi dağıtdı, təhqir etdi. Biz indi Şuşaya qayıtmışıq. Bütün tarixi abidələrimizi bərpa edəcəyik...O cümlədən Şuşada yerləşən məscidlərimiz əsaslı şəkildə təmir edilməlidir, bərpa olunmalıdır, onların öz siması qaytarılmalıdır".

**Ədəbiyyat:**


1. Adıgözəlbəy, M. Qarabağnamələr. Birinci kitab. / M. Adıgözəlbəy, M.C. Cavanşir Qarabaği, Ə. Cavanşir. – Bakı: Şərq-Qərb, 2006. -216 s
2. Çingizoğlu, Ə. Şuşa şəhəri: Təbrizli məhəlləsi: tarixi-geneoloji tədqiqat. / Ə. Çingizoğlu. -Bakı: Zərdabi LTD MMS, 2012. -324 s.
3. Əhmədov, E. ŞUŞA – Azərbaycanın tarixi mədəniyyət mərkəzi, Qarabağın baş tacı və hərbi-strateji əhəmiyyətə malik qədim şəhər https://azerbaijan.az/news/515
4. Qacar, Ç.U. Köhnə Şuşa / Çingiz Qacar. Şərq-Qərb, 2023. -344 s.
5. Quliyev, V. 180 yaşlı Şuşa məktəbi. / V. Quliyev. -Bakı: Şuşa, 2010. -200 s.
6. Mahmudov, Y.M. Qarabağ: Real tarix faktlar və sənədlər / Y.M. Mahmudov, K.K. Şükürov. -Bakı: Təhsil, -2005. -380 s.
7. Mahmudov, Y.M. Şuşa – Pənahabad / Y.M. Mahmudov, C.M. Mustafayev. -Bakı: Təhsil, -2012. -152 s.
8. Məmmədov, N.R. Azərbaycan Respublikasının Şuşa şəhərinin tarixi / N. Məmmədov. -Bakı: Avropa, -2016. -960 s.
9. Muradova, Z.B. Şuşa, hər daşı-qayası tarix / Z.B. Muradova. -Bakı: Orxan NHM, -2022. -416 s.

**E-mail:** axundova.sevda@adpk.edu.az
**Redaksiyaya daxil olub:** 22.10.2024.

***ÜMUMPEDAQOJİ PPROBLEMLƏR***
***ОБЩЕПЕДАГОГИЧЕСКИЕ ПРОБЛЕМЫ***
***GENERAL PEDAGOGICAL PROBLEMS***

*UOT 37.0*

***Müseyib İbrahim oğlu İlyasov***

*Azərbaycan Dövlət Pedaqoji Universitetinin kafedra müdiri,*
*pedaqogika elmləri doktoru, professor,*
*Əməkdar müəllim*
*https://orcid.org/0000-0002-9379-1643*
*https://doi.org/10.69682/arti.2024.91(6).41-47*

# İNNOVASİYALI TƏHSİL MÜHİTİ MƏKTƏBDƏ TƏLİM MÜVƏFFƏQİYYƏTİNİN YÜKSƏLDİLMƏSİ AMİLİ KİMİ

***Мусеиб Ибрагим оглу Ильясов***
*заведующий кафедрой Азербайджанского Государственного Педагогического Университета,*
*доктор педагогических наук, профессор,*
*Заслуженный учитель*

# ИННОВАЦИОННАЯ ОБРАЗОВАТЕЛЬНАЯ СРЕДА В ШКОЛЕ КАК ФАКТОР ПОВЫШЕНИЯ УСПЕШНОСТИ ОБУЧЕНИЯ

***Museyib Ibrahim Ilyasov***
*head of departament at*
*Azerbaijan State Pedagogical University,*
*doctor of pedagogical sciences, professor,*
*Honored teacher*

# INNOVATIVE LEARNING ENVIRONMENT AT SCHOOL AS A FACTOR IN INCREASING LEARNING SUCCESS

**Xülasə.** Məktəbdə təlim müvəffəqiyyətinin yüksək olması pedaqoji prosesin məhsuldarlığını xarakterizə edən ən başlıca amildir. Təlim müvəffəqiyyətinin yüksək olması isə bir sıra amillərlə şərtlənir ki, bunların da içərisində ən mühüm olanı təhsil ocağında innovasiyalı mühitin olmasıdır.

İnnovasiyalı təhsil mühiti birdən-birə formalaşmır. Bunun üçün ilk növbədə şablon streotiplərdən uzaqlaşaraq pedaqoji prosesə yaradıcı yanaşmaq, onu yaradıcı təşkil etməkdən ibarətdir. Bu baxımdan innovativ təhsil mühitin formalaşdırılmasına müəyyən sistem kimi yanaşılmalıdır: ilk növbədə müəllim hazırlığının məzmununda innovasiyaların tətbiqi; təhsil ocaqlarında çalışan müəllimlərin ixtisas və peşə hazırlığının yüksəldilməsi; məktəbin müasir təhsil resursları ilə təmin edilməsi; məktəbin əsl yaradıcılıq emalatxanası kimi fəaliyyətinin gücləndirilməsi; idarəetmə və rəhbərlik proseslərinin müasir dünya standartlarına yaxınlaşdırılması və s. amilləri bu sistemin əsas komponentləri hesab etmək olar.
***Açar sözlər:*** *mühit; innovasiya; müəllim hazırlığı; səriştəlilik; yaradıcılıq*

**Аннотация.** Высокая успеваемость в школе является важнейшим фактором, характеризующим продуктивность педагогического процесса. Высокий уровень успешности обучения определяется рядом факторов, важнейшим из которых является наличие инновационной среды в образовательном учреждении.

Инновационная образовательная среда не возникает в одночасье. Для того, прежде всего, он заключается в творческом подходе к педагогическому процессу и творческой его организации, отходе от шаблонных стереотипов. С этой точки зрения формирование инновационной образовательной среды следует рассматривать как определенную систему: прежде всего, внедрение инноваций в содержании подготовки учителей; совершенствование профессионализма педагогов, работающих в образовательных учреждениях; обеспечение школы современными образовательными ресурсами; усиление деятельности школы как настоящей творческой мастерской; приближение процессов управление школой и руководства к современным мировым стандартам и т.д. Эти и другие факторы можно считать основными компонентами этой системы.
**Ключевые слова:** *среда; инновации; подготовка учителей; компетентность; креативность.*

**Abstract.** High learning success in school is the most important factor characterizing the productivity of the pedagogical process. A high level of training success is determined by a number of an innovative environment in the educational institution. The formation of professional competence is determined by a number of factors, including the presence of an innovative environvent in the educational institutiton, the formation of such an environment.

An innovative learning environment does not happen overnight. For this, first of all, it consists in creative approach the pedagogical process and creatively organizing it, moving away from template stereotypes. Form this point of view, the formation of an innovative educational environment should be viewed as a certain system: first of all, the introduction of innovations in the content of teacher training; inprovement of professional and training of teachers working in educational institutions; providing the school with modern educational resources; strengthening the activity of the school as a real creative workshop; bringing management and leadership processes closer to modern world standards, etc. factors can be considered the main components of this system.
***Key concepts:*** *environment; innovation teacher; training; competence; creativity.*

İnkişafa təsir göstərən mühüm amillərdən biri də mühitdir: həm təbii, həm də və sosial mühit. İstər həyat olsun, istərsə də onun bir parçası olan məktəb, fərqi yoxdur, mühit münbitdirsə, əlverişlidirsə deməli orada böyüməyə, inkişafa imkan da çoxdur. Təhsil mühiti də belədir. Əgər bu mühit özünün məzmunu, yeniliyə can atma xüsusiyyətləri, fəal fəaliyyət və innovativ meyl ilə "qaynardırsa" deməli orada nəticənin yüksək olması ehtimalı da yüksəkdir. Başlıca məsələ mövcud imkanları reallaşdırmaq, ondan səmərəli istifadə etməkdən ibarətdir.

Hazırkı təhsilimizin başlıca hədəfləri gənc nəsli gələcəyin artan tələbləri qarşısında rəqabətəqabil, hər cür maneələri aşmağa qabil, hərtərəfli hazırlıqlı *vətəndaş-şəxsiyyət* kimi hazırlamaq olduğundan bu prosesdə yenilik, innovasiya ən zəruri amil kimi təhsilimizin məzmununda özünə mühüm yer tutmalıdır.

Müasir Azərbaycan təhsil məkanında təhsilin məzmununa yanaşmada iki istiqamət özünü göstərir: ənənəvi yanaşma və innovasiyalı yanaşma. Ənənəvi təhsil bilikyönlülüyü, şagirdlərin yenə də geniş və əhatəli bilik alması, elmi məlumatlara yiyələnməsi ilə, eyni zamanda "müəllim-şagird" münasibətlərində "subyekt- obyekt" cütlüyü ilə xarakterizə olunur. İnnovasiyalı təlim daha çox yaradıcı xarakteri, "subyekt-subyekt" münasibətləri, dərslərdə şagirdlərin təfəkkür və təxəyyülünün inkişaf etdirilməsi, kollektiv iş, sərbəst düşüncəyə yer verilməsi, müstəqilliyin olması, seçim imkanlarından istifadə və s. ilə diqqəti cəlb edir. Lakin heç də belə bir anlama gəlinməməlidir ki, ənənəvi yanaşma Başdan-başa səhvdir və bunun müsbət tərəfləri yoxdur, yaxud, innovasiyalı təhsil sistemi təhsilalanların biliyə yiyələnməsini inkar edir və bunu önəmli hesab etmir. Bilik sərvətdir, dəyərdir və hər zaman da öz dəyərini saxlayacaqdır. Bunu inkar etmək ən azı savadsızlıq olardı. ***İnnovasiyalı təhsil biliyə yiyələnməni inkar etmək deyil, alınan biliklərin sadəcə əzbərlədilməsini, mexaniki olaraq "yaddaşa yazılması"nı inkar edir və məhz bu biliklərin dərk edilməsini, nəyin necə, nə üçün, niyə belə olmasını dərk etməklə qəbul edilməsini irəli sürür.*** Yəni, alınan biliklərin dərk edilərək mənimsənilməsini, təhsilalanların təfəkkür və təxəyyüllərinin inkişaf etdirilməsi, idrakının formalaşdırılması istiqamətində reallaşdırılmasını təşviq edir. Diqqətəlayiq haldır ki, hazırda təhsil ocaqlarımızda ikinci istiqamət daha çox üstünlük təşkil etməkdədir. Burada mövcud proqram və dərsliklərin bu yönümdə

olması ikinci istiqamətin getdikcə daha da genişlənməsinə mühüm təsir göstərir. Lakin ən önəmli məsələlərdən biri və başlıcası yenilikçi müəllimlərin olması, təhsilimizin inkişafı istiqamətində innovativ işlərin aparılması və müəllimlərimizin özlərinin innovasiyaya, yeniliyə maraq göstərmələridir.

***"İnnovasiya"*** terminini ilk dəfə olaraq 1911-ci ildə amerikalı iqtisadçı İ.Şumpeter inkişaf dəyişikliklərinin *"yeni birləşmələri"* məzmununda iqtisadi termin kimi işlətmişdir. Bir neçə il sonra, 1930-cu illərdə İ. Şumpeter və Q. Menş bu termini elmi dövriyyəyə buraxmışlar. Əvvəlcə iqtisadi termin kimi işlənən bu ifadə sonralar bir çox elmlərə nüfuz etmiş və inkişafa səbəb olan yenilik kimi bir çox elmlər tərəfindən işlədilməyə başlanmışdır.

Müasir dövrümüzdə *"İnnovasiya"* terminindən ən çox istifadə edilən sahələrdən biri təhsil sahəsidir. Bu da səbəbsiz deyildir. Təhsil yeniliklərlə inkişaf edir, təkmilləşir, daha mütərəqqi, daha mühüm nəticələrə səbəb olur. Yenilik olmadan təhsil dövrün artan tələbləri qarşısında davam gətirə bilmədiyi kimi, elmin, mədəniyyətin də inkişafına öz töhfəsini verə bilməz.

Hazırda təhsil sahəsində tətbiq olunan yeniliklər, yeni-yeni fikirlər və əməli fəaliyyət növləri yüzlərlədir. Onlardan biri də pedaqoji prosesdə ***innovativ təhsil mühitinin*** yaradılmasıdır.

Müasir dünyada, o cümlədən bizim respublikamızda da təhsilin təkmilləşdirilməsi istiqamətində xeyli işlər aparılır, qabaqcıl dünya təcrübəsi öyrənilir, təhsilin məzmunu və xarakterində yenilklər edillir. Eyni zamanda nəzəri sahədə də irəliləyişlər özünü göstərir.

Cəmiyyətin müasir inkişaf istiqamətləri təhsilin məzmun və xarakterinin təkmilləşdirilməsinin innovasiyalı yolla inkişaf etdirilməsi tələbini qarşıya qoyur ki, bu da bir tərəfdən təhsildə fasiləsizliyin təmin edilməsi, təhsil müəssisələrinin maddi-texniki bazasının möhkəmləndirilməsi, digər tərəfdən *müəllim hazırlığının* müasir tələblər səviyyəsinə qaldırılmasını və təhsil müəssisələrində *innovasiyalı mühitin* formalaşdırılmasını tələb edir.

Hazırda ölkəmizdə innovasiyalı təhsil mühitinə keçid özünü müxtəlif formalarda göstərir: təhsilin məzmununun təkmilləşdirilməsi; proqram və dərsliklərin yeniləşdirilməsi; müasir təlim metodlarına üstünlük verilməsi; təlimdə yeni texnologiyaların tətbiqi; təhsilalanların seçim və müstəqilliyi üçün şəraitin yaradılması; müəllim-şagird əməkdaşlığında yeni müstəviyə keçid və s. Lakin, bütün bunlar o zaman yüksək nəticəyə gətirib çıxarır ki, təhsilverənlər məhz bu fəaliyyətə maraqlı olsun və belə bir şəraitdə işləməyə hazır olsunlar.

Pedaqoji innovasiyalar həmişə yüksək müvəffəqiyyət əldə etmək üçün tətbiq olunur və nəticə etibarilə müvəffəqiyyət qazanmağa hesablanır. Lakin bu proses heç də həmişə uğurlu alınmır. Çünki bu həm çətin, həm də müəyyən vaxt tələb edən prosesdir. Buna görə də onun təkcə tətbiqinə deyil, həm də müvəffəqiyyətlə nəticələnməsinə çalışmaq lazımdır. Əks hal, yəni innovasiyanın tətbiqində olan uğursuzluq nəinki pedaqoji prosesə müsbət divident gətirir, hətta ona mənfi təsir göstərir. Buna görə də hər bir innovasiyanın tətbiqinə ehtiyatla yanaşılmalı, *etibarlılıq, obyektivlik* və onun uğurlu olacağına *əminlik* olduqdan sonra onu tətbiq etmək lazımdır.

İnnovativ təlim mühiti təkcə təhsilin keyfiyyətinin yüksəldilməsinə xidmət etmir, o eyni zamanda şagirdlərin intellektual inkişafına müsbət təsir göstərir, şagirdlərin intellektini inkişaf etdirir, onlarda özünürüallaşdırma, özünütəhsil və özünütərbiyə bacarıqlarının da inkişafına güclü təsir edir. Lakin bunlar o zaman daha səmərəli olur ki, bu mühitin yaradılmasına yaradıcı yanaşma olsun.

İnnovasiyaların mərkəzində *yaradıcılıq* durur. Bu, pedaqoji yaradıcılıq kimi sınaqdan keçirilmiş və əsaslandırılmış metodika tələb edir. Buna görə də tətbiq edilmə növündən və formasından asılı olmayaraq pedaqoji prosesə yaradıcılıqla yanaşmaq bu prosesin həyata keçirilməsi üçün lazım olan bütün parametrlərin əvvəlcədən götür-qoy edilməsini, nəticələrin real olacağına şübhələrin olmadığına inamın olmasını zəruri edir. Bütün bunlar isə müəllimdən böyük hazırlıq, səriştəlilik və yaradıcı təfəkkürün olmasını tələb edir. Lakin təəssüf ki, təcrübədə belə bir fakt da özünü göstərir ki, məktəbdə yenilikçi, innovasiyalı bir mühit olsa da, təşəbbüskar müəllimlər, innovasiyalara maraq göstərən müəllimlər heç də çox deyildir. Bir çox müəllimlər öz fəaliyyətlərini şagirdlərə yalnız proqram materialını mənimsətməklə məhdudlaşdırır və verilmiş təlimatlardan, metodik göstərişlərdən kənara çıxa bilmir və yaxud buna heç təşəbbüs də göstərmirlər. Bu da onu deməyə əsas verir ki,

məktəbdə yenilikçi, innovasiyalı və yaradıcı mühitin formalaşmasına ilk olaraq *müəllim hazırlığından və müəllimlərdən* başlamaq lazımdır.

Müasir cəmiyyət elə bir inkişaf səviyyəsinə gəlib çatmışdır ki, gələcək müəllimlərdə təkcə ixtisas biliklərinə yiyələnmək deyil, elə səriştələrin formalaşdırılması lazım gəlir ki, onlar məktəblərdə müəllim kimi fəaliyyətə başlayarkən şagirdləri təkcə təbiət, cəmiyyət və təfəkkürə aid biliklərə yiyələndirməklə öz işlərini yerinə yetirmiş hesab etməsinlər. Onlar özləri daim axtarışda, yenilikləri öyrənib tətbiq etmək etməkdə maraqlı olduqları kimi, şagirdləri də yeniliklər axtarmağa, təşəbbüskar olmağa, yaradıcı düşünməyə, verilənlərlə kifayətlənməməyə, cəmiyyətin yararlı bir üzvü, əsl vətəndaş-şəxsiyyət kimi formalaşmağa sövq edə bilsinlər.

Bu gün respublikamızda kifayət qədər müəllim kadrları vardır və demək olar ki, başqa sahələr üzrə hazırlanan mütəxəssislərlə nisbətdə müəllim kadrlarının hazırlanması daha çox üstünlük təşkil edir. Hətta elə ixtisas sahələri vardır ki, orada müəllimlərin sayı həddən artıq çoxdur, bəlkə də beş il, on il bu sahədə kadr hazırlığı olmasa da məktəblərimizdə elə bir boşluq hiss olunmaz. Lakin əsas məsələ ondan ibarətdir ki, ***hazırda məktəblərimizdə yaxşı müəllimlərə, öz işinin ustası olan peşəkar və səriştəli pedaqoji kadrlara,*** sözün həqiqi mənasında ***"ürəyini uşaqlara verə bilən" müəllimlərə böyük ehtiyac vardır.***

Müasir məktəblərimizdə (ali məktəblər də daxil olmaqla) müəllimlərin müxtəlif tiplərinə rast gəlinir. Bunları: ustad müəllim; peşəkar müəllim; usta müəllim; fasilitataor müəllim; novator müəllim; inovasiyalı müəllim; tədqiqatçı müəllim; təlimçi müəllim; müəllim; səriştəli müəllim və s. kimi qruplaşdırmaq olar.

Bunların hər birini ayrı-ayrılıqda xarakterizə etmək, onların nə üçün belə adlandırılmasını təbii ki, izah etmək, mənalandırmaq da mümkündür. Lakin əsas məqsəd ondan ibarətdir ki, təhsil ocaqlarımızda müasir dövrün tələblərinə cavab verə bilən, gələcək cəmiyyətimizin taleyi üçün narahat olan, öz işini, peşəsini, ixtisasını və uşaqlarla işləməyi sevən, öz üzərində daim işləyərək peşəkarlığını və səriştəliliyini artırmağa çalışan, sözün əsl mənasında ***"müəllim olan müəllimlərin"*** sayı daha çox olsun, məktəblərimiz belə müəllimlərlə təmin edilmiş olsun. Məktəblərdə *innovasiyalı təhsil mühitinin olması* belə müəllimlərin formalaşmasında az rol oynamır. Fikrimizcə məktəblərdə innovasiyalı mühit olarsa, müəllimlərin inkişafı üçün belə bir mühit yaradılarsa o zaman müəllimlərin bu prosesdə fəal iştirakına da münbit şərait, əlverişli zəmin yaranar və müəllimlərin öz üzərlərində işləmələri, inkişaf etmələri üçün də stimullar, motivlər formalaşmış olar.

İnnnovasiyalı təlim mühiti anlayışı müxtəlif xarici ölkə tədqiqatçıları tərəfindən müxtəlif cür izah edilir. İ.M. Ulanovskaya onu belə xarakterizə edir: – *özünün fəaliyyətində məktəb özü konkret vəzifələr müəyyənləşdirir və konkret qərarlar qəbul edir;*

*– bu vəzifələrin həllinə kömək edən vasitələr (məktəb tədris proqramları, dərsdə təşkilati işlər, müəllimlərin şagirdlərlə qarşılıqlı əlaqə növləri, qiymətləndirmənin keyfiyyəti, uşaqlar arasında qeyri-formal münasibətlər tərzi, dərsdənkənar məktəb həyatının təşkili, məktəbin maddi-texniki təchizatı, siniflərin və koridorların tərtibatı və s.) seçilir;*

*- uşaqların inkişafında müvəffəqiyyətə aparan şəxsi (özünüqiymətləndirmə, özünəhörmət, narahatlıq, üstünlük təşkil edən motivasiya), intellektual və sosial (ünsiyyətdə səriştəlilik, sinifdəki statusu, konflikt zamanı davranışı) keyfiyyətlər mənalı şəkildə qiymətləndirilir* (4, s. 6).

Hazırda pedaqoji tədqiqatlarda innovativ təlim mühitinin yaradılmasına münasibətdə *iki meylin* olduğu müşahidə edilməkdədir. Bunlardan *biri* məktəbin müasir texniki avadanlıqlarla, kompüterlərlə, ağıllı lövhələrlə, müasir təlim laboratoriyaları ilə təchiz olunması ilə bağlıdır. *İkincisi* isə müəllimlərin özlərinin pedaqoji prosesdə yeni, daha müasir təlim texnologiyalarından istifadə etməsi, fəaliyyətlərində yenilikləri tətbiq edə bilməsi, sinifdə öyrədici, inkişafetdirici, əlverişli bir təlim mühitinin yarada bilmələri ilə əlaqələndirirlər. Lakin unutmamalıyıq ki, müasir texniki avadanlıqlarla da, pedaqoji texnologiyalarla da işləyən müəllimdir, necə deyərlər onları "hərəkətə gətirən" məhz müəllimdir. Müəllim özü ***innnovativ müəllim*** olmalıdır. Əgər bu varsa, hər hansı bir innovasiyaya cəhd, onun həyata keçirilməsi üzrə aparılan içlər gec-tez öz faydasını göstərəcəkdir. Əgər müəllim özü bu prosesə maraqlı deyilsə onda nə yaxşı təchiz

edilmiş sinif otağı, nə də müasir pedaqoji texnologiyalar gözlənilən nəticəni verə bilməyəcəkdir. Görkəmli pedaqoq K.D. Uşinskinin dediyi kimi*: “Tədris və tərbiyəyə aid təlimatlar nə qədər müfəssəl və dəqiq olsalar da, onlar müəllimin əqidəsindəki (o cümlədən öyrənmə və öyrətmə marağındakı – M.İ.) kəsri heç bir vaxt əvəz edə bilməzlər.... Tərbiyəçinin şəxsiyyətinin cavan ruha olan təsiri elə bir tərbiyə qüvvəsidir ki, onu nə dərs kitabları ilə, nə əxlaqi nəsihətlərlə, nə də cəza və mükafat sistemi ilə əvəz etmək olar. Əlbəttə, müəssisənin ruhunun da böyük əhəmiyyəti vardır; lakin bu ruh kağızlar üzərində yaşamır, əksinə, müəllimlərin əksəriyyətinin səciyyəsində yaşayır və oradan da tərbiyə edilənlərin səciyyəsinə keçir”* (2, s. 39).

Müəllim innovasiyaya və innovativ fəaliyyətə hazır olmalı, innovasiyaları tətbiq etməyi bacarmalıdır. Bu baxımdan müəllimin pedaqoji səriştələri arasında *innovativ səriştənin* olmasını da xüsusi qeyd etmək lazımdır. Bu həm də müəllimin özünün inkişafının ən mühüm göstəricilərindən biri, inkişaf etməsi istiqamətində fəaliyyətdə olmasıdır ki, bunlarsız inkişaf mümkün deyildir.

Məktəbdə innovasiyalı mühitin olması məktəb rəhbərliyinin, məktəbin kollegial idarəetmə orqanlarının təşəbbüsü, konkret addımları, qərarları, həmçinin onların həyata keçirilməsinə nəzarət və rəhbərlik mühüm yer tutur. Məktəbdə innovasiyalı mühitin olması müəllimlərin bu prosesdə fəal iştiraklarına, bu prosesdən kənarda qalmamalarına bilavasitə öz təsirini göstərməklə müəllimlərin bu istiqamətdə fəaliyyətlərinə əlverişli təsir göstərir. Yəni belə bir mühitin olması müəllim təşəbbüskarlığının inkişafına da, müəllimlərin öz üzərlərində işləmələrinə də öz təsirini göstərir və müəllimlər bu prosesə qoşulurlar. Lakin bu, yalnız rəhbərliyin göstərişi, məktəbin özünün bu sahədə sanki *“pedaqoji laboratoriya”* olması ilə bağlı olan yeganə yol deyildir. Bu prosesdə *müəllimlərin özlərinin yenilikçi olmaq meyli, yaxşı müəllim olmaq motivləri, yaradıcı müəllim kimi inkişaf etmək arzusu* mühüm əhəmiyyət kəsb edir. Əgər bunlar yoxdursa məktəbdə innovativ mühit nə qədər yüksək səviyyədə olursa olsun, bu vasitələrin təsiri bir o qədər də güclü olmayacaqdır.

Aydın məsələdir ki, məktəbdə innovasiyalı mühitin olması və ya yaradılması birbaşa məktəbdə təlimin keyfiyyətinin və səmərəsinin yüksəldilməsi ilə bağlı olan bir məsələdir. Yəni başlıca məqsəd bunların tətbiqi ilə təlimin keyfiyyətinin yüksəldilməsindən ibarətdir. Belə olduğu halda innovasiyalı təlim prosesinə bir qədər dar çərçivədə yanaşmaq və onu təkcə yeni təlim metodlarının və formalarının tətbiqi ilə məhdudlaşdırmaq doğru olmazdı. Bu baxımdan innovasiyalı təlim mühiti dedikdə onun dərslə, bilavasitə təlim prosesi ilə bağlı olan aşağıdakı *aspektlərinin* nəzərə alınmasını zəruri hesab etmək olar:

1) sinifdə şagirdlərin fərdi-psixoloji xüsusiyyətlərindən, qabiliyyət və bacarıqlarından asılı olmayaraq hər biri üçün əlverişli təlim mühitinin olması;

2) şagirdlərin işgüzar təlim fəaliyyətinə cəlb edilməsi, hər bir şagirdin maraq və tələbatlarının nəzərə alınması;

3) sinifdə emosional yaradıcı iqlimin olmasına diqqətin yönəldilməsi, şagirdlərin hər birinin dərsdə özlərini rahat hiss etmələri;

4) hər bir şagirdin fərdi inkişafı üçün şəraitin yaradılması;

5) sinifdə müəllim-şagird, şagird-şagird əməkdaşlığının gücləndirilməsi və s.

Məktəbdə innovasiyalı mühitin olması kollektiv əməyə əsaslanan prosesdir. Burada məktəbin müəllimlərinin vahid məqsəd uğrunda birgə fəaliyyəti üstünlük təşkil edir. Bu baxımdan məktəbdə belə bir mühitin yaradılmasında bütün məktəb kollektivinin maraqlı olması da mühüm əhəmiyyət kəsb edir.

İnnovasiyalı təhsil mühiti özünün bir sıra funksiyaları ilə diqqəti cəlb edir. Başqa sözlə, bu mühitin qarşısında bir sıra funksiyalar vardır ki, bunların reallaşdırılması olduqca vacibdir. Bunların əsasən aşağıdakılardan ibarət olduğunu söyləmək olar:

1. Təşkilati funksiya.
2. İnkişaf funksiyası.
3. Fasiləsizlik funksiyası.
4. İnteqrativlik funksiyası.
5. Stimullaşdırıcı funksiya.
6. Əməkdaşlıq funksiyası.
7. Maneələri dəf etmək funksiyası və s.

Qaçılmaz olan belə faktlar da özünü göstərir ki, bəzən yeniliklər tətbiq edilir, lakin heç bir müsbət nəticəsi ilə diqqəti cəlb etmir. İllərlə tətbiq edilsə də heç bir səmərə vermir. Məsələn,

çox da uzaqda olmayan yaxın bir keçmişdə respublikamızın məktəblərində tətbiq olunan şagirdlərin biliklərinin qiymətləndirilməsində 9 ballıq sistemin tətbiq olunması kimi. On ilə yaxın "eksperiment" kimi bir sıra məktəblərdə tətbiq olunsa da, nəticə etibarı ilə 5 ballıq sistemdən uzağa getmədi və yekunda heç bir yeniliklə yadda qalmadı. Hətta müəllimlərin işlərini bir qədər çətinləşdirdi də...

Məktəbdə innovasiyalı təhsil mühiti öz özünə yaranan bir proses deyildir. Burada müxtəlif amillər, onların təsir mexanizminin olması vacibdir. Bu, bilavasitə innovasiyalı, yaradıcı təhsil fəaliyyəti ilə əlaqədardır. Bunun üçün həm maddi-iqtisadi, həm də mənəvi-psixoloji şərtlərin və şəraitin olması, inkişafetdirici forma və vasitələri özündə birləşdirən bir sistemin olması vacibdir. Belə olmazsa nə inkişafetdirici mühit, nə də belə bir fəaliyyət mövcud ola bilməyəcəkdir. Məsələyə bu tələblərdən yanaşdıqda innovativ təlim mühitinin yaradılmasında aşağıdakı bir sira şərtlərin gözlənilməsini məqbul hesab etmək olar: 1) yaradılan mühitin şagirdlər üçün cəlbedici olması; 2) pedaqoji prosesdə şagirdlərin müstəqil fəaliyyətinə daha çox vaxt və diqqətin ayrılması; 3) dərsdə inklüzivliyin təmin edilməsi və hər bir şagird üçün bərabər təhsil imkanının yaradılması; 4) innovasiyalara imkan verən və şərait yaradan müasir resurslarla təminatın olması və s.

Məktəb təcrübəsində belə faktların olması da özünü göstərir ki, bəzən bir və ya bir neçə müəllim innovasiyaya maraq göstərməkdə, dərslərində, ümumiyyətlə pedaqoji fəaliyyətində yeniliklər etmək istədikdə müəyyən maneələrlə rastlaşmalı olurlar. Bunun daha çox mühafizəkar müəllimlər tərəfindən edildiyi özünü göstərir. Yaddan çıxarmaq olmaz ki, bütün yeniliklər belədir: həmişə maneələrlə qarşılanır. Tətbiq olunub müsbət nəticə verdikdən sonra ona qarşı çıxanlar susmağa məcbur olurlar. Buna görə də əsas məsələ həmin ideyanın, innovasiyanın müvəffəqiyyətinə inanıb onu tətbiq etməklə bağlıdır. Görkəmli alman mütəfəkkiri İ.V. Höte belə əhəmiyyətli ideyaya ətrafdakı insanların münasibətlərini ifadə edərək yazmışdır: *"Əvvəlcə deyirlər: "Bu cəfəngiyatdır", sonra deyirlər: "Burada nə isə var", sonra həmin ideya tətbiq olunub müəyyən müsbət nəticə verdikdə isə: "Axı bunu kim bilmirdi ki?"* – deyirlər.

Sinifdə innovasiyalı təhsil mühitinin yaradılması təhsilin fasiləsizliyi ilə sıx bağlı olan prosesdir. İnnovasiyaların özlərinin də tətbiqi fasiləsizliyə əsaslanır. Bir-iki müvəffəqiyyətlə, yaxud da uğursuzluqla başlanılmış işi dayandırmaq doğru hesab edilə bilməz. Buna görə də həqiqiliyinə əminlik olan innovasiyaların tətbiqi də fasiləsizliyin olması olduqca əlverişlidir. Bunu da əmr və göstərişlərlə deyil, qarşıya qoyulan hədəfə inamla, işgüzarlıqla, yeniliklərə açıq olmaqla nail olmaq mümkündür.

İnnovasiyalı təhsil mütinin yaradılması təhsilalanların şəxsiyyətinin formalaşmasına təsir göstərməklə yanaşı, müəllimlərin peşə fəaliyyətinə, onların səriştə və peşəkarlığının yüksəldilməsinə də təsirsiz qalmır. Belə bir mühitdə fəaliyyət müəllimlərə dövrün tələbləri ilə ayaqlaşmağa yeni impuls və stimullar verir, onları öz üzərlərində işləməyə, səriştə və bacarıqlarını təkmilləşdirməyə təhrik edir.

Məktəbdə innovasiyalı təhsil mühiti məktəbin təhsilalanlar üçün sevimli məkana, onları özünə cəlb edən doğma ocağa, onların məcburiyyətlə deyil, sevinə-sevinə gəldiyi yerə çevrilməsində də mühüm yer tutur. Bu baxımdan məktəbdə innovasiyalı təhsil mühiti özünün çoxsahəli təsir sferasına malik olduğunu göstərir.

İnnovasiya müəyyən fərqli, daha yüksək nəticənin alınmasına səbəb olmalıdır. Belə olmazsa, yəni tətbiq edilən yenilik nəticəsində faydalı nəyəsə nail olunmayıbsa onu innovasiya adlandırmaq olmaz. Buna görə də hər bir innovasiya özünün təkcə forma və tətbiqi yolları, yanaşma tərzi ilə deyil, yüksək nəticəsi ilə faydalı olmalı, pedaqoji prosesə fayda gətirməlidir.

İstər bilavasitə, istərsə də dolayısı yolla, hər iki halda innovasiyalı təlim mühiti şagidlərin təlim keyfiyyətinin yüksəldilməsinə öz təsirini göstərdiyi kimi, müəllimlərin də peşə səriştəsinin artmasına təsirsiz qalmır. Müəllimlər bu prosesdə öz üzərlərində işləməklə, yenilikləri tətbiq etməklə özləri də inkişaf edir, təkmilləşirlər. Buna görə də pedaqoji prosesdə innovasiyaların tətbiqi çoxtərəfli proses olaraq həm şagirdlərə, həm də müəllimlərin özlərinə təsir etmiş olur.

Müasir dövrdə təhsildə cəmiyyətin artan tələblərinə müvafiq olaraq innovasiyalar və yeniliklər fasiləsiz olaraq həyata keçirilir. Bunlara rəğmən müəllimlərin artan tələblər qarşısında özlərini inkişaf etdirmələri artıq zəruri amilə çevrilmişdir. Hələ bütün fənlər və ixtisaslar üzrə

deyil, bu il yalnız bir neçə ixtisas üzrə keçirilən MİQ imtahanlarından dörd minə yaxın müəllimin ikinci dəfə imtahanların keçə bilməmələri bu amilə daha da ciddi, hərtərəfli yanaşılmasını bir nömrəli vəzifə kimi təhsilimizin və müəllimlərin qarşısında qoyur.

**Problemin aktuallığı.** Təhsil mühitinin əlverişli olması məsələsi həmişə aktual mövzu olmuş və müasir şəraitdə daha da aktuallıq kəsb edir. Bu mühitin formalaşdırılmasında peşəkar, səriştəli və yaradıcı müəllimlərin olması, tədrisdə innovasiyaların tətbiqi problemin aktuallığını daha da artırır. Bu baxımdan tədqiq edilən mövzu, onun işlənmə səviyyəsi, problemin həlli istiqamətində araşdırılan məsələlər günümüzün tələbləri ilə səsləşir.

**Problemin yeniliyi.** Problem yenidir, ona yanaşma tərzi də yeniliyi ilə diqqəti cəlb edir. Təhsil mühitinin yüksək səviyyədə təşkili, yeniliklərin tətbiqi və onların təlim müvəffəqiyyətinin yüksəldilməsi istiqamətinə yönəldilərək bir sistem kimi reallaşdırılması, bu prosesdə yenilikçi müəllimlərin müstəsna rolunun əsaslandırılması məsələləri yeniliyi ilə seçilir.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə şərh olunan məsələlər, xüsusən təhsil mühiti, onun rolu, yaradılması yolları, bu mühitdə innovasiyaların tətbiqi, müəllimlərin bu sahədə işi, innovasiyaların tətbiqinin təlim müvəffəqiyyətini təmin edən ən mühüm amillərdən biri kimi əsaslandırılması, bunlara dair irəli sürülən fikirlər və metodika təkcə nəzəri pedaqogika üçün deyil, praktik müəllimlər üçün də faydalıdır. Məktəbdə yüksək səviyyəli müəllimlər olarsa və belə bir mühit yaradılarsa müvəffəqiyyətin olacağı şəksizdir.

**Ədəbiyyat:**


1. İlyasov M.İ. Müasir təhsil: ənənədən innovasiyaya. -Bakı: Elm və təhsil, -2021. - 376 s.
2. Uşinski K.D. Seçilmiş pedaqoji əsərləri. -Bakı: Azərnəşr, -1953. - 314 s.
3. Печеркина, А. А. Развитие профессиональной компетентности педагога: теория и практика [Текст]: монография / А. А. Печеркина, Э. Э. Сыманюк, Е. Л. Умникова: Урал. гос. пед. ун-т. – Екатеринбург: [б.и.], 2011. – 233 с.
4. Улановская И.М. Что такое образовательная среда школы? / И.М. Улановская // Нач. шк.: плюс-минус. – 2002, № 1. – s. 3- 6.
5. Хуторской А.В. Педагогическая инноватика: учеб. пособие для студ. высш. учеб. заведений. – М.: Издательский центр «Академия», 2008. – 256 с.



**E-mail:** museyibilyas@gmail.com



**Redaksiyaya daxil olub:** 18.10.2024.

*UOT 37.0*

***Firədun Nadir oğlu İbrahimov,***
*Azərbaycan Dövlət Dillər Universitetinin Şəki filialının professoru,*
*pedaqoji elmlər doktoru*
*https: //orcid org/0000-0002-0775-1048*
*https://doi.org/10.69682/arti.2024.91(6).48-57*

***Sevinc İlqar qızı Kərimova***
*Azərbaycan Dövlət Dillər Universitetinin*
*Şəki filialının baş müəllimi*
*https: //orcid org/0009-0004-3317-4215*

# TƏHSİLALANMƏRKƏZLİ TƏLİM SİSTEMİNİN FƏLSƏFİ-METODOLOJİ ƏSASLARI

***Фирадун Надир оглы Ибрагимов,***
*доктор педагогических наук, профессор*
*Шекинского филиала Азербайджанского Государственого Педагогического Университета*

***Севиндж Ильгар гызы Керимова***
*старший преподаватель Шекинского филиала*
*Азербайджанского Государственого Педагогического Университета*

# ФИЛОСОФСКО-МЕТОДОЛОГИЧЕСКИЕ ОСНОВЫ ОБРАЗОВАТЕЛЬНО-ЦЕНТРИРОВАННОЙ СИСТЕМЫ ОБУЧЕНИЯ

***Firadun Nadir Ibrahimov,***
*professor at Sheki branch of Azerbaijan State Pedagogical University, doctor of pedagogical sciences*

***Sevinj Ilgar Karimova***
*teacher at Sheki branch of Azerbaijan State Pedagogical University*

# PHILOSOPHICAL-METHODOLOGICAL FOUNDATIONS OF LEARNER-CENTERED TRAINING SYSTEM

**Xülasə**. Məqalədə müxtəlif elmi mənbələrdə "təlim" anlayışı ilə bağlı şərhlərdə fikir müxtəlifliyinə diqqət yönəldilir. Vurğulanır ki, mükəmməl təlim sisteminin nəzəri və praktik əsaslarının işlənilməsi didaktikanın mərkəzi problemidir, daha səmərəli nəticələri hədəfləyən didaktik sistemlərin axtarışı zəruri və davamlı prosesdir. İddia olunur ki, təhsilin həyata keçirilməsinin mühüm yollarından biri olaraq dərk edilən "mükəmməl təlim prosesi"nin *təhsialanmərkəzli* (bu, onun emercent əlaməti kimi qəbul olunur!) və *təhsilalanlarda IV sənaye inqilabının çağrışlarına uyğun bacarıqların formalaşmasını şərtləndirən* sistem kimi interpretasiya edilməlidir. Vurğulanır ki, təlim prosesinin idarə olunması üçün elmin və praktikanın nailiyyətləri ilə ayaqlaşan elmi fəlsəfənin nəzəri-metodoloji əhəmiyyəti olduqca böyükdür və bu prosesdə şagirdlərin idrak fəaliyyətinin idarə olunması, əqli qabiliyyətlərinin inkişafı yalnız o şərtlə mümkündür ki, təfəkkür prosesinin qanunauyğunluqları, elmi idrakın forma və metodlarının xüsusiyyətləri və dialektik əlaqələri daim nəzərə alınsın.

Bu işdə təlim prosesinin idarə olunmasına öz-özlüyündə idrak məsələsi kimi baxmağın məntiqiliyi diqqətə çatdırılır. Təlim prosesində səmərəli nəticələrin reallaşması üçün praktik pedaqoqun idarəetmə fəaliyyətinin müəyyənləşdirilməsində gerçəkliyin dərk olunması və dəyişdirilməsi metodları haqqında dialektika və idrak nəzəriyyəsinin tərkibləri kimi ehtiva edilən komponentlərə istinad etməsinin məqsədəuyğunluğu diqqət mərkəzinə çəkilir və bu "imkandaşıyıcı komponentlər"i özündə saxlayan fikrin hərəkət forması həmin prosesin idarə olunmasının metodoloji əsası kimi dəyərləndirilir.

***Açar sözlər:*** *təlim; dialektika; idrak nəzəriyyəsi; elmi tədqiqat metodları; elmi idrak formaları; problem; idrak məsələsi; əqli fəaliyyətin növləri; dərrakəli və zəkalı fəaliyyət; hissi intuisiya; intellektual intiusiya; ideya; prinsip; nəzəriyyə.*

**Аннотация.** В статье акцентируется внимание на разнообразии мнений в трактовках понятия «обучение» в различных научных источниках. Подчеркивается, что разработка теоретических и практических основ совершенной системы образования является центральной проблемой дидактики, поиск дидактических систем, нацеленных на более эффективные результаты, также считается необходимым и непрерывным процессом. Утверждается, что «совершенный процесс обучения», который воспринимается как один из важных способов реализации образования, следует трактовать как образовательно-центрированную (она рассматривается как его эмерджентный признак!) систему, обусловливающую формирование умений и навыков обучаемых в соответствии с последствиями IV промышленной революции. Подчеркивается, что теоретико-методологическое значение научной философии, идущей в ногу с достижениями науки и практики, для управления образовательным процессом очень велико, и в этом процессе управление познавательной деятельностью обучаемых и развитие их умственных способностей возможно лишь при условии, что всегда будут учитываться закономерности мыслительного процесса, особенности форм и методов научного познания и диалектических отношений.

В данной работе обращается внимание на логику рассмотрения управления процессом обучения как самой познавательной проблемы. В целях достижения эффективных результатов в процессе обучения в центр внимания выдвигается целесообразность обращения педагога-практика к содержащимся в диалектико-когнитивной теории компонентам о способах понимания и изменения действительности при определении управленческой деятельности. В качестве основы ценится форма движения мысли, содержащая эти «обеспечивающие компоненты».

***Ключевые слова:*** *обучение; диалектика; когнитивная теория; методы научных исследований; формы научного познания; проблема; когнитивная задача; виды умственной деятельности; проницательная и разумная деятельность; чувственная интуиция; интеллектуальная интуиция; идея; принцип; теория.*

**Abstract.** The article focuses on the diversity of opinions in the interpretations of the concept of "training" in various scientific sources. It is emphasized that working out the theoretical and practical foundations of an excellent educational system is the central problem of didactics. The search for didactic systems aiming at more effective results is a necessary and continuous process. It is claimed that the "perfect training process", which is perceived as one of the important ways of implementing education, should be interpreted as an learner-centered (it is considered as its emergent sign!) system that conditions the formation of skills in the students in accordance with the implications of the IV industrial revolution. It is emphasized that the theoretical-methodological importance of scientific philosophy, which is in step with the achievements of science and practice, for the management of the educational process is very great, and in this process, the management of students' cognitive activity and the development of their mental abilities is possible only on the condition that the regularities of the thinking process, the characteristics of the forms and methods of scientific cognition and dialectical relations should always be taken into account.

In this work, the logic of looking at the management of the learning process as a cognitive issue in itself is brought to attention. In order to achieve effective results in the training process, the appropriateness of the practical educator's reference to the components contained in the dialectic and cognitive theory about the methods of understanding and changing reality in determining the management activity is drawn into the center of attention, and the form of thought movement that contains these "enabling components" is the methodological basis of the management of that process. Which is valued as the basis.

***Keywords:*** *training; dialectics; cognitive theory; scientific research methods; forms of scientific cognition; problem; cognitive issue; types of mental activity; insightful and intelligent action; sense intuition; intellectual intuition; idea; principle; theory.*

*Tədqiqat mövzusunun aktuallığı.* IV sənaye inqilabının çağırışlarına adekvat bacarıqların formalaşdırılmasını hədəfləyən təhsilalanmərkəzli təhsilin həyata keçirilmə yolu kimi qəbul edilən təlim nəzəriyyəsinin işlənilməsi didaktikanın aktual problemidir. Bu problemin həllinə əsas olan (həllini reallaşdıran) məsələlər sırasında dialektikanın, qnoseologiyanın qanun və kateqoriyalarının metodoloji rolunun bilavasitə

müəyyənləşdirilməsi məsələsi də vardır. Odur ki, sözügedən təhsilalanmərkəzli təlim sisteminin nəzəri və texnoloji əsaslarının müəyyənləşdirilməsi, elmi idrakın mükəmməl forması olan adekvat nəzəriyyənin ərsiyəyə gətirilməsi baxımından "Təhsialanmərkəzli təlim sisteminin fəlsəfi-metodoloji əsasları" mövzusunda tədqiqatın aparılmasının aktuallığını iddia edirik.

*Tədqiqatın metodoloji əsası.* Tədqiqatın reallaşdırılması prosesində empirik, empirik-nəzəri, nəzəri, metanəzəri, metakoqnitiv metodlardan istifadə olunmuş və "sistem-struktur" dialektik yanaşmaya istinad edilmişdir.

*Tədqiqat materialları əsasında formalaşdırılmış ümumiləşmələrin şərhi.* Pedaqogika elm sahəsinin obyekti, tədqiqat metodları, metodologiyası və əsas anlayışları barədə çox yazılmışdır və elmi mənbələrdə bunların özünə yer alan interpretasiyalarında müxtəliflik mövcuddur [10; 43-50]. Görkəmli Azərbaycan psixoloqu prof. Ə.Ə. Əlizadə "Təlim" anlayışına aydınlıq gətirmək məqsədi ilə ona belə bir elmi şərh verir: "Təlim tədris fəaliyyətinin mühüm xarakteristikası olsa da, onun bütün tərəflərini əks etdirmir. Təlim sözün geniş mənasında yeni bilik, bacarıq və vərdişlərin mənimsənilməsini nəzərdə tutur" [2;150]. Prof. Z.İ. Qaralovun fikrincə, təlim prosesi-obyektiv varlığı dərk etmək, bunun əsasında tərbiyələnmək və inkişafda olmaq prosesidir. Obyektiv aləmin insan şüurunda fəal inikası prosesini məqsədyönlü təmin etmək üçün müxtəlif yollardan, metod və vasitələrdən istifadə olunur. Bu metodlar içərisində ən mükəmməli dialektik metoddur. Bütünlükdə təbiət həmin metoda istinad etməklə dərk olunur [4, s. 72].

Yeri gəlmişkən vurğulayaq ki, dialektik metod idrakın ən ümumi metodudur, ona görə ki, o, təbiət və cəmiyyət hadisələrinə birtərəfli yanaşmanı kənar edir, maddi gerçəkliyin konkret sahəsinin inkişafını əks etdirən xüsusi qanundan deyil, təbiət, cəmiyyət və təfəkkürün bütün sahələrinin inkişafını əks etdirən ən ümumi qanunlara əsaslanır. Qeyd etməliyik ki, bir metod olmaq etibarı ilə dialektikanın ən ümumi xarakter daşıması o demək deyildir ki, bu metod elmi idrakın bütün metodlarını əvəz edə bilər. Dialektika idrakın ümumi xarakter daşıyan yeganə elmi metodu olsa da, o konkret elmlərin xüsusi metodlarını əvəz edə bilməz. Müasir elmin sərəncamında ən ümumi və yeganə elmi xarakter daşıyan bu metodla yanaşı, bir sıra xüsusi metodlar da vardır. Onu da xüsusi olaraq vurğulayaq ki, dialektik metodun elmi idrakın ən ümumi metodu olmasını əsaslandırmaq üçün dialektikanın əsas prinsip, qanun və kateqoriyalarının elmi idrak üçün metodoloji və evristik əhəmiyyətinə diqqət yönəltmək lazımdır. Elmi-tədqiqat praktikası göstərir ki, öyrənilən cisim və hadisələrin digər hadisələrlə qarşılıqlı əlaqəsini və asılılığını nəzərə almayan tədqiqatçı idrakda həmişə ciddi çətinliklərlə rastlaşır. İdrakın çox mürəkkəb məsələlərinin müvəffəqiyyətlə həll olunduğu, maddi və mənəvi aləmin əsrarəngiz sirlərinə bacarıqla nüfuz etdiyi hazırkı dövrdə heç bir tədqiqatçı yeganə elmi idrak metodu olmaq etibarı ilə materialist dialektikadan istifadə etmədən keçinə bilməz.

Mətləbdən uzaqlaşmayaq. Təlim prosesində elmi həqiqətlərin gənc nəslə ötürülməsinin əsasını da dialektik metod təşkil edir. Ona görə də öyrənmə (dərk etmə) dialektik idraki hadisə sayılır. Təlim prosesinin yolları, metod və vasitələri, şagirdlərin bu prosesdə alqoritmik və evristik fəaliyyətin nisbətləri dialektik metodun əsasında yaradılaraq müəllim-şagird fəaliyyəti qurulur. Dərketmə prosesi müxtəlif səviyyəli, əlaqəli mərhələlərdən keçir. İnkar olunmur ki, əsil həqiqətə çatmaq üçün insan şüuru bu mərhələlərdən keçməlidir.

Tədqiqatın qayəsinə uyğun olaraq biz burada "Təlim prosesi" anlayışını nəzər-nöqtəsi olaraq seçməklə sözügedən anlayışa "sistem-struktur" baxımdan yanaşaraq mülahizələrimizi, ümumiləşmə halına gətirdiyimiz qənaətlərimizi təqdim etməyi faydalı sayırıq və əslində bununla da pedaqoji fikrə və praktikaya öz töhfəmizi vermək istəyimizi təzahür etməyə çalışmışıq. Onu da öncədən vurğulayaq ki, dialektikanın inkişaf etmiş qolu kimi formalaşan "sistem-struktur yanaşma"ya əsaslandığımız üçün məntiqi olaraq şərhimizdə "mükəmməl sistem" və ya "bütöv sistem" anlayışlarını işlətməli oluruq.

Pedaqogika nəzəriyyəsində təlimin müxtəlif sistemləri barədə də çox yazılmışdır, didaktiklər tərəfindən bu və ya digər konsepsiyaya üstünlük verilməsini özündə ehtiva edən təlim sistemlərinin mövcudluğu göstərilir [5;76-78]. Məsələn, müasirliyi dəyərləndirilən fəal/interaktiv təlimlə bağlı professor A.N. Abbasov yazır: "Fəal/interaktiv təlim dedikdə, məktəblilərin fəal idrak fəaliyyətini diqqət mərkəzinə gətirən və

təhsil prosesinin digər iştirakçıları ilə əməkdaşlıq şəraitində həyata keçirilən təlim başa düşülür. Fəal interaktiv təlim tədris və idrak fəaliyyətinin təşkili və idarə olunması metodlarının məcmusudur" [1, s. 268].

Şübhə yoxdur ki, mükəmməl təlim sisteminin nəzəri və praktik əsaslarının işlənilməsi didaktikanın mərkəzi problemidir. Ümumiyyətlə, daha səmərəli nəticələri hədəfləyən didaktik sistemlərin axtarışı zəruri və davamlı prosesdir.

Bizcə, təlim sisteminin mükəmməlliyi onun bəşər mədəniyyətinin zəruri hissəsinin şagirdlər tərəfindən mənimsənilməsinə imkan verən ən səmərəli yolları özündə saxlama səviyyəsi, başqa sözlə, şəxsiyyətin inkişafina edə biləcəyi sürətləndirici təsirin effektliliyi ilə xarakterizə oluna bilər; belə sistem təhsilin bütün səviyyələrini əhatə etməlidir, həm reproduktiv, həm də yaradıcı səviyyədə mənimsəmə isə yalnız əqli fəaliyyətin analitik və evristik növlərinin məqsədəuyğun idarə olunması nəticəsində mümkündür.[9, s. 451-473] Biz belə hesab edirik ki, idrakın gerçəkliyi əksetdirmə qanunauyğunluqlarına, təlim prosesinin mahiyyətinə az-çox bələd olan hər bir kəs bu fikrə etiraz etməz. Odur ki, biz L. Bertalanfinin "Sistem təhlili ideyası"na istinad etməklə təlimin elə sistemini mükəmməl sayırıq ki, o, özündə bir çox cəhət və keyfiyyətlərlə (altsistemlərdən ibarət olması, ayrıla bilən altsistemlərin qarşılıqlı əlaqəsini təyin edən xassənin olması, idrakın bütöv sisteminə uyğun qoyula bilməsi və s.) yanaşı [6, s. 8], onun alqoritmik (analitik fəaliyyətin mühüm tərkibi olaraq) və evristik fəaliyyətin optimal nisbətini özündə ehtiva etmiş olsun [10, s. 20].

Burada diqqət yönəldilən arqumentləri arxa plana keçirmədən vurğulamağı lazım bilirik ki, təlim prosesinin mükəmməlliyi onun tətbiq edildiyi (həyata keçirildiyi) zaman kəsiyində formalaşan "təhsil məkanının"(təhsil nəzəriyyəsinə "təhsil məkanı" anlayışının daxil edilməsini məqbul və faydalı hesab edirik, hansı ki, bu məkanın formalaşmasını sənaye inqilablarının çağırışları dialektikanın inkari-inkar qanunu davamlı şəkildə şərtləndirir, biz bu qənaətə uzunmüddətli tədqiqat fəaliyyəti sayəsində gəlməli oluruq) xüsusiyyətlərinə adekvatlığı ilə şərtlənir. Bizim elmi mənbələrdən və qabaqcıl pedaqoji təcrübədən əldə etdiyimiz materialların elmi idrakın forma və metodları əsasında formalaşdırdığımız və subyektiv xarakter daşıyan(subyektiv cəhət insanın idrak fəaliyyətində qaçılmaz gerçəkdir!) ümumiləşmələrimizə görə, hazırda təhsilin həyata keçirilməsinin mühüm yolu kimi dərk olunan "mükəmməl təlim prosesi" IV sənaye inqilabının çağırışlarına uyğun bacarıqların formalaşmasını şərtləndirən təhsilalan mərkəzli emercent təbiəti ilə mövcud sistem kimi interpretasiya olunmalıdır, fikrimizcə, onun nəzəri və texnoloji əsaslarının işlənilməsi təhsil nəzəriyyəsinin (didaktikanın) "təkmilləşdirilməsinin paradiqması" kimi qəbul edilməlidir. Bu prosesdə didaktiklərin, təhsil sahəsində çalışan psixoloqların pedaqoji psixologiyaya ərməğan etdiyi töhfələr inkar olunmamalı, onlardan yaradıcılıqla faydalanmaq gərəkdir. Məxsusi olaraq vurğulamaq yerinə düşər ki, savadlılıq, çox dil bilmək, riyazi, elmi, texnoloji, rəqəmsal savadlılıq, şəxsi, sosial və öyrənməyi öyrənmək, fəal vətəndaş mövqeyi, sahibkarlıq, mədəni məlumatlılıq və özünü idarəetmə kompetensiyalarının formalaşdırılmasını hədəfləyən təhsilalan mərkəzli təlim nəzəriyyəsinin işlənilməsində "Çoxnövlü zəka" (Hovard Qardner), "Zehni inkişafın mərhələləri"(Jan Piaje), "Sosial inkişaf" (Lev Vıqotski), "Düşüncə tərzi" (Karol Dvek), "Mənəvi inkişaf"(Lourens Kolberq), "Öyrənmənin şərtləri" (Robert Qanye), "Emosional zəka" (Daniel Qoulman), "İntrovert və ekstrovert şəxsiyyət" (K.Yunq) və digər bu kimi idrak məsələlərindən(qeyd edək ki, bunlar elmi mənbələrdə elmi idrakın ən mükəmməl forması sayılan "nəzəriyyə"lər adı adı təqdim olunur), Sinxiron və asinxron tədris, Sorğu və araşdırma əsaslı təlim, problem əsaslı təlim, lyihə əsaslı təlim (PBL) öyrənmə, oyun əsaslı öyrənmə, birbaşa təlim və digər forma və modellərdən faydalanmaq zəruridir, bu vacib məsələnin arzuolunan səviyyədə həllində istinad olunmalı "imkandaşıyıcı element"lərdir (Ətraflı məlumat üçün bax:[7, s. 90-97, s. 117-151]).

Fikrimizcə, təlim prosesinin idarə olunmasına öz-özlüyündə idrak məsələsi kimi baxmaq olar. Təlim prosesində pedaqoqun idarəetmə fəaliyyətinin müəyyənləşdirilməsində də gerçəkliyin dərk olunması və dəyişdirilməsi metodları haqqında dialektika və idrak nəzəriyyəsinin tərkibləri kimi ehtiva olunan prinsiplərə istinad edilir. Bu prinsipləri özündə saxlayan nəzəriyyə təlim prosesinin idarə olunmasının metodoloji əsası rolunu oynayır.

Təlim prosesinin idarə olunması üçün elmin və praktikanın nailiyyətləri ilə ayaqlaşan elmi fəlsəfənin nəzəri-metodoloji əhəmiyyəti olduqca böyükdür. Qeyd etdiyimiz kimi, burada dialektika və idrak nəzəriyyəsi ön planda durur. Bunu hər şeydən əvvəl onda görmək olar ki, adətən, təlim prosesində müəllim bir sıra fəlsəfi -metodoloji problemləri həll etməli olur. Dialektika müəllimə idarə etdiyi hadisəyə sonsuz hadisələr silsiləsinin bir halqası kimi baxmağa, onun mahiyyətini dərk etməyə imkan verir ki, bu da obyektin hazırkı halını və mahiyyətini dərindən, dəqiq öyrənməyə, onun hansı istiqamətdə inkişaf edəcəyini və gələcəyinin necə olacağını müəyyənləşdirməyə əsas verir.

Dialektikanı həm ümumi idrak nəzəriyyəsi, həm də elmlərin metodoloji əsası hesab edənlər yanılmırlar. Səciyyəvi cəhət budur ki, metodoloji əsas evristik xüsusiyyət daşımağa qadirdir. Fikrimizi daha da konkretləşdirmək üçün dialektikanın qanun və kateqoriyalarına müraciət edək. Dialektikanın əsas qanun və kateqoriyalarının təlim prosesi və onun idarə olunması üçün mühüm metodoloji və evristik əhəmiyyəti əksliklərin vəhdəti və mübarizəsi qanununda daha aşkar görünür. Dialektikanın nəbzi, nüvəsi adlandırılan bu qanunun təlimin idarə olunması üçün metodoloji əhəmiyyəti ondadır ki, o, pedaqoqa bu prosesin ziddiyyətli mahiyyətini müəyyən etməyə, təlim prosesini və onun komponentlərinin inkişafının mənbəyini, hərəkətverici qüvvəsini, daxili impulslarını açmağa imkan verir. Bu qanuna əsaslanmadan, təlim prosesində onun təzahürünü aydın dərk etmədən, pedaqoji prosesə rəhbərlik edənə hadisələrin inkişafında meydana çıxan və təlim prosesində dərk olunanlara əks olan ziddiyyətlərin mahiyyətini başa düşmək, bu obyektiv ziddiyyətləri təfəkkürün məntiqi cəhətdən düzgün olmayan gedişindən törəyən subyektiv ziddiyyətlərdən ayırmaq çətin olardı.

Əksliklərin vəhdəti və mübarizəsi qanununa əsaslanmaq, təlim prosesində ondan şüurlu şəkildə istifadə etmək, təlimin idarə olunması prosesində qarşıya çıxan bir sıra çətinlikləri aradan qaldırmağa və hadisələrin mahiyyətinə nüfuz etməyə imkan verir.

Qeyd etmək lazımdır ki, təkcə əksliklərin vəhdəti və mübarizəsi qanunu deyil, eyni zamanda materialist dialektikanın digər qanun və kateqoriyaları, prinsipləri də mühüm metodoloji əhəmiyyətə malikdir. Məsələn, dialektikanın ümumi əlaqə prinsipini götürək. Dialektikanın bu prinsipini təlimə aid etdikdə təlim metodlarının bir-biri ilə ayrılmaz əlaqəsinin şahidi oluruq. Belə ki, elmi-tədqiqatda olduğu kimi, təlim prosesində də idrakın ən ümumi və xüsusi metodları ayrı-ayrılıqda, yanaşı deyil, ayrılmaz əlaqədə təsir göstərir. Dialektik metodun təlim prosesinin gedişinə və onun nəticələrinə təsiri xüsusi metodlar vasitəsi ilə həyata keçirilir.

Fəlsəfədə dialektikanı təbiət, cəmiyyət və təfəkkürdə ümumi əlaqə və ümumi inkişaf nəzəriyyəsi; dialektikanı həm də ümumi idrak nəzəriyyəsi kimi də səciyyələndirirlər. Dialektikanın ümumi idrak nəzəriyyəsi kimi səciyyələndirilməsi, hər şeydən əvvəl, bununla əlaqədardır ki, idrak prosesi özü dialektik prosesdir, başqa sözlə, idrak nəzəriyyəsi özü xarici aləmin insan şüurunda dialektik inikasıdır və bu əksolunma prosesində gerçəkliyə məxsus qanunauyğunluqlar şüurumuzda bilik kimi formalaşır. Bu qanunauyğunluqların dərk edilməsi, mənimsədilməsi sayəsində ümumi prinsip və nəzəri müddəalar formulə edilir ki, bunun da təlim prosesinin idarə olunması üçün müstəsna əhəmiyyəti vardır. Belə ki, təlim prosesinin özünə gerçəkliyə məxsus olan predmet və hadisələrin dərk olunmasının spesifik bir növü kimi baxmaq olar. Odur ki, qnoseologiyanın, dialektikanın ümumi qanunları, prinsipləri təlimin xüsusi metodları ilə əlaqədar fəaliyyət göstərir. Vəzifə bu əlaqə əsasında təlimin elə qurulmasına nail olmaqdır ki, şagirdlərin bəşər mədəniyyətini, elmlərin əsaslarını yaxşı mənimsəməsinə (hətta onu sonra yaradıcılıqla inkişaf etdirməsinə) şərait yaransın, onlarda idrak müstəqilliyi formalaşsın.

Məlum olduğu kimi, qnoseologiya fəlsəfənin tərkib hissəsidir. O, ümumi idrak nəzəriyyəsidir, bilik haqqında təlimdir. Təsadüfi deyildir ki, fəlsəfi ədəbiyyatda həqiqət anlayışını qnoseologiyanın mərkəzi kateqoriyası hesab edirlər. Həqiqət özü də bilikdir, ətraf aləm, gerçəklik haqqında sınaqdan çıxmış, doğruluğu ictimai praktikada yoxlanılmış bilikdir. Səciyyəvi haldır ki, "bilik" anlayışı pedaqogikanın təlim nəzəriyyəsi ilə bilavasitə bağlı olan kateqoriyasıdır. Bəs bilik nədir, onun fəlsəfi və pedaqoji aspektləri nədən ibarətdir?

Bu məsələlərdən söhbət gedəndə M. Əkbərovun və N. Cəfərovun "Bilik haqqında nə bilirik?" məqaləsi diqqəti çəkir [3]. Məqalədə bilik

insanların ictimai əməyinin və zehni fəaliyyətinin məhsulu, "obyektiv gerçəkliyin ideal inikası, onun nəzəri əxzetmənin nəticəsi... insanların məqsədəuyğun-praktik fəaliyyətinin zəruri elementi, zəmini" kimi səciyyələndirilir. Burada bilik qnoseoloji kateqoriya kimi xarakterizə edilir, onun, ümumiyyətlə, mahiyyəti, növləri, funksiyası araşdırılır. Bununla belə, biliyin pedaqoji aspekti də müəlliflərin nəzərindən yayınmamışdır. Məqalədə oxuyuruq ki, pedaqogikada bilik dedikdə əsasən təhsilin məzmunu ilə bağlı olan elə element nəzərdə tutulur ki, burada bəşəriyyətin əldə etmiş olduğu hazır sərvətin yetişməkdə olan gənc nəslə mənimsədilməsindən, həm də bu sərvətdən təhsil üçün nəyi və onu necə, nə üçün təlim etməkdən söhbət gedir. Burada elmdə "yeni bilik" anlayışı haqqında mülahizə xüsusi əhəmiyyət kəsb edir. Belə ki, fəlsəfədə yeni bilik elmi tədqiqatların elə nəticəsinə deyilir ki, o, obyektiv gerçəkliyə, onun xassə və qanunauyğunluqlarına dair mövcud olan biliklərimizi və onların tətbiqini əsaslı surətdə dəyişdirir və genişləndirir. Buraya daxildir: a)yeni empirik, eksperimental faktların kəşfi, b)müəyyən bir nəzəri sistemdən deduksiya yolu ilə alınan anlayış və mülahizələr, c)mövcud nəzəri təsəvvürləri dəyişən yeni elmi anlayış, qanun, müddəa, prinsiplərin yaranması.

Məxsusi olaraq qeyd etmək gərəkdir ki, təlim prosesində "yeni bilik" dedikdə, buradakı "yeni" sözündə müəyyən şərtilik var; bu bilik elmdə artıq bərqərar olmuş "hazır" biliklərdən müəyyən didaktik prinsiplər əsasında seçilən və dərsliklərə daxil edilən elə proqram materialıdır ki, o, təlim prosesində müəyyən ardıcıllıqla seçilmiş formada şagirdlərə aşılanır [11, s. 21-22]

Sözügedən məqalədə biliyin ümumi, metodoloji təsnifatı və funksiyalarını fəlsəfi baxımdan araşdıran müəlliflər, onun tədris işi üçün mühüm əhəmiyyətini xüsusi qeyd edirlər. Burada tədris fənlərinin məzmununa daxil olan biliklərin aşağıdakı növləri qeyd edilir: a) əsas terminlər və anlayışlar (bunlarsız heç bir mətn, müddəa və ya mülahizə aydın olmaz); b) gündəlik həyati və elmi faktlar (bunlarsız elm qanunlarını anlamaq olmaz, əqidə, ideya, isbat kimi keyfiyyətlər formalaşmaz); c) gerçəkliyin müxtəlif obyektləri və hadisələri arasındakı zəruri, mühüm, davamlı əlaqələri açan elm qanunları (bunlarsız elmdən danışmaq olmaz); ç)elmi nəzəriyyələr; e) metodoloji xarakterli biliklər (biliyin meydana gəlməsi, hasil edilməsi yolları və tarixi, idrak metodları) d) qiymətləndirici (və ya dəyərləndirici) biliklər (müxtəlif həyati hadisələrə münasibət normalarına qiymət vermək barədə biliklər). [3]

Əlbəttə, bu məsələlərin ətrafında müəlliflərlə bu və ya digər baxımdan mübahisə etmək olar. Lakin məqalədə müəlliflərin belə bir nəticəsi bizi qane edir ki, "biliyin müxtəlif növlərə malik olması və bunların təlim prosesində müxtəlif funksiyalar daşımasına baxmayaraq, onlar bir-biri ilə ayrılmaz daxili əlaqədə olub dialektik vəhdət, vahid bir sistem təşkil edir". "Bilik" anlayışının həm fəlsəfi, həm də pedaqoji aspektlərini əsaslı surətdə təhlil edən müəlliflər haqlı olaraq qeyd edirlər ki,"qnoseologiyanın mühüm bir kateqoriyası olan biliyin ümumi, fəlsəfi anlamını bunun pedaqoji aspektlərini bir-birindən təcrid etmək də, bunları bir-birinə qarşı qoymaq da səhvdir" [11, s. 21-22]

Biliyin verilmə üsulları pedaqogika elminin inkişafı gedişində dəyişikliklərə məruz qalmışdır. Xarakterik cəhət budur ki, bu dəyişikliyin metodoloji əsası da məhz idrak nəzəriyyəsində yeri olan prinsiplərdir. Bu prosesin aşağıda göstərilən üç inkişaf mərhələsini fərqləndirmək olar: əvvəllər şagirdlərə biliklər şifahi formada təqdim olunurdu(təlim əməyindən ayrılmış şəkildə), bu zaman doğmatik təlim aparıcı mövqedə idi; sonralar fəaliyyət üsulları haqqında biliklərin verilməsinə və xüsusi qaydada onların tətbiqinə yer verildi; nəhayət, fəaliyyətin nəticəsi kimi biliyin əldə olunması məqsədəuyğun hesab edildi. Fəaliyyətdə olan nəzəriyyə "əvvəlcə hər hansı mənimsəmə, sonra isə tətbiq" öz yerini daha əsaslandırılmış nəzəriyyəyə verməli oldu: "anlayışı mənimsəmə yalnız onun tətbiqi prosesində həyata keçir"[13, s. 59]. Mənimsəmə və tətbiq vahid idrak prosesinin iki tərəfi kimi qəbul olundu.

İndi praktiklərə yaxşı məlumdur ki, proqramlaşdırılmış metod və vasitələrin, problemli öyrənmənin təlim prosesinə daxil edilməsi mənimsəmə ilə tətbiqin vahid halda birləşməsi üçün imkanları xeyli yaxşılaşdırır. Bu o deməkdir ki, düzgün metodoloji əsas təlimin müvəffəqiyyəti üçün vacib şərtdir.

Şagirdlərin idrak müstəqilliyinin və onların yaradıcı qabiliyyətlərinin inkişafı probleminin tədqiqi yaradıcılığın fəlsəfi nəzəriyyəsi ilə sıx bağlıdır. Bu problem öz növbəsində elmin inkişafı, elmi

tədqiqatın məntiqinin dərki, yaradıcı prosesin xüsusiyyəti (o yaradıcılığın psixologiyasının inkişafı ilə bağlıdır), kibernetika, riyazi məntiq, evristik proqramlaşdırma, idrak nəzəriyyəsinin sonrakı inkişafı ilə şərtlənir. Heç şübhəsiz ki, müxtəlif təlim üsullarının, evristik və alqoritmik metodların tətbiqi müəllimdən yaradıcılıq qabiliyyəti, geniş dünyagörüşü xarakterli bilik tələb edir.

Psixologiya elmi sübut etmişdir ki, insan psixikası nəinki cisimlərin hazırda görünən, habelə onlardan kənarda olan surətlərinə əsaslanmaq qabiliyyətinə də malikdir. İnsan fəaliyyəti çox mürəkkəb və xüsusi bir prosesdir. O, sadəcə olaraq tələbatların ödənilməsi ilə deyil, məqsədin dərk olunması və ictimai təcrübə ilə şərtlənir. Məhz insanın qabaqlayıcı inikas fəaliyyətinin əsasında müvafiq məqsəd durur və özünün sonrakı fəaliyyətini ona şüurlu şəkildə tabe etdirir.

Fəlsəfi ədəbiyyatda təfəkkürün iki funksiyasından danışılır: birincisi, gerçəkliyin obyektlərinin adekvat əks olunması, ikincisi isə obyektiv aləmdə həqiqətdə mövcud olmayan, bu və ya digər cisim və hadisələrə adekvat olmayan obrazların yaradılmasıdır. Təfəkkürün hər iki funksiyası inikas anlayışının spesifik tərəfidir, bunun əsasında aktiv idrak durur.

Fəlsəfi ədəbiyyatda idrakın belə aktivliyi inikas-dəyişdirmə anlayışı ilə, şüurlu yaradıcılıq fəaliyyəti ilə bağlı şəkildə izah edilir [18 ], yəni insanın yaradıcılıq fəaliyyətinin təbiətinə filosoflar inikas-dəyişdirmə fəaliyyətinin nəticəsi kimi baxır. Belə ki, yaradıcılıq dəyişdirici inikasın zirvəsi, onun ali dərəcəsi sayılır. Bu fəaliyyətin nəticəsində daha yüksək bilik və fəaliyyət üsulları formalaşır.

V.H. Nəsirov və Ə.B. Məmmədov haqlı olaraq göstərirlər ki, dialektik təfəkkür axtarışlar təfəkkürü olub, bir tərəfdən empirik biliklə, digər tərəfdən isə kateqorial struktur ilə şərtlənən yaradıcı fəaliyyətdir. Mahiyyətin dialektik təfəkkür vasitəsi ilə aşkara çıxarılması o demək deyildir ki, bu prosesdə formal məntiqi təfəkkür formaları, əməliyyatları və üsulları iştirak etmir. Əksinə, formal-məntiqi vasitələr olmadan mahiyyət aşkar edilə bilməz. Lakin bu vasitələr də mahiyyətin aşkar edilməsi üçün kifayət deyil, burada aparıcı rol dialektik təfəkkürə, kateqorial təhlilə məxsusdur [, s. 8; 122]. Təfəkkürün müşahidələr əsasında ilkin təsəvvür, sadə təfəkkür əməliyyatları, ilkin ümumiləşdirmələr, mücərrəd təfəkkür, modelləşdirmə əməliyyatları, fərziyyələr və aksiomlar irəli sürmək, qanun və nəzəriyyələr formalaşdırmaq, təsdiq, sübut, əsaslandırmaq, tətbiqlər və s. hərəkətlərdən istifadə olunaraq mahiyyət aşkara çıxarılır.

Tədris prosesində müəllim tərəfindən diqqət mərkəzində saxlamaq gərəkdir ki, intellektual intuisiya ilə birlikdə kateqorial təhlil zəruri biliyə gətirib çıxaran vahid prosesin ayrılmaz tərkib hissəsidir. Nəzəri biliyin yaradılmasında kateqorial təhlilin rolu faktların kateqorial şəkildə ümumiləşdirilməsindən ibarətdir. Fakt öyrənilən predmetə aid olan empirik bilik, kateqoriya isə ümumiliyə malik olub gerçəkliyin müəyyən sahəsinə daxil olan bütün predmetlərə aid nəzəri biliklərdir [8, s. 123]. Kateqoriya təfəkkürün forması, ideya isə nəzəriyyənin əsas anlayışıdır [11, s. 24]. İdrakda kateqoriya və faktların əlaqəsi intellektual intuisiya vasitəsi ilə təmin edilir.

Yeri gəlmişkən qeyd edək ki, çoxmənalı olmasına baxmayaraq, intuisiya anlayışı əsasən həqiqəti bir dəfəyə aşkara çıxaran müstəqil bilik mənasında başa düşülür.[14, s. 117]. İntuisiyanın iki növü hissi intuisiya (bilavasitə hissi bilik) və intellektual intuisiya(məsələn, həndəsi aksiomlar) bir-birindən fərqləndirilir. İntiusiyanın bundan əlavə evristik növü də məlumdur ki, bu da gözlənilməz kəşflər üçün zəruri olan həllin tapılması və s. formada təzahür edir.

Təlim prosesində şagirdlərin idrak fəaliyyətinin idarə olunması və əqli qabiliyyətlərinin inkişafı yalnız o şərtlə mümkündür ki, təfəkkür prosesinin qanunauyğunluqları daim nəzərə alınsın. Bu həm əqli fəaliyyətin növlərinə, həm də onların strukturuna aiddir. Onlar konkret situasiyada yaddaş və təfəkkürün müxtəlif münasibətləri ilə bağlıdır.

Filosof və psixoloqların tədqiqatları əsasında da müəyyənləşdirilmişdir ki, problem həlli zamanı yeni biliklərin mövcud biliklər sisteminə daxil edilməsi və onun yenidən işlənməsi ilə bağlı insanın yaradıcı əqli fəaliyyəti iki növ (analitik və evristik) ola bilər.

Problem həlli zamanı əqli fəaliyyətin analitik növü həlli alqoritmlərinin, əqli əməliyyatların dəqiq ardıcıllığının mövcudluğu ilə bağlıdır. Bu növdə fikri fəaliyyət məntiqi təfəkkürün bütün qanunları üzrə baş verir. Şagirdin evristik fəaliyyətinin əsasında onun intuitiv təfəkkürü durur. Evristik priyomlar daha çox o zaman tətbiq

olunur ki, həllin alqoritmi məlum olmasın. Hətta alqoritmlərin məlum olduğu halda belə, evristik priyomların tətbiq olunması həll prosesini sürətləndirə bilir.

İnsan fəaliyyətinin cəhəti olan biliyin özünü də rasional və qeyri-rasional kateqoriyaları baxımından qiymətləndirmək olar. Öz təbiəti etibarilə bilik, bəşəriyyətin məqsəd və tələbatına cavab verən ideyalar yaratdığına görə məntiqi, qərarlaşmış olan məlum zəka formalarına uyğun gəlməsinə görə rasionaldır. Bununla birlikdə, o, çox halda, əvvəlcədən yaradılmış təfəkkür formalarından kənara çıxır, təkcə həmin təfəkkür formaları ilə izah edilə bilmir, yəni onda elə bir cəhət vardır ki, bu cəhət məntiqin özünün dəyişilməsi və onun cəbbəxanasının yeni təfəkkür formaları və kateqoriyaları hesabına zənginləşməsi yolu ilə aradan qaldırılır.

İdrakın inkişafının başlıca meyli olmaq etibarilə rasional iki formada – dərrakə və həqiqətən zəka formasında mövcuddur.

Dərrakəli fəaliyyət irəlicədən nəzərdə tutulmuş sxem üzrə, şablon əsasında, metodun özünü, onun hüdudlarını və imkanlarını dərk etmədən, fikir formaları və abstraktsiyalarla əməliyyat aparmaq deməkdir. Dərrakə tamı, vahidi bir-birinə qarşılıqlı surətdə nüfuz edən vəhdət halında əhatə edə bilmədiyindən, onları bir-birini istisna edən əks cəhətlərə bölür. Dərrakənin xüsusiyyətləri alqoritm, qayda timsalında ən parlaq şəkildə nəzərə çarpır ki, buna müvafiq olaraq, məsələn, bu və ya digər hesablama prosesi yerinə yetirilir və həmin hesablama prosesi üçün aşağıdakı ciddi bir müəyyənlik səciyyəvidir: hesablama prosesinin hər bir mərhələsi özündən sonra gələn mərhələni müəyyən edir, prosesin özü ayrı-ayrı addımlara bölünür, göstəriş isə simvolların kombinasiyası şəklində verilir. Dərrakənin fəaliyyət göstərməsi nəzəri təfəkkür üçün zəruridir. Lakin insan təfəkkürünün səciyyəvi xüsusiyyətini dərrakə deyil, məhz zəka ifadə edir. Zəka, məzmunu və təbiəti dərk olunan anlayışlarla əməliyyat aparır, zəkanın köməyi ilə hadisələr, proseslər yaradıcı fəallıqla, məqsədyönlüklə əks olunur. İnsanın zəkası təşəkkül tapmış bilik sistemi hüdudlarından kənara çıxmağa, yeni sistem yaratmağa çalışır. Əgər dərrakə üçün səciyyəvi olan analizdirsə, zəka üçün ən yüksək insan qabiliyyəti səviyyəsinə çatdırılmış sintezdir. İnsan biliyi dərrakədən və zəkadan ibarət fəaliyyətin vəhdətidir ki, həmin fəaliyyətlə obyektiv reallıq dərk olunur və rasional surətdə dəyişdirilməsi yolları müəyyən edilir.

Əlbəttə, yaradıcılığın bütün sirləri, onun qanunauyğunluqları, mexanizmi hələlik tam, axıra qədər öyrənilməmişdir. Lakin bununla belə elmi idrakın nəticələri kimi biliklərin sistemi, onların inkişaf məntiqi haqqında kifayət qədər məlumatımız vardır. Təlim prosesində idrakın formalarının xüsusiyyətlərini, qarşılıqlı əlaqələrini bilmək və bunlardan məqsədəuyğun şəkildə istifadə etmək zəruridir. Bu zəruriliyin bir sıra vəhdət təşkil edən səbəbləri vardır. Birincisi, bu və ya digər tədris fənninin məzmununu təşkil edən bilik və fəaliyyət üsulları müəyyən formalarda təqdim olunur. İkincisi, idrakın müəyyən metod və formalarından istifadə edilərək həmin bilik və fəaliyyət üsulları (tədris fənnin məzmununu təşkil edən ) əldə olunmuşdur. Üçüncüsü, hər bir formanın spesifik xüsusiyyətlərini, idrakın strukturunda həmin elementin yerini və funksiyasını bilməklə, təlim prosesində onun əldə olunması məqsədi ilə şagirdlərin idrak fəaliyyətlərini tənzimləmək mümkündür. Biliyin formasından asılı olaraq onun əldə olunmasına yönələn əqli fəaliyyətin analitik (alqoritmik) və evristik cəhətlərinin münasibətini dürüstləşdirmək mümkündür.

Odur ki, elmi idrakın müxtəlif formalarının təlim prosesinin təşkil və idarə olunması baxımından vacib olan bəzi cəhətlərini nəzərdən keçirməyi, müəyyən mənada haşiyə çıxmağı lazım bilirik.

Məlumdur ki, həm elmi tədqiqatın, həm də təlimin zəruri şərtlərindən biri qazanılmış biliklərin sistemləşdirilməsidir və bu problemlə sıx bağlı olan məsələdir. Problem biliksizlikdən biliyə keçid mərhələsidir. Problem biliyin empirikdən nəzəriyyəyə zəruri hərəkətini ehtiva edir.

Problem məsələnin toplanmış bilikdə cavabı olmayan və buna görə də sadə informasiya axtarışlarından fərqlənən müvafiq praktiki və nəzəri fəaliyyət tələb edən növüdür [15, s. 21-22] Məsələ problemin təmərküzləşmiş ifadəsi, onun düyün nöqtəsidir [16, s. 80]. Qnoseologiyanın mərkəzi anlayışlarından olub, elmdə mühüm rol oynayan ideya öz mənası etibarilə məntiqi təfəkkürün anlayış formasına daha yaxındır. İdeya ilə anlayışın əsas fərqi bunlardır ki, hər bir ideya anlayış olduğu halda, heç də hər cür anlayış ideya deyildir. Yalnız əsasında müəyyən

biliklərin sintez olunduğu və bilik sisteminin yarandığı anlayış ideya rolunu oynaya bilər. İdeya nəzəriyyənin elementi, onun əsasıdır, nəzəriyyə isə artıq inkişaf edib formalaşmış ideyadır.

Nəzəriyyənin ideyadan fərqi bundadır ki, nəzəriyyə həm ideyanı, həm də ondan törəyən bütün digər anlayışları ehtiva edir. İdeyanın nəzəriyyənin strukturuna daxil olan digər anlayışlardan məzmun fərqinə gəldikdə isə o, bundan ibarətdir: İdeya nəzəriyyənin əsasını təşkil edən mühüm qanunauyğunluğu əks etdirdiyi halda, həmin nəzəriyyənin məzmununa daxil olan anlayışlar bu qanunauyğunluğu yalnız qismən, natamam şəkildə, başqa sözlə, onun ancaq mühüm tərəf və aspektini əks etdirirlər.

İdeya, əvvəla empirik bilikdə verilməsi mümkün olmayan mahiyyəti əks etdirir, ikincisi, ideya əsasında predmet və hadisələr haqqında qazanılmış biliklərin yüksək sintezinə nail olunur və nəzəriyyə yaradılır. İdeya gerçəkliyin inikasıdır. İdeyanın təşəkkül prosesi dialektik təfəkkürün yaradıcı xarakterinin təzahürüdür. İdeya – yüksək obyektivlik, dolğunluq və konkretlik dərəcəsinə yüksəlmiş və eyni zamanda praktik olaraq həyata keçirilməyə istiqamətləndirilmiş fikrə deyilir.

İdeya yalnız anlayışla deyil, habelə biliyin digər forması olan prinsiplə də əlaqədardır. Bu əlaqə özünü belə bir cəhətdə göstərir ki, həm ideya, həm də prinsip nəzəriyyənin yalnız əsası olmayıb, habelə onun sərhədləridir. İdeyalarla münasibətdə prinsip ideyanın abstrakt ifadəsidir. İdeya prinsipə nisbətən məzmun genişliyinə malikdir. Nəzəriyyənin əsasını bir ideya təşkil etdiyi halda, nəzəriyyəni ifadə edən prinsiplər bir neçə ola bilər [8, s. 123-124].

İdeya və prinsip kimi qanun da elmi idrakın mühüm formalarından olub, hadisələrin obyektiv, ümumi, mühüm zəruri, nisbi sabit və təkrarlanan əlaqə və münasibətlərini əks etdirir.

Gerçəkliyin müxtəlif sahələrində təsir göstərən qanunların kəşf və formula edilməsi elmi idrakın əsas formalarından olan hipotezaların yaradılması üçün mühüm əhəmiyyət kəsb edir. Hipoteza hər hansı hadisənin səbəbini izah edən, lakin hazırkı zamanda səhihliyi hələ sübut olunmamış elmi fərziyyədir. Nəzəriyyə dedikdə bu və ya digər predmet sahəsinin mühüm, başqa sözlə qanunauyğun, ümumi və zəruri daxili əlaqələrini əks etdirən, öz aralarında məntiqi surətdə əlaqələnən fərziyyələrin müəyyən sistemi kimi mövcud olan həqiqi bilik nəzərdə tutulur. [17, s. 167-168]

Şübhə yoxdur ki, şagirdlərin təlim fəaliyyətləri, onların yaradıcı qabiliyyətləri və müstəqilliyinin formalaşmasının məqsədyönlü şəkildə istiqamətlənməsi elmi biliklərin sistemi və onların inkişaf məntiqini nəzərə almağı tələb edir. Bu prosesdən isə onların alqoritmik və evristik fəaliyyətləri müəyyən nisbətdə çıxış edir, funksiya yerinə yetirir. Məhz bu nisbəti müəyyənləşdirərkən elmi idrakın bu və ya digər formasının xüsusiyyətləri əsas kimi götürülür, müəllimin idarəetmə fəaliyyəti özünə istiqamət müəyyən edir. Burada idarə edənin qarşısında iki mühüm vəzifə durur: 1) qarşıya qoyulmuş məqsədə uyğun olaraq, hər bir şagirdin əqli fəaliyyətində alqoritmik və evristik növlərin yerini dürüstləşdirmək; 2) analitik və yaxud evristik növlü əqli fəaliyyətin strukturuna uyğun olaraq, formal və dialektik məntiqin forma və metodlarından (təlim materialının xüsusiyyətlərinə və şagirdlərin imkanlarına uyğun) istifadənin mexanizmini müəyyənləşdirmək. Belə məntiqi əsaslarla idarə olunan prosesdə şagirdin yaradıcılıq fəaliyyətinə cəlb olunmasına əlverişli imkan yaranır. Başqa sözlə, burada göstərilən əsaslarla idarə olunan proses şagirdə elmi idrakda tətbiq olunan metodlardan müəllimin rəhbərliyi altında istifadə imkanı verir, onun yaradıcılıq təcrübəsinə, əqli fəaliyyətinin alqoritmik, analitik və evristik növlərinin qarşılıqlı əlaqədə, vəhdətdə inkişafına səbəb olur.

Biz belə hesab edirik ki, fəlsəfi anlayışlardan bu və ya digər səviyyədə təlim prosesinin və onun idarə olunması problemlərinin tədqiqində istifadə edilməsi o zama*n* müvəffəqiyyətli ola bilər ki, bu məsələyə məntiq, psixologiya və pedaqogika birlikdə baxsın, onlar bu elmlərin müvafiq nəticələri ilə uzlaşsın. Bu uzlaşmanın özü qnoseologiyanın, dialektikanın qanun və kateqoriyalarının məntiq, psixologiya və pedaqogikada metodoloji rolu ilə bilavasitə bağlıdır. Lakin təlim prosesinin idarə edilməsinin özünəməxsus nisbi müstəqilliyə malik olan məntiqi, psixoloji əsasları da vardır.

**Problemin elmi yeniliyi.** IV sənaye inqilabının çağırışlarına uyğun bərqərar olan gerçəklikdə təhsilin həyata keçirilmə yolunun emercent əlamətinin təhsilalanmərkəzli sistem olması ideyası irəli sürülmüş, onun nəzəri və texnoloji əsaslarının işlənilmə-

sinin zəruriliyi diqqət mərkəzinə çəkilmiş və sözügedən təlim sisteminin fəlsəfi-metodoloji əsaslarının interpretasiyası verilmişdir.

**Problemin praktik əhəmiyyəti.** IV sənaye inqilabının çağırışlarına uyğun bərqərar olan gerçəklikdə təhsilin həyata keçirilmə yolunun emercent əlamətinin təhsilalanmərkəzli sistem olması ideyası 1)daha mükəmməl təlim sisteminin nəzəri və texnoloji əsaslarının tədqiqatına və aşkarlanması prosesinə yön verir, 2) təhsilverənlərin praktiki fəaliyyətlərində məqsəd aydınlığına, səmərəli nəticələri hədəfləyən metodik sistemin formalaşdırılması prosesində yanlışlıqların azalmasına səbəb olur.

**Nəticə**. 1. Mükəmməl təlim sisteminin nəzəri və praktik əsaslarının işlənilməsi didaktikanın mərkəzi problemidir, daha səmərəli nəticələri hədəfləyən didaktik sistemlərin axtarışı zəruri və davamlı prosesdir; 2. Təhsilin həyata keçirilməsinin mühüm yolu kimi dərk olunan "mükəmməl təlim prosesi" IV sənaye inqilabının çağırışlarına uyğun bacarıqların formalaşmasını şərtləndirən təhsilalanmərkəzli emercent təbiəti ilə mövcud sistem kimi interpretasiya olunmalıdır; 3. Təlim prosesinin idarə olunması üçün elmin və praktikanın nailiyyətləri ilə ayaqlaşan elmi fəlsəfənin nəzəri-metodoloji əhəmiyyəti olduqca böyükdür və bu prosesində şagirdlərin idrak fəaliyyətinin idarə olunması, əqli qabiliyyətlərinin inkişafı yalnız o şərtlə mümkündür ki, təfəkkür prosesinin qanunauyğunluqları, elmi idrakın forma və metodlarının xüsusiyyətləri və dialektik əlaqələri daim nəzərə alınsın; 4. Təlim prosesinin idarə olunmasına öz-özlüyündə idrak məsələsi kimi baxmaq məntiqidir; 5. Təlim prosesində səmərəli nəticələrin reallaşdırılması üçün praktik pedaqoq tərəfindən idarəetmə fəaliyyətinin müəyyənləşdirilməsində gerçəkliyin dərk olunması və dəyişdirilməsi metodları haqqında dialektika və idrak nəzəriyyəsinin tərkibləri kimi ehtiva olunan komponentlərə istinad edilməsi məqsədəuyğundur.

**Ədəbiyyat:**


1. Abbasov, A.N. Pedaqogika: Müntəxəbat. Dərs vəsaiti / A.N. Abbasov, R.R. Məmmədzadə, L.A. Məmmədli. – Bakı: Mütərcim, – 2021. – 608 s.
2. Əlizadə, Ə.Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. / Ə.Ə. Əlizadə. - Bakı: Pedaqogika, -2004. – 432 s.
3. Əkbərov, M.S. Bilik haqqında nə bilirik? // Azərbaycan müəllimi. 1983, 13 və 20 may. – s. 4
4. Qaralov, Z.İ. Fizika qanunlarının tədrisi / Z.İ. Qaralov. - Bakı: Elm, - 1997. – 348 s.
5. Kazımov, N.M. Pedaqogika: Pedaqoji İnstitut və universitet tələbələri üçün dərslik / N.M. Kazımov, Ə.Ş. Həşimov. - Bakı: Maarif, - 1996. – 415 s.
6. Mirzəcanzadə, A.X. İxtisasa giriş/ A.X. Mirzəcanzadə. - Bakı: BDU nəşriyyatı, - 1990. – 368 s.
7. Metodika və pedaqogika: Yenilənmiş çərçivə sənədi əsasında: Vəsait / Maksimim Tədris mərkəzi, - 2024. -181 s.
8. Nəsirov, V.H. Elmi idrakın metod və formaları / V.N. Nəsirov, Ə.B. Məmmədov, - Bakı: Maarif , - 1980. – 148 s.
9. İbrahimov, F.N. Pedaqogika: Dərslik. 2 cilddə / F.N. İbrahimov, R.L. Hüseynzadə. - Bakı: Mütərcim , - c.1. – 2013. 708 s.
10. İbrahimov, F.N. Təlimdə alqoritmik və evristik fəaliyyətin optimal nisbətlərinin əsaslarına dair oçerklər / - Bakı: Mütərcim , -1998. – 398 s.
11. İbrahimov, F.N. Təlimin dərk edilməsinə "sistem-struktur" baxımından yanaşma / -Bakı: Mütərcim , - 1999. – s. 172.
12. Abbasov, A.N. Pedaqogika nəzəriyyəsi və tarixi: Ali təhsil müəssisələri üçün dərslik / A.N. Abbasov, L.A. Məmmədli, İ.B. Əmirəliyeva. -Bakı: Mütərcim, -2022. -464 s.
13. Махмутов, М.И. Теория и практика проблемного обучения / М.И. Махмутов . - Казань, Татарское книжное издательство, -1972. - 555 с.
14. Радионов, И.К. О природе интуиции.Сб.: Проблемы отражения и современная наука / И.К. Радионов . - М.: МГУ, - 1967. – 289 с.
15. Крымски, З.С. Научная проблема. Сб.: Логика научного исследования / З.С. Крымски. - М.: Мысль , - 1973. – 203 с.
16. Копнин, П.В. Диалектика как логика и теории / П.В. Копнин. - М.: Наука , - 1973. – 315 с.
17. Штофф, В.А. Введение и методологию научного познания / В.А. Штофф . - Л.:ЛГУ, - 1972. - 243 с.
18. Якиманская, И.С. Советская педагогика: Образное мышление и его место в обучении / И.С. Якиманская . - 1968, № 2. -165 с.


**E-mail:** firedun52@mail.ru

**Redaksiyaya daxil olub:** 02.12.2024.

*UOT 37.0*

***Fidan Emin qızı Əfəndiyeva***
*Bakı Slavyan Universitetinin baş müəllimi,*
*pedaqogika üzrə fəlsəfə doktoru*
*https://orcid.org/0000-0001-9119-8240*
*https://doi.org/10.69682/arti.2024.91(6).58-61*

# MƏKTƏBLƏRDƏ MÜƏLLİM BULLİNQİ VƏ ONUN UŞAQ ŞƏXSİYYƏTİNƏ TƏSİRİ

***Фидан Эмин гызы Эфендиева***
*старший преподаватель Бакинского Славянского Университета,*
*доктор философии по педагогике*
*https://orcid.org/0000-0001-9119-8240*

# БУЛЛИНГ УЧИТЕЛЯ В ШКОЛЕ И ЕГО ВЛИЯНИЕ НА ЛИЧНОСТЬ РЕБЕНКА

***Fidan Emin Afandiyeva***
*senior teacher at Baku Slavic University*
*doctor of philosophy in pedaqogy*
*https://orcid.org/0000-0001-9119-8240*

# TEACHER BULLYING AT SCHOOL AND ITS IMPACT ON THE CHILD'S PERSONALITY

**Xülasə.** Müasir cəmiyyətimizin və gəncliyimizin ən təhlükəli problemlərindən biri olan bullinqin geniş təsir dairəsinə çox təəssüf ki, məktəb də daxildir. Bu gün uşaqların bullinqə məruz qaldıqları sosial mühitlərin başında məktəb durur. Məktəblərdə bullinq təkcə uşaqlar arasında deyil, eyni zamanda müəllim-şagird arasında da baş verir. Məqalədə məktəblilərin müəllimləri tərəfindən bullinqə məruz qalmalarının səbəbləri araşdırılaraq, problemin həlli ilə bağlı bəzi pedaqoji tövsiyələr irəli sürülmüşdür.
***Açar sözlər :*** *məktəb, müəllim, bullinq, şiddət, psixoloji travma*

**Аннотация.** К сожалению, в сферу буллинга, являющегося одной из самых опасных проблем нашего современного общества и молодежи, входят и школы. Сегодня школа находится во главе социальной среды, где дети подвергаются буллингам. Буллинг в школах происходит не только между детьми, но и между учителями и учениками. В статье исследованы причины, по которым школьники подвергаются буллингам со стороны учителей, и предложены некоторые педагогические рекомендации по решению проблемы.
***Ключевые слова:*** *школа, учитель, буллинг, насилие, сихологическая травма*

**Abstract.** Unfortunately, the area of bullying, which is one of the most dangerous problems of our modern society and youth, also includes schools. Today, the school is at the forefront of a social environment where children are subject to bullying. Bullying in schools occurs not only between children, but also between teachers and students. The article examines the reasons why schoolchildren are bullied by teachers and offers some pedagogical recommendations for solving the problem.
***Keywords:*** *school, teacher, bullying, violence, psychological trauma*

Müasir dövrdə dünyanın bir çox ölkələrində fəaliyyət göstərən təhsil müəssisələrində pedaqoq, psixoloq və valideynləri narahat edən ən qabarıq və aktual problemlərdən biri də bu təhsil ocaqlarında təhsilalanların müxtəlif səbəblərdən təzyiq və aqressiv davranışlara, zorakılığa, təhqirlərə məruz qalmasıdır. Bu problemin belə geniş vüsət almasına, onun təkcə pedaqoji və psixoloji deyil, eyni zamanda cəmiyyətimizdə sosial problemə çevrilməsilə bərabər, mövcud problemin həlli,

onunla mübarizə metodlarının hələ də düzgün müəyyən edilməməsi səbəbidir. Bizim təzyiq, zorakılıq, təqib, psixoloji və fiziki şiddət adlandırdığımız bu davranışları müasir pedaqoq və psixoloqlar – "bullinq" (bullying) adlandırırlar.

İnsanların bir-birinə qarşı aqressiv davranışları kimi başa düşülən bullinq ingiliscədən kiməsə zərər yetirməyə, hədə-qorxu gəlməyə, məcbur və təqib etməyə meyllilik kimi mənalarda işlədilir. Bullinqin əsas göstəricilərindən biri bullinq adlandırdığımız davranışların davamlı olaraq təkrarlanması və onun adətən fiziki və emosional cəhətdən daha güclü olan uşaqlar tərəfindən digərlərinə nisbətən daha gücsüz, zəif və özünü müdafiə edəcək mövqedə olmayan şəxslərə qarşı törədilməsidir.

Bullinq əsasən ibtidai siniflərdən başlayaraq məktəbyaşlı uşaqların bir-birinə qarşı göstərdiyi, nəticədə uşaqların incidilməsinə səbəb olan ixtiyari və təkrar olaraq törədilmiş aqressiv davranışdır. Kiçik məktəb yaşı dövründən başlayan bullinq yuxarı sinirlərdə, daha sonra ali təhsil müəssisələrində, iş yerində, bir sözlə həyatımızın bir çox mərhələlərində rastlaşa biləcəyimiz bir prosesdir (1).

Müasir cəmiyyətimizdə bullinqin bir neçə əsas növü məlumdur: kiber, sosial, şifahi, psixoloji və fiziki zorakılıq.

***Kiber bullinq*** – son illərdə İKT inkişafı və onun istifadəçilərinin sayının həddən artıq çox olması ilə əlaqədar olaraq bullinqin ən geniş yayılmış növü hesab olunur. Statistik göstəricilərə əsasən deyə bilərik ki, müasir dövrümüzdə sosial şəbəkələr və mesajlar vasitəsilə insanları izləmək, onlara psixoloji təsir göstərmək, təhqir etmək, hədə-qorxu gəlmək hallarının sayı artmışdır.

***Fiziki bullinq*** – bullinqin bu növü birbaşa təmasa, fiziki zədəyə əsaslandığı üçün həyati təhlükəsi daha çoxdur. Buraya itələmək, vurmaq, bilərəkdən toxunmaq və s. daxildir. Hətta bu bullinq zamanı müxtəlif silahlardan, deşici və kəsici alətlərdən də istifadə olunması hallarına da rast gəlinir. Fiziki bullinq daha çox yuxarı sinif şagirdləri olan oğlanlar arasında baş verir.

***Şifahi bullinq*** – bir şəxsə şifahi formada təzyiq göstərmək, onun ünvanına təhqiramiz sözlərdən istifadə etmək, onu alçaltmaq, böhtan atmaq, etmədiyi bir hərəkətə görə günahlandırılmaq və s. kimi əməllər sayılır. Bullinqin bu növü daha çox qızlar arasında yayılıb.

***Sosial bullinq*** – şəxsin mənsub olduğu hər hansı bir qrupdan, kollektivdən, sosial mühitdən kənarlaşdırılması, təcrid edilməsi və ya yaxud ona qarşı kiçik qruplaşmalar yaratmaqla sıxışdırılmasıdır.

***Psixoloji bullinq***. Bullinqin bu növünə məruz qalan şəxs əsas psixoloji zorakılıqlar, təqib etmə, şəxsinə qarşı qərəzli münasibət və s. ilə rastlaşır.

XX əsrin 60-cı illərindən başlayaraq "mobbinq" anlayışı da meydana çıxmışdır. Məktəbdə mobbinq (ing. mob – kütlə, mobbing – sıxışdırmaq, kobudluq etmək, hücum etmək) anlayışına tez-tez rast gəlinir. Bu qurbanın sinifdə və ya məktəbdə "sıxışdırılması" üçün sistemli və məqsədyönlü təqib olunmasını nəzərdə tutan bir qrup təcavüzkar (mobberlər) ilə qurbanları arasındakı münasibətdir (2, s. 8). Məhz məqaləmizdə də müzakirə edəcəyimiz problem məktəbdə müəllimlər tərəfindən müəyyən qrup uşaqlara qarşı həyata keçirilən pedaqoji bullinqlə bağlıdır.

İlk dəfə məktəbə başlayan uşaq üçün müəllim yeni, eyni zamanda valideyndən sonra ikinci bir nüfuzlu şəxsdir. Bəzən kiçik yaşlı məktəblilərin gözündə müəllimin nüfuzu valideyndən belə yüksək olur. Çünki yeni sosial mühitə adaptasiya olmağa çalışan məktəbli üçün bələdçi rolunu oynayan müəllim hətta onun təlim nəticələrinə və təhsildəki nailiyyətlərinə belə təsir göstərir.

Çox təəssüf ki, bəzən məktəblərdə müəllimlərin uşaqlara qarşı önyarğılı davranması, onların dərs zamanı cavablarını və qabiliyyətlərini bütün sinif qarşısında müzakirə obyektinə çevirərək lağa qoyması, xarici görünüş və ya hər hansı bir qüsurlarına görə kobud və qeyri-etik sözlərlə alçaldılması hallarına da rast gəlinir. Bu qəbildən olan halların qərəzli olaraq hər hansı bir şagirdə qarşı təkrarlanması bullinqin bariz nümunəsidir.

Təhsil müəssisələrində müəllimlər tərəfindən bullinqin həyata keçirilməsi əsasən bir sıra səbəblərlə bağlıdır ki, bunların başında müəllimin peşə və ixtisas səviyyəsinin aşağı olması, peşə kompetensiyalarına yiyələnə bilməmələri, kifayət qədər pedaqoji təcrübələrinin olmaması, müəllimin psixoloji durumunda və şəxsi həyatında problemlərin olması, müəllimin uşağın valideyni ilə konfliktinin olması və bir çox məsələlər durur.

Əksər hallarda müəllimlərini özlərinə örnək götürən şagirdlər müəllimlərinin bütün sinif qarşısında şagirdi alçaltması, fiziki güc tətbiq etməsi, onun ünvanına təhqiramiz sözlər işlətməsi kimi neqativ halları da özlərinə nümunə götürərək zamanla bu davranışları özləri də təkrarlayacaqdır. Məhz bu səbəbdən də müəllimlər şagirdlərinə qarşı daha diqqətli və həssas olmalıdırlar.

Bəzən müəllimlər özləri də bilmədən bullinqi təbliğ edir, onun səbəbkarına çevrilirlər. Müəllim hər hansı şagirdə qarşı qərəzli mövqedə olmasa belə, lakin istəmədən sinifdə elə vəziyyət yarada bilər ki, digər uşaqlar ona qarşı çıxar. Müəllim hər hansı bir şagirdə qarşı birbaşa deyil, dolayı yolla olsa belə neqativ bir fikir söyləsə, onun bu davranışı sinif yoldaşlarını uşağa qarşı qaldıra bilər (3).

Son dövrlər müasir psixo-pedaqoji ədəbiyyatlarda bullinqdan danışarkən “ostrakizm” anlayışına da rast gəlinir. Ostrakizm (qədim yunan ὁ ὀστρακισμός, τὸ ὄστρακον sözündən götürülüb), hərfi mənası “kirəmit və ya saxsı parçası” deməkdir (7). Qədim Yunanıstanda xalq məclisinin qərarı ilə vətəndaşın səsvermə vasitəsi olan kirəmit parçaları ilə ölkədən qovulması kimi başa düşülürdü. Günümüzdə isə insanın onu əhatə edən cəmiyyət tərəfindən nifrətlə qarşılanması, qəbul edilməməsi, ələ salınması mənasını verir. Bu terminin bullinqlə sinonim kimi işlədilməsi təsadüfü deyildir. Çünki müəllim öz davranışı ilə sinif kollektivini kiməsə qarşı ayaqlandıra, qaldıra bilər.

Bəs məktəbdə bullinqin əlamətləri hansılardır?

İlk olaraq uşaq ***məktəbə getməkdən imtina edir və ya zamanla dərslərindən yayınır***. Əlbəttə ki, bir çox uşalar xüsusən də kiçik məktəb yaşı dövründə yorulduqları, dərslərinə hazır olmadıqları və s. kimi səbəblər üzündən məktəbə getmək istəməyə bilər. Amma əgər uşaq mütəmadi olaraq dərslərindən yayınırsa, müxtəlif bəhanələr gətirərək, ağlayaraq dərsə getmək istəmirsə, mütləq ki, bunun səbəbini araşdırmaq lazımdır.

Digər bir əlamət: uşaq hər hansı ***bir fəndən zəif qiymətlər alır.*** Əgər uşağın bütün dərslər üzrə göstəriciləri yaxşıdırsa və yalnız bir fəndən qiymətləri aşağıdırsa, bunun üzərində durmaq lazımdır. Bu kimi halların əsas səbəbi uşağın konkret bir fənni oxumaq istəməsi deyil, o fənni tədris edən müəllimin ona qarşı davranışından irəli gəlir.

Müəllim tərəfindən şagirdə qarşı həyata keçirilən bullinqin digər bir əlaməti də ***uşaqda özünüqiymətləndirmənin, özgüvənin aşağı olmasıdır***. Hər zaman uşağın gözündə böyük nüfuza malik olan müəllim öz yanlış hərəkəti, ona qarşı qeyri-obyektiv hərəkətləri və təzyiqi ilə uşaqda özgüvəni və özünü qiymətləndirməni aşağı sala bilər.

Başqa bir əlamət olaraq ***uşağın öz məktəbi və sinif yoldaşları haqqında danışmaq istəməməsini*** göstərmək olar. Bu kimi hallar özünü adətən özünə təlim fəaliyyətini əsas məşğuliyyət növü kimi qəbul edən, bu sahədə özünü reallaşdırmağa çalışan 7-10 yaşlı kiçik yaşlı məktəblilər arasında daha çox büruzə verir. Çünki adətən öz sinif yoldaşları, məktəbi, müəllimləri haqqında həvəslı danışan uşaq birdən-birə susqunlaşır, özünə qapanır, valideynlərinin məktəb və dərsləri ilə bağlı ona ünvanladığı suallarını cavabsız qoyur.

Məktəbdə bullinqi şərtləndirən beşinci əlamət uşağın ***məktəb və müəllim qorxusudur***. Məktəbdə müəllim tərəfindən bullinqə məruz qalan uşaq təbii olaraq təkcə həmin müəllimdən yox, eyni zamanda digər müəllimlərdən, ümumiyyətlə məktəbə getməkdən qorxur. Çünki travmatik vəziyyət yaradan hadisələri kompleks şəkildə qəbul edir.

Bütün yuxarıda sadaladığımız əlamətlərə əsasən deyə bilərik ki, bullinqin digər növlərində olduğu kimi fiziki və ya mənəvi olmasından asılı olmayaraq, bütün hallarda məktəbdə müəllimləri tərəfindən bullinqə məruz qalan uşaqların hər biri psixoloji travma alır, bunun nəticəsi olaraq bu uşaqlarda özünüqiymətləndirmə aşağı olur, hər zaman özlərini günahkar görürlər, aqressiv olurlar. Hətta yeniyetmələr arasında bullinq özünəqəsd hallarına belə gətirib çıxara bilir.

Bu problemin ciddiliyi ondan ibarətdir ki, əgər müəllim sinif qarşında bir uşağı alçaldarsa, o zaman onun hərəkətini nümunə götürən digər şagirdlər, xüsusən də kişik yaşlı məktəblilər də bir müddət sonra bullinqə başlayacaqlar. Beləliklə də müəllim tərəfindən sevilməyən şagird, qısa bir zamanda sinif yoldaşlarının da sevmədiyi birinə çevrilir (6, s. 24).

Bəs bullinqin uşaq psixologiyasına vurduğu zərbəni aradan qaldırmaq və ya ümumiyyətlə bu tipli halların qarşısını almaq üçün nə etməli?

- İlk növbədə mövcud vəziyyəti sakit və obyektiv qiymətləndirərək yaranmış problemin həlli məqsədilə bullinqi həyata keçirən müəllimlə danışmaq;

- Əgər müəllimin uşağa qarşı olan iradları obyektiv və əsaslıdırsa mütləq ki, uşaqla danışmaq;
- Məsələyə aydınlıq gətirmək və onun həlli üçün, ehtiyac olduğu halda məktəb psixoloqu və rəhbərlikdən yardım istəmək;
- Daxili imkanlar hesabına problemin həlli mümkün olmadıqda uşağın təhsil aldığı məktəbi dəyişmək;
- Uşağın billinqin nəticəsində aldığı psixoloji travmanı aradan qaldırmaq və onda özgüvəni yüksəltmək üçün psixoloq dəstəyi almaq və s. (4).

Qeyd etmək lazımdır ki, istənilən halda, səbəbi nə olursa-olsun, müəllim heç bir vəcdlə təhsil və tərbiyəsi ona etibar olunan uşağa qarşı bullinq törədə bilməz.

Yuxarıda sadalanan müddəalara əlavə olaraq deyə bilərik ki, uşağının müəllim tərəfindən bullinqə məruz qaldığına əmin olan valideyn, qeyd etdiyimiz kimi mövcud vəziyyətə aydınlıq gətirmək üçün ilk növbədə müəllimin özü ilə danışmalıdır. Əgər müəllim ünsiyyətdən qaçarsa və yaxud reallığı qəbul etməzsə, artıq o zaman valideyn qanuni yolla şifahi və ya yazılı formada məktəb rəhbərliyinə müraciət edərək problemin obyektiv həllini tələb edə bilər. Məktəb rəhbərliyi də öz növbəsində problemi həll etmək iqtidarında olmadıqda, valideyn daha üst qurumlara müraciət etmək hüququna malikdir (5).

Beləliklə deyə bilərik ki, məktəb bullinqi çox qəliz, qarışıq və əsasən də sosial bir problemdir. Uşaqların məktəbdə bullinqlə üzləşməməsi üçün məktəbin doğru seçilməsi də çox önəmlidir. Burada valideynin üzərinə böyük vəzifə düşür. Çünki xüsusən də aşağı siniflərdə sinif müəlliminin seçimi onlardan asılıdır. Bu seçimi edən valideyn müəllimin ünsiyyət və davranış mədəniyyətinə, mimika və jestlərinə, sinfi necə idarə etməsinə, uşaqlara yanaşmasına fikir verməlidir. Müəllimin savadlı olması hər şeyi həll etmir. Müəllim həm də seçdiyi peşəsini və uşaqları sevməlidir.

Tədqiqatlar göstərir ki, məktəbdə müəllim-şagird arasında baş verən pedaqoji billinq onun fiziki və ya mənəvi olmasından asılı olmayaraq, uşağa bütün həyatı boyu təsirindən çıxa bilməyəcəyi psixoloji travma yaşadır. Bu qəbildən olan uşaqlar adətən aşağı özünüqiymətləndirmə, güvən əskikliyi və özlərindən zəiflərə qarşı aqressiv davranışları ilə xarakterizə olunurlar. Bu tipli halların baş verməməsi üçün təhsil sahəsində işə götürənlər təkcə akademik savadını yox, həm də müəllimin psixoloji sağlamlığını da diqqətdən kənarda qoymamalıdırlar. Çünki əksər hallarda gənc müəllimlərin əksəriyyəti sinfi idarə etməkdə təcrübəsiz olduqları üçün onların təcrübəsizliyi siniflərdə şagird intizamsızlığına və bunun nəticəsi kimi pedaqoji bullinqa gətirib çıxara bilər. Bu səbəbdən də MİQ imtahanını uğurla keçən müəllimlərin yeni tədris ili başlayana qədər sinfi idarəetmə və pedaqoji ünsiyyətlə bağlı təlimindən keçmələri məqsədəuyğun hesab olunur.

**Problemin aktuallığı.** Məktəblərdə müəllim bullinqi, yəni müəllimlərin şagirdlərə qarşı qərəzli davranışları, təzyiq və ya aşağılayıcı münasibət göstərməsi, son dövrlərdə təhsildə müzakirə olunan mühüm problemlərdən biridir. Bu fenomen, yalnız uşaqların emosional və psixoloji inkişafına deyil, eyni zamanda onların akademik nailiyyətlərinə də ciddi təsir göstərə bilər.

Müəllim bullinqinin qarşısını almaq və onunla mübarizə aparmaq üçün, məktəb mühitinin daha dostyana, dəstəkləyici və inklüziv olması vacibdir. Uşaqların hüquqlarını müdafiə edən proqramlar, müəllimlərin peşəkar inkişafı və məktəbdə müsbət münasibətlərin təşviqi bu problemə qarşı atılacaq önəmli addımlardır. Nəticədə, müəllim bullinqinin aradan qaldırılması, uşaqların sağlam inkişafı və uğurlu gələcəyi üçün mühüm əhəmiyyət kəsb edir.

**Problemin praktik əhəmiyyəti.** Müəllim bullinqini aradan qaldırmaq, məktəb mühitini daha sağlam, inklüziv və dəstəkləyici etməyə imkan tanıyır. Bu, uşaqların psixoloji sağlamlığını qorumaqla yanaşı, onların sosial bacarıqlarını inkişaf etdirir və akademik uğurlarını artırır. Nəticədə, belə bir mühit, gənclərin gələcəkdə uğurlu, sağlam fərdlər kimi yetişməsinə böyük töhfə verir.

**Ədəbiyyat:**

1. Əlizadə Ə.Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı, 2004, 432 s.
2. Həsənova G.A., Məmmədova M.C. Məktəbdə bullinq. Bakı, 2021, 157 s
3. Бочавер А.А., Жилинская А.В., Хломов К.Д. Школьная травля и позиция учителей // Социальная психология и общество. 2015. Т. 6. № 1. С. 103–116.
4. Кон И. Что такое буллинг и как с ним бороться // Семья и школа. 2006. № 11. С. 15-18.
5. Литвинова М. Горький урок: как справится с учителем. Известия, 22 август , 2021

6. Ожиёва Е. Н. Буллинг как разновидность насилия. Школьный буллинг / Сборник докладов конференции. Научная индустрия европейского континента. Белгород: Руснаучкнига, 2008.

*UOT 351.85*

***Мариана Вячеславовна Кернерман***
*заместитель декана факультета государственной культурной политики Московский государственный институт культуры, кандидат педагогических наук, доцент*
*https://orcid.org/ 0009-0009-4269-0293*
*https://doi.org/10.69682/arti.2024.91(6).62-66*

# ПЕДАГОГИЧЕСКИЙ ПОТЕНЦИАЛ ИВЕНТ-ТЕХНОЛОГИЙ В ОРГАНИЗАЦИИ КУЛЬТУРНО-ДОСУГОВЫХ ПРОГРАММ

***Mariana Vyaçeslavovna Kernerman***
*Moskva Dövlət Mədəniyyət İnstitutunun Dövlət Mədəniyyət Siyasəti fakültəsinin dekan müavini, pedaqoji elmlər namizədi, dosent*

# MƏDƏNİ-ASUDƏ PROQRAMLARININ TƏŞKİLİNDƏ İVENT-TEXNOLOGİYALARIN PEDAQOJİ İMKANLARI

***Mariana Vyacheslavovna Kernerman***
*deputy dean of the faculty of State Cultural Policy at Moscow State Institute of Culture, doctor of philosophy in pedagogy, associate professor*

# PEDAGOGICAL POTENTIAL OF EVENT TECHNOLOGIES IN THE ORGANIZATION OF CULTURAL AND LEISURE PROGRAMS

**Аннотация.** В статье рассматривается интеграция ивент-технологий в организации культурно-досуговых программ. Основное внимание уделяется педагогическому потенциалу этих технологий и их роли в формировании ценностных ориентиров, развития социального взаимодействия и поддержки самоидентификации личности.

Анализируются существующие подходы и концепции, касающиеся использования ивент-технологий в рамках культурно-досуговых программ. Также рассматривается влияние ивент-технологий на развитие личности, формирование положительного имиджа организаций и повышение уровня культурной активности населения. Предлагаются рекомендации по внедрению ивент-технологий в культурно-досуговую практику, акцентируя внимание на важности адаптации программ к потребностям различных целевых групп. Статья предназначена для исследователей, педагогов, организаторов мероприятий и всех заинтересованных в развитии культурно-досуговой деятельности.

***Ключевые слова:*** *ивент-технологии, культурно-досуговые программы, педагогический потенциал, социальное взаимодействие, творчество*

**Xülasə.** Məqalədə mədəni-asudə proqramlarının təşkilində ivent texnologiyalarının inteqrasiyasından bəhs edilir. Əsas diqqət bu texnologiyaların pedaqoji potensialına və onların dəyər oriyentasiyalarının formalaşmasında, sosial qarşılıqlı əlaqənin inkişafında və fərdi özünüidentifikasiyanın dəstəklənməsində roluna verilir.

Mədəni-asudə proqramları çərçivəsində ivent-texnologiyalarından istifadə ilə bağlı mövcud yanaşmalar və konsepsiyalar təhlil edilir. İvent-texnologiyalarının şəxsiyyətin inkişafına, təşkilatların müsbət imicinin formalaşmasına və əhalinin mədəni fəallığının artırılmasına təsiri də nəzərdən keçirilir. Proqramların müxtəlif hədəf qruplarının ehtiyaclarına uyğunlaşdırılmasının vacibliyini vurğulayaraq, ivent- texnologiyalarının mədəni-asudə praktikasına inteqrasiyası üçün tövsiyələr təklif olunur. Məqalə tədqiqatçılar, müəllimlər, tədbir təşkilatçıları və mədəni-asudə fəaliyyətinin inkişafı ilə maraqlanan hər kəs üçün nəzərdə tutulub.

***Açar sözlər:*** *ivent-texnologiyaları, mədəni-asudə proqramları, pedaqoji potensial, sosial qarşılıqlı əlaqə, yaradıcılıq.*

**Abstract.** The article examines the integration of event technologies in the organization of cultural and leisure programs. The main attention is paid to the pedagogical potential of these technologies and their role in the formation of value orientations, the development of social interaction and support for self-identification of the individual.

Existing approaches and concepts regarding the use of event technologies within cultural and leisure programs are analyzed. The impact of event technologies on personality development, forming a positive image of organizations and increasing the level of cultural activity of the population is also considered. Recommendations for integrating event technologies into cultural and leisure practice are offered, emphasizing the importance of adapting programs to the needs of different target groups. The article is intended for researchers, teachers, event organizers and all those interested in the development of cultural and leisure activities.

***Keywords:*** *event technologies, cultural and leisure programs, pedagogical potential, social interaction, creativity.*

Организация свободного времени является важным аспектом формирования и развития личности. Как человек использует имеющееся у него свободное время, свидетельствует об уровне его развития в культурном, моральном и духовном плане. Ивент-технологии направлены на всестороннее развитие личности посредством мероприятий, разработанных на основе запросов и интересов общества.

Досуг, как процесс осознанной деятельности человека, направленный на познание и развитие собственной личности в системе окружающего мира в условиях свободного времени, исследовали многие современные педагоги – Выготский, Л.С. Жаркова, Т.Г. Киселева, Н.Е. Ярошенко и другие.

Культурно-досуговые программы, как форма рекреационно-развивающей деятельности, содержание которой включает в себя комплекс синтезированных видов культурной активности личности в досуговой деятельности исследовали ученые А.Д. Жарков, М.В. Кернерман, Ю.А. Стрельцов.

Ивент-технологии рассматривали в своих научных исследованиях Д.Д. Каннер, Е.В.Кривошеева, М.Л. Калужский, В.Д Музыкант и др.

Границы ивент-технологий в сфере досуговой деятельности открывают новые возможности для активного и всестороннего развития личности через участие в культурно-досуговых.

Понятие «ивент-технологии» объединяет два ключевых термина.

Ивент – событие, направленое на достижение различных целей, которые могут носить характер образовательный, развлекательный или коммерческий – развлечение, обучение, реклама или корпоративные коммуникации, могут включать в себя концерты, выставки, конференции, тренинги и различные фестивали.

Технологии в данном контексте представляют собой набор креативных (творческих и технических) инструментов, используемых для планирования, организации и проведения мероприятий. Это могут быть как традиционные подходы, так и современные цифровые решения, включающие социальные сети, приложения для управления событиями, онлайн-платформы.

Ивент-технологии, представляют целостный подход, сочетающий в себе комплекс инновационных инструментов, выстраиваемый на основе потребностей целевой аудитории и вызывающий у них яркие эмоции и желание погрузится в предлагаемую программу. Эти технологии объединяют методы современной педагогики и маркетинговых коммуникаций, при этом организаторы могут развивать личностные качества участников, формировать коммуникативные навыки и расширять границы креативности в досуговой деятельности.

Педагогический потенциал ивент-технологий заключается не только в их способности удовлетворять личные запросы в организации досуга, но и выявлять и развивать личные качества, а также формировать коммуникативную культуру, что делает ивент-технологии инструментом как для образовательных, так и для развлекательных мероприятий.

Ивент-технологии как ресурс развития личности выполняют ряд функций: информативную, педагогическую, мотивационную,

эстетическую, рекреационную и функцию социализации.

Рассматриваемые технологии основываются на следующих принципах: принцип гуманизации, подразумевающий формирование духовно-нравственного сознания личности и ее гуманистического мировоззрения; принцип соответствия – направленность на возраст и интересы аудитории; принцип вариативности, т.е. возможности выбора участниками вида деятельности.

Ученый педагог Л.С. Выготский в контексте ивент-технологий в культурно-досуговых программах может быть реализовано несколькими способами: Концепция Л.С. Выготского [1, с.158] акцентирует внимание на значении социального контекста для обучения и развития личности. Основные аспекты его теории можно применить к ивент-технологиям в культурно-досуговых программах следующим образом: Концепция Л.С. Выготского акцентирует внимание на значении социального контекста для обучения и развития личности. Основные аспекты его теории можно применить к ивент-технологиям в культурно-досуговых программах/

Социальное взаимодействие: ивенты, организуемые в рамках культурно-досуговых программ, создают пространство для общения и взаимодействия между участниками. Это помогает развивать навыки совместной работы, разрешения конфликтов и коммуникации.

Зона ближайшего развития: Выготский ввел понятие зоны ближайшего развития (ЗБР), которая описывает потенциальный уровень развития учащегося с помощью помощи более опытного человека. В контексте ивент-технологий, организаторы могут создавать мероприятия, где участники могут учиться друг у друга, получая поддержку от более опытных или старших участников.

Культурный контекст: Ивенты могут содержать элементы культуры, традиций и норм общества, что способствует формированию идентичности и пониманию социокультурных особенностей. Это помогает участникам лучше осознать свою роль в сообществе и вносить вклад в его развитие.

Интерактивные форматы обучения: Использование игр, мастер-классов и других интерактивных форматов в ивент-технологиях может значительно повысить вовлеченность участников и облегчить усвоение новых знаний и навыков.

Обратная связь: Организация ивентов также включает в себя возможность получения обратной связи от участников, что позволяет учитывать их мнения и улучшать дальнейшие мероприятия.

Применение этих принципов в ивент-технологиях позволяет не только передавать знания, но и формировать у участников необходимые социальные и жизненные навыки, а также ценности, важные для развития их личности.

Культурно-досуговые программы всегда имеют особый интерес в обществе. Именно такие программы отвечают на поставленные вопросы социальных групп населения. Культурно-досуговая программа - Культурно-досуговая программа в концепции Жаркова [2, с.130] рассматривается как интегративная форма организации досуга, направленная на развитие личности через активное участие в культурных и образовательных мероприятиях. Она включает в себя разнообразные виды деятельности, которые способствуют не только развлечению, но и саморазвитию, социализации и формированию ценностных ориентаций. Жарков подчеркивает важность взаимодействия участников, что позволяет создать пространство для обмена опытом и формирования общих интересов, что, в свою очередь, способствует гармоничному развитию личности в условиях современного общества.

Интеграция ивент-технологий в культурно-досуговые программы привлечет дополнительную аудиторию и создаст популярный современный контент программы:

1. Создание совместных проектов – ивент-технологии могут предусматривать организацию мероприятий, где участники работают в командах, что способствует взаимодействию и обмену знаниями. Это может быть, например, создание арт-выставок, театральных выступлений или спортивных мероприятий.

2. Проведение мастер-классов, на которых более опытные участники могут делиться

своими знаниями и навыками, при этом будут устанавливаться социальные связи.

3.Формирование сообществ: Ивент-технологии могут помочь в создании платформ для общения и взаимодействия людей с общими интересами. Это могут быть клубы по интересам, тематические группы и т.д., что также поддерживает идею социализации через общие действия.

4. Интерактивные форматы: Использование различных интерактивных форматов (игры, квесты, тренинги) позволит участникам активно взаимодействовать друг с другом, что также соответствует принципам социального обучения.

5. Обратная связь и рефлексия: Включение процессов обратной связи, например, обсуждение после мероприятий о пережитом опыте, позволит участникам лучше осознать свои действия, а также научиться учитывать мнение других.

Эти подходы помогут не только развивать личные качества участников, но и формировать у них навыки взаимодействия и командной работы, что очень важно в современном социум.

Концентрация в общественном сознании идей, целей и ценностей организации на общем культурном направлении в настоящее время являются залогом долгосрочной конкурентоспособности и эффективности деятельности предпринимательской инициативы, что во многом обуславливается взаимопроверкой этих аспектов с присутствующими в общественном и индивидуальном сознании морально-ценностных установок.

Ивент-технологии поддержания общественный спрос и катализатором, поддерживающим интерес аудитории к предоставляемым услугам и, соответственно, актуальным методом повышения социальной значимости предпринимательской деятельности в сознании аудитории.

Ивент-технология формируют культурные ценности участков культурно-досуговой программы, создают у участников ощущение свободы в своем выборе и эффекта освобождения от традиционного уклада их жизни, возможность уйти от повседневности и погрузиться в атмосферу праздника.

В итоге, ивент-мероприятие с точки зрения того, как воспринимает его участник, должно удовлетворять его культурные представления и социальные ожидания, быть интересным и комфортным, а также активно вовлекающим в процесс. В этом случае мероприятия становятся определенным пространственно-временным феноменом, которому свойственна определенная концептуальная и эмоциональная уникальность.

Интеграция ивент-технологий, таких как, цифровые платформы, интерактивы, социальные сети, виртуальная и дополненная реальность, а также ауди-визуальные технологии не только повышают качество и привлекательность событий, но и способствуют развитию культурных идентичностей, формируя духовно-нравственный уровень и уникальные впечатления молодых людей.

Использование ивент-технологий как ресурса развития личности подразумевает применение методов организации досуга, способных воздействовать на поведенческо-деятельностную сферу личности. Данные методы позволяют включать аудиторию в различные виды деятельности, которые посредством яркой эмоциональной окраски способствуют проявлению положительных личностных качеств. Event-технологии предполагают наличие свободы выбора и ориентацию на личностные потребности, что позволяет целенаправленно влиять на развитие современной личности.

**Актуальность исследования:** С учетом быстрого прогресса общества и цифровых технологий наблюдается необходимость постоянного исследования и улучшения ивент-технологий в контексте культурно-досуговых программ.

Это способствует повышению культурной вовлеченности, а также развитию новых форм взаимодействия между организаторами и аудиторией.

Таким образом, постоянное совершенствование и адаптация ивент-технологий становится важным условием успешного продвижения культурных инициатив и программ, которые учитывают потребности и интересы современной общественности.

**Научно-теоретические новизна исследования.** Ивент-технологии являются существенным инструментом в организации педагогического процесса молодых людей, вовлекая их в процесс обучения через практическое участие.

Современные цифровые решения позволяют сделать мероприятие не только более привлекательным для аудитории, но и значительно повысить его эффективность и взаимодействие с участниками. В контексте образования и культурного досуга ивент-технологии играют создают уникальный опыт вовлеченности в творческий процесс, участников.

**Практические значимость работ** заключается в том что, в массовых мероприятиях, таких как Дни города, социально-культурные фестивали, жители могут познакомиться с местной культурой, историей и традиции, через современные зрелищные инновационные формы, которые позволяют создать не только атмосферу праздника и взаимодействия, но и увеличить охват аудитории, выявить интерес к предлагаемой теме и развивать способность к самообразованию и формированию информального образования.

**Литература:**


1. Выготский, Л. С. Психология искусства. Москва, Издательство Юрайт, 2024. — 414 с.
2. Жарков А.Д. Теория и технология культурно-досуговой деятельности, учебник. Москва, МГУКИ, 2007. 479 с.
3. Кернерман М.В. Развитие художественных умений и навыков у молодежи в учреждениях культуры. Монография. Москва, ИНФРА-М, 2018. 115 с.
4. Каннер Д.Д. Эффективная система корпоративного управления на предприятии сферы услуг (на примере сферы event-менеджмента) // Инновации. Наука. Образование. 2021. – № 36. С. 1986-1991.
5. Музыкант, В. Л. Основы интегрированных коммуникаций: теория и современные практики в 2 ч. Часть 2. SMM, рынок M&A : учебник и практикум для вузов. Издательство Юрайт, 2024. 501с


**E-mail:** vivat_co@mail.ru
**Redaksiyaya daxil olub:** 28.11.2024

*UOT 37.0*

***Nərgiz Edvinovna Əhmədova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Məktəbəqədər təhsilin pedaqogikası kafedrasının baş müəllimi*
*https://orcid.org/0009-0000-9309-1383*
*https://doi.org/10.69682/arti.2024.91(6).67-72*

## BMT-nin DAYANIQLI İNKİŞAF MƏQSƏDLƏRİ PROQRAMINDA TƏHSİLİN İNKİŞAF KONSEPSİYASI

***Наргиз Эдвиновна Ахмедова***
*старший преподаватель кафедры Дошкольной педагогики*
*Азербайджанского Государственного Педагогическкого Университета*

## КОНЦЕПЦИЯ РАЗВИТИЯ ОБРАЗОВАНИЯ В ПРОГРАММЕ ЦЕЛЕЙ УСТОЙЧИВОГО РАЗВИТИЯ ООН

***Nargiz Edvinovna Ahmadova***
*senior teacher of the departament of Pedagogy of*
*preshool education of Azerbaijan State Pedagogical University*

## DEVELOPMENT CONCEPT OF EDUCATION IN THE UN SUSTAINABLE DEVELOPMENT GOALS PROGRAM

***Xülasə.*** BMT-nin dayanıqlı inkişaf məqsədləri proqramı təhsilin inkişaf etdirilməsi qarşısında bir sıra mühüm vəzifələr qoyur. Bunlar ilk növbədə təhsilin inkişaf istiqamətlərinin müəyyənləşdirilməsi ilə bağlıdır. Bu baxımdan məqalədə dayanıqlı inkişaf konsepsiyası kontekstində respublikamızda təhsilin inkişaf etdirilməsinin aşağıdakı bir sıra mühüm konsepsiyaları xarakterizə edilmişdir: 1) təhlükəsiz inkişaf konsepsiyasının həyata keçirilməsi; 2) təhsilin cəmiyyətin inkişafına yönəldilməsi; 3) təhsilin sosial, iqtisadi, siyasi kontekstlə əlaqələndirilməsi; 4) dayanıqlı inkişaf konsepsiyasının şəxsiyyət, onun cəmiyyətdəki yeri haqqında təsəvvürlərin metodoloji əsası kimi qəbul edilməsi; 5) təhsilin məzmunu və metodlarının davamlı inkişaf konsepsiyasının əsas prinsiplərinə söykənməsinin təmin edilməsi; 6) əhalinin böyük sosial-demoqrafik qrupunu təşkil edən tələbə gənclərin cəmiyyətimizin tərəqqisi və dayanıqlı inkişafı təmin etmək üçün onların potensialdan səmərəli istifadə edilməsi.
***Açar sözlər:*** *dayanıqlı inkişaf; təhsil; konsepsiya; kontekst; paradiqma.*

**Аннотация.** Программа ООН «Цели устойчивого развития» ставит ряд важных задач по развитию образования. Они в первую очередь связаны с определением направления развития образования. В связи с этим в статье характеризуются следующие важные концепции развития образования в нашей стране в контексте концепции устойчивого развития: 1) реализация концепции безопасного развития; 2) направление образования на развитие общества; 3) связь образования с социальным, экономическим, политическим контекстом; 4) принятие концепции устойчивого развития как методологической основы представлений о личности, ее месте в обществе; 5) обеспечение того, чтобы содержание и методы образования основывались на основных принципах концепции устойчивого развития; 6) эффективное использование потенциала студенческой молодежи, составляющей большую социально-демографическую группу населения, для обеспечения прогресса и устойчивого развития нашего общества.
***Ключевые слова:*** *устойчивое развитие; образование; концепция; контекст; парадигма.*

**Abstract.** The UN Sustainable Development Goals program sets a number of important goals for the development of education. These are primarily related to determining the direction of development of education. In this regard, the article characterizes the following important concepts of the development of education in our country in the context of the concept of sustainable development: 1) implementation of the concept of safe

development; 2) directing education to the development of society; 3) linking education with social, economic, political context; 4) acceptance of the concept of sustainable development as a methodological basis of ideas about the personality, its place in society; 5) ensuring that the content and methods of education are based on the basic principles of the concept of sustainable development; 6) effective use of the potential of student youth, who form a large socio-demographic group of the population, to ensure the progress and sustainable development of our society.
***Keywords:*** *sustainable development; education; concept; context; paradigm*

Dayanıqlı inkişafa keçid ilk növbədə cəmiyyətin gələcəkdə hansı tip insan formalaşdıracağından asılıdır. Fərdi şüurun inkişaf səviyyəsini, onun şəxsiyyətlərarası əlaqələrinin xarakterini və dolğunluğunu, sosial həyata qatılma dərəcəsini onun dəyələri, motivləri təyin edir. Bunlara isə cəmiyyət təhsil sahəsində dayanıqlı inkişafın hədəflərinə uyğun gələn siyasətlə nail ola bilər.

Məhz bu baxımdan dayanıqlı inkişaf konsepsiyasının pedaqogika nəzəriyyəsi və tarixi çərçivəsində tədqiqini zəruri hesab edirik. Hesab edirik ki, məhz bu elm dayanıqlı inkişaf strategiyasını möhkəmləndirmək, onun anlayışlar aparatını müəyyən etmək və onu ictimai şüura çatdırmaq iqtidarındadır.

Belə ki, bəşəriyyətin sağ qalma strategiyası kimi dayanıqlı inkişaf konsepsiyasının işığında təhsilin xüsusi rolu var. Müasir şəraitdə təhsil qlobal problemləri həll edəcək, sivilizasiyanın sağ qalması, biosferin qorunub saxlanması üçün öz töhfəsini verəcək insan yetişdirməli, onlara "insan-təbiət-cəmiyyət" sistemində təşəkkül tapmış münasibətlərin yeni mərhələsində yeni dəyərləri aşılamalıdır. Dayanıqlı inkişaf demək olar ki, cəmiyyətin məqsəd və dəyərlərində bir inqilabdır ki, onun da əsas istiqamətini istehlakçılıq prioritetlərinin mənəvi dəyərlərlə əvəz edilməsi təşkil edir. Hesab edirik ki, dayanıqlı inkişaf konsepsiyası bu gün təhsil nəzəriyyəsinin, pedaqogikanın ideoloji əsaslarının tərkibinə daxil edilməli və müasir dünyada təhsilin məqsəd və funksiyaları onun məqsəd və prinsipləri nöqteyi-nəzərdən dərk edilməlidir. Təhsil nəzəriyyəsi, pedaqogika gələcəkdə öz metodoloji əsaslarını qurmaq üçün dayanıqlı inkişaf konsepsiyasından istifadə etməlidir.

Belə bir suala cavab axtarmaq olar ki, təhsil ilə dayanıqlı inkişaf konsepsiyasının qarşılıqlı əlaqəsi nədə özünü büruzə verir? Bu suala cavab vermək üçün təhsilə aksioloji yanaşmanın imkanlarına müraciət etməliyik. Bu kontekstdə "davamlılıq" normalda inkişafın necə baş verməli olduğunu göstərir: inkişaf sosial cəhətdən ədalətli, ekoloji və qənaətcil olmalıdır. İnsan-təbiət-cəmiyyət triadasında harmoniyaya yönələn dayanıqlı inkişafın tədqiqində aksioloji yanaşma inkişaf (development) anlayışı ilə bağlı olan yeni dəyərləri, konsepsiyaları üzə çıxarmağa imkan verir. Onların arasında təhlükəsizlik, azadlıq, bərabərlik, həmrəylik, demokratiya, mədəniyyət və s. təməl dəyərlər qeyd olunur. Dayanıqlı inkişafın bu dəyərləri beynəlxalq təşkilatların demək olar ki, bütün sənədlərində daha konkret şəkildə öz əksini tapmışdır.

Belə konsepsiyalardan biri təhlükəsizlik (security) konsepsiyasıdır. Bu konsept çox vaxt "təhlükəsiz inkişaf" ("development security") və ya "inkişafın sekuritləşməsi" [2, s.78-94] kimi də işlədilir. Bu mənada, birincisi, təhlükəsizlik cəmiyyət və dövlətin də əsas dəyərlərindən biridir. Dayanıqlı inkişaf kontekstində isə söhbət sistemli təhlükəsizlikdən gedir. Təhsil isə insanın təməl hüquqlarından biri olmaqla, dayanıqlı inkişafın, ölkələr arasındakı sülhün və sabitliyin açarıdır və buna görə də qloballaşmadan təsirlənən cəmiyyətlərin həyatında və XXI əsrin iqtisadiyyatında səmərəli iştirak üçün zəruri vasitə kimi xidmət edir. Dayanıqlı inkişafa keçid şəraitində təhsil artıq bilik və mədəniyyətin ötən nəsillərdən indiki və gələcək nəsillərə translyasiyası vasitəsi kimi çıxış etmir. Təhsil dayanıqlı inkişafda bir proses olaraq uzunmüddətli iqtisadi inkişafın təmin olunmasında, ekoloji tarazlığın qorunmasında və sosial rifahın yüksəldilməsində lazımi qərarların qəbul edilməsi və həyata keçirilməsi haqqında biliklər verir. Cəmiyyət üçün təhlükə yaradan problemlərlə bağlı müvafiq qərarları qəbul etmək üçün lazımi bacarıqlar verməklə, cəmiyyətin təhlükələrdən qorunmasında və dayanıqlı inkişafın hər bir mərhələsində ortaya fərqli baxış və qiymətləndirmələrin meydana çıxmasına səbəb olmaqla, təhsil milli prioritetlərdən biri, milli təhlükəsizliyin təmin edilməsinin əsasını təşkil edir.

İkincisi, təhsil cəmiyyətin rifahını və dayanıqlı inkişafını təyin edən əsas qurumlardan

biridir. Təhsil sistemi gələcəkdə insanın rifahına töhfə verir, adambaşına daha yüksək istehsal və daha yüksək məhsuldarlığı təmin edir. Eyni zamanda, təhsil mövcud rifahla əlaqəlidir, çünki tədqiqatlar göstərir ki, daha yüksək təhsil səviyyəsi olan insanlar həyatdan daha çox məmnunluq hissi keçirir, sağlamlıqları, başqaları ilə birgə sosiallaşmaq və cəmiyyətlərinin həyatında iştirak etmək üçün daha yaxşı imkanlara malik olurlar. Təhsil bir sıra sosial-iqtisadi məsələlərin həllinə, o cümlədən ətraf aləmdə baş verən prosesləri anlamağa və birgəyaşayış qabiliyyətinin artırılmasına köməklik etməklə tolerant mühitin formalaşmasına zəmin yaradır. Həmçinin iqtisadi təhlillər göstərir ki, inkişaf etmiş ölkələrin inkişafına təsir göstərən başlıca amil təhsil və onun inkişaf etdirilməsidir. Hansı ölkələrin təhsil səviyyəsi yüksəkdirsə, həmin ölkələrin iqtisadi səviyyəsi də yüksəkdir.

Üçüncüsü, təhsil sosial, iqtisadi, siyasi kontekstdən ayrıca mövcud ola bilməz, çünki bütün sosial təsisatlarla sıx əlaqədə olan təhsil iqtisadi, siyasi, sosial, mədəni kimi bir çox amillərdən təsirlənir. Bəşəriyyətin dayanıqlı inkişafa keçidi də təhsildə köklü transformasiyalara səbəb olur. Rəsmi sənədlərin əksəriyyətində, dayanıqlı inkişaf kontekstində təhsil problemləri ilə bağlı elmi tədqiqatlarda "Dayanıqlı inkişaf naminə təhsil" konsepsiyasına rast gəlirik. Bu tədqiqatlarda dayanıqlı inkişaf prinsiplərinə əməl etmək üçün təlimin fənlərarası inteqrasiya prinsip üzərində qurulmalı, dayanıqlı inkişaf məsələlərinin bütün fənlərin ayrılmaz elementi olmalı və bütün tədris planlarına daxil edilməli olduğu vurğulanır [3, s. 94-103].

Dördüncüsü, dayanıqlı inkişaf konsepsiyası şəxsiyyət, onun cəmiyyətdəki yeri haqqında təsəvvürlərin metodoloji əsası kimi qəbul edilməlidir. Dayanıqlı inkişaf konsepsiyası bir tərəfdən bu günün reallıqlarını açıqlayır, digər tərəfdən fəaliyyət proqramını işləyib hazırlayır və dövlətin şəxsiyyətin yetişdirilməsində konkret öhdəliklərini müəyyən edir. Dayanıqlı inkişaf konsepsiyasının bu günün maraqlarını təmin edərkən gələcək nəsillərin mənafelərinin nəzərə alınması zərurətinə dair müddəası metodoloji yanaşma olaraq dövlətin vəzifələrinə və onun təhsil sisteminin xüsusiyyətlərinə əsaslı dərəcədə təsir göstərməlidir. Şəxsiyyətin sosiallaşması bu gün yeni dəyərlər əsasında həyata keçməlidir ki, onların da bəziləri məhz dayanıqlı inkişaf konsepsiyasında öz əksini tapmışdır. Yeni dəyərlər və münasibətlər, davranış və yaşayış tərzi təhsil vasitəsilə yeridilir, bununla da dayanıqlı inkişaf təmin olunur. Bu baxımdan təhsil özü bir dəyərdir, çünki cəmiyyətin bütün digər dəyərləri onun köməyi ilə formalaşır. Beləliklə, müddəalarına şəxsiyyətin sosiallaşması ilə bağlı ideyaların da daxil edildiyi dayanıqlı inkişaf konsepsiyası mütəxəssis şəxsiyyəti haqqında yeni elmi-nəzəri əsasları fomalaşdırır. Belə mütəxəssislərdən biri müəllim, onun bir çox bacarıqlara, o cümlədən kommunikativ bacarıqlara malik şəxsiyyət kimi formalaşmasının pedaqoji əsaslarının işlənilməsidir.

Beşincisi, təhsilin məzmunu və metodları dayanıqlı inkişaf konsepsiyasının aşağıdakı əsas prinsiplərinə söykənir: ehtiyatlılıq, təbii mühitin qorunması, əməkdaşlıq, səmərəli iştirak, insanın şüur və dünyagörüşünün ekolojiləşdirilməsi. Burada önləyicilik prinsipini xüsusi vurğulamaq istərdik. Rio-de-Janeyro Bəyannaməsinin bu ehtiyatlılıq prinsipi (15-ci prinsip) bəşər sivilizasiyasının üzləşdiyi müxtəlif problemlərin qarşısını almaq üçün qabaqlayıcı hərəkətlərə ehtiyacının olmasının konkret ifadəsindən başqa bir şey deyildir. Müvafiq olaraq təhsil sistemi də yeni sosial-iqtisadi və elmi-texniki şəraitdə qeyri-trivial problemləri həll edəcək, önləyici tədbirlər görəcək, lazımi dərəcədə uzaqgörən olan mütəxəssis yetişdirməlidir. Buna görə də təhsil getdikcə proqnostik istiqamət almalı, yəni təbiət, texniki və humanitar elmlərdə baş verən müasir proseslər haqqında bilik sistemini təmin etməklə yanaşı, müvafiq tendensiyaları ekstrapolyasiya etmək qabiliyyətini də formalaşdırmalıdır. Belə təhsili səciyyələndirmək üçün A.D. Ursul "önləyici təhsil" anlayışını işlədir. Bununla da, yeni mütəxəssis hazırlığının yüksək keyfiyyətini təmin etməklə, onlarda qlobal ictimai şüuru və səmərəli həyat qabiliyyətini formalaşdırmaqla ali təhsil qlobal problemlərin həllinə öz töhfəsini vermiş olar.

Və, nəhayət, altıncısı, əhalinin böyük sosial-demoqrafik qrupunu təşkil edən tələbə gənclər güclü innovasiya potensialına malikdir və cəmiyyətimizin tərəqqisi, dayanıqlı inkişafı bir çox mənada bu potensialdan səmərəli istifadə ilə bağlıdır. Eyni zamanda, məhz gənclər bu gün dünyada təbii resurs ehtiyatlarından istifadənin bugünkü təşkilindən əziyyət çəkən təbəqədir.

Cəmiyyətin dayanıqlı inkişafının aktiv iştirakçısı olan tələbə gənclərin peşə səriştəliliyi üzərində çalışmadan dayanıqlı inkişafı təsəvvür etmək mümkün deyil. Axı tələbələr yeni ideologiya və dünyagörüşünü aktiv yayan əhali qrupudur. Gənclər milli-dövlət maraqlarının obyekti və Azərbaycan dövləti və cəmiyyətinin qarantlarından biridir. Ölkəmizin müxtəlif sferalarında gənclərin iştirakı olmadan pozitiv dəyişikliklər mümkün olmazdı. Gənclərin innovativ potensialı, təşəbbüskarlığı, peşə karyerası baxımından perspektivlərinin olması ölkəmizdə cərəyan edən sosial-iqtisadi proseslərin xarakteri və sürətinə ciddi təsir göstərir. "Gənclər xalqımızın, millətimizin, ölkəmizin gələcəyidirlər" – deyən Ulu öndərimiz H. Əliyev gənclərə xitabən bu haqda çox gözəl demişdir: *"Hər bir Azərbaycan gənci öz həyat yolunu müstəqil Azərbaycan Respublikasının gələcək yolu kimi qəbul etməlidir və öz həyatını qurarkən, özünü həyatda fəaliyyətə hazırlayarkən və fəaliyyətə başlayıb onu davam etdirərkən özü haqqında da düşünməlidir, ailəsi haqqında da düşünməlidir, ancaq hər şeydən çox, hər şeydən artıq müstəqil Azərbaycanın bu günü, gələcəyi haqqında düşünməlidir"* [1, s. 344].

Beləliklə, dayanıqlı inkişaf konsepsiyası nəinki gənclərin, o cümlədən tələbələrin xüsusi qayğıya ehtiyacı olduğunu təsdiqləyir, həm də tələbə gənclərin özləri dayanıqlı inkişafa keçid prosesinin əsas iştirakçıları, "davranış qaydalarının dəyişdirilməsi agentləri" elan olunurlar. Demək olar ki, Dayanıqlı İnkişaf Konsepsiyasını təsbit edən bütün sənədlərdə və müqavilələrdə (Gündəm 21, Dayanıqlı İnkişaf haqqında Yohannesburq Bəyannaməsi, Dayanıqlı İnkişaf üzrə Ümumdünya Sammitinin Qərarlarının İcra Planı, "Dayanıqlı inkişaf üçün təhsil və maarifləndirmə", "XXI əsrdə innovativ cəmiyyət üçün təhsil") dayanıqlı inkişafın həyata keçirilməsində əsas amil kimi təhsilin əhəmiyyəti xüsusi vurğulanır. Hələ 1992-ci ildə keçirilmiş Sammitin Proqramının 36-cı bəndində "Təhsil dayanıqlı inkişafın təməlidir" kimi bir müddəa yer almışdır. Bu fikir 10 il sonra Yohannesburq Sammitində bir daha təsdiqləndi. Yenə də qeyd olundu ki, dayanıqlı inkişaf konsepsiyası təhsil sistemi vasitəsilə translyasiya olunmalıdır.

Dayanıqlı inkişaf üçün təhsilin əhəmiyyətini ictimaiyyətə çatdırmaq istiqamətində atılan mühüm addımlardan biri də BMT Baş Assambleyasının 2005-2014-cü illər üçün "Dayanıqlı İnkişaf üçün Təhsil Onilliyi"nin ("education for sustainable development") keçirilməsi ilə bağlı elanı oldu. Burada əsas məqsəd dayanıqlı inkişaf sahəsində bütün prinsipləri, dəyərləri və təcrübəni təhsil və maarifçiliyin bütün aspektlərinə inteqrasiyası etdirmək idi. Eyni zamanda qeyd edilirdi ki, təhsilin dayanıqlı inkişaf kontekstində təkmilləşdirilməsi bütün ölkələrdə və qitələrdə insanların davranışının dəyişməsinə töhfə verəcək və indiki və gələcək nəsillərə münasibətdə təmiz mühit, iqtisadi sabitlik və ədalət ilə səciyyələnən davamlı bir gələcək üçün şərait yaradacaqdır. "Təhsil onilliyi" proqramının əsas məqsədlərindən biri də dayanıqlı inkişaf siyasətinin yeridilməsində innovativ təhsil metodlarının tətbiqi və bu sahədə beynəlxalq əməkdaşlığı inkişaf etdirmək olmuşdur. Bu strategiya əsasən auditoriyası ilə fərqlənən aşağıdakı dörd istiqamətdə yeridilməli idi:

- orta təhsili səviyyəsinin yüksəldilməsi;
- təhsilin hər bir səviyyəsində dayanıqlı inkişafın təmin edilməsi üçün müvafiq təkmilləşdirilmə proqramların tətbiq edilməsi;
- "dayanıqlı inkişaf" anlayışının geniş əhali kütləsi arasında təbliği;
- dayanıqlı inkişaf sahəsində mütəxəssislərin hazırlanması.

"Təhsil onilliyini" təbliğ və təşviq etmək, bu sahədə fəaliyyəti əlaqələndirmək üçün YUNESKO "aparıcı agentlik" olaraq işə salındı. Dayanıqlı inkişaf məqsədlərinə uyğun olaraq bu qurum tədris olunan proqramlarda müvafiq dəyişikliklər edilməsi məsələsini gündəmə gətirdi.

Beləliklə, BMT tərəfindən elan edilmiş "Dayanıqlı İnkişaf üçün Təhsil Onilliyi" proqramının ideyaları əsasında yeni təhsil paradiqması yaradıldı və hər bir ölkənin inkişafında və təhsil sistemində mövcud olan fərqlərlə yanaşı, milli səviyyədə, təhsilin dayanıqlı inkişafı naminə strateji planlaşdırmanın konturları formalaşmağa başladı.

Bütün bu sənədlərin təhlili Dayanıqlı İnkişaf Konsepsiyasının təhsillə bağlı əsas fikirlərinin nədən ibarət olduğunu göstərir.

BMT-nin dayanıqlı inkişafla bağlı qərarlarına uyğun olaraq başqa dövlətlərdə olduğu kimi, Azərbaycan Respublikasında da ölkənin dayanıqlı inkişaf strategiyası işləndi. Dayanıqlı inkişaf fenomeninin nəzəri dərki ilə bağlı ölkəmizin elm adamları tərəfindən çox işlər görüldü və bu

işlər "Azərbaycan Respublikasının milli təhlükəsizlik konsepsiyasının təsdiq edilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin 23 may 2007-ci il tarixli 2198 saylı Sərəncamı, 29 dekabr 2012-ci il tarixli 800 saylı Fərmanı ilə təsdiq edilmiş "Azərbaycan 2020: gələcəyə baxış" İnkişaf Konsepsiyası, "2015-2025-ci illərdə Azərbaycan gənclərinin İnkişaf Strategiyası"nın təsdiq edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 26 yanvar 2015-ci il tarixli Sərəncamı ilə məntiqi şəkildə tamamlandı. Bu sənədlərdə səy və mənbələri dayanıqlı inkişaf üçün elm və təhsilə yönəltməyin zəruriliyi haqqında müddəalar yer almışdır.

Şübhəsiz ki, sadalanan sənədlərin məzmunu BMT-nin 2015-ci ilin sentyabr ayında Nyu-Yorka keçirilən Sammitinin "Dünyamızın transformasiyası: 2030-cu ilədək dayanıqlı inkişaf sahəsində gündəlik" – "Gündəlik-2030" adlı yekun sənədi ilə tam uzlaşır. Sammitdə Dayanıqlı İnkişaf sahəsində Minilliyin Məqsədlərinə nail olma dərəcəsi müzakirə edilmiş və 2015-ci ildən sonrakı dövr üçün yeni fəaliyyət vektorları müəyyən edilmişdir. Dayanıqlı inkişaf sahəsində 17 məqsəd və 169 vəzifə qarşıdakı işlərin miqyası və gərginliyindən xəbər verir. Hökumətlərdən bu 17 məqsədi qəbul etmək və onlara nail olmaq üçün milli çərçivələr yaratmaq gözlənilir. Ölkələrin əsas öhdəliyi dayanıqlı inkişaf məqsədlərinin icrasında əldə olunan irəliləyişi izləmək və təhlil etməkdir. Bunun üçün keyfiyyətli və əlçatan məlumatların vaxtında toplanması tələb olunur. Dayanıqlı inkişaf məqsədlərinin icrasının regional səviyyədə izlənməsi və təhlili isə milli səviyyədə aparılan təhlillərə əsaslanacaq və qlobal səviyyədə izləmə və təhlil işində istifadə olunacaq. Sənəddə bir daha dayanıqlı inkişaf triadasının, yəni onun iqtisadi, sosial və ekoloji komponentlərinin ayrılmaz olduğu vurğulanmaqla kompleks yanaşmanın zəruriliyi əsaslandırılmışdır [4].

"Gündəlik-2030" – da əks olunan və 1 yanvar 2016-cı il tarixdə rəsmi şəkildə qüvvəyə minmiş Dayanıqlı İnkişaf Məqsədlərinə qoşulmuş ölkəmizdə "Gündəlik-2030"dan irəli gələn milli öhdəliklərlə bağlı dövlət orqanlarının üzərinə düşən vəzifələrin icrasının əlaqələndirilməsi məqsədilə Azərbaycan Respublikası Prezidentinin Fərmanı ilə "Azərbaycan Respublikasının Davamlı İnkişaf üzrə Milli Əlaqələndirmə Şurası" yaradıldı, milli səviyyədə dayanıqlı inkişaf məqsədlərinə nail olunmasına dair monitorinq və hesabatlıq mexanizmi müəyyən edildi, müvafiq dövlət orqanlarının qarşısında konkret vəzifələr qoyuldu. Bu vəzifələr əsasən aşağıdakılardan ibarət idi:

- "Gündəlik-2030"un milli səviyyədə icrası ilə bağlı Dövlət Statistika Komitəsinin üzərinə düşən vəzifələrin layiqincə yerinə yetirilməsi;
- Dayanıqlı İnkişaf Məqsədlərinə nail olma göstəriciləri üzrə statistik məlumatların toplanması, işlənməsi, müvafiq statistik məlumat bazasının hazırlanması və yayımı;
- ölkənin dayanıqlı inkişaf vəziyyətini xarakterizə edən statistik göstəricilər əsasında kompleks təhlillərin aparılması;
- dayanıqlı inkişaf statistikasının təşkili və həyata keçirilməsi sahəsində fəaliyyətin təmin edilməsi üçün Dövlət Statistika Komitəsi aparatının strukturunda Davamlı İnkişaf Statistikası şöbəsi yaradılması.

Ümumiyyətlə, Davamlı inkişafa dəstək üzrə tədbirlərin sayı isə ildən-ilə artır.

Ölkəmizdə dayanıqlı inkişaf ideyalarını ali təhsil sahəsində də həyata keçirmək istiqamətində addımlar atılır. Belə ki, respublikanın bir çox universitetlərində, müxtəlif kurslarda mövzuya aid beynəlxalq konfranslar, treninq-kurslar və debatlar keçirilir. Lakin apardığımız təhlil nəticəsində müəyyən edilmişdir ki, dayanıqlı inkişaf sistemində ekoloji konsepsiya öz güclü mövqelərini saxlayır. Dayanıqlı inkişaf konsepsiyası yalnız ekologiyaya dair ixtisas və fakültələrdə ekoloji məsələlərin açıqlanması ilə məhdudlaşır. Çox az sayda ali məktəblərdə dayanıqlı inkişaf sahəsində müvafiq metodiki müşayiətlə təmin olunan, sosial-iqtisadi fənlər blokunu daxil edən inteqrativ təhsil proqramları həyata keçirilir.

Dayanıqlı inkişaf üçün yalnız ekoloji, təbiətin mühafizəsi üzrə kursların təşkili yetərli deyil. Dayanıqlı inkişaf ideyalarını ümumi və xüsusi kurslara inteqrasiya etdirmək, ali və orta məktəbin qarşılıqlı təsirlərini gücləndirmək lazımdır. Təhsilin ekologiyası bu prosesdə geniş yer tutur.

Bu gün üçün xüsusi və vacib problemlərdən biri dayanıqlı inkişafa xidmət edən pedaqoji kadrların hazırlanmasıdır.

Yuxarıda qeyd etdiyimiz kimi, bu gün cəmiyyətlə, bizneslə ətraf mühit arasında ziddiyyətlər mövcuddur. Bunlardan birində arzuolunan

nəticələr digərində arzuolunmaz nəticələrə səbəb olur. Eyni vəziyyət cəmiyyətdə mövcud olan qüvvələr tərəfindən müxtəlif cür qiymətləndirilir. Beləliklə, dayanıqlı inkişaf mümkün nəticələri qabaqcadan görə bilmək, qarşılıqlı təsirləri işə salmaq bacarıqlarını tələb edir [Huber, S., Berchtold, C., Kummert, R. & Kyburz-Graber, R. (2001). Ernährung heute und morgen. Interdisziplinäre Materialien zu Produktion, Verarbeitung, Handel und Konsum. Aarau: Bildung Sauerländer]. Buna isə bütövlükdə o zaman nail olmaq mümkündür ki, cəmiyyətə və onun bir sahəsi olan təhsilə innovativ sistem kimi baxılsın.

**Problemin aktuallığı.** BMT-nin "Dayanıqlı inkişaf məqsədləri proqramı" bütün sahələrdə olduğu kimi, dünya təhsil sistemlərinin, o cümlədən Azərbaycan Respublikası təhsilinin də qarşısına bir sıra mühüm vəzifələr qoyur. Təhsildə dayanıqlı inkişafa nail olmaq ölkənin gələcəyinin təmin olunmasında, təhsilin hamı üçün əlçatanlığının təmin olunmasında və keyfiyyətinin yüksəldilməsində mühüm əhəmiyyətə malik olduğundan problem aktualdır və onun işlənilməsi bu sahədə müəyyən müvəffəqiyyətli nəticələrin alınmasına yardımçı ola bilər.

**Problemin elmi yeniliyi.** Problem özü və araşdırılan məsələlər yenidir. Burada araşdırılan məsələlər ölkəmizdə dayanıqlı inkişaf kontekstində təhsilimizdə bir sıra mühüm amillərin nəzərə alınmasını və yeniliklərin aparılması sahəsində irəli sürülən təkliflərin reallaşdırılmasını zəruri edir.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə araşdırılanlar və irəli sürülən təklif və fikirlər təhsil sahəsində, xüsusən ali pedaqoji təhsil sahəsində çalışan müəllimlərin bu istiqamətdə işlərində müəyyən yeniliklərin aparılmasında onlara praktik köməklik edə bilər.

**Ədəbiyyat:**


1. Əliyev, H. Ə. Təhsil millətin gələcəyidir (Tərtib edənlər: M. Mərdanov, Ə. Quliyev). / H. Əliyev. - Bakı: Təhsil, - 2002.
2. Бартенев, В.И. Связка «безопасность – развитие» в современных западных исследованиях /Международные процессы. 2015. Т.13. № 3
3. Осмоловская, И.М. Междисциплинарный подход в решении дидактических проблем в российском образовании // Ценности и смыслы. 2016. № 4
4. Преобразование нашего мира: повестка дня в области устойчивого развития на период до 2030 года [Электронный ресурс] // ООН, Нью-Йорк, 2015 –44с. http://unctad.org/meetings/en/SessionalDocuments/ares70d1_ru.pdf



**E-mail:** nargiz_ahmedova@mail.ru



**Redaksiyaya daxil olub:**22.10.2024.

*UOT 37.01.*

***Nilufər Cavid qızı Qəhrəmanlı***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun*
*fəlsəfə doktoru proqramı üzrə doktorantı*
*https://orcid.org/0009-0006-7007-4920*
*https://doi.org/10.69682/arti.2024.91(6).73-76*

# TƏHSİLDƏ NAİLİYYƏT MOTİVASİYASININ ƏSAS İSTİQAMƏTLƏRİ

***Нилуфер Джавид гызы Гахраманлы***
*докторант по программе доктора философии*
*Института Образования Азербайджанской Республики*

# ОСНОВНЫЕ НАПРАВЛЕНИЯ МОТИВАЦИИ ДОСТИЖЕНИЯ В ОБРАЗОВАНИИ

***Nilufer Javid Gahramanly***
*doctorial student in the program of doctor of philosophy*
*at the Institute of Education of the Republic of Azerbaijan*

# THE MAIN DIRECTIONS OF ACHIEVEMENT MOTIVATION IN EDUCATION

**Xülasə.** Məqalədə təhsildə nailiyyət motivasiyasının təzahürləri, o cümlədən onun əsas istiqamətləri diqqət mərkəzinə gətirilir. Qeyd olunur ki, nailiyyət motivasiyası motivasiyanın optimal səviyyəsinin qorunub saxlanmasınada, tələblərin akademik göstəricilərinin artırılmasında, o cümlədən akademik performansın qurulmasında mühüm əhəmiyyət kəsb edir. Məqalədə nailiyyət motivasiyası təhsil kontekstindən təhlil edilir, müxtəlif bacarıqların formalaşmasında onun rolu ayırd edilir. Bu sahədə aparılmış tədqiqatlar sistemləşdirlir, o cümlədən tələblərdə, təhsil sahəsində nailiyyət motivasiyasının optimallaşdırlması istiqamətləri göstərilir. Sonda qeyd olunur ki. nailiyyət motivasiyasının inkişaf etdirilməsi üçün zəruri şərt pozitiv təhsil mühitinin formalaşdırılmasıdır.
***Açar sözlər:*** *təhsil, nailiyyət motivasiyası, əsas istiqamətlər, müvəffəqiyyət motivasiyası*

**Аннотация.** В статье освещены проявления мотивации достижения в образовании, в том числе ее основные направления. Отмечается, что мотивация достижения важна для поддержания оптимального уровня мотивации, повышения академических показателей требований, а также формирования академической успеваемости. В статье мотивация достижения анализируется с точки зрения образования, выделяется ее роль в формировании различных умений и навыков. Систематизированы исследования, проводимые в этой области, в том числе обозначены требования, направления оптимизации мотивации достижения в сфере образования. В конце отмечается, что необходимым условием развития мотивации достижения является формирование позитивной образовательной среды.
***Ключевые слова:*** *образование, мотивация достижения, основные направления, мотивация успеха*

**Abstract.** Manifestations of achievement motivation in education, including its main directions, are brought into focus in the article. It is noted that achievement motivation is important in maintaining the optimal level of motivation, in increasing the academic indicators of requirements, as well as in building academic performance. In the article, achievement motivation is analyzed from the context of education, and its role in the formation of various skills is distinguished. The research conducted in this field is systematized, including the requirements, directions for optimizing achievement motivation in the field of education are indicated. In the end, it is noted that A necessary condition for the development of achievement motivation is the formation of a positive educational environment.
***Keywords:*** *education, achievement motivation, main directions, success motivation*

Müasir dövrdə nailiyyət motivasiyasının formalaşadırılması günün tələbidir. Bazar münasibətləri kontekstində insan istehlak məhsuluna çevrilməsi onun cəmiyyətə və özünə münasibətinin dəyişir, daima nailiyyət uğurunda mübarizəyə təhrik edir. Bəs görəsən nailiyyət motivasiyası dedikdə nəyi nəzərdə tuturlar? Ümumiyyətlə, nailiyyət motivasiyasını inkişaf etdirmək, motivasiyanın optimal səviyyəsini saxlamaq mümkündürmü? Bu və ya digər suallara cavab vermək üçün nailiyyət motivasiyanın tədqiqni aparmaq, bu sahədə mövcud tədqiqatlara nəzər yetirmək vacibdir. Nailiyyət motivasiyasının ilk tədqiqatçılarından biri D. Atkinson və D. McClelland olmuşdur. Onların firkincə, nailiyyət motivasiyası fəaliyyət keyfiyyəti meyarı ilə korrelyasiya edilir. Qeyd olunur ki, nailiyyət motivasiyası yuxarı və aşağı təbəqələrə nisbətən orta təbəqənin nümayəndələri üçün daha xarakterikdir (1; 2)

Müvəffəqiyyətlə motivasiya olunan insanlar tapşırıqların öhdəsindən daha yaxşı gəlir, onları daha yaxşı xatırlayır və həmçinin yeni vəzifələr götürmək ehtimalı onlarda daha yüksəkdir. D. Atkinsona görə, nailiyyət motivasiyasının klassik anlayışında fərd qarşısına orta dərəcədə çətin məqsədlər qoyur və bununla da uğur qazanır (1, s. 359). Xüsusi təcrübə və davranışları istiqamətləndirən və ortaya çıxaran fərqli nailiyyət motivi ideyası (1; 2) xüsusən də təhsil kontekstlərinə tətbiq edildikdə motivasiya ilə bağlı bir çox müasir nəzəriyyələrin əsasını təşkil edir. Buna baxmayaraq, nailiyyət motivasiyasının və ya nailiyyət ehtiyacının ən maraqlı aspektlərindən bəziləri bəzən unudulmuş kimi görünür və hələ də səmərəli müzakirələrə məruz qalır və ya hələ də öyrənilməmişdir.

Bu baxımdan aktual olan nailiyyət motivasiyası ilə bağlı iki əsas suala cavab vermək istədik. Birincisi, nailiyyətə olan ehtiyac tələbələrin adətən, yəni real vaxtda və real həyatda necə hiss etdiyini proqnozlaşdırırmı? İkincisi, nailiyyət üçün öz-özünə bildirilən ehtiyacın proqnozlaşdırıcı etibarlılığını hansı hallar müəyyən edir?

Nailiyyət motivasiya nəzəriyyəsinə əsaslanaraq (1; 2) qeyd etmək olar ki, insanın nailiyyətə ehtiyacı, xüsusi təcrübə və davranışları ortaya çıxaran genomotivə bənzəyir (3). Onun gerçəkləşməsi üçün operativ, yəni zamanla kortəbii, əks olunmayan təcrübə və davranışların göstəricisi olmalıdır. Bir çox tədqiqatlarda tətbiq olunan metodlara uyğun olaraq, biz bu xüsusi nəticəni ani təcrübə kimi adlandırırıq. İkinci suala gəldikdə, isə qeyd etmək olar ki, tələbələr, prinsipcə, intrapsixik vəziyyətlərinə açıq fikirlə baxdıqları zaman nailiyyət ehtiyacında ifadə olunan kimi əsas incə üstünlükləri dərk edə bilərlər (2;3). Buna görə də, gündəlik həyatda ani yanaşma və qaçınma təcrübələri üçün öz-özünə bildirilən uğur ümidinin və uğursuzluq qorxusunun proqnozlaşdırıcı etibarlılığı daha güclü olmalıdır.

“Nailiyyətyönlü” insan dedikdə ağlımıza bir çox obrazlar gəlir. Məsələn, ani sınaqlara baxmayaraq, uzunmüddətli məqsədləri istiqamətində səylə çalışan tələbə və ya sadəcə olaraq bu cür davranışa görə yüksək qiymət verən şəxs (2). Klassik nailiyyət motivasiyası nəzəriyyəsində nailiyyət motivasiyası mükəmməllik standartı ilə bağlı öz səriştəsinin özünü qiymətləndirməsi ilə əlaqəli davranışa aiddir. Əsas mənasında insanın uğur qazanmağa qadir olub olmadığını öyrənmək naminə fəaliyyətlə məşğul olmağı xarakterizə edir. Müvəffəqiyyət üçün əsas ehtiyac uşaqlıqda erkən əldə edilən vərdiş halına salınmış, qiymətləndirici və davranış tendensiyası kimi konseptuallaşdırılır. Bu həm də motivə xas situasiya işarələri ilə aktivləşir və fərdin bu cür işarələrə affektiv reaksiyasında özünü göstərir (4).

Tədqiqatçıların fikrincə, tipik olaraq, uğur ümidi və uğursuzluq qorxusu iki ayrı nailiyyət motivi kimi fərqlənir. Birincisi, optimist yanaşma meyli, yəni mükəmməllik standartı ilə əlaqəli vəziyyətlərə doğru hərəkət etmək meyli ilə, ikincisi isə müdafiədən yayınma meyli, yəni belə hallardan uzaqlaşma meyli ilə səciyyələnir. Aparılmış tədqiqatlar göstərir ki, həm məktəbdə, həm də həyatda nailiyyətin ən mühüm komponentlərindən biri nəyəsə nail olmaq üçün yaranan motivasiyadır (5). Faktlar göstərir ki, bir çox hallarda, daha az istedadlı, lakin məqsədlərinə çatmaq üçün daha çox motivasiyaya malik olan şəxslərin uğur qazanma ehtimalı daha yüksəkdir. İstedadı olan, lakin qarşısına məqsəd qoya bilməyən və onlara nail olmağa diqqətini fokuslaşdıra bilməyənlər isə mümkün üstünlüyün olmasından asılı olmayaraq istədiklərinə nail ola bilmirlər (5). Şübhəsiz məqsədlərə çatmaq üçün motivasiya təkcə fərdləri arxasınca aparmağa deyil, həm də dəyərli hesab etdikləri iş onları başqaları ilə rəqabətə də təhrik edir.

Nailiyyət motivasiyası maraq və ya həzzdən qaynaqlandıqda tapşırığın özünə daxili

olur. Yəni onun daxili komponentinə və ya hərəkətverici gücünə çevrilir. Bu xarici təzyiqin məhsulu deyil, insan üçün orqanikdir. Bununla yanaşı insanı fəaliyyətə təhrik edən komponent xarici nailiyyət motivasiyası ola bilər. Tələbələr arasında xarici motivasiyanın ümumi mənbələri yaxşı qiymətlər və ya valideynlər və müəllimlərin tərifləri kimi mükafatlardır.

Tələbələri və ya şagirdləri həvəsləndirmək müəllimlərin gündəlik qarşılaşdıqları əsas problemlərdən biridir. Yeniyetmələrin yeni imkanlar və onları məktəbdə yaxşı işləməyə sövq etməli olan maraqları artırmaq üçün müəllimlər ciddi cəhdlə çalışırlar. Böyüdükcə uşaqlar daha çox idmanla məşğul olur, mürəkkəb düşüncə tərzinə sahib olur və özünütənzimləmək üçün daha böyük imkanlara malik olurlar. Bu zaman məqsədi gerçəkləşdirmək üçün daha güclü istək ortaya çıxır (6). Bu çiçəklənən qabiliyyətlərə və münasibətlərə baxmayaraq, nailiyyət əldə etmək üçün motivasiya kəskin şəkildə azalır, yeniyetməlik yaş dövründə isə məktəb işləri daha tez-tez diqqət mərkəzində olur (5).

Təhlillər göstərir ki, nailiyyət motivasiyası üçün həyatın bir dövründə məktəb daha uyğun görünməlidir. Lakin şagird və tələbələr məktəbi onların rifahı üçün daha az faydalı və vacib hesab edirlər. Belə yanaşma nailiyyət motivasiyasını ən azı təhsil kontekstində azaldır və məqsədlərin reallaşması üçün motiv axtarılmır.

Tədqiqatlar göstərir ki, məqsədlər təyin etmək və bu məqsədlərə nail olmaq üçün səyləri tənzimləmək bacarığı təkcə bu məqsədə xas olan xüsusiyyət deyil, həm fərdi, həm də uşaqların qarşılaşdığı ev və məktəb mühitinin nəticəsidir (6, s.120). Çünki insanlar gənc yaşda həyatda nəyə nail ola biləcəkləri, müsbət motivasiyanın inkişafı ilə bağlı inamlar formalaşdırmağa meyllidirlər.

Nəzərə almaq lazımdır ki, məktəbdə uğura nail olmaq həyatda uğur əldə etmək üçün ilkin şərtdir. Bəs görəsən aparılmış tədqiqatlar bu faktları bütünlüklə dəstəkləyirmi? Bir sıra tədqiqatlar (7) göstərir ki, qızlar oğlanlardan daha çox məktəbdə yüksək qiymət almaq istədiklərini və oğlanlardan daha çox qayğı göstərdiklərini bildirdilər. Onlar məzun olduqdan sonra ən yaxşı imkanlar arasından seçim edə bilmək haqqında düşünürlər. Ancaq oğlanlar qızlara nisbətən özlərini daha iddialı kimi təsvir edir və nə edirlərsə etsinlər, ən yaxşısı olmağa can atırlar.

Nailiyyət motivasiyası məktəbdəki performansla və həyatdan məmnunluqla müsbət əlaqələndirilir. Orta hesabla bir sıra ölkələrdə müvəffəqiyyət motivasiya indeksinin ilk rübündə tələbələr daha yüksək, yəni 37 bal topladılar. Elm və alt pillədəki tələbələrlə müqayisədə həyat məmnuniyyəti 0,7 bal daha yüksək (0-dan 10-a qədər miqyasda) olduğu bildirildi (8).Öz sinfində ən yaxşısı olmaq istəyən və ya ən yüksək qiymət almaq istəyən tələbələr daha çox yüksək nəticə göstərdiklərini bildirmişlər. Hətta testlər nə qədər yaxşı hazırlanmış olsa belə, bu onları narahat edir. Müvəffəqiyyət motivasiyasının yeni ölçüsü tələbələrin qarşısına qoyduğu məqsədlər haqqında faydalı məlumat verir, lakin məlumatlar bu nailiyyət məqsədləri olan tələbələr arasında fərq qoymur. Çünki qarşıya qoyulan məqsədi öz dəyərləri kimi qəbul edən tələbələr onlar daxili motivasiyaya malikdirlər və kənardan onlara qoyulan məqsədlərə çatmağa çalışan tələbələr isə məktəbdə və ondan kənarda mükəmməlliklə əlaqəli hərəkətləri gerçəkləşdirirlər.

Ryan və Deci (2000) göstərir ki, xarici motivasiyalı hərəkətlər passiv uyğunluqla nəticələnə bilər və ya insanlar xarici tənzimləmə ilə eyniləşdikcə və onu tam şəkildə mənimsədikcə zahirən daxililə keçə bilər. Başqa sözlə, tələbələr məktəbdə yaxşı performans göstərmək üçün valideynləri və ya cəmiyyət tərəfindən xaricdən motivasiya oluna bilər və yenə də etdikləri işdə sadiq və orijinal olaraq qala bilirlər (9). Bu, o deməkdir ki, tələbələrdə zahirən görünən motivasiya elə daxili motivasiyadır. Xarici mükafatlara baxmayaraq daxili məmnunluq görünür üstünlük təşkil edir. Yaxşı qiymətlər əldə etməyə çalışmaq və öyrəndiklərini qiymətləndirmək mütləq birbirinə uyğun gəlməyən məqsədlər deyil (10).

Nailiyyət motivasiyası çətin bir niyyətdir və ardınca yüksək səviyyəyə çatmaq üçün tələbələrin sahib olduğu təlim nəticələridir. İki növ nailiyyət motivasiyası var. Onlar aşağı və yüksək nailiyyət motivasiyasıdır. Problemləri olmayan və yüksək nailiyyət motivasiyası olan tələbələr kiçik vəzifələri həyata keçirməyə meyllidirlər. Ancaq yüksək problemi olan tələbələr isə aşağı nailiyyət motivasiyasına malikdirlər, onlar mürəkkəbdən və çətin tapşırıqların həllindən qaçmağa meyllidirlər. Mahesvari və Aruna göstərirlər ki, nailiyyət motivasiyasına nail olma mübarizə prosesidir və yüksək mükəmməl fəaliyyət standartını tətbiq etməklə gerçəkləşir (11).

Onların fikrincə, nailiyyət motivasiyası psixoloji amillərdən asılıdır və gələcək təhsil və peşəni müəyyən etmək üçün xüsusi təhriklərə malikdir. Onlar müəyyən edirlər ki, nailiyyət motivasiyası ən yüksək standartlara əsaslanan tapşırıqları yerinə yetirmək üçün çətin niyyət (mükəmməllik) və ya rəqabətdə uğur qazanmaq niyyətidir. Bu həm də prosesdə hər hansı bir çətinlik və maneəni dəf etmək üçün insan bir məqsədə çatmaq və məmnuniyyət əldə etmək üçün bir gözlənti olaraq çətin bir performansa nəzarət edilməsinə yönəlmiş içəridən gələn bir təşviqdir. Əgər onun idealına nail olarsa, o, özünü tərifləyəcək, əgər deyilsə, o, məyus olacaq. Başqa sözlə, nailiyyət motivasiyası insandan ən yüksək nailiyyətə çatmaq üçün yaranan bir impulsdur (11).

Psixoloji tədqiqatlar göstərir ki, nailiyyət motivasiyası bir çox amillərdən qaynaqlana bilər. Onlara aşağıdakılar daxildir:

1) fizioloji amil;
2) psixoloji amil;
3) fiziki və psixoloji yetkinlik amilləri;
4) sosial amillər;
5) mədəniyyət amili;
6) fiziki ekoloji amillər;
7) ətraf mühit və təhlükəsizlik amilləri (12).

Nailiyyət motivasiyasının tələbələrin təlim nəticələrinə təsiri ilə bağlı bir çox mütəxəssis tərəfindən müvafiq araşdırma aparılmışdır. Onlardan biri şagirdlərin təlim nəticələrində nailiyyət motivasiyası və valideynlər rolu arasında müsbət korrelyasiya olduğunu iddia edilir. Bu o deməkdir ki, nailiyyət motivasiyası və valideynlərin rolu nə qədər yüksək olarsa, təhsil göstəriciləri bir o qədər yüksək olar. Müəllimlər tərəfindən bu fakt nəzərə alınmalıdır.

**Problemin aktuallığı.** Müasir reallıqlarda həyatda yüksək nəticələr əldə etmək üçün gənclər daim uğur əldə etmək üçün özlərini motivasiya etməlidirlər. Müvəffəqiyyət əldə etmək üçün motivasiya səviyyəsinin yüksək nailiyyət motivasiyaya çevrilməsi vacibdir. Bu baxımdan tədqiqat problemi olduqca aktualdır.

**Elmi yeniliyi**. Məqalədə nailiyyət motivasiyasının təhlili verilir, problemin həll olumasına yönəlmiş yanaşmalar sistemləşdirlir, nailiyyət motivasiyası təhsil kontekstində araşdırılır.

**Praktik əhəmiyyəti.** Əldə olunmuş nəticələr təhsil sistemində, xüsusilə də tələbələrdə nailiyyət motivasiyasının stimullaşdırılmasında, yeni metodoloji istiqamətin işlənməsində və məsləhətyönülü işlərin həyata keçirilməsində istifadə oluna bilər.

**Ədəbiyyat:**


1. Atkinson, J. W. Motivational determinants of risktaking behavior // - Nyurok : Psychological Review, - 1957, № 64, -p.359- 372.
2. McClelland, David C. The achievement motive. / - D.C. McClelland - Washincton: 1974.-412 p.
3. Dreber, A., E. von Essen and E. Ranehill. “Outrunning the gender gap – Boys and girls compete equally” // -Wasincton: Experimental Economics, -2011, № 14/4, pp. 567-582
4. Sheldon, K. M. Integrating behavioral-motive and experiential-requirement perspectives on psychological needs: A two process model *//- Psychological Review.* Washincton:*2011, №118*(4),- pp.552–569.
5. Iswanti S.Y. “Pengaruh Motivasi Berprestasi dan Peran Orangtua dengan // - Prestasi Belajar Siswa SMU Tarakanita I,2012, pp. 1–26, 2012.
6. Sabina, K. “The Role of Achievement Motivation in Educational Aspirations and Performance//- Gen. Prof. Educ. Poloniya: 2010,- № 1, pp. 42–48.
7. Covington, M.V. “Goal theory, motivation, and school achievement: An integrative review” // - Harvard, Annual Review of Psychology, 2000, № 51/1, pp. 171-200
8. Carlson E.N. Overcoming the barriers to self-knowledge / Mindfulness as a path to seeing yourself as you really are.Perspectives on Psychological Science, - New York , 2013.
9. Eccles, J.S. and A. Wigfield/ “Motivational beliefs, values, and goals”, // -Wasincton: Annual Review of Psychology,2011,№ 53, pp. 109-132.
10. OECD, PISA Results: Excellence and Equity in Education //- OECD Publishing, - Paris, 2016,-p.230
11. Ryan, R.M. and E. L. Deci. “Self-determination theory and the facilitation of intrinsic motivation, social development, and wellbeing”// - The American Psychologist. Tarakanita: 2000, -Vol.55/1, pp. 68-78,
12. Thrash, T. M. The creation and curation of all things worthy: Inspiration as vital force in persons and cultures // In A. J. Elliot (Ed.), Advances in motivation science . NewYork: 2021, Elsevier Academic Press. - pp. 181–244.


**E-mail:**nilufer.gahramanli@gmail.com
**Redaksiyaya daxil olub:** 25.11.2024

*UOT 373*

***Cəmilə Vaqif qızı Kərimova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin nəzdində*
*Azərbaycan Dövlət Pedaqoji Kollecinin müəllimi*
*https: // orcid.org/0000-0002-2538-9740*
*https://doi.org/10.69682/arti.2024.91(6).77-81*

## UŞAQLARIN HƏRTƏRƏFLİ İNKİŞAFINA ƏŞYAVİ–İNKİŞAFETDİRİCİ MÜHİTİN TƏSİRİ

***Джамиля Вагиф гызы Керимова***
*преподаватель Азербайджанского Государственного Педагогического Колледжа при Азербайджанском Государственном Педагогическом Университете*

## ВЛИЯНИЕ ПРЕДМЕТНО-РАЗВИВАТЕЛЬНОЙ СРЕДЫ НА ВСЕСТОРОННЕЕ РАЗВИТИЕ ДЕТЕЙ

***Jamila Vaqif Karimova***
*teacher of the Azerbaijan State Pedagogical College under the Azerbaijan State Pedagogical University*

## INFLUENCE OF THE SUBJECT-DEVELOPMENTAL ENVIRONMENT ON THE COMPREHENSIVE DEVELOPMENT OF CHILDREN

**Xülasə.** Məqalədə uşaqların hərtərəfli inkişafına əşyavi–inkişafetdirici mühitin təsiri məsələlərindən bəhs olunur. Eyni zamanda bu işin həyata keçirilməsində bir çox pedaqoqların qeyd etdiyi fikirlər də məqalədə yer tutmuşdur.

İnkişafetdirici mühit uşağın inkişafının əqli, fiziki, əxlaqi, estetik və s. aspektlərində də mühüm təsir göstərməsi haqda da məqalədə məlumat verilir.

***Açar sözlər:*** *inkişafetdirici mühit, uşaq, təsir, əşyavi mühit, formalaşma*

**Аннотация.** В статье повествуется о влиянии предметно-развивающей среды на всестороннее развитие детей. В то же время в статье нашли отражение мнения, высказанные многими педагогами при осуществлении данной работы.

В статье также отмечается, что развивающая среда оказывает важное влияние на психические, физические, нравственные, эстетические и другие аспекты развития ребенка.

***Ключевые слова:*** *развивающая среда, ребенок, влияние, предметная среда, формирование*

**Abstract.** The article tells about the influence of the subject-developing environment on the comprehensive development of children. At the same time, the article reflects the opinions expressed by many teachers during the implementation of this work.

The article also notes that the developing environment has an important influence on the mental, physical, moral, aesthetic and other aspects of the child's development.

***Keywords:*** *developing environment, child, influence, subject environment, formation*

Ətraf mühit uşağın meyllərini, maraqlarını, fəaliyyət səviyyəsini nəzərə almaq və fərdiliyinin ən səmərəli inkişafı üçün məkan hesab olunur. Uşağın zəngin və maraqlı həyatı üçün hər cür şəraiti olan parlaq, bənzərsiz dünya yaratmaq lazımdır. Uşaq günün çox hissəsini bağçada olur

və ətraf mühitin onun sevinməsinə, onda müsbət emosiyalar oyanmasına, zövqünün inkişafına töhfə verməsi lazımdır. Uşaq bağçasında estetik dizayna xüsusi diqqət yetirilir, çünki uşaqların şəxsi keyfiyyətlərinin formalaşmasında ətraf mühit böyük rol oynayır.

İnkişafetdirici mühitin əsası ailədə və daha sonra məktəbəqədər təhsil müəssisəsində qoyulur. Çünki uşaq üçün kiçik yaşdan etibarən ailədə münbit şəraitin yaradılması vacib məsələdir. Daha sonra bu iş məktəbəqədər təhsil müəssisəsində davam etdirilir.

"Psixoloqlar hesab edirlər ki, məhz həvəsləndirici mühit fəaliyyət çərçivəsini müəyyən edir. Məsələn, əgər valideyn uşağın yaxşı rəsm çəkməsini istəyirsə, masanın üstündə həmişə qələm və kağız saxlamalıdır. Uşağın proqramlaşdırma işini bilməsini istəyirsə, ona kompüter almalıdır. Uşaqların təlimə marağının artırılması üçün onların fəaliyyətindəki bütün irəliləyişlər qeyd olunmalı və dəyərləndirilməlidir. Məktəbəqədər təhsil müəssisəsində daha çox oyun zamanı uşaqların stimullaşdırılması aparılır. Oyun özözlüyündə uşaqlara təkan verir, stimullaşdırır, həvəsləndirir və təşviq edir" (1, s. 41-42**)**.

Uşaq bağçasında təhsil prosesinin keyfiyyətinə təsir edən əsas komponentlər belə müəyyən edilir:

• pedaqoji prosesin tədris-metodiki materiallarla təchiz edilməsi;

• təhsil prosesi iştirakçılarının qarşılıqlı əlaqəsi;

• inkişafetdirici təlim mühitinin yaradılması.

Uşaq bağçasının tədris-metodiki təchizatı müəllimlərə tədris prosesini kifayət qədər yaxşı səviyyədə aparmağa imkan verir. Uşaq bağçasında əsas ümumi təhsil proqramının həyata keçirilməsi üçün aşağıdakı təhsil sahələrində işin aparılması zəruridir:

• fiziki inkişaf;

• sosial və kommunikativ inkişaf;

• bədii və estetik inkişaf;

• koqnitiv inkişaf;

• nitqin inkişafı.

Adlarını qeyd etdiyim məsələlər inkişafetdirici mühit üçün bir çox vacib nüansları özündə birləşdirir. Belə ki, istər fiziki, istər sosial, istərsə nitq və digərləri uşaqların sağlamlıqları, bir-biri ilə ünsiyyət saxlamaları üçün mühümdür.

Pedaqogikada tərbiyə amili kimi ətraf mühitə gəldikdə isə biz insan mühitini, orada qəbul edilən münasibət və fəaliyyət normalarını nəzərdə tuturuq. Müasir pedaqogikada "inkişafetdirici mühit" anlayışı var (uşağa ən təsirli təsir göstərmək üçün xüsusi şəkildə qurulan). Bəzi müəlliflər insanın inkişafında tərbiyənin əhəmiyyətini əsaslandırmaq üçün təhsilin təsiri altında psixikanın yeni fikirlər əldə etdiyini qəbul edirlər. Bu məqsədlə yetişən nəsildə tərbiyə işlərini asanlaşdıran inkişafetdirici mühitin yaradılması zəruridir.

Müasir məktəbəqədər pedaqogikada tərbiyə və təhsil prosesinin humanistləşdirilməsi, uşaqların psixi və fiziki sağlamlığının qorunması və möhkəmləndirilməsi, onların hərtərəfli inkişafı vəzifələri ön plana çəkilir. Eyni zamanda müasir təhsil sistemində inkişafetdirici mühiti yaratmadan bu problemin həlli mümkün deyil. İnkişafetdirici mühit dedikdə, məkan və zamanda rasional şəkildə təşkil edilmiş, müxtəlif obyektlər və oyun materialları ilə təmin edilmiş təbii rahat mühit başa düşülməlidir. Belə bir mühitdə qrupdakı bütün uşaqları eyni vaxtda aktiv idrak və yaradıcı fəaliyyətə daxil etmək mümkündür.

İnkişafetdirici mühit uşağın inkişafının bütün aspektlərinə formalaşdırıcı təsir göstərir: əqli, fiziki, əxlaqi, estetik və s.

Uşaqların fiziki vəziyyəti əsasən onların emosional rahatlığı ilə müəyyən edilir. Eyni zamanda ətraf məkanın kifayət qədər mənimsənilməsini təmin edən avadanlıqlar uşaqların sağlamlığı və vaxtında fiziki inkişafı üçün əsasdır. Digər bədən funksiyaları ilə müqayisədə formalaşması daha uzun sürən dayaq-hərəkət aparatının vaxtında yetişməsi, uşağın aktiv hərəkət etməsi üçün çox vacibdir.

Uşaqların həyatının bütün aspektləri ilə əlaqəli olan zehni inkişafına xüsusi diqqət yetirilməlidir. Geniş və dar mənada mühit körpənin idrak fəaliyyətinin formalaşmasına təsir göstərir.

Həyatın erkən dövründə uşaq dünyanı özünəməxsus şəkildə, emosional-sensor şəkildə öyrənir. Həm də yalnız səthi olanı, onun görmə və dərki üçün əlçatan olanı mənimsəyir. Bununla belə müəllim nəzərə almalıdır ki, ilk bilik reallığın sonrakı inkişafında öz əhəmiyyətini saxlayaraq, ətraf aləm haqqında bilikdə əsas rol oynayır. Buna görə də, uşağı əhatə edən obyekt mühiti uşağın idraki inkişafına uyğun sadələşdirilmiş şəkildə başa düşülməlidir. Həyatın bu dövründə uşaq təəssüratları toplayır və hiss təcrübəsini genişləndirir. Uşaq ətrafındakı dünyada

gəzməyi öyrənir, onda bilik sistemi formalaşmağa başlayır ki, bu da məcazi mənada beynin "rəflər"ində yerləşdirilir. Bu prosesin nizamlanması gələcəkdə böyük ölçüdə idrak fəaliyyətinin inkişafı üçün məzmunun, materialın və üsulların seçilməsinə gətirib çıxarır.

İnkişafetdirici mühit uşaqların təhsil və tərbiyəsinin bütün komponentlərinin həyata keçirilməsinə kömək etməlidir. Uşaqların hərtərəfli inkişafı, tərbiyəsi və təhsili yalnız müəyyən şərtlər daxilində həyata keçirilə bilər:

▪ Uşağın yanında sevgi dolu, anlayışlı, məsuliyyətli və yüksək peşəkar müəllimlər olmalıdır;

▪ Uşaq üçün onların yaşına uyğun əşyalar və oyuncaqlarla təmin edilmiş inkişafetdirici mühit yaradılmalıdır;

▪ İnkişafetdirici mühiti emosional rahatlıq, əyləncə və təhsil üçün təlim materialları ilə doldurmaq vacibdir.

Uşaq üçün mühit onun həyatının inkişaf etdiyi məkandır. İnkişafetdirici təlim mühiti – uşağın fəaliyyətinin maddi obyektlər sistemi, uşaqların müxtəlif fəaliyyətini təmin edən sosial və obyektiv vasitələrin birliyidir. Bu mühit uşağın şəxsiyyətinin qurulmasının təməli kimi qəbul edilməlidir.

İnkişafetdirici təlim mühiti böyüklər və uşaqlar arasında qarşılıqlı əlaqədə vasitəçi rolunu oynaya bilər və olmalıdır. Burada uşaq öz təcrübələrini başqaları ilə bölüşə, həyatını və fəaliyyətini qura bilər. Bu mühit uşağın sevinclə məşğul olduğu və mümkün qədər uzun müddət qalmaq istədiyi ikinci ev olmalıdır. Ətrafdakı məkanı elə qurmaq lazımdır ki, hər bir uşaq orada özünü rahat hiss etsin, öz fərdiliyini dərk etmək, qrupdakı digər "şəxsiyyətlər" arasında "şəxsiyyət" olmaq imkanı əldə etsin.

Məktəbəqədər təhsil müəssisəsində təşkil edilən inkişafetdirici mühitə aşağıdakılar aiddir: – daxili inkişafetdirici mühit (müəssisənin və qrupun daxili mühiti) – fəaliyyət mərkəzləri belə mühitin yaradılması üçün əsas vasitədir. Belə mühit uşağın maraq (müxtəlif mərkəzlər və müxtəlif materiallar) və ehtiyaclarına (uşağın fəaliyyət mərkəzini seçmək imkanı) uyğun təlimi təcrübədə həyata keçirməyə imkan verir; – xarici inkişafetdirici mühit (uşaq bağçasının həyətyanı sahəsi) – müəssisənin həyətyanı sahəsi daxili məkanda mümkün olmayan imkanları təmin edir (4, s. 37).

Əşyavi-inkişafetdirici mühitin əsası məhz məktəbəqədər dövrdə qoyulur. Bu baxımdan qeyd olunmalı məsələlər daha çoxdur. Məktəbəqədər təhsil müəssisəsində əşyavi-inkişafetdirici mühiti formalaşdırarkən, otaqların rəngindən oyuncaq seçiminə qədər mühitin uşaqların inkişafına olan təsirinin bütün məqamlarını nəzərə almaq lazımdır. Qrup otağının tərtibatı zamanı rənglərin uşağın psixoloji və fiziki əhvalına olan təsirini unutmaq olmaz, bu səbəbdən də, rəng tərtibatı, rəng qavrayışı qanunları, otağın hansı dərslər üçün nəzərdə tutulduğu, uşaqların yaşı nəzərə alınaraq müəyyənləşdirilməlidir. Uşaqlar üçün interyerin qurulması zamanı rəng parlaqlığına deyil, bir aparıcı rəng qammasının üstünlük təşkil etməsi şərti ilə, rəng və fakturaların tonal müxtəlifliyindən istifadə olunmasına fikir vermək lazımdır. Unutmaq olmaz ki, kəskin rəng dəyişikliyi ya stimullaşdırıcı, ya da yorucu təsir göstərə bilər. MTM interyerində rəng siqnal rolunu oynamalı – uşaqlara rənginə görə hər hansı zona və ya otağı tapmaqda kömək etməlidir.

Əşyavi-məkan inkişafetdirici mühitinin ən mühüm təsiri onun uşaqların həm fiziki, həm də psixoloji sağlamlığına olan bağlılığıdır. Buna görə də əşyavi-məkan mühiti elə qurulmalıdır ki, uşaqların sağlamlığının qorunmasına və möhkəmləndirilməsinə səbəb olsun.

Əşyavi-məkan inkişafetdirici mühitinin yaradılmasının əsas şərtlərindən biri uşaqlarda məktəbəqədər təhsil müəssisəsində olduğu müddətdə həm fiziki, həm də psixoloji təhlükəsizlik hissinin yaradılmasıdır. Bununla da uşaqların həyat keyfiyyəti yüksəldilir, sosial və fərdi inkişaf vəhdət şəklini alır. Təhlükəsizlik kateqoriyası inteqrativ xarakter daşıyır. Onun tərkib hissəsini təşkil edən ən mühüm kateqoriya isə psixoloji təhlükəsizlikdir. Təhsil prosesinin psixoloji təhlükəsizliyi təhsil fəaliyyətinin uğurlu təşkilinin ilkin şərtidir.

Məktəbəqədər yaşlı uşaqları inkişaf etdirən əşyavi mühit konsepsiyasının hazırlanmasında alim Y.İ. Tixeyevanın əvəzedilməz rolu olmuşdur. O, öz ideyalarını yerli uşaq bağçalarının birində reallaşdırmışdır. Tixeyevanın, demək olar ki, yüz il əvvəl dediyi bir çox ideyalar bu gün də öz aktuallığını itirməmiş, əksinə, uşaq bağçalarında məktəbəqədər yaşlı uşaqların inkişaf etdirilməsinin əsas şərtinin əşyavi-inkişafetdirici mühit olduğu anlayışı ilə çox uyğundur. Tixeyeva öz tədris proqramını işləyib hazırlayarkən,

əsas yeri uşağı əhatə edən cismi şəraitə verirdi. İnsanın təhsili zahiri hisslərin köməyi ilə əşyaların dərk edilməsindən başlayır, bu səbəbdən də, əşyavi və cismani aləm balaca uşağın təlim və tərbiyəsinin başlıca şərtidir.

Ən yaxşı əhatə təbiətdir. Məhz təbiət uşağın əsas maraqlarını təmin edir, uşaqlarda sevinc hissini saxlayır və yeniləyir, tükənməyən informasiya mənbəyidir. Buna görə, ilk növbədə, uşaqlar olan otaqları canlı təbiət obyektləri ilə: bitkilərlə, heyvanlarla zənginləşdirmək lazımdır.

Əşyavi aləmi yaradarkən, uşaqların yaş və individual xüsusiyyətləri nəzərə alınmalı, qrup otağı artıq əşyalarla doldurulmamalı, orada yalnız ən lazımlı, istifadəsi rahat əşyalar olmalı, məşğələ zamanı uşaqlar məcbur olunmamalı, onlarda qrup otağındakı materiallar, oyunlar və vəsaitlərin köməyi ilə sərbəst fəaliyyətə maraq yaradılmalıdır.

Y.İ. Tixeyeva hesab edirdi ki, uşağın inkişafında əsas müvafiq şərtlərin formalaşdırılmasıdır. Buna görə də o, biliklərin zorla verilməsinə qəti qarşı idi. Onun fikrinə görə, pedaqoq özünə sual verməlidir: bu uşaq bu və ya digər bilikləri qavramağa hazırdır? Yalnız uşaq hazır olduğu halda, ona anlaya biləcəyi qədər informasiyanı sərbəst şəkildə qavramaq təklif olunur.

Mühitin rahat, uşaq təbiətinə uyğun olması, materialların əlçatan və mütəmadi olaraq yenilənən, sistemli olması, azad seçim imkanı Tixeyevanın təklif etdiyi uşaq bağçası şəraitinin aparıcı ideyalarıdır. Bu cür mühit uşaqları fəal olmağa vadar edir, oradakı materialların məzmunu isə onların hərtərəfli inkişafına və özünüinkişafına səbəb olur. Y.İ. Tixeyevanın fikrinə görə, bu zaman pedaqoqun hansı sistemlə işlədiyi mühüm rol oynamır, əsas əhəmiyyət kəsb edən pedaqoqun öz missiyasını nə cür dərk etməsi, qarşısına qoyulan tədris məsələlərini nə cür anlamasıdır. Hər bir tədris proqramı, hər bir tərbiyə metodu və ya sistemi nə qədər yaxşı da olsa, müəllim tərəfindən qəbul edilməzsə, reallıqda heç bir qüvvəyə və təsirə malik olmayan ölü hərflər olaraq qalacaq.

Bu istiqamətdə aparılan işlər müharibədən sonrakı illərdə davam etdirildi və orijinal məktəbəqədər təhsil sisteminin yaradılmasına istiqamətləndi. Bu dövrdə tədqiqatçıları uşağın özünün öyrənilməsindən daha çox, onun təlim və tərbiyəsinin forma, metod və vasitələri maraqlandırırdı. Bilik bu dövrün əsas dəyərinə çevrilir və buna müvafiq olaraq, o zamanın innovativ ideyaları, ilk növbədə, uşaqlara biliklərin ötürülməsi yolları, vasitələri və üsullarını əks etdirirdi. Bununla bağlı olaraq, məktəbəqədər yaşlı uşaqların tədris olunma şəraitinin öyrənilməsinə istiqamətlənmiş tədqiqatların sayı artır, əsas diqqət uşaq bağçası qrupunda tətbiq ediləcək səmərəli tədris vasitələrinin axtarışına ayrılırdı.

Rus alimlərindən A.K. Matveyevanın işlərində göstərilir ki, hətta, üçyaşlı uşaqlarda belə müşahidə və müşahidəçiliyi inkişaf etdirmək olar, bunun əsas şərti canlı obyektlərin müşahidəsini təşkil etməkdir. Heyvanlar məqsədyönlü qavrayışın inkişaf etdirilməsi üçün ideal obyektdir, onlar dinamikdir, onları müşahidə edərkən uşaq sevinc və təəccüb hissləri keçirir, bu hisslər olmadan isə idraki fəaliyyət səmərəli ola bilməz. Təəssüf ki, müasir uşaq bağçalarında canlı obyektin olması çox nadir haldır. Məhz bu səbəbdən müasir uşaqlar onlardan bir neçə onillik öncə doğulan yaşıdları ilə müqayisədə daha aşağı qavrayış səviyyəsi nümayiş etdirirlər.

1990-cı illərdə məktəbəqədər təhsil müəssisələrinin təşkilat işlərinə, o cümlədən əşyavi mühitin təşkilinə təsir edən mühüm dəyişikliklər baş verdi. Şəxsiyyətin, onun insani keyfiyyətlərinin dəyəri artır, təhsilin məqsədləri dəyişir. Əməkdaşlıq pedaqogikası inkişaf edir, uşaqlara qarşı fərdi-istiqamətlənmiş yanaşma elan olunur, yenə də (1930-cu illərdə olduğu kimi), uşağın subyekt, “Mən”, fərd olaraq öyrənilməsinə maraq yaranır. Dəyişikliklər zamanının gəldiyi anlaşılır, o cümlədən zamanın tələbinə uyğun olaraq məktəbəqədər təhsil müəssisələrində uşaqlar üçün əşyavi mühitin təşkilində yeni yanaşmaların hazırlanması zərurəti yaranır.

Praktiki işçilərə uşaq bağçasının əşyavi-məkan mühitini təşkil etməkdə kömək edəcək materiallar hazırlanmışdır. Bu materiallarda məktəbəqədər təhsil müəssisəsinin bütün yaş qrupları üçün əşyavi-inkişafetdirici mühitin modellərinin qurulmasının nəzəri əsasları göstərilmiş, əşyavi-inkişafetdirici mühitin qurulma prinsipləri verilmiş, bu cür mühitin konseptual modeli təsvir olunmuş, inkişafetdirici mühitin məzmununun xarakteristikası verilmiş, həmçinin məktəbəqədər təhsil müəssisələrinin müxtəlif otaqları üçün avadanlıq, tədrisi-metodiki və oyun materiallarının təxmini siyahısı hazırlanmışdır.

Həmin işlərin əsasını təşkil edən əsas qaydalar bunlardır:

1. Uşaq bağçasında əşyavi mühit erkən və məktəbəqədər yaşlı uşaqların əsas tələbatlarını təmin etməlidir. Bu, ünsiyyətə, dərketməyə, hərəkətə, qəbul olunmağa, özünütəsdiqə olan tələbatdır.

2. Əşyavi mühit – tədris məsələlərinin həllinin şərt və vasitələrindən biri olub, uşaq bağçasında həyata keçirilən tədris proqramı ilə sıx bağlıdır. Buna görə də, hər bir təhsil müəssisəsi üçün unikaldır.

3. Uşaqların özü maksimal dərəcədə qrupun, uşaq bağçasının, sahənin yaradılması və dəyişdirilməsi işlərinə cəlb olunmalıdır, belə ki, məhz belə yanaşma həqiqətən də rahat inkişaf mühiti yarada bilər (uşağın özündən yaxşı onun tələbat və maraqlarının kim bilə bilər?).

4. Qrupun əşyavi mühiti doldurulmuş və yorucu deyil, məzmunlu və zəngin olmalıdır. Çünki bu, uşaq inkişafı üçün həyati vacib olan bir məkandır.

5. Əşyavi mühit uşaqla birlikdə dəyişməsə, inkişafetdirici olmayacaq.

Beləliklə, inkişafetdirici təlim mühiti uşağın şəxsiyyətinin formalaşmasının əsas vasitəsidir, onun bilik və sosial təcrübəsinin mənbəyidir. Uşaq bağçasında uşaqları əhatə edən əşyavi mühit onların həyatının təhlükəsizliyini təmin etməli və sağlamlığını möhkəmləndirməlidir.

**Problemin aktuallığı.** Uşaqların hərtərəfli inkişafına əşyavi–inkişafetdirici mühitin təsiri məsələləri mühüm olması ilə seçilir. Çünki həmin məsələlər uşaqların formalaşması və inkişafları baxımından vacibdir.

**Problemin yeniliyi.** Hər yaş dövründə uşaqlar zehni fəaliyyətin inkişafına və təbiətə sabit müsbət münasibətin formalaşmasına kömək edən təbiət haqqında elementar biliklər sistemi əldə edirlər.

**Problemin praktik əhəmiyyəti.** Əldə olunmuş nəticələr müxtəlif məşğələlərdə tərbiyəçi-müəllimlərin istifadəsi üçün tövsiyə edilir. Eyni zamanda tədqiqatdan əldə edilmiş nəticələrdən dərsliklərin, dərs vəsaitlərinin, elmi-metodik ədəbiyyatın və elmi-tədqiqat işlərinin hazırlanmasında istifadə oluna bilər.

**Ədəbiyyat:**

1. Əliyeva, Ş.Q. Həmidova X.A. Mustafayeva S. İnkişafetdirici, dəstəkləyici və təhlükəsiz mühitin yaradılması / Ş.Q. Əliyeva, X.A.Həmidova, S.Mustafayeva. - Bakı, 2020. – 84 s.
2. Cəfərova, L.K. Məktəbəqədər tərbiyə sisteminin müasir problemləri // Bakı: Təhsil, mədəniyyət, incəsənət, - 2002. № 4, - s.71–72
3. Cəfərova L.K. Məktəbəqədər təhsil: tərbiyəçi-müəllimlər və metodistlər üçün stolüstü kitab / L.K.Cəfərova. - Bakı: Letterpress nəşriyyat evi, - 2019. -316 s.
4. Məktəbəqədər təhsil proqramı (Kurikulum) / - 2022. – 54 s.
5. Mursaqulova, R.N. Əliyeva Ş.Q. Məktəbəqədər yaşlı uşaqların təbiətlə tanış edilməsi metodikası / R.N.Mursaqulova, Ş.Q.Əliyeva. - Bakı, ADPU-nun nəşriyyatı, - 2008. – 416 s.

**E-mail:** camila.piriyeva@gmail.com.
**Redaksiyaya daxil olub:**28.11.2024

*UOT 372.3/.4*

***Arzu Sarvan qızı Orucəliyeva***
*Bakı şəhəri Səbail rayonu 189-190 nömrəli məktəbin ibtidai sinif müəllimi*
*https://orcid.org/0009-0006-9956-590X*
*https://doi.org/10.69682/arti.2024.91(6).82-85*

## İBTİDAİ SİNİF ŞAGİRDLƏRİNİN RİYAZİ HESABLAMA BACARIQLARININ DİDAKTİK OYUNLAR VASİTƏSİLƏ FORMALAŞDIRILMASI

***Арзу Сарван гызы Оруджалиева***
*учитель начальных классов школы № 189-190 Сабаильского района города Баку*

## ФОРМИРОВАНИЕ МАТЕМАТИЧЕСКИХ ВЫЧИСЛИТЕЛЬНЫХ НАВЫКОВ У УЧАЩИХСЯ НАЧАЛЬНЫХ КЛАССОВ ПОСРЕДСТВОМ ДИДАКТИЧЕСКИХ ИГР

***Arzu Sarvan Orujaliyeva***
*primary school teacher number 189-190 of Sabail district*
*of Baky city*

## FORMATION OF MATHEMATICAL CALCULATION SKILLS OF PRIMARY CLASS STUDENTS THROUGH DIDACTIC GAMES

**Xülasə.** Məktəbin ilk illərində riyaziyyat ən çətin, bəzi uşaqlar üçün isə ən az sevilən fənn olur. Bu, bəzi uşaqlarda təhlil, sintez, ümumiləşdirmə, müqayisə etmək, təsnif etmək və fərqləndirmək bacarığı kimi zehni fəaliyyət funksiyalarının hələ kifayət qədər inkişaf etməməsi ilə izah olunur. Uşaqları müvəffəqiyyətlə öyrətmək üçün ilk növbədə onlarda təlim fəaliyyətinə maraq oyatmaq, fəaliyyətlərini intensivləşdirmək lazımdır. Tədris mövzusuna böyük maraq oyatmağın ən təsirli vasitələrindən biri didaktik oyundur.
***Açar sözlər:*** *riyaziyyat, didaktik oyunlar, bilik, bacarıq, təfəkkür, yaradıcılıq, təhlil, hesablama*

**Аннотация.** В первые школьные годы, математика – самый трудный, а для некоторых детей и самый нелюбимый предмет. Это объясняется тем, что у некоторых детей функции психической деятельности, такие как умение анализировать, синтезировать, обобщать, сравнивать, классифицировать и дифференцировать, еще недостаточно развиты. Для успешного обучения детей, прежде всего, необходимо вызвать у них интерес к учебной деятельности, увлечь их, активизировать их деятельность. Одним из наиболее эффективных средств вызвать большой интерес к изучаемому предмету является дидактическая игра.
***Ключевые слова***: *математика, дидактические игры, знания, умения, мышление, творчество, анализ, вычисление*

**Abstract.** In the first years of school, mathematics is the most difficult, and for some children, the least favorite subject. This is explained by the fact that in some children the functions of mental activity, such as the ability to analyze, synthesize, generalize, compare, classify and differentiate, are not yet sufficiently developed. In order to educate children successfully, first of all, it is necessary to arouse their interest in educational activities, to charm them, and to intensify their activities. One of the most effective means of arousing great interest in the subject of study is a didactic game.
***Keywords:*** *mathematics, didactic games, knowledge, skill, thinking, creativity, analysis, calculation.*

Dərsdə oyun texnikası və situasiyaların həyata keçirilməsi aşağıdakı əsas istiqamətlərdə baş verir: şagirdlərə oyun tapşırığı şəklində didaktik məqsəd qoyulur, təhsil fəaliyyəti oyun qaydalarına tabe edilir, tədris materialı onun vasitəsi kimi istifadə olunur, didaktik tapşırığı oyuna çevirən rəqabət elementi təhsil fəaliyyətinə daxil edilir, didaktik tapşırığın uğurla yerinə yetirilməsi oyunun nəticəsi ilə əlaqələndirilir.

Riyaziyyat dərslərində didaktik oyun təkcə düşündürmür, həm də şagirdin müstəqilliyini, təşəbbüskarlığını və iradəsini inkişaf etdirir, ona dostlarının maraqlarını nəzərə almağı öyrədir. Oyunun əsiri olan uşaqlar proqram materialını daha asan mənimsəyərək müəyyən bilik və bacarıqlara yiyələnirlər. Ona görə də riyaziyyat dərsinə oyun tapşırıqlarının daxil edilməsi təlim prosesini maraqlı edir, uşaqlarda şən əhval-ruhiyyə yaradır, materialın mənimsənilməsində çətinlikləri aradan qaldırmağa kömək edir, yorğunluğu aradan qaldırır, diqqəti artırır.

Didaktik oyunların mahiyyəti aşağıdakılardır:

- ✓ kiçik məktəblilərin idrak marağı əhəmiyyətli dərəcədə artır;
- ✓ dərs daha canlı və emosional zəngin olur;
- ✓ öyrənmə üçün müsbət motivasiya formalaşır;
- ✓ könüllü diqqət inkişaf edir, performans artır;
- ✓ komandada işləmək bacarığını inkişaf etdirir.

İdrak fəaliyyətinin xarakterindən asılı olaraq didaktik oyunları aşağıdakı qruplara bölmək olar:

- ✓ şagirdlərdən icra funksiyasını tələb edən oyunlar. Bu oyunların köməyi ilə uşaqlar modelə uyğun hərəkətlər edirlər (ədədi ifadələr tapın, bir nümunə qoyun, buna bənzər bir fiqur çəkin)
- ✓ təkrar hərəkət tələb edən oyunlar. Onlar hesablama bacarıqlarını inkişaf etdirməyə yönəldilmişdir (“Riyazi balıqçılıq”, “Labirint”, “Zirvəyə necə çıxmaq olar”, “Qutu doldurun”, “Gəminin gedişini müəyyənləşdirin”)
- ✓ axtarış və yaradıcılıq elementlərini ehtiva edən oyunlar (“Dairəvi nümunələr toplayın”, “Riyazi tırtıl”)

İstifadə olunan materialın xarakterindən asılı olaraq didaktik oyunlar şərti olaraq obyektlərlə oyunlara, lövhə çaplı oyunlara və söz oyunlarına bölünür.

Funksiyalarına görə didaktik oyunlar aşağıdakılara bölünür: öyrədici; yoxlayıcı; inkişafetdirici.

Şagirdlər oyunda iştirak etsələr, yeni bilik və bacarıqlar əldə etsələr və ya oyuna hazırlıq prosesində onları mənimsəməyə məcbur olsalar, oyun ***öyrədici*** olacaqdır. Üstəlik, idrak fəaliyyətinin motivi təkcə oyunda deyil, həm də riyazi materialın özündə daha aydın ifadə olunarsa, biliklərin mənimsənilməsinin nəticəsi daha yaxşı olacaqdır.

***Yoxlayıcı*** oyunu didaktik məqsədi əvvəllər əldə edilmiş bilikləri təkrarlamaq, möhkəmləndirmək və yoxlamaqdır. Bu oyunda iştirak etmək üçün hər bir şagirdin müəyyən riyazi biliklərə malik olması lazımdır.

**İnkişafetdirici** oyunlar biliklərin inteqrasiyasını tələb edir. Onlar fənlərarası əlaqələrin qurulmasına töhfə verir və müxtəlif təlim vəziyyətlərində hərəkət etmək bacarıqlarının əldə edilməsinə yönəlmişdir.

İştirakçıların sayından asılı olaraq didaktik oyunlar: kollektiv, qrup və fərdi ola bilər.

Didaktik oyunlar dərsin müəyyən mərhələlərində istifadə oluna bilər. Hesablama bacarıqları, məlum olduğu kimi, eyni əməliyyatların dəfələrlə təkrarlanması nəticəsində əldə edilir. Vurma və bölməni öyrənərkən monotonluğun qarşısını almaq üçün məşqləri əyləncəli şəkildə aparmaq mümkündür.

Didaktik oyunun dəyərini onun şagirdlərdə doğurduğu reaksiyaya görə deyil, hər bir şagird üçün öyrənmə probleminin həllinə nə dərəcədə səmərəli kömək etdiyinə görə müəyyən etmək lazımdır.

Bir dərs üçün didaktik oyun seçərkən aşağıdakı suallar üzərində düşünmək lazımdır: Oyunun məqsədi nədir? Oyun zamanı hansı bacarıqlar inkişaf etdiriləcək? Oyun zamanı hansı təhsil məqsədləri reallaşacaq? Bu, mənim sinfimdəki şagirdlər üçün mümkündürmü? Bütün uşaqlar oyunda bərabər iştirak edəcəkmi? Oyun necə yekunlaşdırılacaq?

Dərsdə didaktik oyun keçirmək üçün zərurət yaranarsa, əvvəlcədən qruplar qurulur ki, hər qrupa həm güclü, həm də zəif öyrənmə qabiliyyəti olan şagirdlər daxil olur. Hər qrupa bir məsul şəxs təyin edilir. Bir qayda olaraq, bu, yaxşı akademik imkanları olan və ya qrup işini təşkil edə bilən ən mütəşəkkil şagird olur.

Didaktik oyun əzmkarlıq, ciddi münasibət, təfəkkür prosesindən istifadə tələb edir. Oyun uşağın inkişafının təbii yoludur. Təbiət bizi belə yaradıb, bala heyvanların bütün həyati bacarıqlarını oyun vasitəsilə əldə etməsi təsadüfi deyil. Yalnız oyunda uşaq sevinclə və asanlıqla, günəşin altındakı bir çiçək kimi yaradıcılıq qabiliyyətlərini ortaya qoyur, yeni bacarıq və biliklərə yiyələnir, çeviklik, müşahidə, təxəyyül, yaddaş inkişaf etdirir, düşünməyi, təhlil etməyi, çətinlikləri dəf etməyi öyrənir, eyni zamanda əvəzolunmaz şeyləri mənimsəyir.

Didaktik oyunun əsas məqsədi şagirdlərə müxtəlif obyektləri, rəqəmləri, həndəsi fiqurları, istiqamətləri ayırd etmək, vurğulamaq, adlandırmaqla bağlı biliklər verməkdir. Didaktik oyunlar yeni biliklər formalaşdırmaq və uşaqları fəaliyyət üsulları ilə tanış etmək imkanına malikdir. Hər bir oyunun uşaqların riyazi (kəmiyyət, məkan, zaman) anlayışlarını təkmilləşdirmək üçün xüsusi vəzifəsi var.

Məktəblilərdə hesablama bacarıqlarının formalaşdırılması ibtidai məktəbin əsas vəzifələrindən biridir, çünki hesablama bacarıqları həm də hər bir insanın praktik həyatında zəruridir.

Hesablama bacarığı hesablama texnikasına yüksək dərəcədə yiyələnməkdir. Hesablama bacarığına yiyələnmək hər bir hal üçün hesab əməliyyatının nəticəsini tapmaq üçün hansı əməliyyatların və hansı ardıcıllıqla yerinə yetirilməli olduğunu bilmək və bu əməliyyatları kifayət qədər tez yerinə yetirmək deməkdir.

Hesablama bacarığı dəqiqlik, məlumatlılıq, rasionallıq, avtomatiklik və güc ilə xarakterizə olunur.

**Dəqiqlik** – şagirdin hesab əməliyyatının nəticəsini düzgün tapması, yəni texnikanı təşkil edən əməliyyatları düzgün seçməsi və yerinə yetirməsi deməkdir.

**Məlumatlılıq** – şagird əməliyyatların hansı bilik əsasında seçildiyini və onların yerinə yetirilmə ardıcıllığının müəyyən edildiyini dərk edir. Şagird istənilən vaxt nümunəni necə həll etdiyini və niyə belə həll edilməli olduğunu izah edə bilər.

**Rasionallıq** – şagird müəyyən bir iş üçün daha rasional bir texnika seçir.

**Avtomatiklik** – şagird əməliyyatları tez və asan formada yerinə yetirir.

**Davamlılıq** – şagird formalaşmış hesablama bacarıqlarını uzun müddət saxlayır. Hesablama bacarıqlarını inkişaf etdirərkən, həm ədədi məlumatlar, həm də formada müxtəlif olması üçün kifayət qədər məşqlərin olması vacibdir.

Oyun – şagirdə, hətta zəif bir şagirdə də yeni materialı başa düşməyə və mənimsəməyə imkan verən, eyni materialı monotonluq və cansıxıcılıq olmadan dəfələrlə təkrarlamağa şərait yaradan öyrənmə formasıdır. Hər bir oyunun özünəməxsus tapşırıqları var, bunun əsasında uşaqlar mürəkkəb zehni fəaliyyəti inkişaf etdirən oyun hərəkətlərini həyata keçirirlər. Didaktik oyundan dərsin müxtəlif mərhələlərində istifadə oluna bilər. Yeni materialın qavranılması üzrə hazırlıq işləri oyun şəklində də aparıla bilər. Nümunə kimi şagirdlərin hesablama bacarıqlarını yoxlamaq üçün bəzi oyunlara baxaq.

**"Ən yaxşı pilot".** “Kim pilot olmaq istəyir?” sualları ətrafında qısa söhbət aparılır. “Pilot necə olmalıdır?”, “Nəyi bilməli və yaxşı bacarmalıdır?” Uşaqlar ümumiləşdirirlər: “Pilot öz təyyarəsini inamla uçurmaq üçün çox şey bilməli, bacarmalıdır və ilk növbədə hesablamaları düzgün aparmalıdır”. Pilot olmaq, səmaya uçmaq üçün, çox şey bilmək lazımdır, çox şey etməyi bacarmaq lazımdır. Riyaziyyat pilotlara kömək edəcək. Lövhədə üç sütunlu ifadələr yazılıb, onların altında isə rəsmlər var. Hər ifadənin üstündə üç cavab var. Onlardan biri düzgündür.

475 345 867 657 897 1097

3+2 2+2 5+3 4+2 10-3 10-1

Sinif üç komandaya bölünür. Hər birinə pilotlar təyin olunur. Komanda növbə ilə ifadələrin dəyərlərini hesablayırlar, aşağıdan başlayaraq cavabı dairə edirlər və təyyarələrini nəzərdə tutulan kurs boyunca uçurlar. Oyunun sonunda nəticələr yekunlaşdırılır. Ən yaxşı pilot müəyyənləşdirilir, edilən səhvlər təhlil edilir.

**"Riyazi toplar".** Eyni cərgədə oturan uşaqlar üz-üzə dayanırlar. Müəllimin siqnalına görə, hər cərgədən birinci şagird istənilən misalın adını çəkir: toplama və ya çıxma, vurma və ya bölmə, məsələn, 7 + 2 = və topu qonşusuna atır. O, topu tutur, cavabın adını çəkir və cavabın nömrəsini ilkin rəqəm kimi istifadə edərək aşağıdakı ifadəni qurur, yəni bu halda 9 rəqəmi. 9-4 yeni ifadə tərtib edib, topu atır, qarşı cərgədə dayanan yoldaşı topu tutur və beləcə davam edir.

**“Məsələ qur və həll et”.** Müəllim lövhəyə məsələnin şərtini yazır, məsələni şagirdlər qurur və həll edir. Məsələn,

Var idi – 12 nəfər
Var idi –14 top
Qaldı – 5 nəfər.
Götürdülər – 8 top
Çıxdılar – ? nəfər
Qaldı – ? top

**“Bəli. Xeyir"**

Lövhədə nümunələr verilir: 4x6, 8x3, 4x5, 7x3, 9x4, 5x6. Rəqəmləri olan kartlar göstərilir. Əgər rəqəm cavabdırsa, şagirdlər bir ağızdan “Bəli” deyirlər, sonra 4x6=24 misalını söyləyirlər, cavab deyilsə, "Xeyr" deyirlər.

**"Canlı Riyaziyyat".** Bütün şagirdlərə 0-dan 9-a qədər rəqəmləri olan bir kart paylanır. Müəllim misalı oxuyur. (3x2). 6 nömrəli kartı olan şagird ayağa qalxır və ya əlini qaldırır.

**"Özünüzü sınayın".** Müəllim bəzi ədədlərin vurulmasının nəticələrinin yazıldığı kartlar hazırlayır, məsələn 18. Kartı göstərirəm və şagirdlər hansı rəqəmlərin hasilinin 18 olduğunu tapırlar.

**"Dostuna kömək ol".** İki (dörd) şagird eyni vaxtda lövhəyə gəlir. Müəllim bir nümunə oxuyur, məsələn: 6x7. Eyni ədədlərlə dörd vurma və bölmə nümunəsi tərtib etməyi təklif edir. Birinci şagird vurma, digəri isə bölmə üçün nümunələr gətirir. Nümunələr düzgün tərtib edilib həll olunubsa, uşaqlara işlərində komanda işinə görə təşəkkür edirəm. Lövhədəki yazı belə görünür:

6×7=42 7×6=42
42:7=6 42:6=7

Oyun fəaliyyəti uşaqlar üçün cəlbedicidir və yeni şeylər öyrənmək üçün müsbət motivasiya yarada bilər. Eyni zamanda, oyun əyləncə vasitəsi deyil – əyləncəli formada hazırlanmış ümumi bir məşqdir. Oyun şagirdlərdən ağıllı olmağı, diqqətli olmağı, dözümlü olmağı, öyrətməyi, bir-birini dəstəkləməyi, naviqasiya qabiliyyətini inkişaf etdirməyi, düzgün həll yolunu tapmağı, fənnə marağı inkişaf etdirməyi və artırmağı tələb edir. Oyun mühiti hər bir uşağın koqnitiv maraqlarının inkişafına töhfə verir və oyunda iştirak etmək imkanı verir.

**Problemin aktuallığı.** Tədris prosesində oyun texnologiyasının yeri və rolu, oyun və təlim elementlərinin birləşməsi müəllimin pedaqoji oyunların funksiyaları və təsnifatını başa düşməsindən çox asılıdır.

**Problemin elmi yeniliyi.** Oyunun əsas vəzifəsi ciddi iş və zəhmətin birləşməsidir. Oyun öyrənməkdən yayındırmır, əksinə ona təşviq edir. Oyun zamanı müəllim uşaqların oyundakı həyatını təşkil edir və uşağın şəxsiyyətinin inkişafının bütün aspektləri: hisslər, şüur; iradə və davranışlarına təsir edir.

**Problemin praktik əhəmiyyəti.** Oyun pedaqogikası hazırda bütöv bir istiqamətdir. Təlim prosesində pedaqoji vasitələr arasında didaktik oyun xüsusi yer tutur.

**Ədəbiyyat:**


1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 24 oktyabr tarixli nömrəli Sərəncamı ilə təsdiq edilmişdir // - Bakı: Qanun, - 2013.
2. Əlizadə Ə. Ə. // Əsrin meqameylləri: psixopedaqoji problemlər [Mətn]: III cild.- Bakı: 2008.- 501s.
3. İnteqrativ kurikulum / Mahiyyəti və nümunələr: Müəllimlər üçün vəsait (müəllif qrupu) Bakı, 2005.- 300 s. (İREX təşkilatının xətti ilə)
4. Алабина Р. И. Дидактические игры и игровые упражнения в процессе обучения // Начальная школа. Приложение к газете «Первое сентября». -2006. № 9. -С. 17-22.
5. Калинина Г. П. Развитие математической речи в начальных классах. // Специальное образование. -М., 2016. № 1. -С. 62-74.


**E-mail:**aoruceliyeva1972@gmail.com

**Redaksiyaya daxil olub:** 17.10.2024.

UOT 372.3/.4

***Könül Əziz qızı Babayeva***
*Azərbaycan Dövlət Dillər Universitetinin müəllimi,*
*fəlsəfə doktoru proqramı üzrə dissertant*
*https://orcid.org/0009-0008-1108-2861*
*https://doi.org/10.69682/arti.2024.91(6).86-90*

# KİÇİKYAŞLI MƏKTƏBLİLƏRDƏ TƏHLİL-TƏRKİB BACARIQLARININ XÜSUSİYYƏTLƏRİ

***Кёнуль Азиз гызы Бабаева***
*преподаватель Азербайджанского Университета Языков,*
*диссертант по программе доктора философии*

# ОСОБЕННОСТИ УМЕНИЙ АНАЛИЗА-СИНТЕЗА У ШКОЛЬНИКОВ МЛАДШЕГО ВОЗРАСТА

***Konul Aziz Babayeva***
*lecturer at the Azerbaijan University of Languages,*
*doctorial student in the program of doctor of philosophy*

# FEATURES OF ANALYSIS-SYNTHESIS SKILLS IN PRIMARY SCHOOL CHILDREN

**Xülasə.** Məqalədə bəhs edilən problem kiçikyaşlı məktəblilər tərəfindən ingilis dilinin mənimsənilməsinin psixoloji xüsusiyyətləri ilə bağlıdır. Göstərilir ki, uşaqlığın ikinci dövrü olan kiçikyaşlı məktəbli dövründə uşaqların həyatında yeni və mühüm mərhələ başlayır. Onlar oyun fəaliyyətindən təlim fəaliyyətinə keçirlər. Məktəb həyatı ilə bağlı bir sıra dəyişmələr baş verir. Həmin dəyişmələri kiçikyaşlı məktəblilərin dili mənimsəmələrində də görmək mümkündür. Onlar xarici dili maraqla öyrənsələr də bir sıra maneələrlə üzləşirlər. Bu maneələr özünü həm fonetikada, həm sintaksisdə, həm də orfoepiyada göstərir. Məqalədə kiçikyaşlı məktəblilşərin dili mənimsəmələrində yaranan çətinliklərin xarakteri də izah edilir. Qeyd olunur ki, bunun səbəbləri fizioloji və psixoloji amillərlə bağlıdır. Bir sıra uşaqlarda dislaliya və disleksiya əlamətləri özünü göstərir. Nitq problemləri olan uşaqlarda bu sahədəki imkanları genişləndirməkdən ötrü nitqin praktik təcrübədə mənimsənilməsinə üstünlük verilməlidir.
***Açar sözlər:*** *kiçikyaşlı məktəblilər, təhlil-tərkib bacarıqları, obrazlı təfəkkür, dilin mənimsənilməsi, mənimsəmə çətinlikləri, fikri fəaliyyət, nitq, fonetika, sintaksis, orfoepiya*

**Аннотация.** В статье рассматриваются психологические особенности усвоения английского языка младшими школьниками. Отмечается, что на втором этапе детства, соответствующем младшему школьному возрасту, в жизни детей начинается новый и важный этап. Они переходят от игровой деятельности к учебной. В школьной жизни происходят различные изменения, которые также отражаются на усвоении языка младшими школьниками. Несмотря на то, что они с интересом изучают иностранный язык, они сталкиваются с рядом трудностей. Эти трудности проявляются как в фонетике, так и в синтаксисе и орфоэпии. В статье также объясняется характер трудностей, с которыми сталкиваются младшие школьники при усвоении языка. Отмечается, что причины этих трудностей связаны с физиологическими и психологическими факторами. У некоторых детей проявляются признаки дислалии и дислексии. У детей с речевыми проблемами следует уделять особое внимание практическому усвоению речи, чтобы расширить их возможности в этой области.
***Ключевые слова:*** *школьники младшего возраста, умения анализа-синтеза, образное мышление, овладение языком, трудности усвоения, мыслительная деятельность, речь, фонетика, синтаксис, орфография*

**Abstract.** The article discusses the psychological characteristics related to the acquisition of the English language by young schoolchildren. It highlights that during the second stage of childhood, which corresponds

to the early school years, a new and significant phase begins in children's lives. They transition from play activities to learning activities. Several changes occur in their school life, and these changes are also reflected in the way young schoolchildren acquire language. Although they learn a foreign language with interest, they face several challenges. These challenges manifest in phonetics, syntax, and orthoepy. The article also explains the nature of the difficulties young schoolchildren face in acquiring the language. It is noted that the reasons for these difficulties are related to physiological and psychological factors. Some children show signs of dyslalia and dyslexia. For children with speech problems, priority should be given to the practical acquisition of speech to expand their capabilities in this area.

***Keywords:*** *primary school children, analysis-synthesis skills, figurative thinking, language acquisition, learning difficulties, thinking activity, speech, phonetics, syntax, spelling*

Yaş və uşaq psixologiyasında aparılan təsnifatlara görə uşaqlığın II mərhələsi kiçik məktəbli yaşı kimi səciyyələndirilir. Bu dövrdə uşağın həyatında baş verən ən ciddi psixoloji hadisə – onun sosial statusunun dəyişməsi olur. Belə ki, uşaq artıq məktəbli yaşına və məktəb həyatına qədər qoyur. Üzərinə yeni və məsuliyyətli öhdəliklər düşür, həyat tərzi, gün rejimi dəyişir. Bunlar uşağın həyatının bütün sahələrində əsaslı dəyişmələr yaradır. Ən mühüm dəyişmələr uşağın aparıcı fəaliyyətində baş verir. O, oyun fəaliyyətindən təlim fəaliyyətinə keçir.

Kiçikyaşlı məktəbli dövrünün psixoloji xüsusiyyətlərini öyrənmədən onların təfəkkür imkanlarını müəyyənləşdirmək çətindir. Deyilənlər kiçikyaşlı məktəblilərin psixi inkişafına, təfəkkür fəaliyyətinə, yaş imkanlarına həsr edilmiş ədəbiyyatlarda öz izahını tapır. Kiçikyaşlı məktəblilərin nitqi ilə bağlı A.A. Reanın fikri bundan ibarətdir ki, bu dövrdə ən mühüm hadisə yazılı nitqin formalaşmasıdır. *"Yazılı nitqin şifahi nitqlə bir çox ümumi cəhətlərinin olmasına baxmayaraq, o daha çox özünün spesifik xüsusiyyətlərinə malikdir"* [7, s. 247].

Kiçikyaşlı məktəblilərin təfəkkürü və nitqini A.V. Petrovski bildirir ki, "*hələ kiçik məktəbyaşlı şagirdlərdə müəllimin köməyi ilə müxtəlif məfhumlar yaranmağa başlayır. Bu əsas üzərində onlarda müvafiq təsəvvürlər yaranır. Müəllim bu təsəvvürləri təhlil edir, haqqında danışılan quşların oxşar və fərqli əlamətlərini uşaqlara çatdırır. Beləliklə, müvafiq məfhum yaranır"* [4, s. 288].

Tədqiqatımız da kiçik məktəbli yaşı ilə bağlıdır. Araşdırdığımız problem kiçikyaşlı məktəblilər tərəfindən dilin mənimsənilməsində təhlil-tərkib əməliyyatları ilə bağlıdır. Dilin mənimsənilməsi ilə bağlı psixologiyada müxtəlif istiqamətlərində sistemli tədqiqatlar aparılıb. İbtidai siniflərdə təlim materiallarının mənimsənilməsində prof. M.Ə. Həmzəyevin – II-III siniflərdə yeni proqram üzrə qrammatik materialların mənimsənilməsindəki çətinliklərin psixoloji təhlili [2], Ş.M. Babayevin - ibtidai siniflərdə elmi anlayışlar üzrə mümarisələrin psixoloji xüsusiyyətləri [1], İ.İ. Seliseva və S.A. Zaysevanın – I siniflərdə mətn tapşırıqları ilə iş prosesində modelləşdirmədən istifadə [8], S.E. Xəlilovanın – ibtidai siniflərdə təlim materiallarının mənimsənilməsində mümarisələrin rolu [3] mövzularındakı əsərlərində izah edilir.

L.S. Vıqotski kiçikyaşlı məktəbli dövründə dilin əsasında duran anlayışların formalaşmasının klassik izahlarını araşdıraraq yazırdı: *"Təhsil prosesi həmişə reproduktiv (təkrarlamaq, təqlid etmək) deyil, produktivdir (məhsuldar) anlayış hansısa məsələlərin həlinə istiqamətlənmiş (və ya istiqamətləndirilmiş) mürəkkəb əməliyyatların gedişində yaranaraq qurulur. Hansısa bir xarici amilin olmaması və sözlə cisim arasındakı əlaqələrin mexaniki qurulması onun yaranmasına o qədər də mane olmur. Əgər qeyd edilən amillər prosesin gedişi boyu onu müşayiət edirsə, o halda anlayışın yaranması baş vermir"* [5, s. 26].

İbtidai siniflərdə ingilis dilinin mənimsənilməsi ana dilinin mənimsənilməsi və inkişafı ilə paralel olaraq baş verir. Ana dili ilə ingilis dillərinin mənimsənilməsinin dinamikası və keyfiyyəti biri-birindən fərqlənsə də, dil təlimi baxımından hər ikisi eyni qanunauyğunluqlarla gedir. Bu baxımdan tədqiqatçılar (J. Piaje, L.S. Vıqotski, M.Ə. Həmzəyev, Ş.M. Babayev və b.) mənimsəmənin əsasında duran nitqin anlaşılması məsələsini aydınlaşdırmağa çalışıblar. Onlar əyani göstərmə yolu ilə nitqin mənimsənilməsini həmişə uğurlu yol hesab edirlər. Əksinə, yaş artdıqca uşaqlarda məntiqi elementlərin möhkəmləndirilməsini diqqət mərkəzində saxlanılmalı olan məsələ kimi göstərirlər. Belə ki, sözü əvvəlcə şifahi söyləyərək

onun ətrafında müzakirə açmaq mənimsəmədə daha məhsuldar yoldur.

Uşaqlarda xarici dil üzrə nitqin inkişafı bir sıra çətinliklərlə müşayiət olunur. Psixoloqlar bunu mərkəzi əsəb sisteminin üzləşdiyi gərginliklərlə, diqqətin cəmlənməsi, iradi səyin artırılması tələbləri ilə əlaqələndirirlər. Təcrübə göstərir ki, ümumiyyətlə, nitqin ləngiməsi və ya pozulması nəticədə uşağın ünsiyyət tələbatının ödənilməsinə, o da öz növbəsində əsəb sistemində, motorikada fizioloji gərginliklərə, nəhayət, psixoloji problemlərə səbəb olur. Ona görə də xarici dil üzrə nitq imkanları hər bir yaş dövründə inkişaf normalarına müvafiq olmalıdır. Bu amili nəzərə alaraq müəllimlər ingilis dili üzrə nitqin inkişafında hansı şagirdlə hansı üsullarla iş aparmağın əlverişli olduğu müəyyən etməlidirlər.

Kiçikyaşlı məktəblilərdə ingilis dilinin mənimsənilməsi təqlidçiliyə əsaslanır. Yeddi yaşa qədər funksional baxımdan nitq aparatının dilin fonetikası üzrə inkişafı prosesi gedir. Boğaz səslərinin çıxarılması, nitq aparatının formalaşması, eşitmə və cavabvermə refleksiyasının təkmilləşməsi onlara müəllimlə, eləcə də yaşıdları ilə nitq ünsiyyəti yaratmağa imkan verir. Eşitdikləri yeni səsləri təqlid edərək ayrı-ayrı hecaları səsləndirməyə başlayırlar: *"Fikrin sözlərdə, sözlər vasitəsi ilə ifadə olunması, təsbit və qeyd edilməsi onu hissələrə ayırmağa, diqqəti fikrin müxtəlif cəhətləri üzərində saxlamağa, daha dərindən dərk etməyə imkan verir. Bunun sayəsində müfəssəl, sistematik və ardıcıl mühakimə yürütmək, yəni təfəkkür prosesində meydana çıxan bütün əsas fikirləri bir-biri ilə aydın və düzgün şəkildə tutuşdurmaq, müqayisə etmək mümkün olur"* [4, s. 333].

Təcrübədən də məlumdur ki, I sinifdə müəllim və şagird arasında dövrü proses gedir. Uşaq öz fikrini frazalarla, hissələrlə, qırıq-qırıq, özünün qrammatik imkanlarına görə çatdırır. Müəllim isə onu bütövləşdirir, yekunlaşdırır. Şagird onun ardınca öz ifadələrinə düzəlişlər edir. Bu zaman nitqin anlaşılmasının məhsuldarlığı şagird tərəfindən həmin düzəlişlərin yadda saxlanılması və növbəti situasiyada ona əməl etməsidir. Bunun üçün, həmin prosesdə yalnız müəllimin düzəlişlərinin interiorizasiyası deyil, həm də şagird tərəfindən bu materialın eksteriorizasiyası tələb olunur. Bu zaman şagird mənimsədiklərini bacarıqlara çevirməlidir. Əks halda hafizədə qorunanlar unudulur.

Altı-yeddi yaş ərəfəsində kiçikyaşlı məktəblilərdə təqlidçilik bacarığı daha da artır. Nitqin emosional tərəfləri: jest, mimika vasitəsilə canlanma, heca, söz və cümlələrin ifadəsi imkanları genişlənir. Söz ehtiyatının məhdudluğuna baxmayaraq sözün köməyi ilə bir çox mənaları anlada bilirlər. Yeddi yaşa qədər belə ünsiyyət tərzi çətinliklə inkişaf edir. Ünsiyyətin bu məhdudluğu körpələrdə onların davranış təcrübəsində ingilis dili üzrə ünsiyyət bacarıqlarının olmamasından irəli gəlir.

Yeddinci yaşın əvvəllərində uşaqların söz ehtiyatı, fəaliyyət təcrübəsi və sistemli mənimsəmə imkanları xeyli genişlənir. Lüğət ehtiyatında diferensiallaşma yalnız əşyalara münasibətdə deyil, həm də sözlərdə baş verir. Bu proses yeni sözlərin mənimsənilməsi, fəaliyyət prosesində onlardan istifadə edilməsi və lüğət ehtiyatına daxil olaraq fəal nitqində işlədilməsi yolu ilə baş verir:

Yeddi yaşdan sonra nitq inkişafı üzrə “"I speak English"” istiqamətində aparılan işlər dinamik hal alır. Şagirdlər yalnız yeni ifadələri cümlədə asanlıqla işlədir, cümləyə yeni sözlər daxil edir, bu prosesdə qrammatik tələbləri gözləyir, ingilis dili təlimində mənimsədikləri imkanlar sayəsində başqaları ilə dialoqda qurur, ünsiyyət və münasibətlərə, sadə kommunikativ əlaqələrə girirlər.

Səkkiz yaşda ingilis dilinin inkişafına təsir edəcək məqamlardan ən əsası dərs prosesində şagirdin müəllimə ingiliscə şifahi müraciətlərinin artırılması üçün yaradılan şəraitdir. Bu zaman şagird mümkün qədər öz istəyini ifadə etmək üçün dilin imkanlarından düzgün istifadə etməyə çalışmalı olur. Köməkçi suallarla şagirdi buna həvəsləndirmək, sonda nail olmaq mümkündür. Müəllim şagirdin nəyi demək istədiyini bilməli, yol verdiyi qrammatik və fonetik səhvləri hiss etdirmədən ona düzəliş verməyə çalışdırmalıdır. Eyni zamanda, bu dövrdə qarşılıqlı nitqə hörmət, ehtiram, bildirən sözlərin daxil edilməsi dərsin emosional mühitini yaxşılaşdırmaq üçün əlverişlidir. Müraciətlərin ifadəsində etik ton gözlənildikdə, suallar anlaşıqlı, iki-üç sözdən ibarət cümlələrlə qoyulduqda şagird müəllimi daha yaxşı anlayır.

Hissi təsirlər, əyanilik və təsəvvürlər olmadan insan yalnız anlayışların köməyi ilə düşünə bilməz. O, hətta, hissi əyani obrazlarla bağlı anlayış olmadan da düşünə bilməz. Buna görə də əyani təfəkkür və anlayış haqqında xarici ziddiyyətlər kimi danışmaq olmaz, lakin buna baxmayaraq təsəvvür və anlayış bir-birindən tamamilə fərqli olmadığı kimi, eyni zamanda onları eyniləşdirmək də olmaz. Obrazlarla tanışlıq şəraitində həyata keçən obrazlı təfəkkür prosesi kifayət qədər sürətli və dəyişmiş proseslərlə müşayiət olunur. Onun nəticəsi özünəməxsus fikri məkan rəsminin birdən-birə aydınlanması kimi özünü göstərir. Obrazlı təfəkkürün xüsusiyyəti onun nəticələrinin şəxsi məzmun və məna ilə doldurulmasıdır. L.S. Vıqotskinin A.N. Leontyevlə birgə keçirdikləri eksperimentlərdə uşaq və gənclərlə işarəli əməliyyatların erkən interiorizasiyası ilə bağlı problemə müraciət olunmuşdur [5, s. 92-95].

A.N. Leontyev və L.S. Vıqotskininin tədqiqat qruplarının səhvlərindəki fərqlilik daha çox maraqlandırırdı. Məktəbəqədər qrup tapşırıqların öhdəsindən kartla və kartsız eyni dərəcədə gəldilər. Buradan belə nəticə alınırdı ki, uşaqlar kartlardan istifadə etməyiblər. 8-9 yaşlılar qrupundakı uşaqlar və 10-13 yaşlılar qrupundakı yeniyetmələr kartlardan yaxşı istifadə edərək cavab verməzdən əvvəl onlara baxırdılar. Gənclər kartlardan orta dərəcədə istifadə edirdilər. Təcrübədə sınanılanlar tərəfindən cisimlər bir-birindən bir neçə parametrlə fərqləndiyindən, ekvivalentliyi yaratmaq üçün müxtəlif növ xüsusiyyətlərdən istifadə etmək olar. Onlar beş əsas növə ayrılır:

1) həssaslıq: sensor əlamətlərə görə qəbul edilənlər;

2) funksional: daxili xassələrinə görə qiymətləndirilənlər;

3) affektiv: üstün təsiredici keyfiyyətlərə görə fərqlənənlər;

4) isimin nominal xüsusiyyətləri: uşaq, hazır formada mövcud olan adları dildə ifadə edərək obyektləri qruplaşdırır;

5) qaydalara görə bərabərlik yaradaraq təsnifatlaşdırmaq.

Bunu da qeyd edək ki, təsvir etdiyimiz eksperimentdə hər bir növ ekvivalentliyin əsasını xarakterizə etmək üçün uşaqların istifadə etdiyi xüsusi nitq forması uyğundur.

- Cisimlərin həssas hiss olunan xüsusiyyətləri. Uşaq rəng, ölçü, forma, zaman və məkandakı mövqeyinə görə birbaşa müşahidə olunan xüsusiyyətlərə əsasən obyektləri ekvivalent hesab edə bilər. Həssas hiss olunan, mövzu keyfiyyətlərinə aid olanlar nitqdə aşağıdakı kimi ifadə edilir:

Bunlar necədir? (burada “X” sifətdir: "Onların hər ikisi ….(sarıdır)”.

Onlar nədir? (burada “X” isimdir: "Onlar …….(banan və kartofdur)”.

- Obyektlərin funksional xüsusiyyətləri. Cismin nə etdiyini və ya onunla nəyin edilə biləcəyini nəzərə alaraq, uşaq onların istifadəsini və ya funksiyasını obyektlərin bərabərliyini təmin etmək üçün əsas götürür. Cismin funksional daxili keyfiyyətinə xas olanlar nitqdə belə ifadə olunur: Onlar nə üçündür? Burada “X” xəbərdir: "Onlar səs çıxarır" (zurna, tütək) və s.

- Obyektlərin təsirli xüsusiyyətləri. Uşaq, obyektləri özündə doğurduğu duyğular və qiymətləndirmə əsasında ekvivalent hesab edə bilər. Təsirli işarələr nitqdə aşağıdakı kimi ifadə olunur: Onlar necə təsir edir? “X” sifətdir: "O yandırır (istiot ").

- Obyektin ümumi (nominal) xüsusiyyətləri. Uşaq, hazır formada mövcud olan adları dildə verərək obyektləri qruplaşdıra bilər. Nominal əlamətləri nitqdə aşağıdakı kimi ifadə edilir: Onlar necədir? Burada “X” isimdir: "Onları hamısı meyvədir" (portağal, apelsin, mandarin), yaxud, hamısı sarıdır, eləcə də hamısı dadlıdır və s.

- Qaydaya görə ekvivalentliyin yaradılması ("Olsun!"). Uşaq qruplaşdırma üçün əsasları izah etmədən, hətta onlardan tələb olunsa da, ayrı-ayrı əşyaların oxşarlığını və ya oxşamadığını təsdiqləyə bilər. "Olsun!" Qaydasına görə ekvivalentlik ifadəsi bir fikirdə belə ifadə edilir: "A" (ya da deyil) – "B" (X-oxşar, eyni, bənzər və s. )". 6 yaşdan sonra funksional əsasda ekvivalent qrupların ayırd edilməsi getdikcə daha asan olur. Bu göstərici 6 yaşındakı uşaqlarda bütün cavabların 6 %-i, 9 yaşlı uşaqlarda 73% -i təşkil edir.

Göründüyü kimi, hələ uşaqlıq dövründən başlayaraq ana dilinin mənimsənilməsi mərhələlərində olduğu kimi, öyrənilən hər bir xarici dilin mənimsənilməsi, dərk edilməsi və düşüncə səviyyəsinə qalxması prosesi də eyni mərhələlərdən keçir. Əvvəlcə xarici dilin nitqdə qrammatik quruluşu əmələ gəlir. Uşaqlar fonetik eşitmə imkanlarına yiyələnir, orfoepiya qaydalarına əməl

etməyi bacarırlar. Onlarda tədricən hər hansı xarici dil üzrə rabitəli, fəal nitq imkanları yaranır. Onlarla xarici dilin mənimsənilməsi üzrə təşkil olunan əyləncəli məşğələlərdə başlıca diqqət bu mərhələlərdə meydana çıxan çətinliklərin aradan qaldırılmasına yönəldilir. Dilin mənimsənilməsinin ən mükəmməl mərhələsi həmin dildə təfəkkürdə təhlil-tərkib əməliyyatlarının həyata keçirilməsi dövrü ilə izah olunur. Uşaq xarici dil üzrə sadə cümlələrin ifadəsindən sadə və mürəkkəb budaq cümlələrin işlədilməsinə keçir. Məhz nitqin kifayət qədər mükəmməl olmaması səbəbindən bəziləri öz düşüncələrini hələ nitq səviyyəsində qura, sadə fikirlərini cümlələrlə ifadə edə bilmirlər.

Dili mənimsəmə çətinliklərinin səbəbləri fizioloji və psixoloji amillərə görə fərqlənir. Bir sıra uşaqlarda dislaliya və disleksiya əlamətləri olur. Həmin problemlər aradan qaldırıldıqda dilin mənimsənilməsində irəliləyişlər əldə edilə bilər. Nitq problemləri olan uşaqlarda bu sahədəki imkanları genişləndirməkdən ötrü nitqin praktik təcrübədə mənimsənilməsinə üstünlük verilir. Proses təhlil-tərkib bacarıqlarının inkişafı fonunda nizamlanır. Psixologiyada uşaqların təfəkküründə baş verən ləngimələrin testləşdirmə yolu ilə diaqnozlaşdırılması, aşkar edilmiş ləngimələrin, çatışmazlıqların qiymətləndirilməsi, onların korreksiya metodikaları işlənilmişdir. Müxtəlif oyunlar, inkişafetdirici təlim vasitələri, kompüter texnologiyalarından istifadə edərək kiçikyaşlı məktəblilərin təfəkkürünün, intellektinin şəxsiyyətin digər struktur komponentləri ilə qarşılıqlı əlaqədə inkişaf yollarını müəyyən etmək mümkündür. Həmin metodlarda təhlil-tərkib proseslərinin aydınlaşdırılması imkanları da genişdir.

**Problemin aktuallığı.** Dünyada qloballaşmanın getdiyi, fərqli mədəniyyətlər arasında inteqrasiyanın baş verdiyi hazırkı dövrdə bu prosesi intensivləşdirən ən mühüm amillərdən biri – dünya dillərinin öyrənilməsidir. Bu səbəbdən, dillərin mənimsənilməsindəki psixoloji çətinliklərin araşdırılması və həll yollarının göstərilməsi mühüm əhəmiyyət kəsb edir. Apardığımız tədqiqatda bu məsələ kiçikyaşlı məktəblilər tərəfindən ingilis dilinin mənimsənilməsində analiz-sintez bacarıqlarının xüsusiyyətlərinin təhlili ilə əlaqələndirilir.

**Problemin elmi yeniliyi.** Problemin yeniliyi dillərin mənimsənilməsində iştirak edən və bu prosesin əsas tənzimləyicisi olan təfəkkür əməliyyatlarına analitik yanaşma ilə bağlıdır. Təfəkkür əməliyyatları içərisində analiz-sintez proseslərinin rolu böyükdür. Burada məktəb təhsilinin ilk pilləsində olan kiçikyaşlı məktəblilərdə analiz-sintez bacarıqlarından, onun baş verməsinin nəzəri aspektlərindən bəhs edilir. Psixolinqvistik sistemdə analiz-sintez əməliyyatlarının düzgün aparılmasının vacibliyi aydınlaşdırılır.

**Problemin praktik əhəmiyyəti.** Tədqiqatda ibtidai siniflərdə ingilis dilini tədris edən müəllimlər, eləcə də dilin psixoloji tədqiqatlarını aparan mütəxəssislər üçün praktik materiallar verilir. Tədris prosesində ingilis dilini çətin mənimsəmənin praktik təfəkkürlə bağlı olan məsələləri izah olunur.

**Ədəbiyyat:**


1. Babayev, Ş.M. II-III siniflərdə yeni proqram üzrə qrammatik materialların mənimsənilməsindəki çətinliklərin psixoloji təhlili // Elmi tədqiqat işi, ATİ, -1972. -160 s.
2. Həmzəyev, M.Ə. II-III siniflərdə yeni proqram üzrə qrammatik materialların mənimsənilməsindəki çətinliklərin psixoloji təhlili // Elmi tədqiqat işi, ATİ, - 1962.-120 s.
3. Xəlilova, S.E. İbtidai siniflərdə təlim materiallarının mənimsənilməsində mümarisələrin rolu // psixologiya üzrə fəlsəfə doktoru diss. / - Bakı: - 2010. - 142 s.
4. Petrovski, A.V. Ümumi psixologiya / Ə.Ə. Əlizadə, M.Ə. Həmzəyev və İ.Ə. Seyidovun tərcüməsi. - Bakı: Maarif, - 1982. - 494 s.
5. Выготский, Л.С. Собрание сочетаний. 4 том. Детская психология / Л.С. Выготский. - М.: Педагогика, - 1984. - 432 с.
6. Пиаже, Ж. Речь и мышление ребенка/ Ж. Пиаже. - М.: Римис, -2008. - 416 с.
7. Реан, А.А. От рождения до смерти/ А.А. Реан. - М.: Алма-пресс, - 2002. 652 с.



**E-mail: konul.babayeva.75@bk.ru**


**Redaksiyaya daxil olun:** 31.10.2024.

UOT 372.3/.4

***Səyarə Sahib qızı Cəfərova***
*Azərbaycan Respublikası Təhsil İnstitutunun*
*fəlsəfə doktoru proqramı üzrə doktorantı*
*https://orcid.org/0000-0002-7765-9378*
*https://doi.org/10.69682/arti.2024.91(6).91-95*

# KİÇİKYAŞLI MƏKTƏBLİ ŞƏXSİYYƏTİNİN MİLLİ-MƏNƏVİ DƏYƏRLƏRİNİN FORMALAŞMASINDA AİLƏNİN TƏSİR İMKANLARI

***Саяра Сахиб гызы Джафарова***
*докторант по программе доктора философии*
*Института Образования Азербайджанской Республики*

# ВЛИЯНИЕ СЕМЬИ НА ФОРМИРОВАНИЕ НАЦИОНАЛЬНО-НРАВСТВЕННЫХ ЦЕННОСТЕЙ ЛИЧНОСТИ МЛАДШЕГО ШКОЛЬНИКА

**Sayara Sahib Jafarova**
*doctorial student in the program of doctor of philosophy*
*of the İnstitute of Education of the Republic of Azerbaijan*

# THE INFLUENCE OF THE FAMILY ON THE FORMATION OF THE NATIONAL AND MORAL VALUES OF THE PERSONALITY OF A JUNIOR SCHOOLCHILD

**Xülasə.** Şəxsiyyət və cəmiyyətin qarşılıqlı əlaqəsini, inteqrasiyasını və maraq və ehtiyaclarının prioritetləşdirilməsini təmin edən əsas institutlardan biri də ailədir. Dəyər oriyentasiyalarının formalaşması üçün ilk və əsas sosial institut məhz ailədir. Müasir cəmiyyətdə gedən proseslərin təsiri altında mədəni inkişaf daha da sürətlənmiş, yeni informasiya texnologiyaları insan təfəkkürünü kökündən dəyişməyə başlamış, yeni iqtisadi münasibətlər formalaşmağa başlamışdır. Bu proseslər öz növbəsində sosial münasibətlərin ən mühüm tərkib hissəsi olan ailəyə də öz təsirini göstərmişdir. Sosial sistemdə, ictimai əlaqələr sistemində baş verən dəyişikliklər ailə münasibətlərində, milli mənəvi dəyərlərdə də özünü göstərirdi. Müasir elmin aktual problemləri bu problemlərə ailənin mənəvi əsaslarının möhkəmləndirilməsinin inkişafi baxımından baxılmasıdır.
***Açar sözlər:*** *ailə, mənəvi tərbiyə, məktəb, milli-mənəvi dəyərlər, məktəbli şəxsiyyəti*

**Аннотация.** Семья является одним из основных институтов, обеспечивающих взаимодействие, интеграцию и приоритетность интересов и потребностей личности и общества. Первым и основным социальным институтом формирования ценностных ориентаций является семья. Под влиянием процессов, происходящих в современном обществе, ускорилось культурное развитие, новые информационные технологии начали коренным образом менять мышление человека, стали возникать новые экономические отношения. Эти процессы, в свою очередь, отразились на семье, которая является важнейшей составляющей общественных отношений. Изменения в общественном строе и системе общественных отношений проявились также на семейных отношениях и национальных нравственных ценностях. Актуальные задачи современной науки заключаются в том, чтобы взглянуть на эти проблемы с позиции развития укрепления нравственных основ семьи.
***Ключевые слова:*** *семья, нравственное воспитание, школа, национально-нравственные ценности, личность школьника*

**Abstract.** Family is one of the main institutions that ensure interaction, integration and prioritization of interests and needs of personality and society. The first and main social institution for the formation of value orientations is the family. Under the influence of the processes taking place in modern society, cultural development has accelerated, new information technologies have begun to fundamentally change human thinking, and new economic relations have begun to form. These processes, in turn, have had an impact on the family, which is the most important component of social relations. The changes in the social system and public

Bir sıra tədqiqatçılar strateji planlaşdırmanı universitetlərin tədqiqat performansının yüksəldilməsi üçün əvəzsiz bir vasitə kimi qəbul etsələr də (Cowburn, 2005), təcrübədə yalnız strateji planlaşdırmaya diqqət yetirilməsi aktual və nəticəyə yönəlmiş olmaya bilər (Biondi & Russo, 2022). Strateji planlaşdırma özündə müəssisənin əsas məqsədlərinin, siyasətlərinin və fəaliyyət ardıcıllığının vahid və ardıcıl bir plana inteqrasiyasını ehtiva edən strateji idarəetmənin əsas aspektidir.

***Strateji planlaşdırmanın baza modeli*** . Strateji planlaşdırmanın baza modeli, universitet daxilindəki və xaricindəki dəyişikliklərin strateji təhlilindən başlayan və bir neçə ardıcıl addımdan ibarət yanaşmadır. Təhlil əsasında prioritet istiqamətlər, məqsəd və hədəflərin müəyyən olunduğu strategiyalar formalaşdırılır və uğurlu icrası üçün zəruri tədbirlər planlaşdırılır. Sahə üzrə geniş təcrübəyə malik mütəxəssislərin təcrübəsi və tövsiyələri nəzərə alınmaqla müəyyənləşdirilən bu addımlar spesifik planlaşdırmanı əhatə edir. Daha sonra, müəyyən edilmiş zəruri tədbirlər tətbiq edilir və nəticələri qiymətləndirilir. Qeyd olunan addımlar aşağıdakı təsvirdə əks olunub:




***Şəkil 1. Strateji planlaşdırmanın baza modeli***

Əksər universitetlərdə strateji planlar bu baza modelinə əsaslanır. Bu modelə, həmçinin, daxili nəzarət və qiymətləndirmə prosesləri də mütləq şəkildə daxil edilir. Qiymətləndirmənin nəticələri də növbəti dövrün strateji təhlil gündəminə əlavə olunur və yeni strategiyanın formalaşdırılmasında nəzərə alınır. İnstitusional strateji planlar adətən üç fərqli iyerarxik səviyyədə həyata keçiriləcək strateji addımları hədəfləyir. İnstitusional idarəetmə universitetin cəmiyyət qarşısında təmin etməli olduğu uzunmüddətli sosial töhfələri əhatə edir (vizyon və missiya). Orta səviyyə, strateji-idarəetmə istiqaməti – orta və uzunmüddətli məqsəd və vəzifələri, habelə onlara çatmaq üçün qarşıya müəyyənləşdiriləcək strateji addımları ehtiva edir. Üçüncü səviyyə, operativ idarəetmə – 3-5 ili əhatə edən planları yerinə yetirmək üçün zəruri addımları hədəfləyir və həyata keçirir.

Beləliklə, strateji planlaşdırma ilə əlaqədar müxtəlif yanaşmalar mövcuddur Strateji planlaşdırmaya vahid yanaşmanın olmamasına baxmayaraq, universitetin kontekstindən, cari vəziyyətindən, ölçüsündən asılı olaraq tədqiqatın səmərəli idarə edilməsində müxtəlif strateji prioritetlər müəyyən edilə bilər.

Qeyd olunduğu kimi, tədqiqatların idarə edilməsinə dair vahid bir mexanizmin mövcud olmamasına baxmayaraq, idarəetmədə strateji prioritetlərin müəyyən edilməsi aspekti böhran məqamlardan biri sayılır. Elmi tədqiqatlar sahəsi universitetin üç ümumi istiqamətindən biri olaraq, ümumi institusional idarəetmənin tərkib hissəsidir. İnstitusional idarəetmənin ümumi yanaşması elmi tədqiqatların idarə edilməsinə də təsir edir. Beləliklə, strateji prioritetlərin formalaşdırılmasına dair ümumi yanaşmada prioritetlə-

rin (məqsədlərin) kimin tərəfindən təqdim edildiyi və onların necə formalaşdırılması xüsusi olaraq əhəmiyyətlidir. Bu iki ölçünü birləşdirdikdə dördsahəli matris əldə edirik. Matrisdəki hər bir sahə strateji planlaşdırmaya yönəlmiş fərqli yanaşmanı təmsil edir və ali təhsil müəssisəsi daxilində müxtəlif strateji inkişaf metodlarını təhlil etməyə imkan verir (Zechlin, 2010).




***Şəkil 2. Ali təhsilin inkişafına strateji yanaşmalar (mənbə: Zechlin, 2010).***

Yuxarı sol hissə ("Ənənəvi idarəetmə") strategiyanın formalaşdırılması və həyata keçirilməsinə klassik yanaşmanı nümayiş etdirir. Burada institusional məqsədlər və lazımi icra prosesləri iyerarxik qaydada liderlik tərəfindən müəyyənləşdirilir və inkişaf etdirilir. Bu yanaşma əsaslı yenidənqurma proseslərini əhatə edir (məsələn, ayrı-ayrı kafedraların iri fakültələrdə birləşdirilməsi).

Yuxarı sağ hissədə daxili potensial əsaslı idarəetmə yanaşması qeyd olunmuşdur. Burada kənar faktorlardan asılı olan tələblər, ehtiyaclar və gözləntilər rəhbərlik tərəfindən nəzərə alınır və zəruri tədbirlər daxili potensial əsasında müəyyən edilir. Bu, nəticəyə əsaslanan idarəetməni vurğulayan "Yeni İctimai İdarəetmə" ("New Public Management") üçün əsas diqqət mərkəzində olan sahədir. Bu yanaşma maliyyə vəsaitlərinin artırılması, məzunların sayının artırılması və ya daha çox doktorantın hazırlanması kimi konkret nəticələr tələb edir. Eyni zamanda, bu nəticələrə nail olmaq üsullarını sistemin öz öhdəliyinə buraxır.

Aşağı sağ hissə ("Peşəkar idarəetmə") peşəkar təşkilat (institut) paradiqmasına uyğun gələn təkamül yanaşmasını ehtiva edir. Bu Humboldt universitetinin klassik idarəetmə modelidir; o, idarə olunmağa ehtiyacı olmayan və institusional çərçivələri daxilində fəaliyyət göstərə biləcək alimlərə aidiyyəti işləri tam həvalə edir və akademik azadlığı təmin edir.

Aşağı sol hissə ("Sistemli inkişaf idarəetməsi") ali təhsilin inkişafına sistemli yanaşmanı göstərir. Bu, sistemin özünü müşahidəsi ilə təşkil edilən prosesləri vurğulayır və bundan sonra nəticələr çıxarılır. Burada əsas fəaliyyət sahələri qiymətləndirmə və keyfiyyətin idarə edilməsidir. Bu matris universitetlərə öz strategiyalarının mənbəyini və strukturunu anlamağa və onların ehtiyaclarına ən uyğun yanaşmanı seçməyə kömək edir.

**Nəticə.** Elmi tədqiqat fəaliyyəti müxtəlif sahələr haqqında biliklərimizi genişləndirmək məqsədi ilə həyata keçirilən, alimlər, tədqiqatçılar və tələbələr tərəfindən aparılan sistemli araşdırma, təcrübə və təhlili əhatə edir. Elmi tədqiqat fəaliyyətinin səmərəli idarə edilməsi universitetdaxili tədqiqat ilə bağlı problemlərin həlli istiqamətində çıxış yolu etməklə yanaşı, həm də universitetin yerli və xarici nüfuzunun qaldırılmasına təsir etmə gücünə malikdir. İdarəetmədə strateji prioritetlərin müəyyən edilməsi aspekti böhran məqamlardan biri sayılır. Strateji planlaşdırmaya vahid yanaşmanın olmamasına baxmayaraq, universitetin kontekstindən, cari vəziyyətindən, ölçüsündən asılı olaraq tədqiqatın səmərəli idarə edilməsində müxtəlif strateji prioritetlər müəyyən edilə bilər. Ümumilikdə, qeyd edilməlidir ki, elmi tədqiqatların idarə edilməsi fəaliyyətinə aşağıdakı məsələlər daxildir:

- tədqiqat performansının (ümumi və ayrı-ayrı fakültələr üzrə) qiymətləndirilməsi;
- tədqiqat prioritetlərinin müəyyən edilməsi və həyata keçirilməsi;
- tədqiqat istiqamətləri üçün strateji planlaşdırmanın tətbiq edilməsi;
- elmi tədqiqat fəaliyyətinin təşkil edilməsi;
- tədqiqatlara ayrılan maliyyənin idarə edilməsi;
- elmi tədqiqat fəaliyyətinin təşviq edilməsi mexanizmləri;
- tədqiqatçıların peşəkar inkişafı;
- tədqiqat sahəsində beynəlxalq əməkdaşlıq;
- tədqiqat fəaliyyətinin monitorinqi və qiymətləndirilməsi.

Bu siyahıya digər daha spesifik istiqamətlər (universitetin kontekstindən və spesifikliyindən asılı olaraq) də əlavə edilə bilər. Bu məsələlərin effektiv və səmərəli idarə edilməsi ATM-lərin rəhbərliyi tərəfindən tədqiqat fəaliyyətinin göstəricilərinin universitetin strateji missiyası ilə uzlaşdırılmasını tələb edir.

**Problemin aktuallığı.** Universitetlərdə həyata keçirilən elmi tədqiqatların səmərəli idarə edilməsi problemi son 20 il ərzində alimlərin xüsusi diqqətini cəlb etmişdir. Elmi tədqiqat fəaliyyətinin səmərəli idarə edilməsi həm universitetdaxili və xarici problemlərinin həlli istiqamətində çıxış yolları təqdim etmə, həm də keyfiyyət göstəricilərinin artmasına təsir etmə gücünə malikdir. Son illər ərzində Azərbaycan Respublikasının universitetləri qarşısında qoyulmuş məqsədlərdən birinin elmi tədqiqat fəaliyyətinin genişləndirilməsi olduğu nəzərə alınaraq, elmi tədqiqatların səmərəli idarəedilməsinin bu kontekst üçün xüsusi əhəmiyyət daşıdığını qeyd etmək olar.

**Problemin elmi yeniliyi.** Məqalədə qeyd olunan istiqamətdə müxtəlif yanaşma və təcrübələr tədqiq edilmiş və xüsusiyyətlər müəyyən edilmişdir. Araşdırma nəticələri ümumiləşdirilərək yekun model şəklində təqdim edilmişdir.

**Problemin təcrübi əhəmiyyəti.** Elmi tədqiqatların idarə edilməsi məsələsi yerli universitetlərin gündəmində olan elmi tədqiqatların genişləndirilməsi və keyfiyyətin artırılmasına töhfə verə bilər.

**Ədəbiyyat:**


1. "Elm haqqında" Azərbaycan Respublikasının 14 iyun 2016-cı il tarixli 271-VQ nömrəli Qanunu. https://e-qanun.az/framework/33488
2. Barzelay, M., & Jacobsen, A. S. (2009). Theorizing implementation of public management policy reforms: A case study of strategic planning and programming in the european commission. *Governance*, *22*(2), 319–334. https://doi.org/10.1111/j.1468-0491.2009.01437.x
3. Beerkens, M. (2013) Facts and fads in academic research management: The effect of management practices on research productivity in Australia. *Research Policy (2013) 42(9) 1679-1693*
4. Biondi, L., & Russo, S. (2022). Integrating strategic planning and performance management in universities: a multiple case-study analysis. *Journal of Management and Governance*, *26*(2), 417–448. https://doi.org/10.1007/s10997-022-09628-7
5. Bryson, J. M., Edwards, L. H., & Van Slyke, D. M. (2018). Getting strategic about strategic planning research. *Public Management Review*, *20*(3), 317–339. https://doi.org/10.1080/14719037.2017.1285111
6. Chandler, A. (1969) The Structure of American Industry in the Twentieth Century: A Historical Overview. *Business History Review (1969) 43(3) 255-298*
7. Connell, H. (2005). Addressing the research challenge in higher education. In *University Research Management: Meeting The Institutional Challenge* (Vol. 9789264017). https://doi.org/10.1787/9789264017450-en
8. Cowburn, S. (2005) Strategic planning in higher education: Fact or fiction? *Perspectives: Policy and Practice in Higher Education (2005) 9(4) 103-109*
9. Fumasoli, T., & Lepori, B. (2011). Patterns of strategies in Swiss higher education institutions. *Higher Education*, *61*(2), 157–178. https://doi.org/10.1007/s10734-010-9330-x
10. Kirkland, J. (2008) University research management: An emerging profession in the developing world. *Technology Analysis and Strategic Management (2008) 20(6) 717-726*
11. Kirkland, J. (2010). The management of university research. In *International Encyclopedia of Education*. https://doi.org/10.1016/B978-0-08-044894-7.00877-0
12. Poister, T. & Streib, G. (2005) Elements of strategic planning and management in municipal government: Status after two decades. *Public Administration Review (2005) 65(1) 45-56*
13. Zechlin, L. (2010). Strategic planning in higher education. In *International Encyclopedia of Education*. https://doi.org/10.1016/B978-0-08-044894-7.00885-X

**E-mail:** leyla.yadigarova.dok@arti.edu.az
**Redaksiyaya daxil olub:** 22.11.2024

*UOT 378.*

***Abbas İlham oğlu Babayev***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun*
*fəlsəfə doktoru proqramı üzrə doktorantı*
*https://orcid.org/0000-0002-3939-9237*
*https://doi.org/10.69682/arti.2024.91(6).107-110*

# ALİ TƏHSİLİN ƏLÇATANLIĞININ ARTIRILMASI ÖMÜRBOYU TƏHSİL İNFRASTRUKTURUNUN FORMALAŞDIRILMASI ALƏTİ KİMİ

***Аббас Ильхам оглы Бабаев***
*докторант по программе доктора философии*
*Института Образования Азербайджанской Республики*

# ПОВЫШЕНИЕ ДОСТУПА К ВЫСШЕМУ ОБРАЗОВАНИЮ КАК ИНСТРУМЕНТ ФОРМИРОВАНИЯ ИНФРАСТРУКТУРЫ ОБРАЗОВАНИЯ НА ПРОТЯЖЕНИИ ВСЕЙ ЖИЗНИ

***Abbas Ilham Babayev***
*doctorial student in the program of doctor of philosophy*
*at the Institute of Education of the Republic of Azerbaijan*

# INCREASING ACCESS TO HIGHER EDUCATION AS A TOOL FOR FORMING A LIFELONG EDUCATION INFRASTRUCTURE

**Xülasə.** Ömürboyu təhsil sisteminin gücləndirilməsi, bu məqsədlə təhsil infrastrukturunun yaradılması Azərbaycan Respublikasının prioritetləşdirilmiş inkişaf istiqamətləri arasındadır. Ömürboyu təhsilin təşviqində və təşkilində ali təhsil müəssisələrinin rolu, xüsusilə onların müxtəlif əhali qrupları üçün əlçatanlığının təmin edilməsinin əhəmiyyəti vurğulanır. Azərbaycanda ali təhsil pilləsinin əlçatanlıq səviyyəsinin qiymətləndirildiyi bu məqalədə ali təhsil müəssisələrinə qəbul mexanizmlərinin cari vəziyyəti ömürboyu öyrənmənin təşviqi baxımından təhlil edilmiş, onun transformasiyası üçün potensial islahat istiqamətləri göstərilmişdir.
***Açar sözlər:*** *ömürboyu təhsil, ali təhsil, əvvəlki öyrənmənin tanınması, ömürboyu təhsil üzrə Milli Kvalifikasiyalar Çərçivəsi*

**Аннотация.** Укрепление системы образования на протяжении всей жизни и создание с этой целью образовательной инфраструктуры входят в число приоритетных направлений развития Азербайджанской Республики. Подчеркивается роль высших учебных заведений в продвижении и организации образования на протяжении всей жизни, особенно важность обеспечения их доступности для различных групп населения. В данной статье, оценивающей уровень доступности высшего образования в Азербайджане, анализируется современное состояние механизмов приема в высшие учебные заведения с точки зрения продвижения непрерывного обучения, а также указываются потенциальные направления реформы для его трансформации.
***Ключевые слова:*** *обучение на протяжении всей жизни, высшее образование, признание предыдущего обучения, Национальная Рамка Квалификаций для обучения на протяжении всей жизни*

**Abstract.** Strengthening the lifelong education system and creating educational infrastructure for this purpose are among the prioritized development directions of the Republic of Azerbaijan. The role of higher education institutions in promoting and organizing lifelong education, especially the importance of ensuring their accessibility for different population groups, is frequently emphasized. In this article, which evaluates the level of accessibility of higher education in Azerbaijan, the current state of admission mechanisms to higher

education institutions is analyzed in terms of promoting lifelong learning, and potential reform directions for its transformation are identified.

***Keywords:*** *lifelong education, higher education, recognition of prior learning, national qualifications framework for lifelong learning*

Ömürboyu təhsili təmin edən təhsil infrastrukturunun yaradılması Azərbaycan Respublikası Prezidentinin 24 oktyabr 2013-cü il tarixli 13 nömrəli Sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın beş strateji istiqamətindən biri olaraq müəyyənləşdirilmişdir [1]. Adıçəkilən Dövlət Strategiyasının icrası ilə bağlı Fəaliyyət Planına uyğun olaraq Azərbaycan Respublikası Nazirlər Kabinetinin 18 iyul 2018-ci il tarixli 311 nömrəli qərarı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasının ömürboyu təhsil üzrə Milli Kvalifikasiyalar Çərçivəsi"ndə ömürboyu təhsil "bilik, bacarıq, kompetensiya (səriştə) və ya kvalifikasiyaların təkmilləşdirilməsi ilə nəticələnən ömürboyu təlimin (öyrənmənin) bütün növləri" olaraq tərif edilmişdir [2, s. 3]. Anlayışın tərifindən də göründüyü kimi ömürboyu təhsil dedikdə, bütün təhsil formaları, yəni həm formal, həm qeyri-formal, həm də informal təhsil vasitəsilə bilik, bacarıq və səriştələrin təkmilləşdirilməsi nəzərdə tutulur. Ömürboyu öyrənmənin beynəlxalq ədəbiyyatda geniş istifadə olunan təriflərində də oxşar yanaşmanı görmək mümkündür. Belə ki, ömürboyu təhsil istiqaməti üzrə YUNESKO-nun ixtisaslaşmış strukturu olan Ömürboyu Öyrənmə İnstitutu ömürboyu öyrənmənin beş xarakterik xüsusiyyətini müəyyənləşdirmişdir [4, s.18]. Bu xüsusiyyətlərə ömürboyu öyrənmənin bütün yaş qruplarını əhatə etməsi (hər bir yaşda mümkün olması), başqa sözlə desək, fərdin doğumundan başlayaraq bütün həyatı boyunca davam edə bilməsi, təhsilin bütün pillələrini və səviyyələrini əhatə etməsi, bütün təhsil formaları vasitəsilə mümkünlüyü, müxtəlif məkan və sahələrdə baş verə bilməsi (məsələn, işdə, ailədə, cəmiyyətdə və s.), habelə fərqli məqsədlərə xidmət etməsi (məsələn, karyera inkişafı, şəxsi inkişaf, cəmiyyətə xidmət və s.) aid edilmişdir.

Günümüzdə ömürboyu təhsilin əhəmiyyəti adətən iqtisadi məsələlər, əlalxüsus da əmək bazarının iqtisadiyyatda baş verən fundamental dəyişikliklərə çevik uyğunlaşması fonunda vurğulansa da, ömürboyu təhsil müxtəlif sahələrdə inkişafa xidmət edir. Təsadüfi deyil ki, ömürboyu təhsilin təşviqini və keyfiyyətli təhsilin təmin edilməsini hədəfləyən, BMT-nin on yeddi Dayanıqlı İnkişaf Məqsədlərindən (DİM) dördüncüsü yoxsulluğun azaldılması, iqlim dəyişikliyinin təsirlərinə qarşı mübarizə, dəniz və torpaq ekosistemlərinin qorunması, dayanıqlı şəhərlərin yaradılması, sülhsevər və inklüziv cəmiyyətlərin təşviq edilməsi və digər bütün DİM-lərə nail olunmasında xüsusi rol oynamaqla onların hər birisinə təsir edir [4, s.20; 5].

Ömürboyu təhsilin təşviqi və təşkilinə gəldikdə isə, burada yanaşmalar əsasən iki geniş istiqamət üzrə kateqoriyalaşdırılır: formal təhsil vasitəsilə ömürboyu təhsilin təşviqi və qeyri-formal və informal təhsil imkanlarının genişləndirilməsi, habelə belə təhsil formaları vasitəsilə əldə edilmiş səriştələrin tanınması [4, s. 69]. Formal təhsil vasitəsilə ömürboyu təhsilin təşviqinə isə adətən iki prizmadan yanaşılır: peşə təhsili və ali təhsil vasitəsilə ömürboyu təhsilin təşviqi və təşkili.

Bu məqalənin məqsədi Azərbaycanda ömürboyu təhsil infrastrukturunun formalaşdırılması üçün ali təhsil pilləsinin müxtəlif əhali qrupları üçün əlçatanlıq səviyyəsinin qiymətləndirilməsi və qiymətləndirmə nəticəsindən asılı olaraq, ömürboyu öyrənmənin təşviqi baxımından ali təhsilin əlçatanlığının artırılması üçün tövsiyələrin verilməsidir. Tədqiqat çərçivəsində məlumat toplama alətləri kimi Azərbaycanın ali təhsil müəssisələrinin nümayəndələri, elm və təhsil istiqamətlərində dövlət sektorunda çalışan şəxslər, habelə müstəqil ekspertlər ilə yarıstrukturlu müsahibələr və kontent-analizdən istifadə edilmişdir.

Son 25 il ərzində ömürboyu təhsilin təşkilində və təşviqində ali təhsil müəssisələrinin rolunun əhəmiyyəti, onlardan gözləntilər, onların transformasiyası və digər əlaqəli mövzulara həsr edilmiş çoxsaylı beynəlxalq və regional xarakterli tədbirlər keçirilmiş, bəyannamələr qəbul edilmiş və tövsiyələr ortaya qoyulmuşdur. Belə addımlara misal olaraq 1997-ci ildə Almaniyanın Hamburq şəhərində keçirilmiş Yaşlıların Təhsili üzrə Beşinci Beynəlxalq Konfransda qəbul edilmiş Hamburq Bəyannaməsini, 1998-ci ildə Parisdə keçirilmiş "21-ci Əsrdə Ali Təhsil: Baxış və Fəaliyyət" adlı ali təhsil üzrə ümumdünya konfransında qəbul edilmiş iyirmi birinci əsr üçün ali təhsil mövzusunda Bəyannaməni, 2001-

ci ildə qəbul edilmiş Ömürboyu Öyrənən Ali Təhsil Müəssisələrinin Xarakterik Xüsusiyyətləri adlı Keyptaun Bəyanatını və digərlərini gətirmək olar [6,7,8].

Beləliklə, uzun illər boyunca edilmiş çağırışlar, aparılmış tədqiqatlar və formalaşmış gözləntilər fonunda ali təhsil müəssisələrinin missiyasına baxış transformasiyadan keçmiş oldu. Nəticə etibarilə cəmiyyətə xidmət, ömürboyu təhsilin təşviqi və təşkili ali təhsil müəssisələrinin ənənəvi tədris və tədqiqat fəaliyyətlərinə əlavə edilərək onların üçüncü missiyası kimi tanınmağa başladı [4, s.78]. Üçüncü missiyanın icrası çərçivəsində ali təhsil müəssisələrinin fəaliyyətinin səmərəli təşkili məqsədilə bu müəssisələrdən yaşlılar üçün təhsil proqramlarının artırılması, alternativ qəbul mexanizmlərinin yaradılması, təhsilalma formalarının öyrənənlərin ehtiyaclarına uyğunlaşdırılması, pedaqoji innovasiyaların tətbiqi, işəgötürənlər və digər maraqlı tərəflər ilə əməkdaşlığın genişləndirilməsi, habelə iqtisadiyyatda və cəmiyyətdə baş verən dəyişikliklər fonunda faydalılıqlarını təmin etmək və dəyişikliklərə çevik uyğunlaşmaq üçün digər zəruri işlərin görülməsi gözlənilir [4, s.79; 9, s.10].

Göründüyü kimi, yuxarıda sadalanan istiqamətlərin arxasında duran əsas motiv ali təhsilin əlçatanlığının artırılmasıdır. Xüsusilə vurğulamaq lazımdır ki, ali təhsilin əlçatanlığın artırılması dedikdə, sadəcə ali təhsil müəssisələrində təhsil alan tələbələrin sayının artırılması yox, həm də "qeyri-ənənəvi öyrənənlər"in əhatə olunması nəzərdə tutulur [4, s.79]. Başqa sözlə desək, müxtəlif əhali qrupları, o cümlədən sağlamlıq imkanları məhdud, ucqar yerlərdə yaşayan, qeyri-formal məşğulluğa cəlb olunmuş və s. həssas seqmentlər üçün ali təhsil müəssisələrində təklif olunan proqramları əlçatan etməkdir [4, s.80]. Buna nail olmaq üçün təklif olunan əsas islahat istiqamətlərindən biri kimi ali təhsil müəssisələrinə alternativ qəbul imkanlarının yaradılması göstərilir [9, s.35]. Buraya xüsusilə informal və qeyri-formal təhsil vasitəsilə əldə olunmuş səriştələrin tanınması və onun nəticələri əsasında ali təhsil müəssisələrinə qəbul və daha qısaldılmış təhsil proqramlarının təklif edilməsi aid edilir [4, s.80] Bu gün Azərbaycanda ali təhsilə aparan yollara və qəbul mexanizmlərinə baxdıqda tam orta təhsil bazasında Dövlət İmtahan Mərkəzi tərəfindən həyata keçirilən qəbul imtahanlarının əsas qəbul mexanizmi kimi dominantlıq təşkil etdiyini görürük. Hər hansı bir mexanizmin dominantlıq təşkil etməsi normal hal olsa da, diqqətəlayiq məqam alternativ qəbul mexanizmlərinin məhdudluğu, mövcud mexanizmlərin isə tam işlək olmamasıdır. Belə ki, tədqiqat çərçivəsində keçirilmiş müsahibələr zamanı ali təhsildə qeyri-formal və informal təhsil vasitəsilə əldə olunmuş səriştələrin tanınması sisteminin olmadığı vurğulanmışdır. Bundan əlavə, yüksək texniki peşə və ya orta ixtisas təhsilini başa vurmuş şəxslər ali təhsil müəssisələrinə qəbul olmaq hüququna malik olsalar da, belə qəbul mexanizminin ötən dövr ərzində kifayət qədər ictimai tələbat görmədiyi və geniş istifadə edilmədiyi müşahidə olunmuşdur.

**Nəticə.** Qeyd olunanları nəzərə alaraq, ali təhsil müəssisələrinin ömürboyu təhsilin təşviqində və ömürboyu təhsil infrastrukturunun yaradılmasında rolunun artırılması məqsədilə fundamental məsələlərdən biri kimi ali təhsil müəssisələrinə qəbul sistemində islahatların aparılması, qəbul mexanizminin təşkili üzrə ali təhsil müəssisələrinə daha geniş səlahiyyətlərin və muxtariyyətin verilməsinin nəzərdən keçirilməsi, habelə qeyri-formal və informal təhsil vasitəsilə əldə olunmuş səriştələrin tanınması yolu ilə ali təhsil müəssisələrinə qəbul imkanlarının təşkili istiqamətində normativ hüquqi bazanın yaradılması tədqiqat çərçivəsində baş tutmuş müsahibələr zamanı müsahiblər tərəfindən tövsiyə edilmişdir.

**Problemin aktuallığı.** Ömürboyu təhsil sisteminin gücləndirilməsi, bununla bağlı təhsil infrastrukturunun yaradılması kimi istiqamətlər Azərbaycanın inkişaf gündəliyində önəmli yer tutur. Bu məsələlər "Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər", ölkənin 2022-2026-cı illərdə sosial-iqtisadi inkişaf Strategiyası və dövlətin dayanıqlı inkişaf trayektoriyasını müəyyənləşdirən başqa sənədlərdə prioritetləşdirilmişdir [10, s. 11]. Ali təhsil müəssisələrinin ömürboyu təhsilin təşkilində əhəmiyyətli rolunun qlobal səviyyədə tanınması və bu məqsədlə onların əlçatanlığının artırılması yönündə çağırışların edilməsi ölkəmizdə də ali təhsil müəssisələrinin əlçatanlığı ilə bağlı çətinliklərin öyrənilməsini zəruri edir.

**Problemin elmi yeniliyi.** Normativ hüquqi, habelə ölkənin sosial-iqtisadi inkişafına dair müxtəlif sənədlərdə ömürboyu təhsil anlayışına çoxsaylı istinadlara və ali təhsil pilləsinin bu istiqamətdə rolunun beynəlxalq səviyyədə tanınmasına baxmayaraq, məsələ ilə bağlı ölkəmizdəki vəziyyət bugünədək elmi baxımdan araşdırılmamışdır. Məhz bu məqamı məqalənin elmi yeniliyi kimi səciyyələndirmək olar.

**Problemin praktik əhəmiyyəti.** Məqalə ali təhsil müəssisələrinə alternativ qəbul mexanizmlərinin yaradılması, cari qəbul imkanlarının səmərəliyinin artırılması, qeyd olunanlarla bağlı ali təhsil müəssisələrinə daha geniş səlahiyyətlərin verilməsi də daxil olmaqla potensial islahat sahələrini göstərərək keyfiyyətcə yeni mərhələyə qədəm qoymuş ali təhsil sahəsində dövlət siyasətinin icraçıları üçün mühüm əhəmiyyət kəsb edə bilər.

**Ədəbiyyat:**


1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası // 24 oktyabr 2013-cü ildə təsdiq edilmişdir. – Bakı, 2013.
2. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasının həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı // 19 yanvar 2015-ci ildə təsdiq edilmişdir. – Bakı, 2015.
3. Azərbaycan Respublikasının ömürboyu təhsil üzrə Milli Kvalifikasiyalar Çərçivəsi // 18 iyul 2018-ci ildə təsdiq edilmişdir. – Bakı, 2018.
4. Making lifelong learning a reality: A handbook / UNESCO Institute for Lifelong Learning. – Hamburg, 2022.
5. Transforming our world: the 2030 Agenda for Sustainable Development / United Nations General Assembly. – New York: United Nations, - 2015.
6. The Hamburg Declaration on Adult Learning // Fifth International Conference on Adult Education, Hamburg: UNESCO Institute for Education: - 14 – 18 July 1997.
7. World Declaration on Higher Education for the Twenty-first Century: Vision and Action and Framework for Priority Action for Change and Development in Higher Education // World Conference on Higher Education – Higher Education in the Twenty-First Century: Vision and Action, Paris: UNESCO: - 5 – 9 October 1998.
8. The Cape Town Statement on Characteristic Elements of Lifelong Learning Higher Education Institution // International Conference on Lifelong Learning, Higher Education and Active Citizenship, Cape Town: UNESCO Institute for Education: - 10 – 12 October 2000.
9. International trends of lifelong learning in higher education / UNESCO Institute for Lifelong Learning. – Hamburg, 2023.
10. Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər // 2 fevral 2021-ci ildə təsdiq edilmişdir. – Bakı, 2021.
11. Azərbaycan Respublikasının 2022-2026-cı illərdə sosial-iqtisadi inkişaf Strategiyası // 22 iyul 2022-ci ildə təsdiq edilmişdir. – Bakı, 2022.



**E-mail:** abbabayev2018@ada.edu.az



**Redaksiyaya daxil olub:** 17.10.2024

*UOT 371.6 (091)*

***Лидия Владимировна Пироженко***
*профессор*
*Университета Хучжоу (КНР), доктор педагогических наук,*
*https://orcid.org/0009-0001-0560-7595*
*https://doi.org/10.69682/arti.2024.91(6).111-116*

# ОСНОВНЫЕ ТЕНДЕНЦИИ ТРАНСФОРМАЦИИ ЧАСТНОГО СЕКТОРА ОБРАЗОВАНИЯ В КНР

***Lidiya Vladimirovna Pirojenko***
*Huzhou Universitetinin (Çin) professoru,*
*pedaqoji elmlər doktoru*

# ÇİNDƏ MƏKTƏBDƏNKƏNAR TƏHSİL SİSTEMİ: MÖVCUD VƏZİYYƏT VƏ İNKİŞAFIN ƏSAS İSTİQAMƏTLƏRİ

***Lidiya Vladimirovna Pirozhenko,***
*professor of Huzhou University (China),*
*doctor of pedagogical sciences,*

# THE SYSTEM OF EXTRACURRICULAR EDUCATION IN CHINA: CURRENT STATE AND MAIN DIRECTIONS OF DEVELOPMENT

**Аннотация.** Реформа частного сектора китайской системы образования рассматривается руководством КНР как приоритетное направление деятельности государства в сфере образования, призванное решить несколько важных социальных задач: обеспечение равного, справедливого доступа всех граждан к высшему образованию; стимулирование семей к повышению рождаемости за счет снижения расходов на обучение одного ребенка; освобождение учащейся молодежи от непосильных учебных нагрузок; стандартизация сферы образования. В статье раскрываются причины реформирования системы дополнительного частного образования в КНР; анализируются основные предполагаемые изменения в сфере образования.
***Ключевые слова****: система образования КНР, реформирование, система дополнительного образования, равный доступ к образованию, репетиторство, качество образования.*

***Xülasə.*** Çin təhsil sisteminin özəl sektorunun islahatı Çin Xalq Respublikasının rəhbərliyi tərəfindən bir neçə vacib sosial problemi həll etmək üçün hazırlanmış təhsil sahəsində dövlət fəaliyyətinin prioritet sahəsi hesab olunur: bütün vətəndaşların ali təhsilə bərabər, ədalətli çıxışının təmin edilməsi; ailələrin artmasına təşviq bir uşağın təhsil xərclərini azaltmaqla doğum nisbətinin artması; tələbələrin həddindən artıq akademik yüklərdən azad edilməsi; təhsilin standartlaşdırılması. Məqalədə Çində əlavə özəl təhsil sistemində islahatların səbəbləri açıqlanır, təhsil sahəsində təklif olunan əsas dəyişikliklər təhlil edilir.
***Açar sözlər****: Çin Xalq Respublikasının təhsil sistemi, islahat, əlavə təhsil sistemi, təhsilə bərabər çıxış.*

**Abstract**. The reform of the private sector of the Chinese education system is considered by the leadership of the People's Republic of China as a priority area of state activity in the field of education, designed to solve several important social tasks: ensuring equal, fair access for all citizens to higher education; stimulating families to increase the birth rate by reducing the cost of educating one child; freeing students from excessive academic loads; standardization of education. The article reveals the reasons for reforming the system of additional private education in China; the main proposed changes in the field of education are analyzed.

***Keywords***: *the education system of the People's Republic of China, reform, the system of additional education, equal access to education, tutoring, quality of education.*

Важной составляющей стремительного экономического развития КНР является, в том числе, и сохранение многовековой традиции социального отбора и карьерного продвижения граждан, демонстрирующих высокие результаты на общенациональных экзаменах. Хорошая начальная и средняя школы, дополнительное образование, престижный университет, стажировка за рубежом – залог будущего успеха и процветания не только молодого человека, но и его семьи. Выпускникам ведущих университетов страны открыта дорога в государственный аппарат, доступны престижные и хорошо оплачиваемые должности в ведущих китайских компаниях. Не удивительно, что в ментальности китайцев хорошее образование – это не только социальный лифт, но и средство, способное сгладить все социальные отношения, обеспечить успех не только на рынке труда, но и в семейной жизни.

Охват теми или иными видами высшего образования в 2017 году достиг 45,7 %, однако конкурс в некоторые престижные университеты достигает 100 человек на место, ведь вступительные экзамены в вузы в стране ежегодно сдают более 10 млн. человек [1]. Из-за высокой конкуренции высшее образование становится особенно ценным и на долгие годы является главной целью в жизни школьников и их родителей, которые стараются обеспечить своим детям самые благоприятные условия для учебы. Успешные ученики пользуются большим уважением и обладают авторитетом среди учеников младшей школы, подростков, родственников.

Только успешная сдача гаокао, дающая возможность попасть в рейтинговый университет, по мнению китайских школьников и их родителей, является основой последующего жизненного успеха. Задания гаокао год от года принципиально меняются, они непредсказуемы. Для успеха на итоговом экзамене требуется не только владение всем материалом программы, но и знание множества деталей, связанных с процедурой. В связи с этим получила развитие сеть образовательных организаций, в основном частных, специализирующихся на подготовке к гаокао, большим спросом пользуются студенты и преподаватели университетов, школьные учителя, оказывающие услуги репетиторов.

Соответственно, частные учебные заведения дополнительного образования, всевозможные курсы и тренинговые центры, помогающие обеспечить учащемуся высокий уровень успеваемости, превратились в Китае в обязательную составляющую образования, не оставляющую детям и их родителям возможности выбора. Благодаря быстрому росту благосостояния китайских семей, резко выросли и вложенные в образование и здоровье детей средства. А учитывая огромную численность населения Китая, спрос на обучение в хорошей школе, в рейтинговом вузе и, соответственно, в борьбе за престижную и высокооплачиваемую работу несопоставимо выше, чем в других странах. Стремясь обеспечить своему ребенку большую конкурентоспособность и хорошее будущее, родители вкладывают в его развитие огромные суммы денег, часто превышающие их финансовые возможности.

Частное внешкольное образование стало в Китае важнейшим фактором такой конкурентоспособности. За десятилетия, в условиях экономического роста, этот вид услуг превратился в мощную и высокодоходную индустрию. В 2020 году коронавирус заставил китайских детей некоторое время учиться дома, что принесло огромную популярность онлайн-образованию. По данным консалтинговой фирмы iResearch, индустрия образования Китая привлекла 116,4 миллиарда юаней (17,96 миллиарда долларов). На онлайн-образование пришлось 89% финансирования. Движимые капиталом, многие учебные заведения тратили значительные средства на рекламу и маркетинг, а некоторые даже инвестировали или спекулировали финансовыми средствами за обучение студентов.

Некоторые учреждения предоставляли кредиты для привлечения учащихся [2]. Девизом индустрии обучения служит предупреждение родителям: «Вы приходите, мы обучаем вашего ребенка; вы не приходите, мы обучаем конкурентов вашего ребенка» [3].

Оно заставляет их, не считаясь с затратами, записывать своих детей на самые разные обучающие и развивающие курсы, стимулируя рост спроса, и, соответственно, цен на услуги частного внешкольного обучения. В результате в более выигрышной ситуации оказались обеспеченные семьи, жители промышленно развитых регионов страны с наиболее высокими доходами.

Ситуация усугубляется тем обстоятельством, что, несмотря на поразительные экономические успехи, в сфере образования КНР сохраняются социально-экономические, культурные и географические различия в доступе к образованию и в его качестве, в содержании школьного образования, определяемом провинциальными органами управления образованием. Средние школы в значительной степени финансируются местными органами управления и, соответственно, жители бедных сельских районов имеют хуже оснащенные и укомплектованные квалифицированными кадрами учебные заведения. Так, финансирование образования в восточных провинциях в несколько раз превышает соответствующее финансирование в северо-западных, западных и юго-западных регионах страны, что не может не влиять на доступность и качество образования. И, хотя государство пытается исправить положение финансовыми вливаниями и разнообразными льготами, для выпускников проблема остается нерешенной. Таким образом, в менее развитых регионах у родителей не только более скромные возможности дополнительно обучать детей, но и значительно ниже уровень обеспечиваемого государством уровня образования.

Министерством образования КНР были введены разнообразные льготы и преференции для выпускников разных регионов и национальностей (в общей сложности было введено 11 видов общенациональных льгот и 95 видов преференций). Так, представителям национальных меньшинств и жителям экономически отсталых районов добавлялось 50 баллов. Получила развитие система образовательных кредитов и другие формы поддержки талантливых студентов – выходцев из малообеспеченных семей [4]. Однако проблема достижения социальной справедливости в образовании (чрезвычайно важная для развития в Китае социального равенства) осталась не только не решенной – она до сих пор усугубляется дополнительным, доступным не всем детям платным образованием.

К началу 2022 года сеть внешкольных образовательных учреждений оформилась в Китае в хорошо организованную, разветвленную, высокодоходную систему образования, существующую параллельно с общегосударственной школьной системой. Согласно статистическим данным образования на 2016 год, более 75 % учащихся от 6 до 18 лет посещали репетиторов. Траты родителей на репетиторские курсы по школьным учебным предметам и всякого рода кружки и секции уже в начальной школе достигают в крупных городах порядка 47 500 юаней в год (более 7000 $ по текущему курсу) на одного ребенка [2]. Плата за репетиторство на одного ребенка может составлять порядка 30 % от общих годовых расходов семьи (так, например, услуги репетитора в старших классах школы варьируются в среднем от 100 $ в час). Однако «по мере того, как капитал устремлялся в прибыльный частный сектор образования в Китае, ценностная ориентация некоторых учебных заведений смещалась с “обучения” на “прибыль”, превращая учащихся и их родителей в средство создания капитала» [2].

Вместе с непомерным ростом финансовой нагрузки на родителей стремительно росла и учебная нагрузка учащихся, превысившая к концу второго десятилетия 2000-х годов все допустимые нормы. С раннего утра до позднего вечера и практически без выходных учащиеся средней школы бесконечно делают домашние задания, повторяют уже выученное раньше, проходят тренировочные тесты, решают задачи. Помимо учебы дополнительные занятия и репетиторы – никакого свободного времени. Внешкольные курсы посещают учащиеся и в выходные. Ситуация усугубляется тем, что немногое свободное время, которое иногда выпадает китайским школьникам, они тратят на компьютерные онлайн-игры. Зачастую страдает психическое и физическое состояние детей – портится зрение, обостряются хронические болезни,

снижается иммунитет. Дети систематически испытывают серьезные учебные перегрузки, что зачастую вредит их нормальному физиологическому развитию, создает психологические проблемы, проблемы с социализацией из-за нехватки времени на свободное общение со сверстниками вне соцсетей.

В последнее время серьезной критике в научных публикациях подвергается традиционная для китайской школы практика многократного повторения как одного из ведущих инструментов повышения академической успеваемости учащихся. Увлечение родителей разнообразными внешкольными курсами не всегда помогает обеспечить более качественную всестороннюю подготовку школьника. Исследователи Ян Чжимин, Ву И приводят многочисленные примеры того, как усталость и перегрузка школьников снижает их успеваемость: «После того, как количество тренировок достигнет определенной критической точки, неизбежно наступает “феномен плато” обучения, то есть тренировки вместо закрепления знаний будут снижать уже достигнутый уровень» [5]. Осуждению подверглась и практика частого проведения тестов для приобретения навыков их написания. Многократно обсуждаемым в китайских педагогических изданиях является пример ученицы старшей школы, которая на протяжении трех лет собирала контрольные работы по всем предметам. Толщина сложенных ею стопкой тестов только по одному предмету достигла 2,41 метра. Число неправильно сформулированных или неточных вопросов в тестах по одному предмету исчислялось сотнями [6].

Попытки ослабить учебную нагрузку учащихся и обеспечить каждому справедливые, равные условия для получения качественного образования, в том числе и высшего, предпринимались в последние десятилетия неоднократно. На решение этих острых социальных проблем так или иначе были направлены и опубликованные в последнее десятилетие «Мнения об углублении реформы системы приема абитуриентов» (2014), «Общая программа углубления реформы системы оценки образования в новую эру» (2020) и др.

С 2021 года вступило в силу постановление ЦК КПК и Главного Управления Госсовета КНР «О дальнейшем снижении нагрузки на студенческую работу и внешкольную подготовку на этапе обязательного образования» [7]. Главной целью постановления стало масштабное реформирование и стандартизация сферы образования, повышение уровня образования, снижение чрезмерной нагрузки учащихся и сокращение коммерческой составляющей системы образования. Предпосылкой столь радикальных мер стало изменение в последние годы государственной демографической политики. Длительный период контроля и ограничения рождаемости отрицательно повлиял на традиционное чадолюбие китайских семей. Соответственно, даже после отмены политики «одного ребенка», в условиях роста продолжительности жизни, в КНР остро обозначилась проблема быстрого старения населения. Значительное число пар готовы завести двух и более детей, но в силу огромных материальных затрат на их обучение пока не могут это позволить.

Кроме того, как уже говорилось выше, значительно ухудшается доступность к качественному образованию детей из семей с низкими доходами, из национальных окраин и отдаленных сельских районов Китая. В будущем у этих детей невысокие шансы получить высокооплачиваемую работу, что закрепляет имущественное расслоение в обществе.

Острой и нерешенной, несмотря на ряд предпринятых в последние годы мер (пересмотр содержания школьного образования с целью его сокращения, ограничение домашних заданий в начальной школе, ранняя профилизация и т. п.), остается проблема чрезмерной учебной нагрузки школьников.

Главной целью постановления «О дальнейшем снижении нагрузки на студенческую работу и внешкольную подготовку на этапе обязательного образования» стало масштабное реформирование и стандартизация сферы образования, повышение уровня государственного образования, снижение чрезмерной нагрузки учащихся и сокращение коммерческой составляющей системы образования.

Дополняет систему мер по оздоровлению воспитательно-образовательной среды вокруг детей и подростков полный запрет компаниям, производящим онлайн-игры, предоставлять услуги несовершеннолетним в будние дни. Дети смогут играть в онлайн-игры только в течение одного часа вечером по пятницам и выходным [7]. Новые правила широко приветствуются родителями по всему Китаю как решительная попытка защитить физическое и психическое здоровье несовершеннолетних.

Перечисленные меры по реформе внешкольного образования должны не только благоприятно сказаться на повышении качества образования, но и устранить острые социальные проблемы, такие как неравенство в доступе к образованию, низкая рождаемость и др. Запрет на обучение во все остальные дни, кроме выходных и каникул, должен остановить изнурительные родительские гонки за как можно большим числом внешкольных курсов, секций, кружков для своих детей, избавить детей от колоссальных учебных перегрузок, а самих родителей – от разорительных расходов.

Как показывает анализ публикаций за два месяца после начала реализации реформы, органы управления образованием и государственные школы используют все доступные финансовые и административные ресурсы для создания системы дополнительного бесплатного образования на территории школьных кампусов. При школах создаются тематические клубы, предметные кружки, спортивные секции, а учителя различных предметов определяют время для дополнительных консультаций и углубленного изучения своих предметов. При этом кроме административно-командного регулирования, во многом определяющего скорость создания кружков и секций (школы рапортуют о 100–200 мероприятиях за неделю), школы и конкретные учителя стимулируются и финансово [8; 9].

**Заключение**. Таким образом, суть преобразований состоит в повышении доступности качественного среднего образования для детей из малоимущих семей и экономически слабо развитых сельских регионов за счет повышения качества государственного школьного образования, углубленного изучения учебных предметов и предоставления дополнительных бесплатных образовательных услуг в стенах школ. Центр тяжести подготовки учащихся к переходным и вступительным экзаменам переносится в школы, чтобы все учащиеся, независимо от доходов родителей, могли получать знания не на дорогих частных курсах, а в рамках государственного бесплатного дополнительного образования. Постановление обязывает школы организовывать дополнительное всестороннее развитие детей в спортивных секциях и кружках по интересам, предметных факультативах, не отдавая это направление на откуп частному внешкольному образованию. Однако вместе с частным дополнительным образованием родители лишаются выбора и вынуждены будут рассчитывать только на возможности школы.

Таким образом, планируется нивелировать фактор имущественного неравенства и снизить финансовую нагрузку на родителей учащихся и учебную нагрузку на детей. Предполагается, что вместе со снижением затрат на обучение уйдет и одно из наиболее серьезных препятствий для рождения второго и третьего ребенка, что, в свою очередь, может стать важным фактором решения в Китае проблемы быстрого старения населения.

**Литература:**

1. Министерство образования КНР. Статистические данные [Электронный ресурс]: moe.gov.cn — Режим доступа: http://www.moe.gov.cn/s78/A03/moe_560/jytjsj_2017/qg/201808/t20180808_344686.html — Дата доступа: 12.09.2024.
2. Чжан Дань, Тао Миньян. Китай запрещает частным образовательным фирмам привлекать деньги через IPO, стремясь сместить акцент отрасли с прибыли на преподавание / Чжан Дань, Тао Миньян [Электронный ресурс]: — Режим доступа: https://www.globaltimes.cn/page/202107/1229595.shtml — Дата доступа: 12.09.2024.
3. Предметное обучение за пределами кампуса [Электронный ресурс]: huanqiu.com — Режим доступа: https://lx.huanqiu.com/article/44PmMgdUjWh — Дата доступа: 12.09.2024.

4. Ван Синсинь, Пироженко Л. В. Система вступительных экзаменов в высшие учебные заведения КНР: проблемы, поиски, решения // Университетский педагогический журнал. – 2021. – № 1. – С. 62–69.
5. Чжи Мин, Ву И. Тренировка с точки зрения закона уменьшения предельных выгод в контексте «двойного сокращения» [Электронный ресурс]: — Режим доступа: https://kns.cnki.net/kcms/detail/detail.aspx?dbcode=CJFD&dbname=CJFDLAST2021&filename=PJYC202109002&uniplatform=NZKPT&v=0Kqp5RKOKX26VSwrTnzuTaCAxmeW%25mmd2F7YMYNcqDxcC%25mmd2FywpdUR8TA4K8TeSwV1%25mmd2FJUQR — Дата доступа: 12.09.2024.
6. Дин Цзяньтин. Старшеклассницы за три года накопили 2,41 метра контрольных работ [Электронный ресурс]: Chinese news. com — Режим доступа: http:// www.Chinesenews.com/e-du/2012/06-09/3951022.shtml — Дата доступа: 12.09.2024.
7. О дальнейшем снижении нагрузки на студенческую работу и внешкольную подготовку на этапе обязательного образования» [Электронный ресурс]: gov.cn — Режим доступа: http://www.gov.cn/xinwen/2021-05/21/content_5610228.htm. — Дата доступа: 12.09.2024.
8. Пусть дети учатся эффективно и растут счастливо [Электронный ресурс]: huanqiu.com — Режим доступа: https://lx.huanqiu.com/article/45DZA9kVa02 — Дата доступа: 12.09.2024.
9. Система государственного образования по схеме «двойного сокращения» – реконструкция и управление [Электронный ресурс]: cnki.net — Режим доступа: http://www.gov.cn/xinwen/2021-05/21/content_5610228. html https://wap.cnki.net/touch/web/Journal/Article/ ZJYX202109018.html — Дата доступа: 12.09.2024.

**E-mail:** Lidiia17@yandex.ru
**Redaksiyaya daxil olub:** 09.12.2024.

UOT 371.6 (091)

***Günay Eldar qızı Hüseynzadə***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun elmi işçisi,*
*fəlsəfə doktoru proqramı üzrə dissertant*
*https://orcid.org/0000-0002-5972-2572*
*https://doi.org/10.69682/arti.2024.91(6).117-120*

# XIX ƏSRİN SONU XX ƏSRİN ƏVVƏLLƏRİNDƏ NAXÇIVANDA TƏHSİLİN İNKİŞAFINDA MAARİFÇİLİK HƏRƏKATININ ROLU

***Гюнай Эльдар гызы Гусейнзаде***
*научный сотрудник Института Образования Азербайджанской Республики,*
*диссертант по программе доктора философии*

# РОЛЬ ПРОСВЕТИТЕЛЬСКОГО ДВИЖЕНИЯ В РАЗВИТИИ ОБРАЗОВАНИЯ В НАХЧЫВАНЕ В КОНЦЕ XIX – НАЧАЛЕ XX ВЕКА

***Gunay Eldar Huseynzade***
*scientific researcher at the Institute of Education of the Republic of Azerbaijan,*
*doctorial student in the program of doctor of philosophy*

# THE ROLE OF THE ENLIGHTENMENT MOVEMENT IN THE DEVELOPMENT OF EDUCATION IN NAKHCHIVAN AT THE END OF THE 19TH CENTURY AND THE BEGINNING OF THE 20TH CENTURY

**Xülasə.** XIX əsrin sonu XX əsrin əvvəllərində Naxçıvanda maarifçilik hərəkatının təsiri ilə məktəb, maarif, elm, təhsil ictimai-siyasi və mədəni həyatın əsas məsələsinə çevrilmişdir. Həmin dövrdə maarif xadimlərinin göstərdiyi fəaliyyət nəticəsində Naxçıvan bölgəsində yeni tədris ocaqlarının sayı artmış, maarifçilik yüksək səviyyəyə çatmışdır. Onları daha çox düşündürən pedaqoji problemlər dünyəvi məktəblərin yaradılması, təlimin ana dilində aparılması, qızların təhsilə cəlb olunması idi.
***Açar sözlər:*** *Naxçıvan, təhsil, məktəb, maarifçilik*

**Аннотация.** В конце XIX -го и начале XX -го века школа, просвещение, наука, образование стали главным вопросом общественной, политической и культурной жизни Нахчывана. За этот период в результате деятельности педагогов в Нахчыванском регионе увеличилось количество новых образовательных центров, а просвещение достигло высокого уровня. Педагогическими проблемами, волновавшими их, являлось создание светских школ, преподавание на родном языке, привлечение девочек к образованию.
***Ключевые слова:*** *Нахчыван**,** образование, школа, просвещение*

**Summary.** At the end of the 19th century and the beginning of the 20th century, school, enlightenment, science, education became the main issue of social, political and cultural life in Nakhchivan. During that period, as a result of the activity of educators, the number of new educational centers increased in the Nakhchivan region, and enlightenment reached a high level. The pedagogical problems that concerned them more were the establishment of secular schools, teaching in the mother tongue, and the involvement of girls in education.
***Keywords :*** *Nakhchivan, education, school, enlightenment*

XIX əsrin sonlarında Naxçıvanda teatrın fəaliyyətə başlaması, dünyəvi məktəblərin açılması burada maarifçilik hərəkatının yaranmasına və inkişafına təkan vermişdir. Naxçıvanda təhsilin inkişafında yüksək xidmət göstərmiş maarifçilərdən Cəlil Məmmədquluzadə, Məmmədqulu bəy Kəngərli, Məhəmməd Tağı Sidqi,

Mirzə Ələkbər Süleymanov, Əbülqasım Sultanov, Nazlı xanım Tahirova və Hüseyn Cavidin böyük rolu olmuşdur.

Dövrün görkəmli maarifçilərindən olan Cəlil Məmmədquluzadə Qori Müəllimlər Seminariyasını bitirdikdən sonra pedaqoji fəaliyyətinə İrəvan quberniyasının Uluxanlı kəndində başlamışdır. Daha sonra 1890-1897-ci illərdə Naxçıvan mahalının Nehrəm kəndində müəllimlik etmişdir.

Cəlil Məmmədquluzadə ana dilimizin inkişafı, saflığının qorunması uğrunda mübarizə aparmışdır. məktəblərin sayının artırılması və ana dilinin ayrıca fənn kimi tədris edilməsində böyük rolu olmuşdur. Ana dili uğrunda apardığı mübarizə dilimizin mükəmməl şəkildə, assimilyasiyaya uğramadan bizlərə gəlib çatmasına zəmin yaratmışdır. O, yazdığı bütün əsərlərdə ana dilini beşik başında deyilən laylaların dili kimi, xalqla meydana gələn, onunla inkişaf edən, xalqın mənəvi dünyasını özündə əks edən bir dil kimi təqdim edirdi [1, s. 100].

Tədris, təlim və tərbiyə sahəsində də böyük xidmətləri olmuş Cəlil Məmmədquluzadə "Ölülər", "Danabaş kəndinin məktəbi" və s. kimi əsərlərində bu sahədə apardığı mübarizəni qələmə almışdır. O, öz tərcümeyi-halında mollaxanalarda olan ağır şəraiti, müəllimlərin tətbiq etdiyi yanlış tərbiyə üsullarını tənqid edərək yazırdı: "Yeddi-səkkiz yaşında molla yanına gedib çərəkə və Quran oxumağım da yadıma düşür. Naxçıvanda o vədə müdərrislikdə məşhur olan Hacı Molla Bağır və Molla Əlinin məktəblərində oxumuşam və H.M. Bağırın falaqqasının, çubuqlarının acısını, deyəsən, indi bu saat yenə ayaqlarımda hiss edirəm. Həmin mollaların həsirli və bitli-sirkəli məktəblərində üç-dörd il avara olandan sonra atam məni qoydu şəhər məktəbinə. Üç il orada oxudum: rusca və genə müsəlmanca. Amma sözün doğrusu budur ki, dəxi mollaların bitli-sirkəli məktəbindən əlim çıxandan sonra əməlli-başlı müsəlman dərsi görmədim" [2, s. 100-101].

O, 1896-cı ildə Nehrəm məktəbində müxtəlif dövrlər üzrə Azərbaycan tarixinə aid materialları toplamaqla tarix muzeyi yaratmış, eyni zamanda Naxçıvanda teatr tamaşaları təşkil etməklə xalqın maariflənməsinə çalışmışdır.

C. Məmmədquluzadənin maarifçi müasirlərindən olan Məmmədqulubəy Kəngərli hüquqçu idi. O, 1864-cü ildə Naxçıvan şəhərində anadan olmuşdur. Məmmədqulubəy ilk təhsilini atası mayor Şəfiağa Kəngərlidən almış, daha sonra təhsilini ailə ənənələrinə sadiq qalaraq Tiflis Hərbi Məktəbində davam etdirmişdir. 10 il hərbçi kimi çalışdıqdan sonra xalqa xidmət etmək məqsədilə 1893-cü ildə maarifçilik hərəkatına qoşulmuşdur. Onun fəaliyyətində hüquqçuluqla yanaşı məktəbdarlıq da xüsusi yer tutmuşdur.

Əməkdar elm xadimi İsa Həbibbəyli yazır ki, indiyədək deyilirdi ki, ilk azərbaycanlı qız məktəbi 1901-ci ildə Bakıda məşhur xeyriyyəçi Hacı Zeynalabdin Tağıyev tərəfindən açılıb. H.Z. Tağıyevin xidmətini heç də azaltmadan, M. Kəngərlinin ondan bir az əvvəl qız məktəbi açmağı qeyd edilməlidir. H.Z. Tağıyevin açdığı sadəcə qız məktəbi idi və müsəlman qızlarının ilkin savad almalarına xidmət edirdi. Məhəmmədqulu bəyin təsis etdiyi isə qızlar üçün gimnaziya idi. Bu vaxtadək digər Qafqaz şəhərlərində də oğlan gimnaziyaları fəaliyyət göstərirdi. Qızlar üçün isə belə təhsil ocağını birinci dəfə M. Kəngərli açmışdı. Həmin gimnaziyanı bitirən qızlar universitetlərə daxil olmaq imkanı qazanırdılar [3, s.151].

İsa Həbibbəyli həmçinin arxiv materiallarına istinadən qeyd edir ki, 30 aprel 1901-cı il tarixdə Naxçıvan şəhər pedaqoji şurasının yığıncağında M. Kəngərlinin hesabdan keçdiyi nümunə dərsi müzakirə olunaraq ona "İbtidai sinif müəllimi" adı verilməsi qərara alınmışdır. İrəvan quberniyası Xalq Məktəbləri Direktorluğu həmin qərara əsasən, 29 may 1901-cı ildə M. Kəngərliyə 1163 №-li müəllimlik vəsiqəsi vermişdir. Pedaqoji fəaliyyət üçün lazım olan sənədləri əldə etdikdən sonra, o, 2 sentyabr 1901-ci ildə Qafqaz Təhsil Dairəsindən şəxsi məktəb açmaq üçün rəsmi icazə almışdır. Məktəb ilkin sənədlərdə "Məhəmmədqulubəy Kəngərlinskinin üçüncü dərəcəli birsinifli şəxsi məktəbi" adlandırılmış, sonra qızlar üçün gimnaziya statusu almışdır. Şəxsi məktəb 15 sentyabrdan etibarən fəaliyyətə başlamışdır. Məktəbin hazırlıq sinfində-4; birinci sinfində-4; ikinci sinfində-4; üçüncü sinfində-6 nəfər, cəmi 18 nəfər şagird təhsil almışdır. Məktəbin illik təhsil haqqı 1350 manat idi. Tərbiyə işlərinə-1935, binanın kirayəsinə-700, şəxsi heyət üçün 960, digər xərclərdən ötrü-1635 manat sərf edilmişdir. Məktəbin ümumi maliyyə vəsaiti- 6380 manat təşkil etmişdir[3, s.152].

Maarifçi, pedaqoq Məhəmməd Tağı Sidqi Ordubad ədəbi mühitinin yetirmələrindən biri

idi. Sidqi 1892-ci ildə Ordubad şəhərində "Əxtər" adlı məktəb açır. Məktəb, dərslərin ana dilində keçirilməsi, təlim və tərbiyə üsulları, şagirdlərin döşəmədə deyil partalarda oturması ilə köhnə mollaxanalardan fərqlənirdi. Məktəbdə həmçinin hesab, coğrafiya, hifzi-səhiyyə, fars və ərəb dilləri də tədris olunurdu. 1894-cü ildə C.Məmmədquluzadənin xahişi ilə Naxçıvana gələn Məhəmməd Tağı maarifçilik hərəkatına qoşulur. Burada o, öz fəaliyyətini genişləndirərək dünyəvi fənlərin tədris olunduğu, "Əxtər" məktəbi kimi eyni quruluşa malik olan "Məktəbi-tərbiyə" adlı məktəbi təsis edir. Bu məktəbdə hesab, tarix, coğrafiya fənləri, Azərbaycan, rus, ərəb və fars dilləri ilə yanaşı etika dərsləri də keçilirdi.

Xalqın böyük rəğbətini qazanan Sidqi azərbaycanlı qızların təhsil alması üçün də uzun müddət mübarizə aparmış və 1896-cı ildə "Qız məktəbi"ni açmağa nail olmuşdur. O, Qurani-Kərimdən misallar gətirərək qızların təhsil almasının dinə qarşı çıxmaq olmadığına camaatı inandırmağa çalışırdı.

"Tərbiyə" məktəbində fəaliyyət göstərdiyi dövrdə Sidqi, "Puşkin", "Heykəli-insana bir nəzər", "Kəblə Nəsir", "Həkimanə sözlər", "Mənəviyyati-mədəniyyət", "Yüz il yatandan sonra" kimi əsərlərini yazmışdır. Bu əsərlərlə yanaşı o, "Nümuneyi-əxlaq", "Coğrafiya xüsusunda məlumati-mücmələ", "Tənviri-əfkar", "Müxtəsər coğrafiya risaləsi", "Təfhimi-insaniyyət", "Töhfeyi-bənat, yainki qızlara hədiyyə" adlı dərsliklər də hazırlamışdır.

Naxçıvanda təhsil və mədəniyyətin inkişafına töhfə verən ziyalılardan biri də tanınmış maarif və teatr xadimi Ələkbər Süleymanov olmuşdur. 1882-ci ildə Qori Müəllimlər Seminariyasında təhsilini başa vurduqdan sonra Şərur qəzasında açılmış Yengicə kənd məktəbinə müdir təyin olunur. 1890-cı ildən pedaqoji fəaliyyətini Cəlilkənd ikisinifli kənd məktəbində davam etdirir. 1894-cü ildən Naxçıvanda görkəmli maarifçi Məhəmməd Tağı Sidqinin "Məktəbi-tərbiyə" məktəbində rus dili fənnini tədris edən Ə. Süleymanov, 1897-ci ildə həmin təhsil müəssisəsinə müdir təyin olunur.

Naxçıvanda teatrın formalaşmasında Ələkbər Süleymanovun da misilsiz xidmətləri olmuşdur. Onun Mirzə Məmməd Zamanbəyov ilə birgə Naxçıvanda ilk dəfə olaraq yaratdığı "Müsəlman incəsənəti və dram cəmiyyəti" ndə həvəskar aktyorlar tərəfindən Mirzə Fətəli Axundzadənin "Hacı Qara" və "Sərgüzəşti-vəziri-xani-Lənkəran" komediyaları əsasında tamaşalar göstərilirdi və bu tamaşalardan toplanan vəsait "Tərbiyə" məktəbinin hesabına köçürülürdü.

Naxçıvan maarifçi mühitinin görkəmli xadimlərindən olan Əbülqasım Sultanov ömrünün böyük bir hissəsini gənc nəslin elminə, təhsilinə sərf etmişdir. Həm ibtidai təhsili həm də Qori Müəllimlər Seminariyasındakı təhsilini Cəlil Məmmədquluzadə ilə birlikdə alan maarifpərvərin ilk təyinatı 1888-ci ildə Şahtaxtı kənd məktəbinə olur. Fəaliyyətinə müəllim kimi başlasa da 1896-cı ilə qədər orada müdir vəzifəsində çalışır. 1896-cı ildən 1908-ci ilə qədər isə Cəlilkənd kənd məktəbində rus dili müəllimi olaraq çalışır.

Təhsilin inkişafı ilə yanaşı teatrın inkişafında da Əbülqasım Sultanovun əvəzsiz xidmətləri olmuşdur. O, teatr tamaşalarında qadın aktyorlar tapılmadığına görə qadın rollarını məharətlə ifa edirdi. O dövrdə E. Sultanovun "Azərbaycan qızı" pyesində Sənəm, M.F. Axundzadənin "Müsyo Jordan və Dərviş Məstəlişah" komediyasında Gülçöhrə, Ə. Haqverdiyevin "Pəri cadu" dramında və Şamama, "Dağılan tifaq" faciəsində Sona xanım obrazlarının yaradıcısı Əbülqasım Sultanov olmuşdur.

Həmin dövrdə qızların məktəbə cəlb olunmasında Əbülqasım Sultanovun da bir sıra xidmətləri olmuşdur. O, qızların təhsil almasının gələcək nəslin savadlı yerişməsinə əhəmiyyətli təsirinin olacağını düşünürdü. Əsl maarifpərvər olan Əbülqasım Sultanov Dilbər və Süsən adlı iki qızını da Naxçıvan rus-tatar məktəbində oxutdurmuş və həmin gənc qızlar sonradan Naxçıvanda qadın təhsilinin inkişafında, savadlılığın yüksəlməsində və qadınların ictimai-siyasi həyatda aktiv olmalarında böyük rol oynamışlar.

Naxçıvanda qızların təhsil almasında ilk maarifpərvər qadınlarımızdan olan Nazlı xanım Tahirovanın da müstəsna xidmətləri olmuşdur. Yaşadığı dövrün çətinliyinə baxmayaraq 1912-ci ildə Naxçıvanda qızlar məktəbini açmağa nail olan Nazlı xanım həmin məktəbdə pedaqoji fəaliyyətlə məşğul olaraq qızların təhsil almasına, savadlanmasına dəstək olmuşdur.

Tarixçi alim Musa Quliyev "Unudulmaz maarif fədaisi – Nazlı xanım Tahirova" adlı məqaləsində Nazlı xanım haqqında geniş məlumat verərək qeyd etmişdir ki: "1912-ci ildə atasıgil

Naxçıvana köçdüklərindən Nazlı xanım da Naxçıvana qayıdır. O, Naxçıvan şəhərində qızlar üçün məktəb açdırır və həmin məktəbdə dərs deməklə bərabər, həm də məktəbə müdirlik edir. 1917-ci ildə baş verən siyasi hadisələrlə əlaqədar məktəbin fəaliyyəti dayansa da, 1920-ci ildə Naxçıvan Maarif Komissarlığının nəzdində yaradılan Qızlar Məktəbində Nazlı xanım fəaliyyətini davam etdirir. Yeni qurulmuş sovet hökumətinin qanunları ilə işləməyə başlayan Nazlı xanım həyatının sərt hadisələri ilə qarşılaşır" [4].

Naxçıvanda qadınlar üçün qadın klubları, qadın müəllimlərin hazırlığı üçün xüsusi bir şöbə və Ordubadda qızlar üçün yeni bir məktəb də təsis edən Nazlı xanım, bunu ona dəstək verən digər maarifçi qadınların köməyi ilə etmişdir.

Yaşadığı əsri "maarif əsri, səadət zamanı" adlandıran dövrün görkəmli pedaqoqlarından olan Hüseyn Cavid, xalqın maariflənməsini, tərəqqisini ən vacib amillərdən hesab edirdi. Naxçıvan şəhərində anadan olan görkəmli mütəfəkkir ilk təhsilini mollaxanada, sonrakı təhsilini isə müəllimi M. Sidqinin təsis etdiyi "Məktəbi-Tərbiyə"də almışdır. 1898-1904-cü illərdə İranda (Talibiyyə mədrəsəsi), 1906-1910-cu illərdə İstanbulda təhsilini davam etdirmişdir. Naxçıvana qayıtdıqdan sonra Cavid 1918-cu ildə buradakı "Rüşdiyyə" məktəbində müəllimlik fəaliyyəti ilə məşğul olmuşdur. Bu barədə "İstiqlal" ordenli maarif xadimi Lətif Hüseynzadə "Aras şahittir" adlı kitabında bəhs edir: "1918 yılı Nisan ayının ortalarıydı. Savaş durmuşdu. Her yerde işlerin normale döndügü gibi, okullarda da dersler başlamıştı. Ben rüştiye okulunun 9. Sınfında okuyordum. Bir gün okulumuzun müdürü Halil ağa Hacılarov Hüseyin Cavidle sınıfımıza geldi. Müdürümüz Hüseyin Cavid'i bize takdim edip gitti. Bu muhterem şair ve dramaturqumuz Hüseyin Cavid'i gıyaben tanıyorduk. Onun bize öğretmen olarak atanması bizi çok sevindirdi" [5, s 23].

Hüseyn Cavid öz ədəbi nümunələri, tövsiyə və təklifləri ilə Naxçıvan yazıçı və şairlərinə yeni yaradıcılıq istiqaməti aşılayırdı. O, ətrafına toplaşan aktyor, rəssam və yazıçılarla birlikdə şəhər teatrında tamaşalar və rəsm sərgiləri təşkil edirdi. Səhnələşdirilmiş tamaşalardan toplanan vəsait vətənindən zorla çıxarılan mühacirlərə, yoxsul tələbələrə, yetim və kimsəsiz uşaqlara paylanılırdı. Həmin dövrdə Cavidin təşəbbüsü ilə məşhur türk dramaturqu Əbdülhak Həmidin "Dohter-i Hindu" əsəri ilk dəfə Naxçıvan Dram Teatrında tamaşaya qoyulmuşdu.

Göründüyü kimi, Naxçıvanda təhsilin, mədəniyyətin inkişafında Naxçıvan ziyalılarının böyük rolu olmuşdur. 1924-cü ildə Naxçıvan muxtariyyət qazandıqdan sonra da həmin ənənələr inkişaf etdirilmişdir.

**Problemin aktuallığı.** Maarifçilik Azərbaycanda bilik və mədəniyyətin ötürülməsində, təhsilin inkişafında mühüm rol oynamışdır. Azərbaycanın pedaqoji fikir tarixində xüsusi yer tutan və aktuallıq təşkil edən XIX əsrin sonu XX əsrin əvvəllərində Naxçıvanda təhsilin inkişafında maarifçilik hərəkatının rolu məsələsi məhz bu zərurətdən yaranmışdır.

**Problemin elmi yeniliyi.** Məqalədə XIX əsrin sonu XX əsrin əvvəllərində Naxçıvanda təhsilin ana dilində olması, onun inkişafı, savadsızlıqla aparılan mübarizə, qızların təhsilə cəlb edilməsi kimi məsələlər təhlil edilmişdir. Bununla yanaşı Naxçıvanda təhsilin inkişafında naxçıvanlı maarifpərvər ziyalıların göstərdiyi xidmətlər, onların fəaliyyətlərinə dair faktlar müəyyənləşdirilmişdir.

**Problemin praktik əhəmiyyəti.** Naxçıvanda təhsili inkişafında maarifçi xadimlərin rolunun pedaqoji istiqamətdə öyrənilməsi mühüm elmi əhəmiyyət kəsb edir. Məqalədə əskini tapmış ideyalardan pedaqoji fikir tarixinin öyrənilməsində, tədrisində istifadə oluna bilər.

**Ədəbiyyat:**


1. Seyidov, Y. Yazıçı və dil. / - Bakı: Yazıçı, - 1979, - 288 s.
2. Məmmədquluzadə, C. Əsərləri. [4 cilddə]. - Bakı: Öndər, - c.4. 2004. - 472 s.
3. Həbibbəyli, İ.Ə. C. Məmmədquluzadə: mühiti və müasirləri / İ.Ə. Həbibbəyli. - Naxçıvan: Əcəmi, - 2009. - 424 s.
4. Quliyev, M. Unudulmaz maarif fədaisi – Nazlı xanım Tahirova // 525-ci qəzet. – 2013, 30 may. - s.7
5. Hüseynzade, L. Aras şahittir. Hatıralarım (1918-1920 yıllar) / L. Hüseynzadə. – Bakü: Nurlan, - 2001.



**E-mail:** g.huseynzade@arti.edu.az


**Redaksiyaya daxil olub:** 18.10.2024.

*UOT 37.0*

***Lalə Akif qızı Məmmədli***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun aparıcı mütəxəssisi,*
*pedaqogika üzrə fəlsəfə doktoru*
*https://orcid.org/ 0000-0003-0686-3627*
*https://doi.org/10.69682/arti.2024.91(6).121-123*

## ŞƏXSİYYƏTİN FƏAL HƏYAT MÖVQEYİNİN FORMALAŞDIRILMASI MƏSƏLƏLƏRİ

***Лала Акиф гызы Мамедли***
*ведущий специалист Института Образования Азербайджанской Республики,*
*доктор философии по педагогике*

## ВОПРОСЫ ФОРМИРОВАНИЯ АКТИВНОЙ ЖИЗНЕННОЙ ПОЗИЦИИ ЛИЧНОСТИ

***Lala Akif Mammadly***
*leading specialist of the Institute of Education of the Republic of Azerbaijan,*
*doctor of philosophy in pedagogy*

## FORMING AN ACTIVE LIFE POSITION OF AN INDIVIDUALS

**Xülasə**. Şəxsiyyətdə fəal həyat mövqeyinin formalaşdırılması mühüm problemdir. Bu problem də müəyyən tarixə malikdir. Bu mənada demək mümkündür ki, şəxsiyyətin fəal həyat mövqeyinin formalaşması mürəkkəb, ziddiyyətli, son nəticədə tarixən mütərəqqi prosesdir. Fəal həyat mövqeyinin təşəkkülünü şəxsiyyət nəzəriyyəsinin başlıca problemlərindən biri hesab etmək mümkündür. Lakin bu prosesin hər bir elementini, formalaşma perspektivlərini yalnız ayrı-ayrı aspektlərdə deyil, əsasən onların dialektik şəkildə bir-biri ilə əlaqəli sistemində dərindən bilmək, həmin sistemin dinamikada, inkişafda hərtərəfli təhlilini mümkün edir.
***Açar sözlər**: tələbələr, fəal mövqe, fəal, mövqe, fəal həyat mövqeyi, fəal həyat mövqeyini formalaşdırılması, mənəviyyat, mənəvi keyfiyyətlər*

**Аннотация:** Формирование активной жизненной позиции личности является важной проблемой. Эта проблема также имеет определенную историю. В этом смысле можно сказать, что формирование активной жизненной позиции личности представляет собой сложный, противоречивый, в конечном итоге исторически прогрессивный процесс. Формирование активной жизненной позиции можно считать одной из основных проблем теории личности. Однако глубокое знание каждого элемента этого процесса, перспектив формирования не только в отдельных аспектах, но главным образом в их диалектически взаимосвязанной системе, дает возможность всестороннего анализа этой системы в ее динамике и развитии.
***Ключевые слова**: студенты, активная позиция, активная, позиция, активная жизненная позиция, формирование активной жизненной позиции, духовность, духовные качества*

**Abstract.** The formation of an active life position of an individual is an important problem. This problem also has a certain history. In this sense, it can be said that the formation of an active life position of an individual is a complex, contradictory, and ultimately historically progressive process. The formation of an active life position can be considered one of the main problems of personality theory. However, a deep knowledge of each element of this process, the prospects for formation not only in individual aspects, but mainly in their

dialectically interconnected system, makes it possible to comprehensively analyze this system in its dynamics and development.

***Keywords**: students, active position, active, position, active life position, formation of active life position, spirituality, spiritual qualities*

Həmin əhəmiyyətli məsələnin bir tərbiyə problem kimi ortaya çıxarılması ötən əsrin 1979-ci illərinin sonuna, 80-ci illərə təsadüf edir. Hələ 1979-cu ildə Bakı şəhərində "Fəal həyat mövqeyinin formalaşdırılması: mənəvi tərbiyənin təcrübəsi və aktual problemləri" mövzusunda çox möhtəşəm bir konfrans keçirildi. O zamanlar biz SSRİ-nin tərkibinə daxil olan bir respublika idik. Konfrans beynəlxalq konfrans sayılırdı, bu tədbirə bütün müttəfiq respublikalardan nümayəndələr gəlmişdi. Konfrans bir neçə gün davam etdi. Çıxışlar, məruzələr sonradan 5-6 kitabda toplandı və nəşr edildi. Əsas məruzəçi o zaman Azərbaycan KP MK-nın birinci katibi mərhum Heydər Əliyev idi.

Bu problem – fəal həyat mövqeyinin formalaşdırılması heç zaman gündəlikdən düşməyən bir mövzu, məsələdir. Bu gün də, sabah da bu məsələ ilə məşğul olunmalıdır. Özü də ailədə, uşaq bağçalarında, ümumtəhsil məktəblərində, kolleclərdə, institut və universitetlərdə.

Şəxsiyyətin fəal həyat mövqeyinin formalaşması prosesinin öyrənilməsində bütöv bir elmlər kompleksi – fəlsəfə, psixologiya, etika, pedaqogika və fiziologiya iştirak edir. Bu elmlər arasındakı əlaqə şəxsiyyətin fəal həyat mövqeyinin təşəkkülünün əsas aspektləri arasındakı obyektiv əlaqələrlə şərtlənir. Fəqət həmin elmlərin hər biri tədqiqatın özünəməxsus cəhətini diqqət mərkəzinə gətirir.

Bu problemin tədqiqi nəzərdən keçirilən bilik obyektinin təbiətinə uyğundur və sosial hadisə kimi şəxsiyyətin özünün mürəkkəbliyi və çoxşaxəliliyi ilə əlaqədardır. Lakin həmin problemin metodoloji aspektlərinin əlavə tədqiqata ehtiyacı var.

Fərdin fəal həyat mövqeyinin formalaşdırılması probleminə maraq təbiidir, çünki o:

birincisi, yeni tipli şəxsiyyətin yetişdirilməsi, onun davranış və fəaliyyət prinsiplərinin öyrənilməsi ilə sıx şəkildə bağlıdır;

ikincisi, həmin fenomenə dair dəqiq elmi məlumatlara yiyələnməni nəzərdə tutur. Bunsuz fərdin məqsədyönlü sosial inkişafı prosesini idarə etmək, onun inkişafının xüsusiyyətlərini proqnozlaşdırmaq, təcrübədən nəticə çıxarmaq istiqamətində fəaliyyətinin səmərəliliyini artırmaq qeyri-mümkündür.

Müasir şəraitdə şəxsiyyətin hərtərəfli və ahəngdar inkişafının həyata keçirilməsində, tələbələrdə fəal həyat mövqeyinin formalaşdırılmasında ali təhsil müəssisələrinin rolu və məsuliyyəti artır.

Fəal həyat mövqeyinin inkişafı ilə bağlı problemlər cəmiyyətin inkişafının bütün mərhələlərdə aktual olmuşdur.

İnsan məhz fəal ictimai həyat prosesində şəxsiyyətə çevrilir. Şəxsiyyətin formalaşmasının mürəkkəb dialektik ziddiyyətli prosesi onun sosial mahiyyətinin müxtəlif fəaliyyətlər əsasında formalaşması prosesində reallaşır.

Şəxsiyyətin fəal həyat mövqeyinin tərbiyə olunmasının etik aspekti, mənəvi inkişaf problemləri kontekstində çoxşaxəli əxlaq və fəal həyat mövqeyi arasındakı əlaqə problemi kimi özünü göstərə bilər, yəni: məqsəd və məna, həyat, xoşbəxtlik və insan rifahı, dünyanın taleyi üçün kollektiv və şəxsi məsuliyyət, demokratiya və tərəqqi.

Fəal həyat mövqeyinin formalaşması makro və mikromühitin formalaşdırıcı təsirlərindən, həmçinin şəxsiyyətin özünün seçici fəaliyyəti əsasında sosial mühitlə əlaqəni təmin edən inteqrativ bir prosesdir.

Makro və mikromühit bir-birini tamamlamaq və yardım etmək prinsipi əsasında fəaliyyət göstərən, aktiv həyat mövqeyinin formalaşması prosesinin sosial təyinatını dəyişdirən, ünsiyyət quran amillərdir. Buna baxmayaraq, onlar nisbətən müstəqildirlər və keyfiyyətcə orijinallığa malikdirlər.

"İnsanın fəal həyat mövqeyi" anlayışının mənəvi mənası ondan ibarətdir ki, o, "şüurlu, qərar qəbul etmək, müəyyən bir davranış xətti seçmək və bir yerdə əlaqəli bir insanın aktiv mahiyyətinin təzahürünü əks etdirir. Xarici aləmə, özünə münasibətdə aktiv həyat mövqeyi fərd tərəfindən əxlaqi anlayış kimi öyrənilir.

Fəal həyat mövqeyi anlayışı tələbə oğlan və qızlarda fəal həyat mövqeyinin formalaşdırılması cəmiyyətin vəzifələrindən və onların həyata keçirilməsi şərtlərindən, şəxsiyyətin mənəvi yüksəlişindən asılı olaraq, yeni məzmun alacaq, fərdin aktiv həyat mövqeyinin formalaşması prosesinin özü də təkmilləşdirilmişdir. Fəal həyat

mövqeyinin invariant aspektini təşkil edən dünyagörüşü dəyərləri – ictimai vəzifəyə şüurlu münasibət, ideoloji inam, əməli fəaliyyətdə reallaşan sosial məsuliyyət – gələcək insanın milli idealına xas olan xüsusiyyətlərdir. Həm də onlar müasirliyin canlı reallığı, "bəşər sivilizasiyasının özəyində kök salmış, insan həyatının dərin yerlərindən qaynaqlanan çoxamilli proses kimi sosial şəraitin, tərbiyəvi təsirlər və təbii meyllərinin təsiri altında baş verir.

Filosofların, pedaqoq və psixoloqların, sosioloqlarının, əsərlərində fərdin fəal həyat mövqeyinin tərbiyəsi məsələləri daha da inkişaf etdirilmişdir.

Şəxsiyyətin fəal həyat mövqeyinin təşəkkülünün mühüm cəhəti bu prosesi müəyyən edən fizioloji mexanizmləri bilməkdir. Son on illərdə fizioloqlar müxtəlif davranış növlərinin təhlilinə, həmin davranış aktlarını təmin edən beyin mexanizmlərinin öyrənilməsinə, onların vegetativ komponentlərinin aşkarlanmasına və bu tiplərin rolunun aydınlaşdırılmasına yönəlib.

Şəxsiyyətin fəal həyat mövqeyinin meyarı mürəkkəbdir və bu mövqeyin öyrənilməsinin üç cəhətinə uyğun olan vahid göstəricilər sistemini əhatə edir: 1) fəaliyyət ölçüsü kimi; 2) fəaliyyət prosesi kimi; 3. struktur və şəxsi təhsil kimi.

Sosial-psixoloji yanaşma baxımından fəal həyat mövqeyinin təşəkkülü şəxsiyyətin (*bizim tədqiqatda tələbələrin – L.M.*) və onun bütün strukturunun – sosial davranışının, maraqların, dəyər oriyentasiyalarının, münasibətlərinin yenidən qurulması deməkdir. Sosial həyatın bu və ya digər sahəsində şəxsiyyətin formalaşmasının obyektiv qanunauyğunluqları müəyyən edilir. Bu qanunauyğunluqlara aiddir: bütövlükdə cəmiyyət, sinif, müəyyən qrup.

Şəxsiyyətin fəal həyat mövqeyinin tərbiyə olunması ilə bağlı tədqiqatın pedaqoji istiqaməti təhsilin təşkili sisteminə, təhsil təsirinin vasitələrinə və üsullarına, formalarına bələd olmaqdan, tələbənin şüurunu, davranış və rəftarını formalaşdırmaq üçün didaktik metodların işlənib hazırlanmasından ibarətdir. Tələbələrdə fəal həyat mövqeyinin formalaşmasında kollektivin üzərinə mühüm vəzifələr düşür.

Fəal həyat mövqeyi üçün təhsil sisteminin ən mühüm prinsipi nədə ifadə olunur? Təbii ki, təhsilin məqsədlərinin fərdin maraqlarına cavab verən, nəticəsinin isə məqsədlərə uyğun gələn fəaliyyətlə birləşməsində.

Fəal həyat mövqeyi – bu və ya digər cəmiyyətdə insanın (bizim tədqiqatda tələbənin – L.M.) bir şəxsiyyət kimi sosial reallaşmasının obyektiv qanunauyğunluğu, həyata keçirilmə dərəcəsi konkret tarixi xarakterə malikdir və şəxsiyyətin tarixi yaradıcılıq subyekti kimi inkişafı ilə əlaqədardır.

**Problemin aktuallığı**. Tələbələrdə fəal həyat mövqeyinin formalaşdırılması həmişə olduğu kimi bu gün də öz aktuallığı ilə seçilir.

**Problemin yeniliyi.** Tələbələrdə fəal həyat mövqeyinin formalaşdırılması problemi respublikamızda nisbətən az işlənmiş problemlərdəndir. Belə aktual bir problemin diqqət mərkəzinə gətirilməsi diqqətəlayiqdir.

**Problemin praktik əhəmiyyəti**. Məqalə gənc tədqiqatçılar üçün faydalı olacaqdır.

**Ədəbiyyat**

1. Abbasov, A.N. Pedaqogika: Müntəxəbat: Ali təhsil müəssisələri üçün dərs vəsaiti / A.N. Abbasov, R.R. Məmmədzadə, L.A. Məmmədli. -Bakı: Mütərcim, -2020. – 608 s.
2. Məmmədli, L.A. Pedaqogika nəzəriyyəsi: Ali təhsil müəssisələri üçün dərs vəsaiti / L.A. Məmmədli. -Bakı: Mütərcim, -2022. – 232 s.

**E-mail:** lale23@mail.ru

**Redaksiyaya daxil olub:** 12.12.2024

UOT 37.0

***Sevinc Tofiq qızı Vəliyeva***
*Naxçıvan Müəllimlər İnstitutunun*
*Pedaqogika və psixologiya kafedrasının müdiri,*
*pedaqogika üzrə fəlsəfə doktoru*
*https://orcid.org/0009-0000-0710-6324*
*https://doi.org/10.69682/arti.2024.91(6).124-127*

# MUSİQİ DƏRSLƏRİNDƏ KİÇİKYAŞLI MƏKTƏBLİLƏRDƏ TƏBİƏTƏ QAYĞIKEŞ MÜNASİBƏTİN FORMALAŞDIRILMASININ İMKANLARI VƏ YOLLARI

***Севиндж Тофиг гызы Велиева***
*доктор философии по педагогике,*
*заведующий кафедрой педагогики и психологии Нахчыванского Института Учителей*

# ПУТИ И ВОЗМОЖНОСТИ ФОРМИРОВАНИЯ БЕРЕЖНОГО ОТНОШЕНИЯ К ПРИРОДЕ У МЛАДШИХ ШКОЛЬНИКОВ НА УРОКАХ МУЗЫКИ

***Sevinj Tofig Valiyeva***
*Nakhchivan Pedagogical Institute*
*head of the department of Pedagogy and psychology,*
*doctor of philosophy in pedagogy*

# POSSIBILITIES AND WAYS OF FORMING A CAREFUL ATTITUDE TOWARDS NATURE IN PRIMARY SCHOOL CHILDREN IN MUSIC LESSONS

**Xülasə**. Təhsil müəssisələrində ayrı-ayrı fənlərin tədrisi prosesində, sinifdənxaric və məktəbdənkənar tədbirlər zamanı şagirdlərin, o cümlədən kiçikyaşlı məktəblilərin ekoloji tərbiyəsi, onlarda ətraf mühitə, təbiətin flora və faunasına qayğıkeş münasibətin formalaşdırılması ilə bağlı sistemli, məqsədyönlü işlər həyata keçirilir. Bu məqsədlə ibtidai siniflərdə müəllimlər Azərbaycan dili, həyat bilgisi, təsviri incəsənət, musiqi və başqa fənlərin təhsilləndirici, tərbiyələndirici və inkişafetdirici imkanlarından faydalanırlar.

Böyüyən nəsildə ölkəmizin bitki və heyvanat aləmə qayğı ilə yanaşmaq, onu mühafizə etmək ekoloji mədəniyyətin, ekoloji tərbiyə üzrə aparılan işlərinin ayrılmaz tərkib hissələrindəndir.

***Açar sözlər****: musiqi dərsləri, flora, fauna, Azərbaycanın flora və faunası, flora və faunaya qayğıkeş münasibət*

**Аннотация.** В образовательных учреждениях в процессе преподавания отдельных предметов, во время внеклассных и внешкольных мероприятий проводится систематическая, целенаправленная работа, связанная с экологическим воспитанием обучающихся, в том числе младших школьников. У них формируется бережное отношение к окружающей среде, флоре и фауне природы. С этой целью учителя начальных классов пользуются образовательными, воспитательными и развивающими возможностями азербайджанского языка, познания мира, изобразительного искусства, музыки и других предметов.

В подрастающем поколении бережное отношение к флоре и фауне нашей страны, ее охрана являются неотъемлемой частью экологической культуры и экологического воспитания.

***Ключевые слова***: *уроки музыки, флора, фауна, флора и фауна Азербайджана, бережное отношение к флоре и фауне*

**Abstract**. In educational institutions, in the process of teaching individual subjects, during extracurricular and extracurricular activities, systematic, targeted work is carried out related to the environmental education of students, including primary school students, the formation of a careful attitude towards the environment, flora and fauna of nature. For this purpose, primary school teachers use the educational, educational and developmental opportunities of the Azerbaijani language, knowledge of life, fine arts, music and other subjects. In the younger generation, a careful attitude towards the flora and fauna of our country, its protection are an integral part of environmental culture and environmental education.

***Keywords**: music lessons, flora, fauna, flora and fauna of Azerbaijan, caring for flora and fauna*

Biz problem baxımından musiqi dərsliklərini də araşdırdıq. I sinfin “Musiqi” dərsliyi (1) aşağıdakı bölmələrdən ibarətdir: “Musiqi aləmi”, “Melodiya”, “Ritm”, “Melodiya, ritm və temp”, “Könül açan nəğmələr”. Təbiətə, onun gözəlliklərinin vəsfinə, düzlərimizin, meşələrimizin, dağlarımızın, “durna gözlü” bulaqlarımızın, merimizin-meyvəmizin, gül-çiçəklərimizin, şəfalı (dərman) bitkilərimizin ecazkarlığından söz açan heç bir mahnının adı çəkilmir. Lakin I sinfin dərsliyində “Könül açan nəğmələr” bölməsi üzrə “Nəğməli bahar”, “Gözəl məkan Azərbaycan”, “Hər birimiz bir çiçək”, “Güllərin rəqsi”, “Uşaqların nəğməli dünyası” mövzuları özünə yer almışdır. Həmin mövzuların imkanlarından faydalanmaq mümkündür. Bölmənin adına (“Könül açan nəğmələr”) əsaslanaraq dərsdə dərslikdə adı çəkilməyən, lakin təbiətin gözəlliklərini ifadə edən mahnı səsləndirilə, onun barəsində məlumat verilə bilər.

II sinfin “Musiqi” dərsliyindəki (2) bölmələrə aşağıdakı adlar verilmişdir: “Mahnı janrı”, “Marş janrı”, “ “Melodiya, ritm, temp”, “Lad, ölçü, dinamika”, “Musiqidə məzmun və forma”, “Konsert zalında”.

Bu sinfin dərsliyində də təbiət haqında mahnılar barədə məlumatın verilməsi, bu və digər uyğun mahnının səsləndirilməsi nəzərdə tutulmamışdır. Lakin bəzi bölmələr üzrə bəzi mövzuların imkanlarından istifadə etmək olar. Diqqət yetirək:

“Mahnı janrı” bölməsi üzrə “Vətənpərvər mahnılar”, “Əmək mahnıları”, “Laylalar”, “Mahnı oyunlar”.

Və yaxud, “Musiqidə məzmun və forma” bölməsi üzrə “Musiqidə məzmun”, “Musiqi obrazları” və s.

III sinfin “Musiqi” dərsliyi (3) də diqqət mərkəzimizdə oldu. Dərsliyin bölmələri bunlardır: “Bayram musiqisi”, “Mahnıların ritmik müşayiəti”, “Musiqi forması”, “Musiqi təəssüratları”, “Musiqi alətləri”, “Kino musiqisi”, “Konsert zalında”.

IV sinfin “Musiqi” dərsliyi (4) barədə nə demək olar? Dərslik nəzərdən keçirildi. Dərslikdə aşağıdakı bölmələr öz əksini tapmışdır: “Musiqi kollektivləri”, “Musiqi əsərlərinin melodiyaları”, “İkisəsli musiqi”, “Musiqi və incəsənətin başqa növləri”, “Musiqili şəkillər”, “Konsert zalında”.

“Gözəl məkan Azərbaycan”, “Hər birimiz bir çiçək”, “Güllərin rəqsi”, I sinifdə musiqi dərsində “Könül açan nəğmələr” bölməsi üzrə “Uşaqların nəğməli dünyası” mövzusu keçilərkən “Salam, Payız” mahnısı səsləndirilə bilər (Söz, mus: Nüşabə Nuri, layihə rəhbəri: Zaur Ali Lyrics)

**“Salam, Payız” mahnısı**

Salam, payız, salam, payız,
Sən bizə xoş gəlmisən.
Söylə görüm bizə sən,
Nə sovqat gətirmisən.
Gətirmişəm mən sizə
Sarı, sari buğdalar,
Gətirmişəm mən sizə
İsti çörək, qoğalla.
Bişirəcəklər sizə.
Bağlarda bol meyvə var.
Alma, armud, heyva, nar.
Onları siz çox yeyin,
Onlarda vitamin var.
Dadlı meyvələr üçün,
Sağ ol deyirik sənə.
Sən bolluq gətirmisən,
Bizim ana Vətənə [5].

Bu gözəl mahnı kiçikyaşlı məktəblilərdə təbiətə, onun fəsillərindən biri olan payıza, təbiətimizin gözəlliklərinə rəğbət və məhəbbət hisslərini qüvvətləndirməyə, eyni zamanda təbiətə qayğılı münasibətin daha da güclənməsinə imkan verir.

Bu sahədə “Yarpaqlar” uşaq mahnısı da faydalıdır. Uşaqlarda təbiətə, flora və faunamıza məhəbbət hisslərini artırır. Diqqət yetirək

Həmin bölmə üzrə “Nəğməli bahar” mahnısı ilə yanaşı sözləri Teymur Elçinə məxsus “Yarpaqlar” uşaq mahnısına müraciət etmək mümkündür. Diqqət yetirək:

**Teymur Elçin. Yarpaqlar**

Payız gəldi, uşaqlar,
Tökülürlər yarpaqlar.
Yarpaqlar, yarpaqlar,
Sarı, qızıl yarpaqlar
Yarpaqları biz yağaq
Onlar ilə oynayaq.
Külək əssə, vermərik,
Arxada gizlədərik [6].

Diqqətəlayiq uşaq mahnılarından biri də musiqisi M. Əlibəyliyə, sözləri Z. Ağayevaya

məxsus “Yeddi çiçək, yeddi gül” mahnısıdır. İfa edir: “Kəpənəklər qrupu”.

Yeddi çiçək, yeddi gül,
İstəyirsən sən də gül.
Qoşul bu göyçəklərə,
Sən də oxu, sən də gül.
Şən qızların hər biri,
Dağların bənövşəsi.
Onlar mahnı oxuyur,
Heyran edir hər kəsi.
Geyimləri al-əlvan,
Baxan olur heyran.
İstəyirəm qoşulum,
Mən də onlara bu an [7].

Şagirdlərə anlatmaq lazımdır ki, şən əhval-ruhiyyəyə, xoş əhvala yiyələnmək üçün təbiətin ən gözəl nemətlərindən, floramızın mühüm nümunələrindən biri olan güllərin, çiçəklərin rolu böyükdür. Odur ki, gülləri sevmək, onları qorumaq, artırmaq lazımdır. Gülü, çiçəyi sevməyən adama rast gəlmək olmaz. Odur ki, onlara qayğı ilə yanaşmaq lazımdır.

“Günəş olaram mən də” mahnısında təbiətin əsrarəngiz gözəllikləri təsvir olunur. İfadə tərzi elə kamildir ki, təbiətə sevgini çoxaldır.

IV sinifdə sözləri Gülzar İbrahimovaya, musiqisi Aliyə Sabirqızına məxsus “Dünya gözəldir” [8] mahnısının dinlənilməsi məqsədəuyğundur.

**“Dünya gözəldir” mahnısı:**

Moderato
mf
Dost-lar, sa-lam - la - yaq a - çan gün - dü - zü,
Doğ-ma yur-du - mu-zun çı - xaq sey - ri - nə.
Bir-gə qu - laq a - saq sə - hər dan ü - zü
Ça - yın nəğ - mə - si - nə, çö - lün seh - ri - nə.
Təkrar üçün
Son üçün
// lar, İlk ba - har o - lar, ilk ba-har o - lar.

I-IV siniflərin musiqi dərslərində eyni zamanda sözləri Pərvin Feyziyeva, musiqisi Aliyə Sabirqızına məxsus “Fəsillər” musiqisi, Aygün Teymurova aid olan "Təbiəti qoruyaq"; Mirzəyev M. "Təbiət nəğməsi" mahnılarında faydalanmaq tövsiyə olunur.

Beləliklə, gəldiyimiz nəticə budur ki, ibtidai sinif müəllimləri uşaq mahnıların təhsilləndirici, tərbiyələndirici və inkişafetdirici imkanlarından faydalanmaqla kiçikyaşlı məktəblilərin diqqətini təbiətə, onun qorunmasına, ekoloji mühitin saflaşdırılması, heyvanat və bitki aləminə qayğıkeş münasibətə yönəldirlər.

**Problemin aktuallığı**. Azərbaycanın flora və faunasına, təbiətinə qayğıkeş münasibətin formalaşdırılması məsələsi iqlim dəyişikliyi, ekoloji böhran, ekoloji fəlakətlər fonunda aktuallığı ilə seçilir.

**Problemin yeniliyi**. Azərbaycanın flora və faunasına, təbiətinə qayğıkeş münasibətin formalaşdırılması diqqət mərkəzinə gətirilir.

**Problemin praktik əhəmiyyəti**. Məqalə şagirdlərdə Azərbaycanın flora və faunasına, təbiətinə qayğıkeş münasibətin formalaşdırılması ilə bağlı iş aparan ibtidai sinif müəllimləri üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**


1. Rəcəbova N. Ümumtəhsil məktəblərinin I sinifləri üzrə Musiqi fənni üzrə dərslik. / N. Rəcəbova, Ş. Quliyeva, Z. Əliyeva. -Bakı: Şərq-Qərb ASC, -2024. – 82 s
2. Rəcəbova N. Ümumtəhsil məktəblərinin II sinifləri üzrə Musiqi fənni üzrə dərslik. / N. Rəcəbova, Ş. Quliyeva, Z. Əliyeva. -Bakı: Şərq-Qərb ASC, -2021. – 66 s.
3. Rəcəbova N. Ümumtəhsil məktəblərinin III sinifləri üzrə Musiqi fənni üzrə dərslik. / N. Rəcəbova, Ş. Quliyeva, Z. Əliyeva. -Bakı: Şərq-Qərb ASC, -2022. – 66 s.
4. Rəcəbova N. Ümumtəhsil məktəblərinin IV sinifləri üzrə Musiqi fənni üzrə dərslik. / N. Rəcəbova, Ş. Quliyeva, Z. Əliyeva. -Bakı: Şərq-Qərb ASC,- 2022. – 82 s.
5. Nuşabə youtube Nuri. Salam, payız. https://www..com/watch?v=X2KzO3oqnSI**):**
6. Teymur Elçin. Yarpaqlar. https://www.youtube.com/watch?v=QIQFVG1Deh8)
7. Ağayeva Z. Yeddi çiçək, yeddi gül. https://www.youtube.com/watch?v=ahHM-6axmM8
8. İbrahimova, G. Dünya gözəldir. https://www.youtube.com/watch?v=O8cV18iVHQo



**E-mail:** veliyeva_1979@bk.ru



**Redaksiyaya daxil olub**: 03.12.2024

UOT 37.0

***Kəmalə Rüstəm qızı Quliyeva***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Ümumi pedaqogika kafedrasının dosenti,*
*pedaqogika üzrə fəlsəfə doktoru*
*https://orcid.org/ 0000-0002-8448-2021*
*https://doi.org/10.69682/arti.2024.91(6).128-131*

## MÜƏLLİMİN PEDAQOJİ MƏDƏNİYYƏTİ

***Кямаля Рустам гызы Гулиева***
*доцент кафедры общей педагогики Азербайджанского*
*Государственого Педагогического Университета,*
*доктор философии по педагогике*

## ПЕДАГОГИЧЕСКАЯ КУЛЬТУРА УЧИТЕЛЯ

***Kamala Rustam Guliyeva***
*associate professor of General pedagogy department of the*
*Azerbaijan State Pedagogical University*

## A TEACHER'S PEDAGOGICAL CULTURE

**Xülasə.** Dəyəryönlü təhsilin xüsusi önəm kəsb etdiyi hazırkı şəraitdə şagirdlərdə zehni, əxlaqi, fiziki, estetik, ekoloji, iqtisadi və hüquq mədəniyyətinin formalaşdırılması başlıca vəzifə kimi qarşıda durur. Mədəniyyət isə ən böyük dəyər hesab edildiyindən müəllimin özünün də pedaqoji mədəniyyətə yiyələnməsi, onun komponentlərinə tam mənasında sahib olması zəruridir.

Müəllimin pedaqoji mədəniyyəti onun peşəkar keyfiyyətləri arasında aparıcı yer tutur. Onun başlıca komponentlərinə akseoloji, texnoloji, evristik və şəxsi komponentlər daxildir. Müəllimin nitq, davranış və estetik mədəniyyəti də onun peşəkarlığının və səriştəliyinin başlıca göstəriciləri hesab edilir.
***Açar sözlər:*** *pedaqoji mədəniyyət, mükəmməl nitq, davranış mədəniyyəti, estetik mədəniyyət*

**Аннотация.** В современных условиях, когда ценностно-ориентированное образование приобретает особое значение, формирование психической, нравственной, физической, эстетической, экологической, экономической и правовой культуры у обучающихся является основной задачей. Поскольку культура считается величайшей ценностью, учителю необходимо овладеть педагогической культурой и иметь ее компоненты в полном смысле.

Педагогическая культура учителя занимает ведущее место среди его профессиональных качеств. К ее основным компонентам относятся аксиологический, технологический, эвристический и личностный компоненты.

Речь, поведение и эстетическая культура педагога также считаются основными показателями его профессионализма и компетентности.
***Ключевые слова:*** *педагогическая культура, совершенная речь, поведенческая культура, эстетическая культура*

**Abstract.** In the current condition, where value-oriented education is of particular importance, the formation of mental, moral, physical, aesthetic, ecological, economic and legal culture of students is the main task. Since culture is considered the greatest value, it is necessary for the teacher to acquire pedagogical culture and to have its components in the full sense.

A teacher's pedagogical culture takes a leading place among his or her professional qualities. Axiological, technological, heuristic and personal components are the main components.

The teacher's speech, behaviour and aesthetic culture are also considered the main indicators of his or her professionalism and competence.

***Keywords:*** *pedagogical culture, perfect speech, behavioural culture, aesthetic culture*

Müəllim cəmiyyətdəki sosial statusundan asılı olmayaraq həmişə insanın formalaşması prosesində iştirak etmişdir. Bu peşənin ictimai və humanist əhəmiyyəti, cəmiyyətdəki önəmli rolu da məhz bununla bağlıdır. Bəşəriyyətin bütün işıqlı şəxsiyyətləri, qüdrətli zəka sahibləri, pedaqoji elmin korifeyləri müəllimliyi bütün peşələrdən uca tutmuş, onu gənc nəslin təlim-tərbiyəsində başlıca istiqamətverici qüvvə hesab etmişlər.

Ulu Öndər Heydər Əliyevin fikrincə, həyatını müəllimliyə həsr edən insanlar ən fədakar, xalqına, millətinə sədaqətli, eyni zamanda qəhrəmanlıq göstərən insanlardır.

Müəllim gələcək cəmiyyətin memarı və qurucusudur, çünki gələcək cəmiyyət məhz onun yetirmələrinin əli ilə qurulur. Keyfiyyətli təhsilin taleyi məhz müəllimlə bağlıdır. O, mədəniyyətin, sosial dəyərlərin daşıyıcısı kimi mühüm bir missiyanı yerinə yetirir. Müəllim öz fəaliyyəti ilə keçmişin sınaqlarından keçib gələn elmi, mədəniyyəti gənc nəslə ötürür, eyni zamanda onlara dövrün tələblərinə uyğun bilik, bacarıq və vərdişlər aşılayır. Bu baxımdan onun özünün də pedaqoji mədəniyyətə yiyələnməsi, onun komponentlərinə tam mənasında sahib olması zəruridir.

Pedaqoji mədəniyyət müəllimin ümumi mədəniyyətinin tərkib hissəsi olmaqla onun ümumi inkişaf səviyyəsini təmin edən xüsusiyyətlərin interpretasiyasıdır.Müəllimin ümumi mədəniyyəti onun ixtisas hazırlığı və peşə yüksəlişini əhatə edir. Pedaqoji mədəniyyət isə bu təsirlər sırasında önəmli yer tutur.

**ARAŞDIRMALAR.** Pedaqoji mədəniyyət müəllimin peşəkar keyfiyyətləri arasında aparıcı yer tutur. Onun başlıca komponentlərinə akseoloji, texnoloji, evristik və şəxsi komponentlər daxildir.

Akseoloji komponentə müəllimin pedaqoji taktı və etikası, texnoloji komponentə, əsasən, müəllimin fəaliyyət mədəniyyəti, yəni pedaqoji ünsiyyət bacarığı, evristik mədəniyyətə isə peşə hazırlığı ilə bağlı keyfiyyətlər daxildir. Pedaqoji mədəniyyətin şəxsi komponentinə müəllimin xarici görünüş mədəniyyəti aid edilir.

Müəllimin nitq və davranış mədəniyyəti onun peşəkarlığının və səriştəliliyinin başlıca göstəriciləri hesab edilir. Vaxtilə ərəb filosofu İbn Xəldun yazırdı ki, hər öyrədən müəllim deyil, kimdən ki, öyrənirsən, müəllim odur.

"Müəllim öz yetirmələrinə verməli olduğu xüsusi (fənn üzrə), etik və həyati biliklərin daşıyıcısıdır. Buna görə də bilik müəllimin kamil şəkildə yiyələnməli olduğu əmək silahıdır" [1, s. 47].

Müəllimin ifadəli sözü digər pedaqoji təsir vasitələrini də yaxşı tətbiq etməyə imkan verdiyindən mükəmməl nitq qabiliyyətinə malik olmaq pedaqoji mədəniyyətin başlıca komponentidir. Çünki şagirdlərlə ünsiyyətdə müəllimin ən böyük silahı onun canlı sözüdür. "Şifahi nitq pedaqoji ünsiyyətin əsas vasitəsidir. Müəllimin sözü hisslərə və şüura təsir göstərməli, təfəkkürü və təxəyyülü stimullaşdırmalı, axtarıcılıq fəaliyyətinə tələbat yaratmalıdır" [2, s. 210].

Bu baxımdan nitqin emosionallığı, kamilliyi, inandırıcılığı təlim-tərbiyə prosesinin səmərəliliyini təmin edən əsas amillərdən biridir. V.A. Suxomlinski nitq mədəniyyətini mənəvi mədəniyyətin güzgüsü hesab edərək müəllimdən sözə sahib olmaq ustalığı tələb edirdi. Onun fikrincə, məktəb divarları arasında deyilmiş hər bir söz məqsədyönlü, düşünülmüş və müdrik olmalıdır. Nitq müəllim üçün həm tədris, həm də öyrənmə vasitəsidir. Müəllim nitq vasitəsilə müəyyən informasiyaları ötürür, şagirdlərin zehnini zənginləşdirir və inkişaf etdirir, onların diqqətini idarə edir, anlayışlar və təsəvvürlər dünyasını formalaşdırır. Şagirdlər, ilk növbədə məntiqli, dəqiq, qrammatik cəhətdən düzgün, orijinal nitqi yadda saxlayırlar. Ona görə də müəllim həm ümummədəni, həm də nitq baxımından şagirdlər üçün nümunədir. Nitq mədəniyyəti yalnız müəllimin mənəvi zənginliyinin, onun təfəkkür və davranış mədəniyyətinin ifadəsi deyil, eyni zamanda şagird şəxsiyyətini formalaşdırmağın qüdrətli vasitəsidir.

"Bəlkə də, bizim təşkilati işlərdəki səhvlərimiz çox zaman uşaqlarla əsl danışıq bacarığımızın olmamasindan irəli gəlir. Elə deməyi bacarmaq lazımdır ki, onlar sizin iradənizi, sizin mədəniyyətinizi, sizin şəxsiyyətinizi hiss edib duysunlar." [3, s. 102]

Düzgün nitqə malik olan müəllim nitqinin dəqiqliyini daim təmin etməlidir. Nitqin ilk və əsas şərtlərindən olan nitqin dəqiqliyi, müəllimin daim diqqət mərkəzində saxlamalı olduğu əsas meyar olmalıdır. Çünki, bu meyar müəllimin

nitqinə verilən digər tələblərin də yerinə yetirilməsində əsas rol oynayır. Belə ki, nitqin dəqiqliyi onun yığcamlığını, təmizliyini, ifadə və rabitəliliyini təmin edir.. Fikrini qısa izah etmək, lakonik və təsirli şəkildə şagirdlərdə mövzuya uyğun təsəvvür formalaşdırmaq qabiliyyəti peşəkar müəllimin əsas kompetensiyalarından biridir.

Müəllimin nitq mədəniyyətinin düzgün qurulmasında nitqin aydınlığı olduqca böyük əhəmiyyət kəsb edir. Nitqin aydınlığı düzgün ünsiyyət qurmaq üçün əsas şərtdir. F. Köçərli belə hesab edir ki , dili dolaşıq şəxsin fikri də dolaşıqdır. Deməli nitqin aydınlığı peşəkar müəllim fəaliyyətində həqiqətən mühüm rol oynayır. Müəllim diqqət yetirməlidir ki, şagirdlərdə öz fikirlərini dəqiq ifadə etmək vərdişləri formalaşdırsın.

Müəllimin pedaqoji mədəniyyətinin əsas komponentləri arasında onun ünsiyyət və davranış mədəniyyəti də xüsusi yer tutur. Pedaqoji prosesdə müəllimin müvəffəqiyyətinin başlıca amillərindən biri də onun şagirdlərlə emosional zəmin üzərində qurulmuş səmimi qarşılıqlı münasibətlər yarada bilməsidir. Bu da birbaşa müəllimin pedaqoji etikası ilə bağlıdır. Pedaqoji etikanın incəliklərinə yiyələnən müəllim həm də demokratik ünsiyyət üslubuna yiyələnmiş olur. Eyni zamanda müəllim-şagird münasibətlərində pedaqoji əməkdaşlığa nail olur. Alman şairi V. Höte yazırdı ki, bizə kim dərs deyirsə, ona müəllim deyirik, lakin hər dərs deyən adam müəllimlik ləyaqətini doğrulda bilməz.

Müəllimin ünsiyyət mədəniyyəti – şagirdlər, onların valideynləri, müəllim həmkarları, məktəb rəhbərliyi ilə düzgün qarşılıqlı münasibətlər yaratmaq bacarığında özünü göstərir. Ünsiyyət üslubuna görə müəllimləri avtoritar, liberal və demokratik olmaqla üç qrupa bölürlər.

Avtoritar ünsiyyət üslubu subyekt-obyekt münasibətlərinə əsaslanır. Bu zaman müəllim həmişə hökmran mövqedə dayanır, şagirdlərin fəal olmalarına şərait yaratmır. Liberal üsluba malik müəllimlər şagirdlərin işinə qarışmamağa çalışır, neytral mövqe tuturlar. Demokratik ünsiyyət üslubuna malik müəllimlər isə şagirdi subyekt kimi, bərabərhüquqlu tərəf-müqabil kimi qəbul edir, şagird kollektivinə hörmətlə yanaşır, onların müstəqilliyini boğmur, rəy və təkliflərini nəzərə alır. Bu gün təhsilin humanistləşdirilməsi, şəxsiyyətyönlülük kimi prinsiplərin reallaşdırılması eyni zamanda demokratik ünsiyyət üslubuna əsaslanır.

Müəllim-şagird ünsiyyəti verbal (nitq vasitəsi ilə), qeyri-verbal (mimika, jestlər, duruş), vizual (baxışlar-gözlər vasitəsi ilə) və taktil yolla (əsasən kiçik yaşlı şagirdlərin başını sığallamaq, xoş sözlər demək və s.) həyata keçirilir. Pedaqoji ünsiyyət müəllim- şagird əməkdaşlığıdır. Ünsiyyətin köməyilə bir çox tərbiyəvi vəzifələri də reallaşdırmaq mümkündür .

"Müəllim və şagirdlər arasında psixoloji təmasın yaradılması şəxsiyyətin idrak istiqamətini formalaşdırmağa, psixoloji baryerləri dəf etməyə, şagird kollektivində - şəxsiyyətlərarası münasibətlərdə sağlam mənəvi-psixoloji iqlim yaratmağa imkan verir" [4, s. 13] .

Müəllimin davranış mədəniyyəti onun pedaqoji etikasında özünü göstərir. Pedaqoji etika müəllimdən dərsdə, tərbiyəvi tədbirlərdə, ümumiyyətlə hər yerdə, insanlara münasibətdə humanizm, yüksək mədəniyyət, nəzakət, qayğıkeşlik, nikbinlik, xeyirxahlıq nümayiş etdirməsini nəzərdə tutur.

Azərbaycan Respublikası Təhsil Nazirliyinin 16 may 2014-cü il tarixli Qərarı ilə "Müəllimlərin etik davranış Qaydaları" [5] təsdiq edilmişdir. Həmin qaydalara görə hər bir müəllim cəmiyyətin və dövlətin maraqları naminə öz peşə fəaliyyətini keyfiyyətlə və səmərəli yerinə yetirməyə borcludur. Müəllim bütün hallarda hər bir şəxs üçün vicdanlılıq nümunəsi olmalıdır. O, öz peşəkar fəaliyyəti və şəxsi nümunəsi ilə təhsilalanların, valideynlərin, cəmiyyətin ölkəmizin təhsil sisteminə, təhsil müəssisəsinə və təhsil işçilərinə inamını artırmalıdır. Peşə fəaliyyəti prosesində şərəfli müəllim adına, habelə çalışdığı təhsil müəssisəsinin nüfuzuna xələl gətirə biləcək hərəkətlərə yol verməməlidir.

Müəllim həmişə mədəni davranış nümayiş etdirməli, təhsilalanlarla, həmkarları və rəhbərliklə münasibətlərində nəzakətli, xeyirxah, diqqətli və təmkinli olmalıdır. Məktəb rəhbərinin, həmkarlarının tənqidi fikirlərini düzgün qiymətləndirməli və onlardan nəticə çıxarmağı bacarmalıdır. Müəllim səmimi, çalışqan, intizamlı, təşəbbüskar olmalı, xarici görkəminə, geyiminə xüsusi diqqət yetirməlidir.

Müəllim öz davranışında pedaqoji taktı gözləməlidir. Pedaqoji takt şagirdlərlə ünsiyyət-

də müəyyən həddə riayət etmək deməkdir. Pedaqoji takt müəllimin, tərbiyəçinin ağlının, hisslərinin və mədəniyyətinin ümumiləşmiş ifadəsidir. "Pedaqoji takt müəllimin şagirdlərə münasibətində məqsədyönlü təsir ölçüsü, ünsiyyətin məhsuldar üslubda yaradılması baçarığıdır" [6. s.56]. Şagird şəxsiyyətinə hörmət etmək pedaqoji taktın özəyidir. Şagirdləri başa düşən, onların qəlbinə yol tapan müəllim qeyri-etik hərəkətlərə yol vermir. Müəllim təhsilalanların biliyini qiymətləndirərkən obyektiv və qərəzsiz olmalı, şagirdin hər hansı nöqsanına görə onu qiymətlə cəzalandırmamalıdır. Müəllim unutmamalıdır ki, ona nüfuz qazandıran keyfiyyətlər sırasında ədalətlilik ön sırada dayanır.

Müəllim təhsilalanlara qarşı həmişə diqqətli, xeyirxah və qayğıkeş olmalı, "mənəvi valideyn" statusunu qorumağa çalışmalıdır. Nitqində kobud və təhqiredici ifadələr işlətməməli, şagirdin hər kiçik qüsurunu onun üzünə vurmamalı, təhsilalanların şərəf və ləyaqətini alçaldan hərəkətlərə yol verməməlidir. Hər bir müəllim qarşısında əyləşən şagirdin şəxsində gələcəyin böyük adamını görməyi, şagirdlərin yaddaşında onların inandığı, etibar etdiyi, sevdiyi şəxsiyyət kimi qalmağı bacarmalıdır. Müəllim unutmamalıdır ki, şagirdlər sevdikləri müəllimin fənnini daha yaxşı oxuyurlar, yəni müəllimə məhəbbət fənnə məhəbbətdən əvvəl yaranır. Bu baxımdan tədris etdiyi fənni sevdirmək üçün ixtisasını mükəmməl bilməklə yanaşı, ilk növbədə, şagirdlərin qəlbinə yol tapmalıdır.

Müəllim eyni zamanda öz həmkarlarının fikirlərinə hörmətlə yanaşmalı, pedaqoji münasibətlərdə münaqişələrdən uzaq olmalıdır. Məktəb rəhbərliyinin irad və təkliflərini təmkinlə qəbul etməyi, səhvlərini etiraf etməyi bacarmalıdır.

Valideynlərə münasibətdə hörmət və nəzakət nümayiş etdirməlidir.

Müəllim öz vətəndaşlıq borcunu dərk etməli, öz şəxsi və peşə nüfuzunu daim qorumalı, milli-mənəvi dəyərlərin, mədəni irsin qoruyucusu missiyasını daşımaqla bərabər cəmiyyətdə fəal həyat mövqeyi tutmalıdır..

**NƏTİCƏ**. Həyat sübut edir ki, yalnız daim axtarışda olan, yenilikləri həvəslə öyrənən və bunları öz təcrübəsində yaradıcılıqla tətbiq edən, pedaqoji mədəniyyətin bütün komponentlərinə yiyələnən müəllimlər peşəkar və səriştəli təhsilverənlər kimi formalaşırlar. Müəllim yalnız məktəbdə deyil, həyatın bütün sahələrində öz adının şərəfini, müqəddəsliyini qoruyub saxlamağı bacarmalıdır. Pedaqoji mədəniyyət müəllimin peşə fəaliyyətinin güzgüsüdür.

**Problemin aktuallığı.** Müəllimin davranış, nitq, ünsiyyət mədəniyyəti onun peşə fəaliyyətinin əsas aspektləridir. Bütün zamanlarda peşəsinin tələb etdiyi mədəni normaları özünün həyati tələbatına çevirən müəllimlərimiz bu gün də yüksək peşəkarlıq və səriştəliliyi ilə yanaşı həm də , etik davranışları baxımından nümunə olmağı bacarmalıdır. Bu mənada müəllimin pedaqoji mədəniyyətə yiyələnməsi onun fəaliyyətinin başlıca cəhətidir və bütün zamanlarda aktual problem olaraq qalır.

**Problemin elmi yeniliyi.** Məqalədə müəllimin pedaqoji fəaliyyətinin başlıca aspektləri , pedaqoji mədəniyyətin akseoloji, texnoloji, evristik və şəxsi komponentləri sistemli təhlilə cəlb edilmişdir.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə əks olunan fikirlər gələcək müəllimlərin peşə seçiminə əminliyinin yüksəldilməsinə təsir göstərəcək. Müəllimlərin peşəkarlıq və səriştəlilik səviyyəsinin artırılmasında, onların pedaqoji mədəniyyətin vacib komponentlərinə daha dərindən yiyələnməsində istiqamətverici rol oynayacaqdır.

**Ədəbiyyat:**


1. Quliyeva K. Yuxarı sinif şagirdlərinin müəllimlik peşəsinə istiqamətləndirilməsi / K. Quliyeva . -Bakı: Nurlan,- 2003. - 140 s.
2. Ağayeva X. Müəllimin pedaqoji ustalığı təlimin səmərəliliyinin şərti kimi. Müəllim hazırlığına yeni yanaşmalar. / X. Ağayeva . -Bakı: Mütərcim, -2012. -324 s.
3. Abdullayev N. Nitq mədəniyyətinin əsasları: / N.Abdullayev.- Bakı : ADPU,- 2015. - 281səh.
4. Кан- Калик В.А. Учителю о педагогическом общении. / В.А.Кан- Калик. Москва: Просвещение, -1987. - 190 с.
5. Müəllimin etik davranış qaydaları. https://edu.gov.az
6. İlyasov M. Müəllim peşəkarlığı və pedaqoji səriştəliliyin müasir problemləri. / M. İlyasov. - Bakı: Elm və təhsil, - 2018. - 208 s.



**E-mail:**kamala.quliyeva51@gmail.com



**Redaksiyaya daxil olub:** 02.12.2024.

UOT 37.0

***Nigar Nəsir qızı Niftəliyeva***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin müəllimi,*
*fəlsəfə doktoru proqramı üzrə doktorant*
*https://orcid.org/0003-2810-9502*
*https://doi.org/10.69682/arti.2024.91(6).132-135*

# AİLƏ TƏRBİYƏSİ ZAMANI PEDAQOJİ CƏHƏTDƏN BURAXILAN NÖQSANLAR VƏ ONLARIN ARADAN QALDIRILMASI

***Нигяр Насир гызы Нифталиева***
*преподаватель*
*Азербайджанского Государственного Педагогического Университета,*
*докторант по программе доктора философии*

# ПЕДАГОГИЧЕСКИЕ НЕДОСТАТКИ ПРИ СЕМЕЙНОМ ВОСПИТАНИИ И ИХ УСТРАНЕНИЕ

***Nigar Nasir Niftaliyeva***
*teacher at Azerbaijan State Pedagogical University,*
*doctorial student in the program of doctor of philosophy*

# PEDAGOGICAL DEFICIENCIES DURING FAMILY UPBRINGING AND THEIR ELIMINATION

**Xülasə**. Məqalədə ailə tərbiyəsi zamanı pedaqoji cəhətdən buraxılmış nöqsanlar və onların aradan qaldırılması üsullarından bəhs edilmişdir. Aparılmış qeydlər, təhlillər şəxsi elmi təcrübəyə əsaslanır. Müxtəlif ailə qrupları üzərində aparılmış sorğular, uzunmüddətli müşahidə məqalədə əksini tapmış məsələlərdəndir. Burada problemin həllinə elmi-pedaqoji aspektdən yanaşılmışdır. Məqalədə pedaqoji tövsiyələr öz əksini tapmışdır.
***Açar sözlər**: ailə tərbiyəsi, məktəb mühiti, müəllim, pedaqoji diaqnostika, pedaqoji məsuliyyət*

**Аннотация.** В статье рассматриваются педагогические недостатки семейного воспитания и методы их устранения. Заметки и анализ основаны на личном научном опыте. Среди вопросов, отраженных в статье - многолетнее наблюдение и опросы, проводимые в различных семейных группах. В данной статье к решению проблемы подошли с научно-педагогического аспекта. В статье также отражены педагогические рекомендации.
***Ключевые слова**: семейное воспитание, школьная среда, учитель, педагогическая диагностика, педагогическая ответственность*

**Abstract.** Pedagogical shortcomings during family upbringing and methods of their elimination are discussed in the article. Notes and analyzes are based on personal scientific experience. Surveys conducted on different family groups, long-term observation are among the issues reflected in the article. Here, the solution of the problem was approached from a scientific-pedagogical aspect. Pedagogical recommendations are reflected in the article.
***Keywords**: family education, school environment, teacher, pedagogical diagnosis, pedagogical responsibility*

Respublikamızda təhsilin inkişafı dövlətin ən prioritet məsələlərindən biridir. Bu həmişə dövlət başçısının da diqqət mərkəzindədir. Həmişə yeni təhsil texnologiyalarının, innovasiyaların, inkişaf etmiş ölkələrin təhsil sistemlərindəki yeniliklərin hərtərəfli araşdırılması,

öyrənilməsi, tətbiqi vacib istiqamətlərdən biridir.(1) Bu ən əsas müəllimlərin də üzərinə böyük məsuliyyət qoyur, daim axtarışda olmaq, öz üzərində işləmək, biliyini artırmaq, yeni təcrübələrdən yararlanmaq və yeniliklərə nail olmaq tələbi qoyur. Bunun üçün müəllim tədris zamanı həm dərsdə, həm də sinifdənkənar tədbirlərdə pedaqoji ustalıq nümayiş etdirməlidir. Müəllim təkcə şagirdlə deyil, həm də siniflə, ailələrlə işləməli olur.

Orta ümumtəhsil məktəblərində, xüsusilə də ibtidai siniflərdə müəllimin valideynlərlə kontakt yaratması xüsusi önəm daşıyır və bu şagirdin təlim-tərbiyəsində müsbət təsir göstərir. Ancaq bunda müəllimin məsələyə düzgün yanaşması tələb olunur ki, bu da pedaqoji diaqnostikanın köməyi ilə mümkündür. Müəllim təkcə şagird üzərində deyil həm də valideyn üzərində pedaqoji diaqnostika aparmalı və özü üçün düzgün diaqnoz qoymalıdır ki, şagirdin hansı zəif tərəfləri var və valideynin öz övladı haqqında hansı istiqamətlərdə düzgün, hansı istiqamətlərdə yanlış təsəvvürləri var. Adətən valideynlər əksər hallarda öz övladlarının zəif tərəflərini görə bilmir, bəzən də boyunlarına almaq istəmirlər, müsbət tərəflərini də daha çox qabardırlar. Müəllim həmçinin dəqiqləşdirməlidir ki, şagirdin zəif tərəflərinin aradan qaldırırıması üçün valideynə hansı məsləhətləri və necə verə bilər. Əgər müəllim burada həm şagird, həm valideyn üzərində düzgün pedaqoji diaqnostika apara bilsə bunun çox müsbət nəticəsi ola bilər. Bununla müəllim şagirdlərlə olduğu kimi valideynlərlə də ünsiyyət qurarkən hansı valideynlə hansı mövzudan başlamağı, hansı istiqamətlərdə daha çox söhbət etməli olduğunu təyin etməlidir.

Müəllim, xüsusi ilə ibtidai sinif müəllimləri valideynlə düzgün dialoq qurub şagirdin həm də məktəbdənkənar davranışlarında özünü tərbiyəli, intizamlı, nümunəvi aparması üçün istiqamətlər göstərə, məsləhətlər verə bilər. Ümumiyyətlə müəllimlə valideynin düzgün qurulmuş ”ittifaqı”, müəllimin şagirdə verdiyi məsləhətlərin valideyn tərəfindən də təkrarlanması şagirdə istər tədris prosesində, istərsə də tərbiyəsində mühüm rol oynayır. Bir sözlə, müəllimin şagird və valideyn üzərində qurduğu pedaqoji diaqnostika hansı yöndə kömək etməyi, necə yanaşmağı təyin edir, valideyni müəllimin bir nömrəli köməkçisi, şagirdin yaxın “dostu” edir və bu da hökmən öz müsbət nəticələrini verir. Ümumiyyətlə, düzgün qurulan müəllim-valideyn ünsiyyəti şagirdə həm də stimul verir, inam yaradır.

Bəzən valideynlərin böyük əksəriyyəti uşaqlarının işini ”yüngülləşdirmək”, güya onların əziyyətlərini azaltmaq, onlara guya kömək etmək məqsədi ilə səhv addımlar atırlar. Bu uşaqların qidalanmasından, gigiyenasından, əməyə, işə öyrəşməsindən tutmuş tərbiyəsinə, məktəbə, kollektivə adaptasiyasına, yoldaşları ilə ünsiyyət qurmasına, intizamlı olmasına və s. keyfiyyətlərinə qədər səhv istiqamət verməsindən ibarətdir. (3) Məsələn valideyn övladını vitaminli qidalarla, meyvə-tərəvəzlərlə qidalanmaqdansa, şirniyyatlara, yarımfabrikatlara, güya dadlı, əslində isə orqanizmə zərərli qidalara meylli öyrədirlər. Uşağına guya yaxşı olsun deyə yuxu rejiminə riayət etmir, uşaq nə vaxt gəldi yatır, nə vaxt istədi oyanır ki, bu da gələcəkdə uşaq üçün böyük problemlər yaradır. Hətta böyük yaşlarında belə valideyn uşağın yatağını, paltarlarını özü sahmana salır. Hansı ki bunu kiçik yaşlarından belə uşaq özü etməyi öyrənməlidir. Hətta belə hallar da olur ki, 2-ci, 3-cü sinifdə oxuyan uşağın yeməyini valideyn qaşıqla ağzına verir ki, uşağa əziyyət olar ya da üstünə dağıdar. Uşağı idmana öyrəşdirmir ki, əziyyət çəkməsin, ağır olar. Uşaq məktəbə qədəm basan gündən onun sərbəstliyini əlindən alır, kiminlə oynamağını, kiminlə yoldaşlıq etməsini valideyn təyin edir. Belə uşaqlar böyük yaşlarında belə valideyn danlağından qorxaraq özləri sərbəst qərar qəbul edə bilmirlər. Valideynlər hətta müəllimin işlərinə müdaxilə etməyə çalışırlar ki, mənim uşağım sinifdə kiminlə otursun, hansı cərgədə, hansı partada otursun və i.a. Belə valideynlər özləri də bilmədən öz övladlarının “dostuna” yox “düşməninə” çevrilirlər, övladlarının gələcəyi üçün böyük çətinliklər yaradırlar.

Belə valideynlər müəllimlərin də işini çətinə salırlar və gələcəkdə övladları da kollektivlə işləməkdə, yoldaşları ilə ünsiyyət qurmaqda, sərbəst qərar qəbul etməkdə, öz işlərini planlaşdırmaqda çox əziyyət çəkirlər. Ancaq müəllimlər belə valideynlərlə də işləməyə məcburdurlar. Məhz belə hallarda müəllim pedaqoji diaqnostikanın köməyi ilə həm valideynlə, həm də şagirdlə düzgün ünsiyyət qura bilir və onları düzgün istiqamətləndirə bilir.

H. İlyasovun fikrincə isə “Valideynlər tərbiyəçilik fəaliyyətlərində bir neçə cəhətə diqqət

yetirməlidirlər: onlar uşaqların psixoloji və fizioloji xüsusiyyətlərini, fiziki hazırlığını öyrənməli, uyğun olaraq inkişafetdirici təsir mexanizmini tapmalıdırlar. Eləcə də onların sosial mühitinin məqsədyönlü olmasına təsir göstərməlidirlər, ailə ahənginin pozulmasına yol verməməlidirlər, öz söhbətlərinin, işlərinin, əməllərinin vətəndaşlıq tərbiyəsi təsiri oyatmasına səy etməlidirlər.

Tədqiqat göstərir ki, valideynlər uşaqların inkişaf dövrlərini və həmin dövrlərdəki onlara məxsus xüsusiyyətləri nəzərə aldıqda öz tərbiyəvi məqsədlərinə asanlıqla nail ola bilirlər.

Bəlli olduğu kimi şəxsiyyətin formalaşdırılmasında irsi-bioloji və sosial amillərin mühüm əhəmiyyəti vardır. Valideynlər tərəfindən bu cəhətlərdə nəzərə alınmalı və unudulmamalıdır ki, uşaqların vətəndaşlıq tərbiyəsində sosial mühitin və məqsədyönlü tərbiyəvi işin əhəmiyyətli təsiri vardır."(7.8)

F. Bakışlı isə tədqiqat işini yeniyetmələrin üzərində apararaq belə qeyd edir " Tərbiyənin çox mühüm tərkib hissəsi olduğundan tərbiyənin prinsipləri eyni zamanda mənəvi tərbiyə üçün də səciyyəvidir. Başqa sözlə, mənəvi tərbiyə işinin təşkilatçıları həmin prinsipləri əldə rəhbər tuta bilərlər.

Mənəvi tərbiyənin humanist yönümdə təşkili prinsipinin tələbinə görə aşağıdakılar diqqət mərkəzində dayanır:

1. Yeniyetmənin hüquq və azadlıqlarına hörmətli münasibət;

2. Yeniyetmənin şəxsiyyətinə humanist münasibət;

3. Yeniyetmənin öz-özülə qalmaq hüququna hörmətlə yanaşmaq;

4. Yeniyetməyə gücüçatan və ağıllı tələblərin verilməsi.

5. Onunla aparılan tərbiyə işinin məqsədinin yeniyetməyə bildirilməsi;

6. Yeniyetmə verilən tələbləri yerinə yetirməkdən imtina etdikdə belə onun rəyinin nəzərə alınması;

7. Bu və ya digər səbəbdən (humanitar, dini və b.) onun (tərbiyəolunanın) əqidəsinə zidd olan keyfiyyətlərin formalaşdırılmasından yeniyetmənin imtina etmək hüququnun nəzərə alınması.

8. Verilən tələblərin könüllü yerinə yetirilməsinin vacibliyi;

9. Yeniyetmə şəxsiyyətinin şərəf və ləyaqətini alçaldan cismani və digər cəzalara yol verməmək və s. Yeniyetmələrə fərdi yanaşmaq üçün müəllim, eləcə də valideyn onların qavrayışının, təfəkkürünün, yaddaşının, nitqinin, xarakterinin, temperamentinin, iradəsinin xüsusiyyətlərini nəzərə almalıdır. Bəzən belə güman edirlər ki, fərdi yanaşma dedikdə bu, yalnız "çətin", qanun pozan yeniyetmələrə aid bir məsələdir. "Çətin", qanun pozan yeniyetmələr həqiqətən xüsusi diqqət tələb edirlər. Lakin "uğurlu" yeniyetmələr də diqqətdən kənarda qalmamalıdırlar. Bu "uğurlu"luğun arxasında xoşagəlməz niyyətlər, yönəlmələr, motivlər və əməllər dayana bilər.

... Şagirdlər ilə aparılan işlərdə mənəvi tərbiyənin aşağıdakı prinsiplərindən fəal şəkildə istifadə olunurdu: 1. Mənəvi tərbiyədə məqsəd aydınlığı prinsipi. 2. Tərbiyə işinin həyatla və ölkəmizin dinc quruculuq işləri ilə bağlılığı prinsipi. 3. Yeniyetmələrin yaş xüsusiyyətlərinin hesaba alınması prinsipi. 4. Fərdi xüsusiyyətlərin hesaba alınması prinsipi. 5. Mənəvi tərbiyə prosesində sistemliliyin, ardıcıllığın və fasiləsizliyin gözlənilməsi prinsipi. 6. Mənəvi tərbiyənin zəruri prinsiplərindən biri də nikbinlik prinsipidir. 7. Yeniyetmənin şəxsiyyətinə hörmət etməklə ona verilən düzgün tələbkarlığın uyğunlaşdırılması (mənəvi tərbiyədə hörmət və tələbkarlıq) prinsipi. 8. Tələblərdə vahidliyin gözlənilməsi prinsipidir. Mənəvi tərbiyə üzrə yeniyetmələrlə iş apararkən müəyyən prinsiplər əsas götürülməklə yanaşı, eyni zamanda müvafiq metodlar da tətbiq olunur. Həmin metodlar mənəvi tərbiyəliliyin səviyyəsini artırır, keyfiyyətini yüksəldir. Lakin mənəvi tərbiyə metodlarından səmərəli istifadə olunmalı, onların növbələşməsi düzgün təşkil edilməlidir." (8.11)

G. Hüseynovanın fikrincə, "Ailə tərbiyəsində bir çox nöqsanlar vardır ki, onlar yenidəntərbiyəyə ehtiyacı olan yeniyetmələrin meydana çıxmasına və onların başqalarına meydan oxumalarına imkan verir. Həmin nöqsanları diqqət mərkəzinə gətirək:

1. Yeniyetmənin xarakter xüsusiyyətlərini müəllimin səthi bilməsi; yeniyetmənin xarakterindəki mürəkkəbliyi və özünəməxsusluğu səhvən çətin tərbiyəlilik kimi qəbul edilməsi;

2. Hədə, cəza, valideynlərə şikayət etməklə yeniyetməyə təzyiq göstərərək, onun müqavimətini qırmağa cəhd.

3. Valideynlərin müəllimlərlə; yaxud yeniyetmənin müəllimlərlə münaqişəli münasibətləri və s.

Ailə və məktəb tərəfindən tərbiyə prosesinin təkmilləşdirilməsi, yuxarıda göstərilən tipik səhvlərin aradan qaldırılması çox vaxt şəxsiyyətin mənəvi aləmində müsbət cəhətlərin intensiv inkişafına səbəb olur.” (5., s. 8)

H.İ. Roeriç isə məsələyə bu aspektdən yanaşır: “Doğrudan da, ən aktual, ən vacib vəzifə uşaq və gənclərin təhsilidir... Adətən təhsili tərbiyə ilə qarışdırmaq adətdir, lakin artıq başa düşmək vaxtıdır ki, məktəb təhsili əksər hallarda qurulduğu kimi, təkcə gəncliyin əxlaqi tərbiyəsinə töhfə vermir, əksinə hərəkət edir. Anglo-Sakson ölkələrində məktəblər əsasən gənclərin əqli inkişafının zərərinə olan fiziki inkişafı ilə məşğul olurlar. Amma idmana hədsiz həvəs xarakterin kobudlaşmasına, zehni degenerasiyaya və yeni xəstəliklərə gətirib çıxarır. Düzdür, müasir ailə şəraitində evdə təhsilin vəziyyəti o qədər də yaxşı deyil. Ona görə də uşaq və gənclərin mənəvi baxımdan ağır və sahibsiz vəziyyətinə ən ciddi diqqət yetirməyin vaxtı çatıb. Bir çox uca məfhumlar vərdişdən tamamilə çıxıb, ən vulqar rahatlıq və statusa asanlıqla nail olmaq üçün gündəlik düsturlarla əvəzlənib... Təhsil proqramı həyatın özü qədər genişdir. Təkmilləşdirmə imkanları tükənməzdir...Biz bütün məktəb təhsilinə yeni yanaşma və yenidənqurma ərəfəsindəyik... Elmin bütün sahələrində yeni kəşflərin kəmiyyəti və sürəti o qədər sürətlə artır ki, tezliklə müasir məktəb təhsili dövrün yeni nailiyyətləri və tələbləri ilə ayaqlaşa və onlara cavab verə bilməmək; bütün təhsil sistemində yeni üsullar işlənib hazırlanmalı olacaq” (6)

Yuxarıdakı müəlliflərin fikirlərini ümumiləşdirərək isə belə deyə bilərik: “Ailə tərbiyəsi zamanı pedaqoji cəhətdən buraxılan nöqsanlar və onların aradan qaldırılması üçün pedaqoji diaqnostikanın üsul və vasitələrindən istifadə edilməli, valideynlər tərəfindən övladlar nəzarət və qayğı ilə əhatə olunmalı, zərurət yarandıqda isə özünütərbiyə və yenidəntərbiyə vasitələrini tətbiq etməlidirlər.

**Problemin aktuallığı.** Müasir dövrdə kütləvi informasiya vasitələrində şagird özbaşınalıqlarının, valideyn məsuliyyətsizliyi, müəllim nəzarətsizliyi, laqeydliyi və bunun yaratdığı ağır fəsadlar, “itirilmiş uşaqların” yaranması barədə məlumatlara tez-tez rast gəlinir. Bu baxımdan, məqalə dövrün problemləri ilə səsləşdiyinə görə aktuallıq kəsb edir.

**Problemin elmi yeniliyi.** Məqalədə ailə tərbiyəsi zamanı pedaqoji cəhətdən buraxılan nöqsanlar və onların aradan qaldırılması ilə əlaqədar məsələlərə elmi aspektdən yanaşılmışdır. Aydınlıq gətirilmişdir ki, belə nöqsanların aradan qaldırılması üçün problemə ciddi yanaşılmalı, müvafiq metodlar sistemləşdirilməlidir.

**Problemin praktik əhəmiyyəti.** Məqalə gənc ailələrin övlad tərbiyəsində daha səriştəli yanaşmasında köməkçi olacaqdır.

**Ədəbiyyat:**


1. Xəlilov, N.Ə. Ailə tərbiyəsinin bəzi məsələləri. -Bakı: Maarif, -1985, -192 s.
2. Əlizadə, H.Ə., Mahmudova R.M. Sosial pedaqogika. Dərslik. / H.Ə. Əlizadə. -Bakı: “Bakı Universiteti” nəşriyyatı, -2013. -174 s.
3. Quliyev, S.M. Ailə pedaqogikasının mühüm problemləri. -Bakı: Nurlan, -2005, -45 s.
4. Əlizadə, Ə., Abbasov A. Ailə həyatının etika və psixologiyası üzrə müntəxabat. /-Bakı: Maarif, -1989, -232 s.
5. Hüseynova G.Q. Tələbələrin yenidən tərbiyəyə ehtiyacı olan yeniyetmələrlə təlimtərbiyə işinə hazırlanması. Pedaqogika üzrə fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün təqdim edilmiş dissertasiyanın avtoreferatı. Bakı, -2018.
6. https://az.wikiquote.org/wiki/T%C9%99rbiy%C9%99
7. İlyasov H.V. Ailədə kiçik məktəb yaşlı uşaqlarla vətəndaşlıq tərbiyəsi üzrə aparılan işin imkanları və yolları. Pedaqogika üzrə fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün təqdim edilmiş dissertasiyanın avtoreferatı. Bakı, -2016.
8. Bakışlı F.O. Yeniyetmələrdə mənəvi tərbiyənin diaqnostikası üzrə işin pedaqoji əsasları. Pedaqogika üzrə fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün dissertasiyanın avtoreferatı. Bakı, -2017.



**E-mail:**nasir2010@mail.ru



**Redaksiyaya daxil olub:**25.11.2024

*UOT 37.1*

***Aygün Rəhim qızı Qafarova***
*fəlsəfə doktoru proqramı üzrə doktorant*
*Xəzər Universiteti*
*https://orcid.org/0009-0004-1260-129X*
*https://doi.org/10.69682/arti.2024.91(5).91-94*
https://doi.org/10.69682/arti.2024.91(6).136-139

# ETNOPEDAQOJİ MATERİALLAR TƏLƏBƏLƏRİN MÜSTƏQİL AİLƏ HƏYATINA VƏ ÖVLAD TƏRBİYƏSİNƏ HAZIRLANMALARI VASİTƏSİ KİMİ

***Айгюн Рагим кызы Гафарова***
*докторант по программе доктора философии*
*Университет Хазар*

# ЭТНОПЕДАГОГИЧЕСКИЕ МАТЕРИАЛЫ КАК СРЕДСТВО ПОДГОТОВКИ УЧАЩИХСЯ К САМОСТОЯТЕЛЬНОЙ СЕМЕЙНОЙ ЖИЗНИ И ВОСПИТАНИЮ ДЕТЕЙ

***Aygun Rahim Gafarova***
*doctorial student in the program ofdoctor ofphilosophy*
*Khazar University*

# ETHNOPEDAGOGICAL MATERIALS AS A MEANS OF PREPARING STUDENTS FOR INDEPENDENT FAMILY LIFE AND RAISING CHILDREN

**Xülasə**. Ölkəmizdə uğurlu nikahlar, xoşbəxt ailələr minlərlədir. Lakin son dövrlərdə ailə ixtilaflarının, uğursuz ailələrin, boşanmaların da sayı artıb. Bəzi gənclər nikaha laqeyd yanaşır, ailədə kiçik bir problem baş qaldıranda buna dözmür. Ailələrin möhkəm olmasını gənclərin valideynlər də, cəmiyyət də istəyir.

Məqalədə etnopedaqoji materiallar tələbələrin müstəqil ailə həyatına və övlad tərbiyəsinə hazırlanmasının vasitəsi kimi nəzərdən keçirilir.
***Açar sözlər**: etnopedaqoji materiallar, ailə həyatı, müstəqil ailə həyatı, uğurlu nikah, uğursuz nikah, ailə həyatına hazırlıq, uşaqların tərbiyəsi*

**Аннотация**. В нашей стране тысячи успешных браков и счастливых семей. Однако в последнее время увеличилось количество семейных конфликтов, неудавшихся семей и разводов. Некоторые молодые люди равнодушны к браку и не могут терпеть даже незначительных проблем в семье. И родители молодых людей, и общество хотят, чтобы семьи были крепкими.

В статье рассматриваются этнопедагогические материалы как средство подготовки учащихся к самостоятельной семейной жизни и воспитанию детей.
***Ключевые слова**: этнопедагогические материалы, семейная жизнь, самостоятельная семейная жизнь, удачный брак, неудачный брак, подготовка к семейной жизни, воспитание детей.*

**Abstract**. There are thousands of successful marriages and happy families in our country. However, the number of family conflicts, failed marriages and divorces has increased recently. Some young people are indifferent to marriage and cannot tolerate even minor problems in the family. Both parents of young people and society want families to be strong.

In the article, ethnopedagogical materials are considered as a means of preparing students for independent family life and raising children.
***Keywords**: ethnopedagogical materials, family life, independent family life, successful marriage, unsuccessful marriage, preparation for family life, raising children.*

Atalarımız ailəyə müqəddəs məkan, isti ocaq, ən yaxın, ən ülvi, ən əziz, doğma insanların qan qohumluqlarına əsaslanan birlik kimi baxıblar.

Tarixən Azərbaycan ailələrinin öz adət-ənənələri, qayda-qanunları, oğlan və qız tərbiyəsinin özünəməxsus üsulları meydana gəlmiş, yüz illər, əsrlər boyu həmin qayda-qanunlar, ailə adət-ənənələri qorunub saxlanmış, yaşadılmış, bu günümüzə gəlib çıxmışdır.

Azərbaycan ailələrində uşağın – uşaq, böyüyün – böyük, ağsaqqalın – ağsaqqal, qarasaqqalın – qarasaqqal, atanın – ata, ananın – ana, baba-nənənin – baba-nənə yeri olmuşdur. Çox zamanlar "Kiminlə evlənməli?", "Kimə ərə getməli?" suallarına cavab axtarılanda valideynlər köməyə gəlmiş, öz məsləhətləri ilə övladlarına dəstək durmuşlar.

Bütün bunlar təbiidir. Gənclər bir sıra hallarda hissə qapılırlar. Böyüklər, yaşlılar zəngin həyat təcrübəsi keçdiklərindən yaxşını yamandan, düzü əyridən ayırmağı öyrənmişlər. Övladlarını xoşbəxt görmək istəyirlər.

Övlad tərbiyəsi ilə bağlı da Azərbaycan ailələrində tarixən özünəməxsus tərbiyə üsulları mövcud olmuşdur. Cavan ailələr ata-analarının tərbiyə üsullarını yadlarına salaraq onlardan faydalanmağa çalışırlar.

Gələcək ailələrin möhkəm, nikahın uğurlu, ailə münasibətlərinin səmimi, tələb olunan səviyyədə, yüksək olmasından ötrü böyüməkdə olan nəsil müstəqil ailə həyatına, övlad tərbiyəsinə hazırlanmalıdırlar. Bəs nə zaman? Harada? Hansı şəraitdə? Kim hazırlamalıdır?

Bu suallara cavab verməyə çalışaq. Müstəqil ailə həyatına hazırlıq işləri ilk növbədə ailədə aparılmalıdır. Ailənin, ailə münasibətlərinin necə olmasını ata-analar, ər-arvad öz nümunələri, qarşılıqlı münasibətləri, davranış və rəftarları, uşaqlarla ünsiyyəti ilə nümayiş etdirirlər. Uşaqlar görür, götürürlər. Bundan başqa, ata-ana uşaqlara davranış mədəniyyəti vərdişləri aşılayır, qızlara ev işlərini, oğlanlara çöl işlərini görməyi və s. və i.a. başa salır, öyrədirlər.

Valideynlər ata-anaya, bacı-qardaşa, baba-nənəyə, əks cinsə rəğbət, məhəbbət hissləri, xeyirxahlıq, mehribanlıq, mərifət, nəvaziş və s. bu kimi keyfiyyətləri tərbiyələndirməlidirlər. Bütün bunlar gələcək ailə həyatında oğlanlara da, qızlara da lazım olacaqdır. Qarşılıqlı münasibətləri səmərəli qurmaq üçün, mehriban olmaq üçün, bir-biri üçün yaşamaq, fəaliyyət göstərmək, bir-birinin sevincinə, kədərinə şərik olmaq üçün.

Ailədə başlanan tərbiyə işləri uşaq bağçasında, ümumtəhsil məktəblərində, kolleclərdə və nəhayət, ali təhsil müəssisələrində davam etdirilir.

Böyüməkdə olan nəsli, tələbələri müstəqil ailə həyatına, övlad tərbiyəsinə hazırlamaq üçün müxtəlif vasitələrdən istifadə olunur. Həmin vasitələrin arasında şifahi xalq yaradıcılıq nümunələrinin – atalar sözlərinin, nağılların, bayatıların, laylaların, nəğmələrin və s. böyük rolu vardır.

Atalarımız ailənin həmişə möhkəm olmasını istəmiş, öz sözləri, öyüd-nəsihətləri ilə ər-arvad arasında baş qaldırmış ixtilafları aradan qaldırmışlar. Lazım gəldikdə oğlan (bəy) və qız (gəlin) adamları – ağbirçəklər, ağsaqqallar görüşüb bir masa ətrafında əyləşərək olub-keçənləri araşdırmağa, tərəfləri – ərlə arvadı yola gətirməyə çalışmışlar.

Atalarımızın sözləridir: "Ər-arvad ipəkdir, araya girən köpək". Bu atalar sözü necı yaranıb? Atalar sözündən göründüyü kimi, kim isə, söz-söhbət yaradıb, ərlə arvadın arasına girib, nəyi isə yalandan düzüb-qoşub, araya narazılıq salıb. İxtilafın yaranmasından da sevinib. Həqiqət, onsuz da gec-tez ortaya çıxır.

Ailə münasibətlərinin kamilliyi həm kişidən, həm də arvaddan asılıdır. Bəzi atalar sözlərində qadının kamilliyi, yaxşı keyfiyyətləri və xasiyyəti, müsbət cəhətləri ("Şən arvad həyatın şənliyidir"), digərində mənfi cəhətləri, xoşagəlməz keyfiyyətləri ("Yaman arvadın evi cəhənnəmdir", "Yaman arvad çox danışar, danışmasa savaşar"), bəzilərində isə, həm yaxşı və pis davranış və rəftar tərzi ("Qadın kişini vəzir də edər, rəzil də", "Yaman arvad, tez kişini qocaldar, əsil arvad dərdlərini azaldar") diqqət mərkəzinə gətirilir.

Ər-arvad ailə, nikah şəraitində bir-biri ilə mehriban dolanmalı, bir-birini qayğı və nəvaziş göstərməlidirlər. Bir-birini həqiqi məhəbbətlə sevən, bir-birinə inanan, bir-birinin halına yanan şəxslər arasında ixtilaflar olmur. Olsa da kiçicik inciklik, ötəri küsmə baş verə bilər. Əgər bir-birlərini başa düşürlərsə, bir-birinə əzab vermək istəmirlərsə, tez barışırlar. Atalarınmız nahaq yerə deməmişlər: "Bir-birini sevən ər-arvad komada da xoşbəxt olar".

Son dərəcə gözəl qənaətdir. Qadınla kişini sıx, qırılmaz tellər bir-birinə bağlayırsa, yaşadıqları daxma da, kirayənişin qaldıqları mənzil də onlara ibarət, saray kimi görünəcəkdir.

Atalarımız oğul və qız tərbiyəsi, tərbiyə işində atanın və ananın roluna, nümunəsi aid də çoxlu faydalı fikirlər demişlər. Onları yada salaq:

"Dövlət öz uşaqlarının tərbiyəsi ilə bağlı valideyndən üzərinə mühüm vəzifələr qoyur. Bu tələblər ölkəmizin Əsas Qanununda – Azərbaycan Respublikasının Konstitusiyasında, "Ailə Məcəlləsi"ndə öz ifadəsini tapmışdır.

Məsələn, Azərbaycan Respublikasının Konstitusiyasının 14-cü maddəsində yazılmışdır: "I. Cəmiyyətin əsas özəyi kimi ailə dövlətin xüsusi himayəsindədir. II. Uşaqların qayğısına qalmaq və onları tərbiyə etmək valideynlərin borcudur. Bu borcun yerinə yetirilməsinə dövlət nəzarət edir. III. Valideynləri və ya qəyyumları olmayan, valideyn qayğısından məhrum olan uşaqlar dövlətin himayəsindədirlər. IV. Uşaqları onların həyatına, sağlamlığına və ya mənəviyyatına təhlükə törədə bilən fəaliyyətə cəlb etmək qadağandır. V. 15 yaşına çatmamış uşaqlar işə götürülə bilməzlər. VI. Uşaq hüquqlarının həyata keçirilməsinə dövlət nəzarət edir" (1).

"Azərbaycan Respublikasının Ailə Məcəlləsi"nin 49-cu maddəsinin 3-cü bəndində isə deyilir: "Uşaq öz valideynləri tərəfindən tərbiyə olunmaq, öz maraqlarının təmin olunması, hərtərəfli inkişafı, onun ləyaqətinə hörmət olunması hüququna malikdir" (2).

Bəs atalarımız bu barədə nə demişdir. Diqqət yetirək: "Balam mənə əzizdir, tərbiyəsi özündən də əzizdir".

Odur ki, ata-analar ailədə mənəvi və psixoloji atmosferin saflığı keşiyində durmalı, övladlarının təlim və tərbiyəsi, təhsili qayğısına qalmalıdırlar. Atalarımız təsadüfdən deməmişlər ki: "Ata-ananın canı övlada bağlı olar". Yəni özünü övladına sərf edir. Lakin qayğının, nəvazişin həddi olmalıdır. Hədsiz əzizləmə mənfi nəticələrə səbəb olur. Atalar sözündə deyildiyi kimi, "Ərkəsöyün böyüyən oğul avara olar".

Və yaxud, "Qızını döyməyən, dizini döyər". Burada söhbət tərbiyələndirmək üçün qız övladını döyərək cəzalandırmaqdan getmir. Qızın düzgün tərbiyə etməyin vacibliyindən söhbət gedir. Ataların fikrincə, yanlış tərbiyənin acı nəticələri olur. Odur ki deyilir: "Pis övlad altıncı barmaq kimidir – kəsərsən ağrıyar, kəsməzsən səni eybəcər göstərər".

Ata da, ana da övladına nümunə göstərməlidir. Ata (ana) özü nümunəvi davranmalı, xoş ünsiyyətli olmalı, yaxşı rəftar tərzinə yiyələnməlidsir ki, uşaq onu özünə nümunə götürsün. Atalarımız demişkən, "Böyük danışanı kiçik götürər", "Böyük tökəni kiçik yığar", "Uşaq gördüyün götürər, eşitdiyin deyər" və s. Düzgün olmayan tərbiyənin nəticəsi budur: "Anası gəzən ağacları balası budaq-budaq gəzər", "Anasına bax qızını al, Qırağına bax bezini al".

Odur ki, atalarımız uşaq, yeniyetmələrə və gənclərə məsləhət görür: " Ata-ana sözünə baxmayan xoş gün görməz", "Böyük sözünə baxmayan, baxımsız qalar".

Söhbətlər zamanı tələbələr (eyni zamanda şagirdlər), qeyd edilər ki, ailənin möhkəmlənməsindən ötrü ər-arvadın bir-birinə sədaqətli olması mühüm şərtdir. Vəfasızlıq, sədaqətsizlik ailəni məhvə aparır. "Kişi qeyrəti, qadın namusu" mövzusunda söhbət, müzakirə və disputlar zamanı aşağıdakı atalar sözləri diqqət mərkəzinə gətirilir: "Namus gedər dönməz geri, yoxdur onun bəlli yeri", "Namus insanın qan bahasıdır", "Dovşanı qamış öldürər, əri – namus", "Papaq isti soyuq üçün deyil, namus üçündür", "Varını itirən az şey itirər, namusunu itirən çox şey".

Atalar uşağı evin yaraşığı hesab edərək deyir:

Bala dadı, bal dadı,<br>
Bala adamı aldadır.<br>
Şirini şirin olur,<br>
Acısı da bal dadır.

Atalar sözləri ilə yanaşı bayatılarımız da böyüməkdə olan nəslin, tələbələrin müstəqil ailə həyatına və övlad tərbiyəsinə hazırlanmalarına kömək göstərir. Aşağıdakı bayatıya diqqət yetirək:

Göydə ulduz naşıdı,<br>
Kim balamın yaşıdı?<br>
Qız gözümün işığı,<br>
Oğlan ürək başıdı.

Deyilənlərdən görünür ki, ümumtəhsil məktəblərində olduğu kimi ali təhsil məktəblərində də tələbələrin müstəqil ailə həyatına və övlad tərbiyəsinə hazırlanmaları məqsədi ilə etnopedaqoji materiallardan faydalanmaq məsləhətdir.

**Problemin aktuallığı**. Böyüməkdə olan nəsli, gəncləri müstəqil ailə həyatına və övlad tərbiyəsinə hazırlanmaları problemi həmişə olduğu kimi hazırda da aktuallığı ilə seçilir.

**Problemin yeniliyi**. Tələbələrin nikah-ailə münasibətlərinə hazırlanmaları problemi diqqət mərkəzinə gətirilir.

**Problemin praktik əhəmiyyəti**. Məqalə magistrantlar, magistrlər və doktorantlar üçün faydalı ola bilər.

**Ədəbiyyat**:


1. Azərbaycan Respublikasının Konstitusiyası. Bakı: Qanun, 2009.
2. Azərbaycan Respublikasının ailə Məcəlləsi https://e-qanun.az/framework/46946
3. https://www.testbook.az/proverb/proverbtype/6/aile-haqqinda-atalar-sozleri


**Redaksiyaya daxil olub**: 12.12.2024

UOT 37.0

***Elmira Vahid qızı Həsənova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*fəlsəfə doktoru proqramı üzrə doktorantı*
*https://orcid.org/0009-0002-6285-6878*
*https://doi.org/10.69682/arti.2024.91(6).140-144*

## ŞAGİRDLƏRİN SOSİAL MÜNASİBƏTLƏRİNİN FORMALAŞMASI

***Эльмира Вахид гызы Гасанова***
*докторант по программе доктора философии*
*Азербайджанского Государственного Педагогического Университета*

## ФОРМИРОВАНИЕ СОЦИАЛЬНЫХ ОТНОШЕНИЙ УЧАЩИХСЯ

***Elmira Vahid Hasanova***
*doctorial student in the program of doctor of philosophy*
*of Azerbaijan State Pedagogical University*

## FORMATION OF STUDENTS' SOCIAL RELATIONSHIPS

**Xülasə.** Şagirdlərin sosial münasibətlərinin formalaşdırılması onların məktəb mühitində və cəmiyyətdə sosial bacarıqlarının inkişaf etdirilməsi prosesidir. Bu proses uşaqların şəxsiyyət və xarakterlərinin formalaşmasında mühüm rol oynayır və onların gələcək həyatına təsir göstərir. Şagirdlərin sosial münasibətlərinin əsası ailədə qoyulur. Ailə dəyərləri, münasibətlər və davranış modelləri uşaqların cəmiyyətə uyğunlaşmasında böyük rol oynayır. Məktəb uşaqların sosial bacarıqlarını inkişaf etdirdiyi əsas yerlərdən biridir. Müəllimlərin və sinif yoldaşlarının davranışı, kollektiv fəaliyyət (qruplar, oyunlar) sosial münasibətlərin formalaşmasına təsir göstərir.
***Açar sözlər:*** *sosial, münasibət, davranış, şagird, uyğunlaşma.*

**Аннотация.** Формирование социальных отношений учащихся – это процесс развития их социальных навыков в школьной среде и обществе. Этот процесс играет важную роль в формировании личности и характера детей, влияет на их дальнейшую жизнь. Основа социальных отношений учащихся закладывается в семье. Семейные ценности, установки и модели поведения играют важную роль в адаптации детей к обществу. Школа является одним из основных мест, где дети развивают свои социальные навыки. Поведение учителей и одноклассников, коллективная деятельность (группы, игры) влияют на формирование социальных отношений.
***Ключевые слова:*** *социальное, отношение, поведение, ученик, адаптация.*

**Abstract.** The formation of students' social relations is the process of developing their social skills in the school environment and society. This process plays an important role in the formation of children's personality and character and affects their future life. The basis of students' social relations is laid in the family. Family values, attitudes and behavior patterns play a major role in children's adaptation to society. School is one of the main places where children develop their social skills. The behavior of teachers and classmates, collective activity (groups, games) affects the formation of social relations. Social skills such as camaraderie, leadership and empathy are developed in the classroom. Social media has a huge influence in modern times.
***Keywords:*** *social, attitude, behavior, learner, adaptation.*

Şagirdlərin sosial münasibətlərini inkişaf etdirmək onların məktəb zamanı əldə etdikləri ən vacib bacarıqlardan biridir. Sosial münasibətlər uşaqların cəmiyyətdə yer tapmasında, qarşılıqlı maraqların yaradılmasında və səmərəli münasibətlərin qurulmasında əsas rol oynayır. Məktəb mühiti, dostluq münasibətləri və ailə təsirləri bu prosesin əsasını təşkil edir. Sosial münasibətlərin

düzgün inkişafı uşaqların emosional və psixososial inkişafına müsbət təsir göstərir və onların həm şəxsi, həm də gələcək həyatlarında uğur qazanmasını təmin edir. Bu baxımdan sosial münasibətlərin formalaşması təkcə uşaqların fərdi inkişafı üçün deyil, həm də cəmiyyətin ümumi rifahı üçün vacibdir. Məktəbdə sosial münasibətlərin necə inkişaf etdiyini, ona hansı amillərin təsir etdiyini və şagirdlərin sosial bacarıqlarının formalaşmasında müəllimlərin və valideynlərin rolunun olduğunu anlamağa kömək edəcəkdir.

Şagirdlərin sosial münasibətlərinin formalaşması onların cəmiyyətə uyğunlaşmasında, sosial bacarıqlarının inkişafında və şəxsiyyətlərinin tam formalaşmasında mühüm rol oynayır. Bu prosesə məktəb və ailə mühitində, eləcə də digər sosial dairələrdə uşaqların qarşılıqlı münasibətləri təsir göstərir. Sosial münasibətlərin formalaşması tələbələrdə empatiya, yoldaşlıq, dostluq, liderlik və problem həll etmək kimi sosial bacarıqların inkişafına səbəb olur. Ailə uşağın ilk sosiallaşdığı yerdir və burada aldığı dəyərlər və münasibətlər onun cəmiyyətə, ətrafa qarşı davranışını müəyyən edir. Ailə üzvləri arasında qarşılıqlı münasibətlər və valideynlərin davranışı uşağın sosial bacarıqlarının ilkin formalaşmasına ciddi təsir göstərir [1, s. 40-43].

Məktəb uşaqların fəal şəkildə sosial münasibətlərini formalaşdırdığı əsas yerdir. Burada tələbələr təkcə akademik bilikləri deyil, həm də sosial həyatda tələb olunan davranış standartlarını, ictimai münasibətlərin incəliklərini öyrənirlər. Müəllimlər, sinif yoldaşları və ümumi məktəb mühiti sosial bacarıqların inkişafı üçün vacib amillərdir. Şagirdlərin həmyaşıdları ilə qurduqları dostluq və qrup münasibətləri sosial inkişafın mühüm cəhətlərindən biridir. Dostlar arasında yaranan münasibətlər uşaqlarda özünü başqalarının yerinə qoymaq, birlikdə hərəkət etmək və kollektivdə yer tapmaq bacarıqlarını inkişaf etdirir. Məktəb uşaqların fəal şəkildə sosial münasibətlərini formalaşdırdığı ən mühüm mühitlərdən biridir. Məktəb təkcə akademik biliklərin verildiyi yer deyil, həm də şagirdlərin sosial bacarıqlarını inkişaf etdirdikləri, cəmiyyətin müxtəlif qayda və normalarını öyrəndikləri yerdir. Məktəbdə şagirdlər dostluq münasibətləri qurur, həmkar olmağı öyrənir, ünsiyyət bacarıqlarını inkişaf etdirir və müxtəlif sosial rollar yaşayırlar. Məktəb mühitində həyata keçirilən kollektiv fəaliyyətlər, qrup layihələri, oyunlar və sinif fəaliyyətləri şagirdləri birlikdə işləməyə, fərqli fikirləri qəbul etməyə və onların mahiyyətini paylaşmağa təşviq edir. Müəllimlər bu prosesdə mühüm rol oynayır, tələbələrə liderlik, problem həll etmək və bir-birinə hörmət kimi dəyərləri aşılayır. Məktəb həm də ictimai təşkilatların, dostluq dərnəklərinin qurulduğu yerdir. Burada tələbələr bir-biri ilə rəqabət aparmağı, lider olmağı və münaqişələri idarə etməyi öyrənirlər. Sinifdə yaşanan qarşılıqlı münasibətlər, uşaqların gələcək həyatlarında hansı ictimai münasibətlər quracaqlarına, necə insanlar olacaqlarına böyük təsir göstərə bilər. Bu səbəbdən məktəbdə sosial münasibətlərin düzgün idarə olunması və sosial bacarıqların inkişafı xüsusi əhəmiyyət kəsb edir.

Müasir texnologiya və sosial media tələbələrin sosial əlaqələrində mühüm yer tutur. Uşaqların virtual mühitdə qurduqları əlaqələr onların sosial münasibətlərinə müsbət və ya mənfi təsir göstərə bilər. Bu səbəbdən tələbələrin rəqəmsal platformalardan düzgün istifadə etmələri vacibdir. Şagirdlərin sosial bacarıqlarının inkişafında müəllimlərin və valideynlərin rolu əvəzsizdir. Şagirdlərin sosial davranış və dəyərlərinin formalaşmasında müəllimlər tərəfindən verilən dəstək və valideynlərin göstərişləri mühüm əhəmiyyət kəsb edir.

İctimai münasibətlərin düzgün formalaşması şagirdlərin təkcə məktəb illərində deyil, gələcək həyatlarında da güclü və uğurlu insanlar olmasına şərait yaradacaq. Ailə, məktəb və cəmiyyətlə birlikdə bu proses daha da güclü və möhkəm sosial qurma və onlara inamlı şəkildə kömək edir [2, s. 8-14].

Şagirdlərin sosial inkişafında, şəxsiyyətlərinin formalaşmasında dostluq və qrup münasibətləri mühüm rol oynayır. Qrup daxilində dostluq münasibətləri və münasibətlər uşaqların emosional, sosial və psixoloji ehtiyaclarını ödəməyə kömək edir. Bu əlaqələr vasitəsilə tələbələr özlərinə inam qazanır, emosional dəstək alır və bir-biri ilə əməkdaşlıq etməyi öyrənirlər. Dostluq münasibətləri vasitəsilə uşaqlar dostluq, dostluq, empatiya və münaqişələrin həlli kimi sosial bacarıqları inkişaf etdirirlər. Dostlar arasında qarşılıqlı münasibətlər uşaqlara sosial mühitdə necə davranmağı öyrənməyə kömək edir. Uşaqlar dostluq münasibətlərində özlərini daha

yaxşı tanımağa və qiymətləndirməyə başlayırlar. Dostların reaksiyaları və rəyləri uşaqların özlərini müxtəlif nöqteyi-nəzərdən qiymətləndirmələrinə və heysiyyət haqqında öyrənmələrinə səbəb olur. Qrup fəaliyyəti tələbələrin birgə işləmək, qərar qəbul etmək və ardıcıl nəticələr əldə etmək bacarıqlarını inkişaf etdirir. Bu əlaqələr sinifdə qrup fəaliyyətləri zamanı və ya sinif fəaliyyəti zamanı xüsusilə vacibdir. Hər kəsin qrupda xüsusi rolu var. Onlardan bəziləri liderliyi təmin edir və qrupun fəaliyyətini istiqamətləndirir, digərləri isə köməkçi rol oynayır. Şagirdlər sosial rollarını qrup münasibətləri vasitəsilə dərk edir və özlərinə uyğun olan rolu seçirlər. Bəzən qruplar daxilində güc və liderlik münaqişəsi ola bilər. Tələbələr bu mübarizədə öz yerlərini müəyyənləşdirir və sosial qəbul prosesi keçirlər. Bu, uşaqların qrup daxilində sosial vəziyyətini və özünə hörmətini rəsmiləşdirir. Qrup daxilində mübahisələrin və anlaşılmazlıqların baş verməsi normaldır. Bu vəziyyətlər tələbələrə münaqişələri həll etmək, güzəştə getmək və empatiya yaratmaq bacarıqlarını öyrənmək imkanı verir [3, s. 200].

Dostluq və qrup münasibətləri tələbələrin sosial inkişafı üçün vacibdir. Bu əlaqələr sayəsində uşaqlar sosial bacarıqlarını inkişaf etdirir, özünə inam qazanır, gələcəkdə cəmiyyətdə daha uğurlu, münasibətlərdə daha sabit olmağı öyrənirlər. Bu münasibətlər həm də onların emosional rifahını təmin edir və cəmiyyətdə necə davranmalı olduqlarını anlamağa kömək edir.

Müasir texnologiya və sosial medianın tələbələrin həyatında mühüm yer tutduğunu nəzərə alsaq, onların bu vasitələrdən düzgün istifadə etməsi çox vacibdir. Valideynlər və müəllimlər şagirdlərə rəqəmsal səxavət öyrətməli, onları təhlükələr barədə məlumatlandırmalı və vaxtın idarə edilməsi bacarıqlarını inkişaf etdirməlidirlər. Sağlam sosial mühitin yaradılması və sosial media vasitəsilə tələbələrin sosial münasibətlərinin düzgün inkişaf etdirilməsi onların gələcəkdə uğurlu sosial həyatlarına zəmin yarada bilər.

Texnologiya və sosial media tələbələrin sosial münasibətlərinə böyük təsir göstərir. Bu platformalar düzgün istifadə edildikdə tələbələrin ünsiyyət bacarıqlarını inkişaf etdirir və onlara yeni dostluqlar və maraqlı təcrübələr qazandırır. Lakin vəziyyətdən ehtiyatsız və həddindən artıq istifadə mənfi nəticələrə səbəb ola bilər. Bu səbəbdən sosial mediadan istifadə düzgün istiqamətləndirilməli və balanslaşdırılmış olmalıdır.

Şagirdlərin sosial münasibətlərinin formalaşması onların şəxsi və sosial inkişafında mühüm rol oynayır. Sosial münasibətlərə insanın ətraf mühitə qarşılıqlı marağı, digər insanlarla ünsiyyət qurma bacarığı, yoldaşlıq, hörmət və anlayış kimi sosial davranışlar daxildir. Bu prosesi səmərəli şəkildə inkişaf etdirmək üçün müxtəlif yanaşma və üsullar tətbiq edilir.

Şairlərin ictimai münasibətlərinin formalaşmasında əsas amillər:

Ailə mühiti: Şagirdlərin sosial münasibətləri ilk növbədə ailədə formalaşır. Ailə münasibətlərində səmimiyyətin, qarşılıqlı hörmət və empatiya bacarıqlarının təşviq edilməsi tələbələrin sosial bacarıqlarının inkişafında əsas rol oynayır.

Məktəb mühiti: Məktəb şagirdlərin sosial əlaqələr qurması və inkişaf etdirməsi üçün ən vacib mühitlərdən biridir. Müəllimlərin və məktəb məsləhətçilərinin təşkil etdiyi komanda işi, layihələr və qrup fəaliyyətləri şagirdlərin sosial əlaqələrini gücləndirir.

Dostlar çevrəsi: Şagirdlərin dostluq dairəsi onların sosial bacarıqlarına birbaşa təsir edir. Dostlarla əlaqələr qurmaq, problemləri həll etmək və fəaliyyətlərdə iştirak etmək tələbələrdə dostluq, empatiya və münaqişə ilə bağlı bacarıqları gücləndirir.

Sosial fəaliyyətlər: Məktəbdən kənar sosial fəaliyyətlər (məşq, sosial elm dərnəkləri, sosial tədbirlər və s.) şagirdlərin müxtəlif insanlarla tanış olmasına şərait yaradır, onların müsbət fikirlərlə tanış olmasına və sosial bacarıqlarını daha geniş şəkildə inkişaf etdirməsinə şərait yaradır.

Müəllim-şagird münasibətləri: Şagirdlərin sosial münasibətlərinin formalaşmasında müəllimlər mühüm rol oynayır. Tələbələrə empatiya göstərmək, onların fərqli baxışlarını qəbul etmək və onlara dəstək olmaq müəllim-şagird münasibətlərini gücləndirəcək və sosial bacarıqlarını artıracaq.

Şagirdlərin sosial münasibətlərinin formalaşmasına təsir edən təhsil münasibətləri [4, s. 272]:

Təqaüd əsaslı təlim: Qruplarda işləmək tələbələrin digər insanlarla işləmək bacarığını inkişaf etdirir. Bu yanaşma sosial münasibətlərin və əmr işinin inkişafına kömək edir.

Problemlərin birgə həlli: Şagirdlərin qrup şəklində problemlər üzərində işləməsi onların

əməkdaşlıq, empatiya və münaqişələrin həlli bacarıqlarını inkişaf etdirir.

Sosial-emosional təhsil: Tələbələrin emosional və sosial bacarıqlarını gücləndirmək üçün xüsusi təlim proqramları və kurslar onlara emosiyalarını tanımağa və sosial bacarıqlarını təkmilləşdirməyə kömək edir.

Şagirdlərin sosial münasibətlərinin yaxşılaşdırılması həm şəxsi həyatında, həm də gələcəkdə cəmiyyətdə uğurlu şəxsiyyət kimi formalaşmasında mühüm üstünlüklərə malikdir.

Sosial münasibətlər insanlar arasında qurulan qarşılıqlı əlaqələr və bu əlaqələr əsasında formalaşan münasibətlər sistemidir. Sosial münasibətlər yalnız dostluq və ailə əlaqələri ilə məhdudlaşmır; bu münasibətlər cəmiyyətdə, iş yerlərində, məktəbdə, ictimai yerlərdə və müxtəlif qruplar daxilində də formalaşa bilir. Sosial münasibətlərin əsas xüsusiyyətləri qarşılıqlı anlaşma, hörmət, empatiya, əməkdaşlıq və konfliktlərin sülh yolu ilə həll edilməsidir.

Sosial münasibətlər insanların cəmiyyətin bir parçası kimi özlərini qəbul etmələrinə və mənsubiyyət hissi yaşamalarına imkan verir. Güclü sosial münasibətlər insanın psixoloji sağlamlığını yaxşılaşdırır və stressə qarşı müqavimətini artırır. Sosial münasibətlər əməkdaşlıq, problem həlli, ünsiyyət və empatiya kimi həyati bacarıqları öyrənməyə imkan verir. Sosial münasibətlərin sağlam olması cəmiyyətin birgə şəkildə fəaliyyət göstərməsinə və konfliktlərin daha asan həll edilməsinə kömək edir. Sosial münasibətlərin sağlam şəkildə inkişaf etdirilməsi fərdin həm şəxsi, həm də ictimai həyatda uğurlu olması üçün vacibdir. Bu münasibətlər həmçinin mədəni müxtəlifliyin qəbul edilməsinə, fərqliliklərin qiymətləndirilməsinə və cəmiyyətdə birgə yaşayışa töhfə verir [5, s108].

Nəticədə şagirdlərin ictimai münasibətlərinin formalaşması onların həm fərdi, həm də sosial inkişafında mühüm rol oynayır. Ailə, məktəb mühiti, dostluq və qrup münasibətləri, eləcə də müasir texnologiya və sosial medianın təsiri bu prosesin mühüm komponentləridir. Şagirdlər arasında güclü sosial münasibətlərin qurulması onların gələcəkdə uğurlu və balanslı fərdlər olmasına kömək edəcək, cəmiyyətdə səmərəli əlaqələr qurmaq və sosial bacarıqlarını tətbiq etmək bacarıqlarını artıracaq.

Sosial münasibətləri inkişaf etdirmək üçün müəllimlər, valideynlər və digər pedaqoqlar şagirdlərə dəstək olmalı, onların sosial bacarıqlarının inkişaf etdirilməsi üçün münasib şərait yaratmalıdırlar. Eyni zamanda, sosial medianı düzgün idarə etmək, zorakılığa qarşı çıxmaq və uşaqların real ünsiyyət bacarıqlarını inkişaf etdirmək vacibdir.

Bu baxımdan, ictimai münasibətlərin düzgün formalaşması təkcə tələbələrin mənəvi rifahı üçün deyil, həm də onların gələcək xeyirxah və məsuliyyətli vətəndaşları üçün, həm də cəmiyyətin gələcəyinə böyük təsir göstərir. Güclü sosial əlaqələr qurmaq bacarığı tələbələrin akademik, maliyyə və şəxsi həyatlarında davamlı uğurlara gətirib çıxarır.

**Problemin aktuallığı.** Şagirdlərin sosial münasibətlərinin formalaşdırılması müasir təhsil sistemində mühüm mövzudur. Bu, tələbələrin cəmiyyətə inteqrasiyası, sosial bacarıqlarının inkişaf etdirilməsi və gələcəkdə uğurlu şəxsiyyət kimi cəmiyyətin müxtəlif sahələrində iştirak etməsi üçün vacibdir. Müasir dövrdə texnologiyanın rolunun artması və sosial medianın geniş yayılması ilə gənclərin sosial əlaqələri yeni çətinliklərlə qarşılaşır. Münasibətlər arasında məsafə nə qədər çox olarsa, qarşılıqlı əlaqələrin azalma ehtimalı da bir o qədər çox olar və bu, tələbələrin empatiya, dinləmə və münasibətləri idarə etmə kimi əsas bacarıqlarını azaldır. Buna uyğun olaraq məktəb və müəllimlər şagirdlərin sosial münasibətlərini yaxşılaşdırmaq üçün xüsusi proqramlardan, təlim metodlarından istifadə etməlidirlər. Şagirdlərin emosional-psixoloji sağlamlığının qorunmasında sosial münasibətlərin formalaşması da mühüm rol oynayır. Güclü sosial əlaqələr quran şagirdlər məktəb həyatında daha motivasiyalı, özünə inamlı və xoş olurlar ki, bu da onların akademik uğurlarına müsbət təsir göstərir. Aktuallıq baxımından təhsil müəssisələri sosial münasibətlərin inkişafı üçün müxtəlif layihə və tədbirlər, müzakirələr və ictimai fəaliyyətlər kimi üsullardan istifadə edirlər. Bu, tələbələrə müxtəlif mövzularda fikir mübadiləsi aparmağa, müxtəlif nöqteyi-nəzərləri qiymətləndirməyə və sağlam ticarət bacarıqlarını öyrənməyə imkan verir.

**Problemin yeniliyi.** Şagirdlərin sosial münasibətlərinin formalaşdırılması probleminin yeniliyi müasir cəmiyyətin dəyişən dinamikası və texnoloji inkişafla bağlı yeni çağırışlarla bağlıdır. Texnologiyanın, sosial medianın və rəqəmsal əlaqə vasitələrinin geniş yayılması ilə mənəvi mənsubiyyət formalarının və sosial bacarıqların inkişafında yeni bir dövr yaranmışdır. Bütün bu yeniliklər onu göstərir ki, tələbələrin sosial münasibətlərinin formalaşması indi əvvəlki dövrlərlə müqayisədə daha çox nəzərə alınmalı, xüsusi proqram və yanaşmalarla dəstəklənməlidir.

**Problemin praktik əhəmiyyəti.** Şagirdlərin sosial münasibətlərinin formalaşdırılmasının praktik

insanlar arasında münasibətlərin prinsipi kimi mövcud normaların özünə riayət etmək naminə davranışlarını tənzim edirlər.

Bu istiqamətdə tədqiqat aparan D.B. Elkonin ontogenetik inkişafın sosial qanunauyğunluqlarla müəyyən edilməsi konsepsiyasını ilk dəfə mənəvi, əxlaqi inkişafa tətbiq edərək, ilkin əxlaqi-mənəvi fikirlərin böyüklər tərəfindən qiymətləndirilməsi ilə əlaqəli davranış nümunələrinin mənimsənilməsi prosesi kimi meydana çıxması ideyasını irəli sürdü. Bu nümunələr uşağı əhatə edən reallıqdan götürülür. Nümunə rolunda isə onların həmyaşıdları, tanış böyüklər, həmçinin müəyyən peşə və ya mənəvi keyfiyyətlərə malik insanların kollektiv obrazları ola bilər.

**Problemin aktuallığı.** Valideyn himayəsindən məhrum uşaqların yalnız fizioloji deyil, həm də psixoloji inkişafı onların mənəvi əxlaqi keyfiyyətləri mənimsəməsi və bu istiqamətli təhlillərin aparılması mühüm əhəmiyyət daşıyır.

**Problemin elmi yeniliyi**. Məqalədə şəxsiyyətin özünüdərk və əxlaqi inkişaf məsələlərinə toxunulmuşdur.

**Problemin nəzəri və praktiki əhəmiyyəti.** Məqalə bu sahədə çalışan pedaqoqlar, psixoloqlar, eləcə də mövzuyla bağlı təhlillər aparmaq istəyən tələbələr üçün əhəmiyyətli ola bilər.

**Ədəbiyyat:**


1. Альбекова С.Б., Данилова Т.Н. Детско-родительские отношения как фактор влияния на психическое развитие ребенка // Молодежный научный вестник. – 2017. – № 4. – С. 45-48
2. Бернс Р. Что такое Я-концепция / Р. Бернс // Психология самосознания: Хрест. / Ред. Д. Я. Райгородский. – Самара: Бахрах. -М, 2011. – С. 333-393. s.
3. *Божович Л.*И. О *нравственном развитии* и *воспитании детей* / *Л.*И. Божович // *Вопросы психологии*. – М.: Просвещение, 1975. – 254
4. Кон И.С. Психология старшеклассника / И.С. Кон.–Москва: Просвещение, –1980. –192 с.
5. Столин, В.В. Самосознание личности / В.В. Столин. – М.: Просвещение, 1983. – 288 с.
6. Субботский Е.В. Формирование морального действия у ребенка // Вопросы психологии. 1979. №3. С. 47-55.
7. Killian B. Risk and Resilience: A Generation at Risk? HIV/AIDS, Vulnerable Children and Security in Southern Africa // Killian B. – 2007, 456 p.
8. Kohlberg L. Moral stages and moralization: the cognitive-developmental approach // Moral development and behavior: theory, research, and social issues / Ed by T. Lickona. – New-York etc.: Holt, Rinehart and Winston, 1976. – p. 31–53
9. Lansford J. Parental divorce and children's adjustment. Perspectives on Psychological Science // J.Lansford. 2009;- 2: -p. 40- 52
10. Lin, K.K., Sandler, I.N., Ayers, T.S., Wolchik, S.A. Luecken, L.J. Resilience in Parentally Bereaved Children and Adolescents Seeking Preventive Services // K.K. Lin, I.N. Sandler.- Journal of Clinical Child and Adolescent Psychology.-2004. - 33(4), -p. 673-683
11. Luecken, L.J., Kraft, A., Appelhans, B.M., Enders, C. Emotional and cardiovascular sensitization to daily stress following childhood parental loss, Developmental Psychology // L.J. Luecken, A .Kraft. B.M. Appelhans, -2009. -45 (1), p. 296-302
12. Shubina, A. The image of the family in children's picture of the world, deprived of parental care // A .Shubina.- Volgograd: Volgograd State Pedagogical University, -2013.- 303 p.
13. Shulga, T. Social and psychological problems of orphanage graduates and children left without parental care // T.Shulga.- Bulletin of the Moscow State Regional University. Series Psychology, -2013.- 3,p. 68-75


**E-mail:** abbasovagunel@inbox.ru
**Redaksiyaya daxil olub:** 31.10.2024

*UOT 37.01*

***Asif Hacıyev (Şirvanelli)***
*Azərbaycan Respublikası Təhsil İnstitutunun böyük elmi məsləhətçisi,*
*pedaqogika üzrə fəlsəfə doktoru, dosent*
*https://orcid.org/: 0000-0002-7084-9347*
*https://doi.org/10.69682/arti.2024.91(6).158-162*

# "DƏDƏ QORQUD KİTABI" VƏ MƏHƏMMƏD FÜZULİNİN ƏSƏRLƏRİNDƏ MÜASİR DİL BAXIMINDAN ARXAİKLƏŞMİŞ ORTAQ SÖZLƏR

***Асиф Гаджиев (Ширванелли)***
*старший научный советник Института Образования Азербайджанской Республики,*
*доктор философии по педагогике, доцент*

# АРХАИЧНЫЕ СЛОВА С ТОЧКИ ЗРЕНИЯ СОВРЕМЕННОГО ЯЗЫКА В «КНИГЕ ДЕДА ГОРГУТА» И ПРОИЗВЕДЕНИЯХ МУХАММЕДА ФИЗУЛИ

***Asif Hajiyev (Shirvanelli)***
*associate professor, senior scientific advisor of the Institute of Education of the Republic of Azerbaijan*

# IN BOTH THE 'BOOK OF DEDE KORKUT' AND THE WORKS OF MUHAMMAD FUZULI, NUMEROUS COMMON WORDS HAVE BECOME ARCHAIC FROM A CONTEMPORARY LINGUISTIC PERSPECTIVE

**Xülasə.** Böyük Azərbaycan şairi Füzulinin dili söz ehtiyatının zənginliyi ilə özünəqədərki və sonrakı sənətkarların dilindən əsaslı surətdə fərqlənir. Onun leksikonunda ərəb-fars mənşəli sözlər çoxluq təşkil etsə də, milli mənşəli sözlərimiz daha işləkdir. Bu sözlərin böyük əksəriyyəti müasir dilimizdə işləkliyini qoruya bilsə də, müəyyən bir qismi istifadədən çıxaraq arxaikləşmişdir. Təhlil göstərir ki, həmin arxaizmlərin az bir qismi şairin yaşadığı və ona yaxın dövrlə əlaqədardırsa, böyük hissəsi dilimizin daha qədim çağlarından başlayaraq XVIII əsrin sonlarına qədər şifahi və yazılı ədəbiyyatımızın dilində geniş işlədilmişdir. Məqalədə ustad sənətkarın əsərlərində rast gəlinən belə arxaizmlər üzərində dayanılmış və konkret nümunələr gətirilməklə mənası açıqlanmışdır.
***Açar sözlər**: "Dədə Qorqud kitabı", Füzulinin əsərləri, arxaik sözlər, lüğət ehtiyatı*

**Аннотация.** Язык великого азербайджанского поэта Физули благодаря богатству словарного запаса, основательно отличается от языка мастеров слова, творивших до и после него. Несмотря на то, что в его лексиконе большинство составляют слова арабо-персидского происхождения, слова национального происхождения более употребляемы. Хотя подавляющее большинство этих слов могут сохранить свою функциональность в нашем современном языке, некоторые из них вышли из употребления и стали архаичными. Анализ показывает, что некоторые из этих архаизмов относятся к той эпохе, в которой поэт жил и был близок ему, но большинство из них широко употреблялись в языке нашей устной и письменной литературы, начиная с древнейшего периода нашего языка и до конец XVIII века. В статье основное внимание уделяется подобным архаизмам, встречающимся в творчестве мастера-творца, и поясняется их значение на конкретных примерах.
***Ключевые слова:** «Книга Деде Горгут», произведении Физули, архаичные слова, словарный запас*

**Abstract.** The language employed by the distinguished Azerbaijani poet Fuzuli markedly differs from that of his contemporaries and successors due to its linguistic richness. While his vocabulary includes many

words of Arabic-Persian origin, our indigenous terms take precedence. Although the majority of these words remain in active use in our modern language, a certain portion has fallen into disuse, becoming archaic. Analysis indicates that while some of these archaisms were contemporaneous with the poet's era and those closely associated with it, the majority were extensively utilized in our language's oral and written literature from ancient times until the late 18th century. This article examines such archaisms found in the works of the master artist, elucidating their significance through concrete examples.
***Keywords:*** *"The Book of Dede Korkut", works of Fuzuli, archaic words, vocabulary reserve*

Məhəmməd Füzuli yaradıcılığını səciyyələndirən mühüm xüsusiyyətlərdən biri sözdən məharətlə, yerli-yerində yararlanmaq bacarığıdır. Düşündürücü zərif, həssas, aşiqanə poeziyası böyük şairi ədəbiyyat tariximizdə "könül mülkünün sultanı" ali mərtəbəsinə yüksəltdiyi kimi [12, 15], bu müstəsna bacarıq onun "ədəbi dilimizin tarixində ən zəngin söz ehtiyatı olan sənətkar" [1, 36] kimi "söz mülkünün sultanı" kimi dəyərləndirilməsinə əsas yaratmışdır. Azərbaycan türkcəsində yazdığı nəzm və nəsr əsərlərinin dili ilə bağlı araşdırmalar göstərir ki, onun leksikonunda ərəb və fars dillərinə məxsus sözlər sayca üstünlük təşkil etsə də, milli mənşəli sözlər özünəqədərki və hətta özündən sonrakı sənətkarların dili ilə müqayisədə daha çoxdur. Bu baxımdan dil tariximizin dərin tədqiqatçısı T. Hacıyevin gəldiyi belə bir qənaətlə razılaşmamaq mümkün deyil: "M. Füzuli təkcə Azərbaycanın, hətta Şərqin də yox, dünyanın böyük lüğət ehtiyatı olan söz ustadlarından biridir. Onun söz tutumunda üstünlük ərəb, fars sözlərinin tərəfindədir – ədəbi dilimizin tarixində Füzulidə heç kəsdə olmadığı qədər ərəb, fars sözləri işlənir. Eyni zamanda onun dilində heç kəsdə olmadığı qədər türk sözləri var" [3, 314]. Məlumdur ki, bu sözlərin əksəriyyəti dövrümüzə qədər işləkliyini saxlamışdırsa, bir qismi müxtəlif amillərin təsiri ilə arxaikləşmişdir. Təhlilə cəlb etdikdə həmin arxaizmləri 2 yerə ayırmaq olar:

Birincisi, əsasən, Füzuli və ona yaxın zamanda yaşayıb-yaratmış sənətkarların dilində işlənən sözlər.

Ümumiyyətlə, belə sözləri az işləndiyinə və yazılı mənbələrdə təsadüfi hallarda istifadə edildiyinə görə nadir arxaizmlər kimi səciyyələndirmək mümkündür. Bəzi nümunələrə diqqət yetirək:

1. **"Acıtmak"** feili Füzulinin dilində *"ağrıtmaq, incitmək"* mənasında cəmi bir dəfə rast gələnən sözlərdəndir:

Acıtdı məni acı sözün, tünd nigahın,
Ey nəxli-məlahət, nə bəla, təlx bərin var! [9, 118]

Bu qədim feil eyni anlamda Qazi Bürhanəddinin

"Gözün görəli uyımışam şimdi qəmzəsi
Acıtdı bəni dilər olamı ki, oyanam" [6, 513] və İmadəddin Nəsiminin

"Münəvvər eylə vüsalınla, ey qəmər, gözümü
Ki, firqətin anı acıtdı tutiyasından" [5, 160] beytlərində də işlədilmişdir.

2. **"Bitmək"** feili Füzulinin dilində "*sağalmaq"* mənasında bir neçə dəfə işlədilib:

Çak görüb köksümü qılma ilacım, təbib,
Zaye olu mərhəmin, məndə bitər yarə yox. [9, 92]

Ey söyləyən Füzuliyə eşq içrə səbr qıl,
Söylə, bu mərhəm ilə kimin bitdi yarəsi? [9, 314]

Eyni zamanda Qövsü Təbrizinin aşağıdakı beytində də bu qədim feilin göstərilən mənada işlənildiyini görürük:

Bülbül mənim hərayimə yetsəydi kaş ki,
Yüz qanlı yarəmin biri bitsəydi kaş ki. [7, 276]

3.**"Dolu"** ismi Füzulinin dilində *"şərab qabı, cam, badə"* mənasında cəmi bir dəfə işlədilib:

Dili-pürxunimə yağdırma bəla peykanın,
Həzər et, şişəyə nagəh zərər eylər, doludur. [9, 126]

Bununla yanaşı, həmin söz Füzulinin əsrdaşı olan Həbibinin və Şah İsmayıl Xətayinin dilində də yer almışdır:

Qıldı nəzər çün halimə, bir dolu sundu əlimə,
Dedi təbəssüm edərək: künci-kədüyi meykədə. [4, 31]

İçmişəm bir dolu, olmuşam ayıq,
Düşmüşəm dağlara, olmuşam geyik,
Sənə derəm, sənə, sürməli keyik,
Qaçma məndən, qaçma, avçı deyiləm. [13, 353]

4. "**Savutmaq**" feili Füzulidə *"azaltmaq"* mənasındadır:

Ey xuni-didə, kəsmə cigərdən təəllüqün,
Mehrin savutma sinədən, ey atəşi-dərun! [9, 260]

Bu qədim feilə ustad sənətkarla eyni dövrdə yazıb-yaratmış Kişvərinin qəzəllərində rast gəlinir:

Ey səba, hüsn əhlinə məndən degil bulsun məcal
Kim, savıtmın neçə gün kim, gərmdür bazarınız. [8, 36]

Bizdən sarı ol mah könülni savudubdur,
Yarəb, nə bəla, əhli-vəfani unudubdur. [8, 24]

5. **"Tuğra"** sözü *"gerb, dövlət nişanı"* mənasında həm Füzulinin, həm də Xətayinin dilində işlədilib:

Təhrir qılanda əhli-inşa
Böylə bu misalə çəkdi tuğra... [10, 154]

Çünki rəhmin yox məzarim üstünə bir daş edib,
Ey vəfasız ani tuğra qılduğun, yəni ki, nə? [13, 216]

Gətirilən sözlərdən əlavə, Füzuli və XIII-XVII əsrlərdə yaşamış şairlərimizin dilində **"iltirmək"** (aparmaq), **"onulmaq"** (sağalmaq, yaxşılaşmaq), **"önərmək"** (uğur gətirmək, düzəltmək; sağaltmaq; ucaltmaq, yüksəltmək) kimi qədim sözlərin yer aldığı müşahidə olunur.

Bununla belə, araşdırma göstərir ki, bəzi arxaizmlərə yalnız Füzulinin əsərlərində rast gəlinir. Məsələn:

**"Usanmaq"** (*ağıllanmaq* mənasında):

Füzuli rindü şeydadır, həmişə xəlqə rüsvadır,
Sorun kim. bu nə sevdadır, bu sevdadən usanmazmı? [9, 290]

**"Yağdırmaq"** (*yaymaq, səpmək* mənasınada):

Cəfa oxun mənə yağdırman ancaq, ey əflak,
Demin ki, yeddi kəmandarə bir nişanə yetər. [9, 103]

**"Yağıtmaq"** (*atmaq* mənasında):

Cəfa oxun mənə yağıdırman ancaq, ey əflak,
Demin ki, yeddi kəmandarə bir nişanə yetər. [9, 103]

"**Yaş**" (*təzə, gənc* mənasında):

Dəmbədəm gər düşsə gözdən dürri-əşkim, vəchi var.
Yaş uşaqlardır yetim, onlarda yox rəsmi-ədəb. [9, 72]

Baş açıb yağmurlara, suya batırmış kisvətin,
Yaş uşaqdır, lövhi sadə, hiç bilməz xeyrü şər. [11, 86]

**"Yelmək"** (*çapmaq, sürətlə getmək* mənasında):

Eşq ətvarın müsəlləm eylədi gərdun mana,
Bunca kim, yeldi-yügürdü, yetmədi Məcnun mana. [9, 49]

**"Yumşamaq"** (*yumşalmaq* mənasında):

Ursa Həcəri-mübarəkə baş,
Yumşaya, əgər ola qara daş. [10, 85] və s.

İkincisi, dilimizin daha qədim qatlarından qaynaqlanan bəzi türk mənşəli arxaizmlər ta qədimdən üzü bəri əksər klassik sənətkarların, o cümlədən Füzulinin dilində işlənilməklə geniş bir zaman dairəsini əhatə edir. Demək olar ki, XVIII əsrin sonlarına qədər dilimizin əsas lüğət fonduna daxil olan bu sözlər məhdud zaman kəsiyində işlənən öncə üzərində dayandığımız arxaizmlərdən kəmiyyətcə daha çoxdur. Belə arxaizmlərə yaranma və yazıya alınma baxımından daha qədim tarixə malik "Dədə Qorqud kitabı"nda da rast gəlinir ki, onların bir qisminin Füzuli əsərlərindəki işlənmə məqamları ilə müqayisədə verilməsi böyük söz ustadının dilimizin incəliklərinə nə dərəcədə bələd olduğunu, onun ən dərin laylarından necə bəhrələndiyini göstərmək üçün faydalı olardı. Bunlardan bəzilərini nəzərdən keçirək:

**Ağırlamaq** – əzizləmək, hörmət etmək

Qan Turalı Oğuz bəglərin ağırladı. [D-200, 13]

Qıymadın sakini-kuyin olana peykanın,
Bir içim su ilə ağırlamadın mehmanın. [9, 189]

**Çəri** – ordu, qoşun, əsgər

Təkur dəxi həman çərisini dərdi, bunlarıň üzərinə gəldi. [D-273, 5]

Gözümü üzüm arasında çəri çəkdi müjəm
Ki, gözümdən su çıxıb yumaya xaki-dərini. [9, 306]

**Dəprətmək** – tərpətmək

Sancubanı yerə çaldı, dəprətmədin başın kəsdi. [D-152, 13]

Yerindən dəprədən mən mübtəlayi şövqi-qalibdir,

Havadır gəzdirən yerdən-yerə səbri-giranbari. [9, 100]

**Dərilmək** – yığılmaq, toplanmaq, toplaşmaq

İç Oğuz, Taş Oğuz bəgləri Bayındır xanıñ söhbətinə dərilmişdi. [D-67, 2-3]

Əzmi-bağ eyləmiş ol sərvi-rəvan, ey güllər,
Zər nisar edə görün, cümlə yığılın, dərilin. [9, 194]

**Gedirmək (//gedərmək)** – aradan götürmək, kənarlaşdırmaq, uzaqlaşdırmaq

Oğlan buğanıñ alnından yumruğın gedərdi, yolundan savuldı. [D-17, 2-3]

Füzuli, zülfi sevdasın qələmtək başa salmışsan,
Gedər başın, əgər başdan gedirməzsən bu sevdayi. [9, 315]
Əgməzdi hilalı vəsməyə baş,
Gözdən gedirərdi sürməsin yaş. [10, 135]

**Gəz** – dəfə, səfər, vaxt, yol

Sudan keçdi, bu gəz bir qurda tuş oldı. [D-45, 9-10]

Min can olaydı kaş məni-dilşikəstədə,
Ta hər birilə bir gəz olaydım fəda sana. [9, 55]

**Gözətmək** – gözləmək; göz önünə almaq; göz yetirmək; qorumaq

Ol gün müxənnətlər sapa yer gözətdi. [D-63, 7]

Çəkmə təxtü tac qeydin, bisərü palıq gözət
Kim, əyağə bənddir təxtü bəladır başə tac. [9, 85]

**Güz** – payız

Güz almasına bəñzər al yanaqlum! [D-12, 10-11]

Güz evi tək oldu əşkimdən çox evlər qərqi-ab... [9, 343]

**İlətmək (//ilitmək)** – aparmaq, çatdırmaq, yetirmək

Qo bəni, qadın ana, çəngələ ursunlar, qo ətümdən çəksünlər, qara qavurma etsünlər,
Qırq bəg qızınıñ öñünə ilətsünlər. [D-53, 12-13]

Sən qasid imişsən, ey həmamə,
Məndən həm ilət nigarə namə! [10, 95]

İlətsəm xəncərin şövqini qəbrə, hər bahar olğac,
Olur səbzə yerinə xaki-qəbrimdən əyan xəncər. [11, 34]

**Savmaq** – uzaqlaşdırmaq, kənar etmək, sovuşdurmaq

Azub gələn qəzayı Tañrı savsun, xanım, hey! [D-5, 10]

Tutub quşlar başımda aşiyan, fəryadə gəlmişlər,
Çıx, ahim odu, bir dəm başımdan sav bu qovğayı. [9, 315]

**Sərpmək** – götürmək, açmaq

Qan Turalı niqabın sərpdi. [D-180, 3]

Vay əgər tezcik çıxıb, sərpib ləçək, salsan niqab.
Hiç şək yox kim, səni görcək olur aləm xərab. [9, 342]

**Ulalmaq** – böyümək

Əyəgülü ulalur, qabırğalu böyür. [D-256, 5-6]

Sən yaman cəhl içində qalmışsan,
Ayın öz başına ulalmışsan. [10, 239]

Bir öz başına ulalmış, qərarı yox, dəlidir,
Şıxınca dutmasalar, aləmi yıxar qələm. [11, 89]

Müşahidələrimiz göstərir ki, Dədə Qorqudun düzüb qoşduğu boyların və ustad Füzulinin əsərlərinin dilində “ayaq” (*badə, şərab qabı* mənasında), “bulmaq” (*tapmaq* mənasında), “dikmək//tikmək” (*qurmaq* mənasında), “irmaq” (*bulaq* mənasında), “irmək” (*çatmaq, yetmək* mənasında), “kəndi”, “kəndözü” (*özü* mənasında), “qaç” (*dəfə, neçə* mənasında), “qaçan” (*haçan* mənasında), “qanqı” (*hansı* mənasında), “qararmaq” (*qaralmaq* mənasında), “qat” (*yan, hüzur, qarşı* mənalarında), “nəsnə” (*şey* mənasında), “saqınmaq” (*çəkinmək* mənasında), “sayru” (*xəstə* mənasında), “səgirtmək” (*səyirtmək, çapmaq* mənasında), “sunmaq” (*uzatmaq, vermək, təqdim etmək* mənasında), “sürmək” (*sürtmək; qovmaq* mənalarında), “urmaq” (*vurmaq, qoymaq* mənalarında) və s. kimi qədim sözlərimiz də işlədilmişdir.

Beləliklə, gətirilən faktlar bir daha sübut edir ki, Füzulinin dili dilimizin daha qədim qatları ilə möhkəm bağlı olub onu bütün zənginliyi

ilə çanlandırmışdır. Fikrimizcə, indiki mərhələdə qüdrətli sənətkarın sözlüyünün hazırlanması onun yaradıcılığının daha dərindən araşdırılmasına böyük töhfə vermiş olardı.

**Ədəbiyyat:**


1. Azərbaycan ədəbi dil tarixi. 4 cilddə. I cild. / -Bakı: Şərq-Qərb, -2007, -480 s.
2. D Kitabi-Dədə Qorqud əla lisani-tayifeyi-oğuzan / Kitabi-Dədə Qorqud Ensiklopediyası (iki cilddə). -Bakı: YNE, Ic, -2000, -s.304-621
3. Hacıyev T.İ. Azərbaycan ədəbi dilinin tarixi. I hissə. / T.İ. Hacıyev -Bakı: Elm, -2012, -476 s.
4. Həbibi. Şeirlər. -Bakı: Şərq-Qərb, -2006, -88 s.
5. İmadəddin Nəsimi. Seçilmiş əsərləri. İki cilddə. I cild. -Bakı: Lider nəşriyyat, -2004, -336 s.
6. Qazi Bürhanəddin. Divan. -Bakı: Öndər nəşriyyat, -2005, -728 s.
7. Qövsi Təbrizi. Seçilmiş əsərləri. -Bakı: Lider nəşriyyat, -2005, -328 s.
8. Kişvəri. Əsərləri. -Bakı: Şərq-Qərb, -2004, -176 s.
9. Məhəmməd Füzuli. Əsərləri. Altı cilddə. I c. -Bakı: Şərq-Qərb, -2005, -400 s.
10. Məhəmməd Füzuli. Əsərləri. Altı cilddə. II c. -Bakı: Şərq-Qərb, -2005, -336 s.
11. Məhəmməd Füzuli. Əsərləri. Altı cilddə. IV c. -Bakı: Şərq-Qərb, -2005, 344 s.
12. Mir Cəlal. Füzuli sənətkarlığı. -Bakı: Çaşıoğlu, -2018, 348 s.
13. Şah İsmayıl Xətayi. Əsərləri. -Bakı: Şərq-Qərb, -2005, -384 s.



**E-mail:** haciyev_asif@mail.ru



**Redaksiyaya daxil olub:**27.11.2024

UOT 37.01

***Pərvanə İsa qızı Süleymanova***
*Ağdaş Dövlət Humanitar Kollecinin müəllimi,*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun*
*fəlsəfə doktoru proqramı üzrə doktorantı*
*https://orcid.org/0009-0008-8364-2135*
*https://doi.org/10.69682/arti.2024.91(6).163-166*

# AZƏRBAYCAN DİLİ DƏRSLİKLƏRİNDƏKİ MƏTNLƏRİN ŞAGİRDLƏRDƏ NİTQ VƏRDİŞLƏRİNİN FORMALAŞDIRILMASINDA ROLU

***Парвана Иса гызы Сулейманова***
*преподаватель Агдашского Государственного Гуманитарного Колледжа,*
*докторант по программе доктора философии*
*Института Образования Азербайджанской Республики*

# РОЛЬ ТЕКСТОВ УЧЕБНИКОВ АЗЕРБАЙДЖАНСКОГО ЯЗЫКА В ФОРМИРОВАНИИ РЕЧЕВЫХ НАВЫКОВ УЧАЩИХСЯ

***Parvana Isa Suleymanova***
*teacher of Agdash State Humanitarian College,*
*doctorial student in the program of doctor of philosophy*
*at the Institute of Education of the Republic of Azerbaijan*

# THE ROLE OF THE TEXTS IN AZERBAIJAN LANGUAGE TEXTBOOKS IN THE FORMATION OF STUDENTS' SPEECH HABITS

**Xülasə.** Bu araşdırmada orta məktəblərin V-IX siniflərində Azərbaycan dili dərsliklərində göstərilən mətn növlərinin və mövzuların dərsliklərə necə və nə dərəcədə daxil edildiyi müəyyən edilməyə çalışılıb. Bundan əlavə, müxtəlif nəşriyyatlar tərəfindən hazırlanan dərsliklər arasında mətn növü və mövzu baxımından fərqlərin olub-olmaması araşdırılmağa çalışılıb. Əldə olunacaq məlumatlar dərsliklərin hazırlanmasına töhfə verəcəyi üçün mühüm hesab edilir.
***Açar sözlər**: Azərbaycan dili; mətn; nitq mədəniyyəti; dərslik*

**Аннотация.** В данном исследовании была предпринята попытка определить, как и в какой степени в учебники включены типы текстов и темы, представленные в учебниках азербайджанского языка в V-IX классах средних школ. Кроме того, была предпринята попытка выяснить, существуют ли различия по типу текста и тематике между учебниками, подготовленными разными издательствами. Полученная информация считается важной, поскольку она будет способствовать подготовке учебников.
***Ключевые слова:** Азербайджанский язык; текст; культура речи; учебник*

**Abstract.** In this research, it was tried to determine how and to what extent the types of texts and topics shown in the Azerbaijani language textbooks in the V-IX classes of secondary schools are included in the textbooks. In addition, it was tried to investigate whether there are differences in terms of text type and subject matter between textbooks prepared by different publishing houses. The information to be obtained is considered important as it will contribute to the preparation of textbooks.
***Keywords:** Azerbaijani language; text; speech culture; textbook*

Müasir dövrdə informasiya texnologiyalarının və elmin sürətli inkişafı və dəyişməsi ilə təhsil sahəsində də dəyişiklik və yeniləşmə baş verir. Orta məktəblərdə bütün fənlərdə olduğu kimi, Azərbaycan dilinin tədrisi sahəsində də qarşıya qoyulan məqsədə nail olmaq ixtisaslı proqramlar sayəsində mümkün olacaq. Bunun

üçün orta məktəblərdə həyata keçirilən Azərbaycan dili proqramlarının bu dəyişiklik və inkişaflarla ayaqlaşmaq üçün daim nəzarətdə saxlanması, çatışmazlıqların aradan qaldırılması, inkişaf və yenilənməsi tələb olunur.

Təhsil müəssisələrinin göstərdiyi ən böyük cəhdlərdən biri də təhsilin keyfiyyətinin yüksəldilməsidir. Həm dövlət, həm də özəl təhsil müəssisələrində bütün tədris fəaliyyəti əvvəlcədən hazırlanmış proqram çərçivəsində həyata keçirildiyi üçün təhsilin keyfiyyətinin yüksəldilməsi vacibdir. Həyata keçirilən proqramlardakı nöqsan və çatışmazlıqlar aradan qaldırıldıqca, cəmiyyətdə elm sahəsində baş verən dəyişikliklərə uyğun olaraq yenidən qurulduqca, başqa sözlə, proqramlar təkmilləşdirildikcə təhsilin keyfiyyətinin yüksələcəyi gözlənilir.

İnformasiya və texnologiyalarda baş verən sürətli dəyişikliklər kurikulumda da öz əksini tapır. Məzmun standartları hazırlanarkən şagirdlərin idraki, informativ-kommunikativ və qeyri-iradi fəaliyyətlərinin əhatə olunması, düşünmə, emosional və psixomotor bacarıqlarının inkişaf etdirilməsi nəzərdə tutulmuşdur. Bütün standartlar fəaliyyətlərə aid bacarıqlar şəklində ifadə olunmuş, şagirdlərin bilik və bacarıqları ilə bağlı nailiyyətlərini müəyyənləşdirmək diqqət mərkəzində saxlanılmışdır [1, s. 4].

Yenilənmiş Azərbaycan dili kurikulumunda şagirdlərin həyatları boyu istifadə edə biləcəkləri yazma, oxuma, dinləmə və danışma ilə bağlı dil vərdişləri və zehni bacarıqlara yiyələnmələri, bu bacarıqlardan istifadə edərək özlərini fərdi və sosial cəhətdən inkişaf etdirmələri, effektiv ünsiyyət qurmaları tələb olunur. Şagirdlərdə Azərbaycan dilini böyük həvəslə öyrənmək, oxuma və yazma vərdişi qazanmalarını təmin etmək və Azərbaycan dilinin qrammatik quruluşunu elmi cəhətdən aşılamaq üçün dil bacarıqlarının və səriştələrinin inkişafını bütün digər sahələrdə öyrənmə, şəxsi və sosial inkişaf və peşəkar bacarıqlara yiyələnmək üçün ilkin şərt kimi qəbul edilir.

Tematik təsnifat əsasında hazırlanan kurikulumda oxu və yazı nəticələri mətndaxili, mətndənkənar və mətnlərarası oxu vasitəsilə məna yaratmağa imkan verəcək şəkildə qurulmuşdur. Birinci sinifdən səkkizinci sinfə qədər nailiyyətlərin strukturu və iyerarxiyası şagirdlərin əsas dil bacarıqlarının, eləcə də yüksək səviyyəli idrak bacarıqlarının inkişafına töhfə verəcək şəkildə təşkil edilmişdir. Şagirdlərin inkişaf xüsusiyyətləri nəzərə alınmaqla qrammatika və orfoqrafiya qaydaları ilə bağlı nailiyyətlər tədricən və artan intensivliklə qurulur.

Azərbaycan dili dərslərinin fəaliyyətə əsaslanan, şagirdyönlü yanaşma ilə, mövzulara uyğun və müxtəlif növ mətnlərlə aparılması nəzərdə tutulur. Azərbaycan dili dərsində kurikulumun tətbiqi zamanı hər sinif səviyyəsində Azərbaycan dilinin öyrənilməsində şagirdlərin ünsiyyət imkanlarını genişləndirməklə onlarda nitq fəaliyyətinin növləri ilə yanaşı, *düşünmə, öyrənmə* və *danışma* bacarıqlarını formalaşdırır. Nəticədə bu dil düşünmə, öyrənmə, danışma vasitəsinə cevrilir [1, s. 4].

Mətnlərin seçimində bütün sinif səviyyələrində hər mövzuda bir neçə mətndən istifadə edilir. Bu mətnlər oxu, dinləmə/izləmə mətnləridir. Dərsliklərə daxil ediləcək mətnlərin diqqətlə seçilməli olduğunu qeyd edən A. Yılmazerin fikrincə, şagirdə ana dilinə məhəbbət və mütaliə vərdişinin aşılanmasının yollarından biri də seçilən mətnlərin mövzu və məna baxımından bir-birinə uyğun olmasıdır [2, s. 42].

İ. Arifə görə isə mətn bir çox fərqli səviyyələrdə dillə ünsiyyət qurmaq üçün yaradılmış ifadə və anlama vasitəsidir [3, s. 7]. Dr. Richard Dalton mətni "fikrin və ya təcrübənin yazılı ifadəsi" adlandıraraq onu "dil göstəricilərinin birbirinin ardınca əvvəli və sonu olan qapalı struktur təşkil etdiyi mənalı struktur" kimi dəyərləndirmişdir. R. Daltona görə, mətn müəyyən bir ünsiyyət kontekstində bir və ya bir neçə şəxs tərəfindən şifahi və ya yazılı şəkildə yaradılan bütöv bir dil sistemidir [4, s. 111].

Azərbaycan dili dərslərində də nitq vərdişlərinin öyrədilməsi üçün müxtəlif mövzularda mətnlərdən istifadə edilir. Bu mövzulardan vətənpərvərlik, milli mədəniyyətimiz mövzularının işıqlandırılması məcburidir. Bildirilir ki, məcburi mövzulardan başqa digər mövzular istəyə bağlıdır və kitab müəllifləri tərəfindən müəyyən edilə bilər. Azərbaycan dilinin tədrisində ibtidai məktəbin birinci sinfindən başlayaraq şagirdlər Azərbaycan dilinin ifadə gücünü əks etdirən, onların dil inkişafına və ehtiyaclarına uyğun gələn ən orijinal mətnlərdən istifadə edilməlidir. İncə həssaslıq ilə hazırlanmış bədii mətnlərlə (nağıl, şeir, hekayə, roman və s.) şagirdlər arasında ünsiyyət prosesi onların daha

asan qavramasına, duyğu və anlama bacarıqlarının güclənməsinə, dünya görüşünün genişləndirməsinə imkanlar yaradır.

Tədqiqatçıların fikrincə, dərs kitablarına seçiləcək mətnlər öz janrının ən yaxşı nümunələrindən seçilməli, uşağın dil və məna aləminə uyğun olmalı, müəyyən milli, mənəvi, mədəni və s. O, dəyərlərə malik olmalı, estetik keyfiyyətə və bütövlüyə malik olmalı, uşaqlarda oxuyub-anlama, düşünmə, müqayisə və tənqid etmə bacarıqlarını inkişaf etdirəcək, mütaliə mədəniyyəti qazanacaq və dil bacarıqlarını inkişaf etdirəcək xüsusiyyətlərə malik olmalıdır [2, s. 97].

Dili sevmək üçün onu öyrənmək ehtiyacları və dili öyrənərkən insana göstərilən xidmət çox önəmlidir. Şagirdlərə hər fürsətdə bunun məcburiyyət olmadığı, Azərbaycan dili dərslərinə göstərəcəkləri maraq və o dərsdən əldə edəcəkləri uğurun onları gələcəyə hazırlayacağı izah edilməlidir. Şagirdlər bu yolla həvəsləndirilməli və dili öyrənməyə maraqlı olmalıdırlar. Bu marağı artırmaq üçün onlara Azərbaycan dilində olan ən gözəl mətn nümunələri ilə müraciət etmək lazımdır. Bu mətnlərdə uşaq özünü və yaşadığı dünyanı tapmalıdır. Dr. Almas Khan qeyd edir ki, uşaqların ehtiyacları ilə bağlı məlumat və təcrübələrin bədii həssaslığa malik yazıçılar tərəfindən diqqətlə qiymətləndirilməsi və təşkil edilməsi olduqca vacibdir [5, s. 233].

Şagirdlərin mətnləri başa düşmək və hazırlamaq bacarığı, bir sözlə, düzgün ünsiyyət qurmaq üçün lazımi avadanlıq əldə etmək onların yaxşı mətn nümunələri ilə müqayisəsindən asılıdır. Dərsliklərdəki mətnlər mətn yaratma meyarları olan ahəngdarlıq, uzlaşma, məqsədə uyğunluq, əsaslılıq, informativlik, situasiya və mətnlərarasılıq xüsusiyyətlərinə malik olmalıdır.

Azərbaycan dilinin kurikulumunda mətn növləri iki əsas formada qruplaşdırılır: bədii və informativ. Azərbaycan dilinin tədrisində mətnlər həm də şagirdlərdə bir çox səriştələrin – onların xarakterinin, əxlaqi keyfiyyətlərinin, dünyagörüşünün, sosial bacarıqlarının və s. inkişafını nəzərdə tutur. Lakin digər fənlərdən fərqli olaraq, dil tədrisində mətni oxumaqda əsas məqsəd bilik qazanmaq deyil, informasiyanı qavramaq, onu emal etmək və analoji mətn yaratmaq bacarığını formalaşdırmaq və inkişaf etdirməkdir. Bununla yanaşı, bir daha qeyd etmək lazımdır ki, dil tədrisində mətnlə iş digər fənlərlə inteqrasiyaya geniş imkanlar yaradır [6, s. 85].

Dil tədrisində istifadəsinə görə mətnlərin ötürülmə və təşkil üslublarına görə təsnif edən A. Yılmazer qeyd edir ki, şifahi mətn nitq və ya sözlə ötürülənlərə, yazılı mətni isə şəkillər, rəqəmlər, qrafika və s. ilə ötürülənlərə aid edilən mətnlərdir. Təşkili üslublarına görə isə mətnləri romanlar, hekayələr, məqalələr, lətifələr, xatirələr, şeirlər və s. kimi təsnif etmişdir [2, s. 107]. İ. Arif isə mətn növləri ilə bağlı qəti təsnifat aparmağın mümkün olmadığını bildirmiş və aşağıdakı mətn növlərinə diqqət yetirmişdir: Hekayə növü, poetik mətnlər, danışıq mətnləri, mətbuat mətnləri, xüsusi informativ mətnlər, funksional mətnlər, didaktik mətnlər [3, s. 19].

Azərbaycan dili dərsliklərindəki mətnlərin şagirdlərdə nitq vərdişlərinin formalaşdırılmasında effektiv nəticə əldə etmək üçün, aşağıdakı bir sıra şərtlərin gözlənilməsi yüksək nəticələrin əldə olunmasına öz müsbət təsirini göstərə bilər:

-dərsliklərdə geniş şəkildə qəbul edilmiş müəlliflərin və bu sahədəki əsərlərin ədəbi-mədəni dəyərə malik mətnləri yer almalıdır;

seçilmiş mətnlər ikinci dərəcəli köçürmələrdən deyil, müəllifin əsərindən götürülməlidir;

-dərsliklərdə *"Bu kitab üçün yazılmışdır"* ifadəsi olan mətnlərdən istifadə edilməməlidir. Yalnız 1-ci sinif dərsliklərinə dərsliyin müəllif(lər)i tərəfindən yazılmış maksimum iki mətn daxil edilə bilər;

-eyni nəşriyyata məxsus kitablarda bir sinif səviyyəsi üçün seçilmiş mətndən başqa sinif səviyyəsində istifadə olunmamalıdır;

-şagirdlərin duyğu və düşüncə dünyasını zənginləşdirmək üçün eyni müəllif və/və ya şairlərdən maksimum iki mətn (sərbəst oxu mətnləri, o cümlədən dərslik müəllif(lər)inin yazdığı mətnlər istisna olmaqla) seçilməlidir;

-dünya ədəbiyyatından seçilmiş mətnlər dəqiq və keyfiyyətli tərcümələrdən götürülməlidir;

-dərsliyə mövzulara uyğun sərbəst oxu mətnləri daxil edilməlidir;

-dərsliyə daxil edilməyəcək qədər uzun olan roman, hekayə, pyes, dastan kimi əsərlərdən sitatlarda mətnin əvvəlində ardıcıllıqla seçilmiş bölməyə qədər əsərin qısa xülasəsi verilməlidir;

-mətnlərdə tərbiyə baxımından uyğun olmayan ifadələr (arqon və söyüş ehtiva edən elementlər, mənfi nümunə ola biləcək davranışlar və s.) mətnin bütövlüyünü pozmamaq şərti ilə çıxarılsa daha məqsədəuyğun olar;

-mətndə dövri fərqlərə (orfoqrafiya və durğu işarələri) aid izahatlar dipnot kimi verilməlidir. Bundan əlavə, bu məsələlər tədris məqsədləri üçün istifadə edilə bilər;

-dərs kitabında qəzet xəbəri, reklam, sosial media platformalarında yer alan yazı növləri də dərsliyin müəllifi tərəfindən mətn kimi də istifadə oluna bilər;

Nəhayət, Azərbaycan dili dərsliyi üçün mətnlər seçilərkən diqqətli olmaq lazımdır. Kitablara daxil ediləcək janrlarda uşaq ədəbiyyatı nümunələrindən daha çox istifadə olunmalıdır. Şagirdlərin mütaliə mədəniyyətinə yiyələnməsi prosesində bir addım olan dərsliklər üçün mətnlər seçilərkən uşaq reallığını və uşaq dünyagörüşünü nəzərə alan, bədii həssaslığa malik müəlliflərin mətnlərinə daha çox yer verilməlidir. Kitabın hazırlanması mərhələsində, xüsusən də mətn seçimində bu sahədə mütəxəssislərin rəyi və dəstəyi axtarılmalıdır. Dərsliklərə daxil olan janrlar müxtəlif olmalı və öz janrının ən yaxşı nümunələrindən seçilməlidir.

**Problemin aktuallığı.** Orta məktəblərdə tədris olunan Azərbaycan dili fənni təhsil proqramının – kurikulumun vacib hissəsidir. Azərbaycan dilinin tədrisinə yeni yanaşma yalnız dövlət məktəblərində deyil, həm də özəl kollec və liseylərdə öz əksini tapır. Şagirdlərdə nitq vərdişlərini aşılamaq üçün öz ana dilini daha geniş kontekstdə istifadə etmək məqsədilə sərbəst ünsiyyət üçün kifayət qədər bacarıqlar əldə etməsi müəyyən faktorları daxil edir ki, bura bədii mətnlərin öyrənilməsi proqramı da daxildir. Bu vəziyyətdə xüsusi bədii mətnlərin və bədii əsərlərin seçilməsinə, onlarla işləmək üsul və vasitələrinə xüsusi diqqət yetirilməlidir. Eləcə də şifahi oxunun inkişaf etdirilməsi üçün bədii mətnlərin seçilməsi məqsədilə məşğələnin məqsədini və eləcə də tələbələrin dil səviyyəsini nəzərə almaq məqsədə uyğundur.

**Problemin elmi yeniliyi.** Azərbaycan dilinin bədii mətnlərlə tədrisi zamanı mətnlərin düzgün seçiminin aparılması yollarını tədqiq etməkdir.

**Problemin praktik əhəmiyyəti və tətbiqi.** Məqalədə aparılan tədqiqat və əldə olunan məlumatları Azərbaycan dili dərslərində də istifadə etmək olar.

**Ədəbiyyat:**


1. Azərbaycan Respublikasının Ümumtəhsil məktəbləri üçün Azərbaycan dili üzrə təhsil proqramı (Kurikulumu) (I-XI siniflər). (2013), // –Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi Azərbaycan Respublikasının Təhsil İnstitutu, – Bakı.
2. Yılmazer, A. (2019), Ana dili öğretimi // – Ankara, – 216 s.
3. Arif, İ. (2017), Dil öğretiminde metin seçimi // – İzmir, Pala yayınları
4. Richard, D. (2022), Speech formation using texts // – Kopenhagen, Denmark, International Reading Association
5. Dr. Almas, Kh. (2016), Introduction to text linguistics // – London, 305 p.
6. Azərbaycan Respublikasının Ümumtəhsil məktəbləri üçün Azərbaycan dili üzrə təhsil proqramı (Kurrikulumu) (I-XI siniflər). (2023), Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi Azərbaycan Respublikasının Təhsil İnstitutu // – Bakı.
7. Bayramov, A. Məhərrəmov, Z. İsgəndərzadə, M. (2015), Azərbaycan dili və nitq mədəniyyəti // – Bakı.
8. Abdullayev, N. (2013), Nitq mədəniyyətinin əsasları // – Bakı.
9. Balıyev, H. Balıyev, A. (2014), Azərbaycan dilinin tədrisi metodikası // – Bakı.
10. Azərbaycan Respublikasında ümumi təhsilin dövlət standartları // (2020), – Bakı, 29 sentyabr



**E-mail:** parvanasuleyman85@gmail.com



**Redaksiyaya daxil olub:** 28.11.2024

*UOT 372.851*

***Arzu Faiq qızı Əliyeva***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*https://orcid.org0000-0001-7385-0389*
*https://doi.org/10.69682/arti.2024.91(6).167-169*

# KOLLECLƏRDƏ İNFORMASİYA-KOMMUNİKASİYA TEXNOLOGİYALARININ TƏTBİQİ İLƏ RİYAZİYYAT VƏ QOHUM FƏNLƏRİN ƏLAQƏLİ TƏDRİSİNDƏ TƏLİM METODLARININ SEÇİLMƏSİ PROBLEMİ

***Арзу Фаиг гызы Алиева***
*доктор философии по педагогике*

# ПРОБЛЕМА ВЫБОРА МЕТОДОВ ПРЕПОДАВАНИЯ МАТЕМАТИКИ И СМЕЖНЫХ ПРЕДМЕТОВ С ПРИМЕНЕНИЕМ ИНФОРМАЦИОННО-КОММУНИКАЦИОННЫХ ТЕХНОЛОГИЙ В КОЛЛЕДЖАХ

***Arzu Faig Aliyeva***
*doctor of philosophy in pedagogy*

# THE PROBLEM OF CHOOSING TEACHING METHODS IN THE TEACHING OF MATHEMATICS AND RELATED SUBJECTS WITH THE APPLICATION OF INFORMATION-COMMUNICATION TECHNOLOGIES IN COLLEGES

**Xülasə.** Orta ixtisas təhsili müəssisələrində İKT-nin tətbiqi ilə fənlərin tədrisi tam şəkildə öz həllini tapmamışdır. Buna görə hazırlanmış məqalədə kolleclərdə riyaziyyatın və qohum fənlərin əlaqəli tədrisinin təkmilləşdirilməsində İKT-nin tətbiqinin yolları göstərilmişdir.
***Açar sözlər:*** *informasiya, texnologiya, tətbiq, metod, təkmilləşdirmə, istiqamət, keyfiyyət.*

**Аннотация.** Преподавание предметов с применением ИКТ в средних специальных учебных заведениях до конца не решено. Поэтому в подготовленной статье показаны пути применения ИКТ в совершенствовании преподавания математики и смежных предметов в колледжах.
***Ключевые слова****: информация, технология, приложение, метод, внедрение, направление, качество.*

**Abstract.** The teaching of subjects with the application of ICT in secondary specialized educational institutions has not been fully resolved. Therefore, the prepared article shows the ways of applying ICT in improving the teaching of mathematics and related subjects in colleges.
***Keywords:*** *information, technologies, application, method, development, direction, quality.*

Müasir dövrdə ölkəmizdə aparılan islahatlar və inteqrasiya təhsilin məzmununun təkmilləşdirilməsini zəruri şərt kimi qarşıya qoyur. Mütərəqqi ölkələrin təhsil sisteminə inteqrasiya olmaq üçün aparılan islahatlar təhsilin bütün pillələrində olduğu kimi, həm də orta ixtisas təhsili müəssisələrində təhsilin məzmununda dəyişikliklərin, yeniliklərin və modernləşmələrin aparılmasını ciddi şəkildə qarşıya qoymuşdur. XX əsrin sonu və XXI əsrin əvvəllərindən başlayaraq orta ixtisas təhsili müəssisələrində riyaziyyatın nəzəri və praktik istiqamətlərdə tədrisində mü-

təmadi olaraq dəyişikliklər, yeniliklər və modernləşmələr baş verməyə başlamışdı. Bu halda əsas məqsəd gələcək mütəxəssislərin müasir tələblərə uyğun bilik və bacarıqlara yiyələnmələri, təlimin keyfiyyətinin yaxşılaşdırılması və yüksəldilməsindən ibarət idi.

Ölkəmizin təhsil sistemində aparılan inteqrasiya prosesi orta ixtisas təhsili müəssisələrində fənlərin təlimində də həyata keçirilir. İnteqrasiya bütövləşmənin, tamamlanmanın nəticəsi kimi meydana çıxan bir prosesdir. Fənndaxili inteqrasiya istənilən bir fənnin öyrənilməsində təhsilalana verilən bilik və bacarıqların əlaqələndirilməsi və sistemləşdirilməsindən ibarətdir.

Kolleclərdə riyaziyyat və qohum fənlərin əlaqəli tədrisində İKT-dən istifadə gələcək mütəxəssislərin təhsil, səhiyyə, sənaye, kənd təsərrüfatı və s. sferalarda öz iş fəaliyyətlərində müasir tələblərə uyğun hazırlıqlarına səbəb olur. Eyni zamanda qeyd edə bilərik ki, kolleclərdə təlim prosesində fəndaxili və fənlərarası inteqrasiyanın təmin edilməsi, varislik prinsipinin gözlənilməsi və vərdişlərin dərinləşməsinə, möhkəmlənməsinə səbəb olur. Riyaziyyatın informatika və yaxın fənlərlə fəndaxili və fənlərarası əlaqələrini əlaqə kimi deyil, həm də inteqrasiya rolu oynaması kimi qəbul etmək lazımdır, çünki bu proses öyrənənlə öyrədən arasında qarşılıqlı məqsədyönlü fəaliyyətin yaranmasına zəmin yaratmaqla keyfiyyətli təlimin əldə olunmasında özünü əks etdirir.

İnteqrasiya zamanı Dövlət Təhsil Standartlarına görə, riyaziyyat kursunda materialların tamlığı gözlənildiyi, təlimin prinsip və yeni metodlarından istifadəyə üstünlük verildiyi və İKT-dən istifadə edildiyi halda tələbələr daha keyfiyyətli təhsilə nail olarlar. Riyaziyyat və qohum fənlər arasında əlaqə yarandıqda və İKT-nin tətbiqi öz əksini tapdıqda təhsilalanlar tərəfindən daha keyfiyyətli bilik, bacarıq və vərdişlər əldə olunar. Bu halda, həm də müəllim hazırlığı müasir tələblərə uyğun olmalı, yəni müəllim riyaziyyat kursunun bütün bölmələrinə (nəzəriyyələrinə) yaxşı bələd olmalı, fənlərarası əlaqələrdən istifadə etməyin yollarını, onun tədrisi metodikasını mükəmməl şəkildə bilməlidir.

Müasir müəllim İKT-dən faydalanmaqla fəal və interaktiv təlim metodlarından istifadə etməklə yanaşı, həm də inteqrasiyanı tətbiq etməklə müasir tələblərə uyğun yaradıcı mütəxəssislərin hazırlanmasına münbit şərait yaradır. Yəni kolleclərdə təhsilverənlər tərəfindən tədris prosesində İKT-nin tətbiqi ilə riyaziyyat və qohum fənlərin əlaqəli tədrisi təmin edilərsə bu, təlimin keyfiyyətinin artmasına böyük təsir göstərər.

Müşahidələr göstərir ki, riyaziyyat və qohum fənlərin əlaqəli tədrisində İKT-dən istifadə tələbələrdə fənlərə marağın artdığını özündə əks etdirir. Bu fənlərin tədrisində İKT-nin tətbiqinin üstünlüklərindən biri də informasiya və biliklərin səmərəli istifadə olunmasıdır.

Kolleclərdə riyaziyyatın nəzəri və praktik istiqamətlərdə tədrisində İKT-dən faydalanmaq təlimin keyfiyyətinin yaxşılaşdırılmasında, təhsilin keyfiyyətinin yüksəldilməsində mühüm rol oynayır. İnformatika kursunun tədrisində riyaziyyatdan məsələlərin kompüterlərlə həllinin reallaşdırılması tələbələrin bilik və bacarıqlarının daha da dərinləşməsinə və möhkəmlənməsinə səbəb olur, onlarda marağın və fəallığın artmasında rol oynayır. Təlim prosesində tələbələrin yaradıcılıq fəaliyyəti stimullaşır və onlarda dərketmə qabiliyyətinin aktivləşməsi özünü əks etdirir. Kolleclərdə riyaziyyatın qohum fənlərlə əlaqəli tədrisində İKT-dən və internet texnologiyalarından istifadənin üstünlüklərinin əhəmiyyəti danılmazdır.

Təhsilin keyfiyyətinin yüksəldilməsinin yollarından biri də tədris prosesinin İKT-nin tətbiqi ilə təkmilləşdirilməsi və kadrların müasir texnologiyaların tələblərinə uyğun hazırlanmasıdır. Bu zaman əldə olunan bilik, bacarıq və vərdişlər bir-birilə bağlıdır, belə ki, biri digərinin səbəbi və biri digərinin nəticəsi olmaqla eyni bir fəaliyyəti ifadə edir.

Kolleclərdə İKT-dən istifadə etməklə riyaziyyatın qohum fənlərlə əlaqəli tədrisinin nəzəri, praktik və metodik problemlərinin həlli işçi tədris proqramının və dərsliklərin yenilənməsini, bu kursların müasir tələblərə uyğun tədris olunmasını, təhsilalanların mükəmməl və sistemli bilik və bacarıqlara yiyələnməsini təmin edir.

Kolleclərdə interaktiv (fəal) təlim metodlarının düzgün həyata keçirilməsi təlimin keyfiyyətinə təsir edən amillərdən biridir. Yəni, bu halda hər bir tələbənin ayrılıqda aktivliyinin təmin edilməsi; tədris prosesində müəllim-kompüter-tələbə münasibətlərinin idarə olunması; təhsilalanların bir-birilə və təhsilverənlə qarşılıqlı məqsədyönlü fəaliyyətinin proqramla həyata keçirilməsi; təlim prosesində təhsilalanların bilik və bacarıqlarını nəzərə alıb fənlərarası əlaqələrdə

kompüterdən istifadə ilə reallaşdırılması daha əlçatan olur.

Tədris prosesində informatikanın yerini, rolunu, məqsəd və vəzifələrini, əhəmiyyətini kollec tələbələrinə hərtərəfli aydınlaşdırmaq lazımdır. İKT sahəsində, eləcə də kompüter texnologiyası sferasında demək olar ki, hər gün yeniliklər baş verir. Buna görə də təhsilalanlara əsas (ilk) anlayışların öyrədilməsi dərin və möhkəm olmalıdır. Bu, təhsilalanların bilik, bacarıq və vərdişlərinin praktik tətbiqinə kömək etmiş olar. Hər gün yeni texnologiyaların meydana gəlməsi, informatikanın öyrənilməsində və eyni zamanda fənlərarası əlaqələrdə İKT-dən istifadə bilavasitə elektron təhsil platformalarının, onlayn kursların yaradılmasına zəmin yaratmışdır ki, bu da təhsili daha əlçatan etmişdir. Buna görə də bu istiqamətdə tədris metodikasına üstünlük verilməli, meydana çıxan problemlərin aradan qaldırılmasına əməl edilməlidir.

Tədrisdə inteqrasiyanın həyata keçirilməsinin əhəmiyyəti böyükdür. İstər bütövlükdə təlim prosesində, istərsə də müxtəlif fənlərin tədrisində inteqrasiya ayrı-ayrı hissələrin məntiqi surətdə bütöv bir tam halında bir-biri ilə birləşməsi deməkdir.

Kolleclərdə İKT-dən faydalanmaqla fənlərarası əlaqələr yaradılarkən təhsil verənlə təhsilalan arasında sıx əməkdaşlıq bərqərar olur. Bu prosesdən aydın olur ki, kolleclərdə təhsilalanların bir çoxu proqram üzrə nəzəri və praktik istiqamətlərdə materialları şüurlu şəkildə dərk edir, mənimsəmiş olduqları nəzəri bilikləri praktik məsələlərin həllinə yönəltməyi bacarırlar.

Təcrübə göstərir ki, əlaqəli fənləri ayrı-ayrılıqda tədris etməklə tələbələri müasir tələblərə uyğun, yüksək səviyyəli mütəxəssis kimi yetişdirmək, onları dünyagörüşlü şəxsiyyət kimi formalaşdırmaq qeyri-mümkündür. Tədris prosesində fəndaxili və fənlərarası inteqrasiyanın təmin edilməsi təhsilalanlar tərəfindən bilik və bacarıqların daha asan mənimsənilməsi, dərs prosesinin maraqlı və məzmunlu qurulması, tələbələrdə tədqiqatçılıq qabiliyyətinin inkişaf etdirilməsi üçün vacib şərtdir.

**Problemin aktuallığı.** Orta ixtisas təhsili müəssisələrində hazırlanan müasir tələblərə uyğun mütəxəssislər bilik əldə etməklə yanaşı, dünyagörüşlü şəxsiyyət zənginliyinə də malik olmalıdırlar. Təhsilini başa vuran hər bir şəxs öz peşə istiqamətində müasir tələblərə uyğun bilik səviyyəsinə yiyələnməlidir. Bu halda orta ixtisas təhsili müəssisələrində tədris olunan fənlərin qarşılıqlı əlaqə formalarından istifadənin rolu danılmazdır. Odur ki, təlim prosesində İKT-dən istifadə etməklə riyaziyyat və qohum fənlərin məqsədəmüvafiq şəkildə əlaqələndirilməsi müasir tələblərə uyğun mütəxəssis hazırlığının təminatına zəmin yaradır. Bu baxımdan təqdim etdiyimiz mövzu xüsusi aktuallıq kəsb edir.

**Problemin elmi yeniliyi.** Orta ixtisas təhsili müəssisələrində riyaziyyat və qohum fənlərin əlaqəli tədrisinin mahiyyətini və iş sistemini müəyyənləşdirmək.

**Problemin praktik əhəmiyyəti.** Tədqiq etdiyimiz mövzunun praktik əhəmiyyəti ondan ibarətdir ki, orta ixtisas təhsili müəssisələrində çalışan müəllimlər İKT-dən istifadə etməklə riyaziyyat və qohum fənlərin əlaqəli tədrisi zamanı problemlə əlaqədar müəyyənləşdirdiyimiz istiqamətlərdən öz praktik fəaliyyətlərində faydalana biləcəklər.

**Ədəbiyyat:**


1. Abışov N.Ə. Müasir informasiya-kommunikasiya texnologiyalarının tədris prosesinə tətbiqi : -Bakı, Elm, -2011.
2. Mahmudov M.C. Riyaziyyatın tədrisi metodikası. I və II hissə: -Bakı: AzTU-nin nəşriyyatı, -2005.
3. Adıgözəlov A.S., T.M. Əliyeva. Riyaziyyatın tədrisi prosesində fənlərarası əlaqələrin tətbiqi. -Bakı, 1993.
4. Kazımov M.S. Orta ixtisas təhsilinin məzmununun təkmilləşdirilməsinə yeni yanaşmalar: -Bakı: ARTİ-nun Elmi əsərləri, -2007. № 1.
5. Əliyeva T.M. Ali pedaqoji məktəblərin riyaziyyat fakültəsində riyaziyyat və riyaziyyatın tədrisi metodikası fənləri arasındakı əlaqələrin reallaşdırılmasının yol və vasitələri: -Bakı: Elm, -2004.
6. Muradova Z. Pedaqoji prosesdə fənlərarası əlaqənin mahiyyəti. - Bakı, ARTİ-nun Elmi əsərləri, -2017. № 5.


**E-mail:** a.aliyeva73@bk.ru

**Redaksiyaya daxil olub:** 27.11.2024.

UOT 372.851

***Əlişah Əzizxan oğlu Eyyubov***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Şamaxı filialının baş müəllimi*
*https://orcid.org / 0000-0001-7467-5965*
*https://doi.org/10.69682/arti.2024.91(6).170-173*

# BUCAQLARA AİD BƏZİ DÜSTURLARIN İSBATI

***Алишах Азизхан оглы Эйюбов***
*старший преподаватель Шамахинского филиала*
*Азербайджанского Государственного Педагогического Университета*

# ДОКАЗАТЕЛЬСТВО НЕКОТОРЫХ ФОРМУЛ, ОТНОСЯЩИХСЯ К УГЛАМ

***Alishah Azizkhan Eyyubov***
*Head teacher of Shamakhi branch of Azerbaijan State Pedagogical University*

# PROOF OF SOME FORMULAS RELATING TO ANGLES

**Xülasə.** Məktəb riyaziyyat kursunda bucaqlara aid çoxlu düsturlar isbatsız olaraq şagirdlərə verilir. Bunlara nümunə olaraq iti bucağa adi düsturlar, saat əqrəblərinin arasındakı bucağın təyin edilməsi, bucağın daxilindəki nöqtənin bucağın təpəsinə qədər məsafənin təyini və sair misal göstərmək olar.

İti və kor bucaq daxilində götürülmüş nöqtədən təpə nöqtəyə qədər məsafə maraq doğuran hallardan biridir. Bu məsafəni təyin etmək üçün əvvəlcə iti bucaq daxilində götürülmüş nöqtədən təpə nöqtəsinə qədər məsafə üçün düstur təyin edilmişdir. Sonra kor bucağ halına baxılır. Hər iki hal üçün düsturun təyin edilməsi və isbatı göstərilmişdir.

Beləliklə şagirdlərə verilən düsturların isbatı onlarda maraq doğurur. Bu düsturlardan istifadə etmək bacarığı artır, məntiqi təfəkkürləri inkişaf edir.
***Açar sözlər:*** *Bucaq, iti, kor, məsafə, isbat*

**Аннотация.** В школьном курсе математики ученикам без доказательств задаются многие формулы, связанные с углами. В качестве примеров можно указать обычные формулы острого угла, определение угла между стрелками часов, определение расстояния от точки внутри угла до вершины угла и так далее. Интерес представляет расстояние от точки до вершины, взятое в пределах острого и слепого угла. Для определения этого расстояния сначала определяют формулу расстояния от точки, взятой в пределах острого угла, до вершины. Затем рассматривается случай слепого угла. Показаны определение и доказательство формулы для обоих случаев.

Таким образом, доказательство формул, данное учащимся, вызывает у них интерес. Повышается умение пользоваться этими формулами, развивается логическое мышление.
***Ключевые слова:*** *Угол, острый, слепой, расстояние, доказательство*

**Abstract.** In the school mathematics course, many formulas for angles are given to students without proof. Examples of these are the usual formulas for an acute angle, determination of the angle between the hands of the clock, determination of the distance from the point inside the angle to the top of the angle, and so on.

The distance from a point to a vertex taken within an acute and blind angle is one of interest. To determine this distance, the formula for the distance from the point taken within the acute angle to the vertex is first determined. Then the case of blind angle is considered. The determination and proof of the formula for both cases are shown.

Thus, the proof of the formulas given to students arouses interest in them. The ability to use these formulas increases, logical thinking develops.

***Keywords**: Angle, sharp, blind, distance, proof*

Məktəb riyaziyyat kursunda bucaqlara aid çoxlu düsturlar hazır şəkildə şagirdlərə verilir. Bunlardan həndəsənin əsaslarında, üçbucaqlara, çevrəyə və çoxbucaqlılara və s. aid düsturlar verilir. Bunlardan biri iti və kor bucaq daxilində götürülmüş nöqtədən bucağın təpə nöqtəsinə qədər məsafəyə aid düstur təyin edilmişdir və isbatı yerinə yetirilir.

İxtiyari $\alpha$ iti bucağının daxilində verilmiş nöqtədən bucağın tərəflərinə qədər məsafələr $a$ $və$ $b$ olarsa həmin nöqtədən bucağın təpə nöqtəsinə qədər olan məsafəni aşağıdakı düsturla hesablamaq olar:

$$l = \sqrt{a^2 + \frac{(a + \frac{b}{\sin(90^0 - \alpha)})^2}{\frac{1}{[\sin(90^0 - \alpha)]^2} - 1}}$$

**İsbatı:** İxtiyari iti $\alpha$ bucağı götürüb, onun daxilində bir $M$ nöqtəsi qeyd edirik. Həmin nöqtədən bucağın tərəflərinə qədər $AM = a\,; MB = b$ məsafələrini çəkirik, $O$ nöqtəsi ilə $M$ nöqtəsini birləşdiririk. Axtarılan məsafə isə $OM$-ə bərabərdir.




Bunun üçün $AM$ düz xəttinin bucağın digər tərəfi ilə kəsişən uzantısını çəkirik və kəsişmə nöqtəsini $D$ hərfi ilə işarə edirik. $OAD$ $və$ $MBD$ hər ikisi düzbucaqlı üçbucaqlardır. Buradan biz $\angle ADO$ bucağını təyin edə bilərik. Həmin bucaq $\angle ADO = 90^0 - \alpha;\ 90^0 - \alpha = \gamma$ işarə edək. Düzbucaqlı üçbucaqda iti bucağın sinusunun tərifinə görə aşağıdakı münasibəti yazırıq:

$$sin\varphi = \frac{OA}{OD} : \Rightarrow OD = \frac{OA}{sin\varphi}$$

$$sin\varphi = \frac{MB}{MD} = \frac{b}{MD} : \Rightarrow MD = \frac{b}{sin\varphi}$$

$$AD = AM + MD\ olduğundan$$

$$AD = AM + MD = a + \frac{b}{sin\varphi}$$

$\Delta OAM$ $və$ $\Delta OAD$ düzbucaqlı üçbucaq olduğundan

$$|OM|^2 = |AM|^2 + |OA|^2\ və\ |OA|^2 = |OD|^2 - |AD|^2$$

$$|OA|^2 = |OD|^2 - |AD|^2 - dən$$

$$OA^2 = (\frac{OA}{sin\varphi})^2 - \left(a + \frac{b}{sin\varphi}\right)^2 = OA^2 \cdot \frac{1}{(sin\varphi)^2} - \left(a + \frac{b}{sin\varphi}\right)^2$$

$\left(a + \frac{b}{sin\varphi}\right)^2 = OA^2\ \left(\frac{1}{(sin\varphi)^2} - 1\right)$ Buradan alınır ki, $OA = \sqrt{\frac{(a + \frac{b}{sin\varphi})^2}{(\frac{1}{(sin\varphi)^2} - 1)}}$

$|OM|^2 = |AM|^2 + |OA|^2$ olduğundan

$$|OM|^2 = a^2 + \frac{\left(a + \frac{b}{sin\varphi}\right)^2}{\left(\frac{1}{(sin\varphi)^2} - 1\right)} :$$

$$\Rightarrow OM \sqrt{a^2 + \frac{(a + \frac{b}{sin\varphi})^2}{\left(\frac{1}{(sin\varphi)^2} - 1\right)}}$$

$\varphi = 90^0 - \alpha$ işarə etdiyimizdən düsturda $\varphi - nın\ əvəzinə$ $(90^0 - \alpha)$ qiymətini yazırıq. Onda düstur

$$OM = \sqrt{a^2 + \frac{(a + \frac{b}{\sin(90^0 - \alpha)})^2}{\frac{1}{[\sin(90^0 - \alpha)]^2} - 1}}$$

Alırıq.

Xüsusi hal olaraq $\alpha = 30^0$ olanda

$$OM = 2\sqrt{\frac{1}{3}\ a^2 + \frac{1}{\sqrt{3}}\ ab + \frac{1}{3}b^2}$$

$\alpha = 45^0$ olanda

$$OM = \sqrt{2a^2 + 2\sqrt{2}\,ab + 2b^2}$$

$\alpha = 60^0$ olanda

$$OM = \frac{2}{\sqrt{3}}\sqrt{a^2 + ab + b^2}$$

Beləliklə iti bucağın daxilindəki nöqtədən bucağın təpəsinə qədər məsafə düsturu təyin edildi. Düsturda bucağın xüsusi hallarına baxdıq. Belə ki, triqonometrik funksiyaların məlum cədvəl bucaqlarının qiymətlərinə uyğun hesablamalar yerinə yetirməklə düsturun xüsusi hallarını

aldıq. İndi bucağın kor bucaq olduğu halına baxaq.

İxtiyari $\alpha$ kor bucağının daxilində verilmiş nöqtədən bucağın tərəfinə qədər məsafələr $a$ və $b$ olarsa həmin nöqtədən bucağın təpə nöqtəsinə olan məsafəni aşağıdakı düsturla hesablamaq olar:

$$l = \sqrt{a^2 + \frac{(\frac{b}{\sin(\alpha-90^0)} - a)^2}{\frac{1}{[\sin(\alpha-90^0)]^2} - 1}}$$

**İsbatı:** İxtiyari $\alpha$ kor bucağı götürüb və onun daxilində bir $M$ nöqtəsi qeyd edirik.




Həmin nöqtədə bucağın tərəflərinə qədər $AM = a$; $MB = b$ məsafələrini çəlirik. $O$ nöqtəsi ilə $M$ nöqtəsini birləşdiririk. $OM$ parçasının uzunluğu axtarılan məsafə olur.

Bunun üçün $AM$ düz xəttinin bucağın digər tərəfinin əksinə uzantısı ilə kəsişmə nöqtəsini tapırıq və onu $D$ hərfi ilə işarə edirik.

Alınan üçbucaqlardan $OAD$ və $MBD$-nin hər ikisinin düzbucaqlı olduğu asanlıqla görünür. Bundan biz $\angle ADO$ bucağını təyin edə bilərik. Həmin bucaq $\angle ADO = \alpha - 90^0$; $\alpha - 90^0 = \varphi$ işarə edək. Düzbucaqlı üçbucaqda iti bucağın sinusunun tərifinə görə aşağıdakı münasibəti yazarıq:

$$sin\varphi = \frac{OA}{OD}: \Rightarrow OD = \frac{OA}{sin\varphi}$$

$$sin\varphi = \frac{MB}{MD} = \frac{b}{MD}: \Rightarrow MD = \frac{b}{sin\varphi}$$

$AD = MD - AM$ olduğundan

$$AD = MD - AM = \frac{b}{sin\varphi} - a$$

$\Delta OAM$ və $\Delta$OAD düzbucaqlı üçbucaqlar olduğundan aşağıdakı münasibəti yaza bilərik. $|OM|^2 = |AM|^2 + |OA|^2$; və $|OA|^2 = |OD|^2 - |AD|^2$

$$|OA|^2 = |OD|^2 - |AD|^2 - dən$$

$$OA^2 = \left(\frac{OA}{sin\varphi}\right)^2 - \left(\frac{b}{sin\varphi} - a\right)^2$$

$$= OA^2 \cdot \frac{1}{(sin\varphi)^2} - \left(\frac{b}{sin\varphi} - a\right)^2$$

$$\left(\frac{b}{sin\varphi} - a\right)^2 = OA^2 \cdot \frac{1}{(sin\varphi)^2} - OA^2$$

$$OA = \sqrt{\frac{\left(\frac{b}{sin\varphi} - a\right)^2}{\frac{1}{(sin\varphi)^2} - 1}}$$

$|OM|^2 = |AM|^2 + |OA|^2$ olduğundan

$$|OM|^2 = |AM|^2 + |OA|^2 = a^2 + \frac{\left(\frac{b}{sin\varphi} - a\right)^2}{\frac{1}{(sin\varphi)^2} - 1}$$

$$OM = \sqrt{a^2 + \frac{\left(\frac{b}{sin\varphi} - a\right)^2}{\frac{1}{(sin\varphi)^2} - 1}}$$

Əvvəldə $\varphi = \alpha - 90^0$ işarə etdiyimizdən düsturu belə yazarıq.

$$OM = \sqrt{a^2 + \frac{(\frac{b}{\sin(\alpha-90^0)} - a)^2}{\frac{1}{[\sin(\alpha-90^0)]^2} - 1}}$$

Xüsusi hal olaraq $\alpha = 120^0$ olarsa

$$l = \sqrt{\frac{2}{3}a^2 - \frac{4}{3}ab + \frac{4}{3}b^2}$$

$\alpha = 135^0$ olanda

$$l = \sqrt{2a^2 - 2\sqrt{2}ab + 2b^2}$$

$\alpha = 150^0$ olanda

$$l = \sqrt{\frac{4}{3}a^2 - \frac{4}{3\sqrt{3}}ab + \frac{4}{9}b^2}$$

Burda da alınmış düsturda kor bucağın xüsusi hallarına baxıldı. Baxılmış bu bucaqlar üzərində çevirmə düsturları yerinə yetirilib, məsafə üçün xüsusi hallara aid düsturlar alınıb.

**Problemin elmi yeniliyi.** Məktəb riyaziyyatında bucaqlara aid çoxlu hazır düsturlar şagirdlərin ixtiyarına verilir. Bunlardan bəzisinin isbatı ilə məşğul olmuşdur.

**Problemin praktik əhəmiyyəti.** Şagirdlərə verilən hazır düsturlardan məsələ həllində istifadə edilir.

Hamısının isbatını bilməsələr də onlardan istifadə etməyi bacarır və müxtəlif tətbiqlərinə nail olurlar.

**Problemin aktuallığı.** Bucağın daxilində götürülmüş nöqtədən şagirdlərdə digər hazır düsturların isbatına maraq yaradır. Bu maraq onların təfəkkürlərinin inkişafına kömək edir.

**Ədəbiyyat:**


1. R. Əliməmmədov. Riyaziyyat. Bakı, 2010. - s.150-156
2. Mərdanov M.G. Yaqubov M.H. və. b. Həndəsə: orta məktəb şagirdləri üçün dərsliklər. -Bakı, 2003 – 2007- 99 – 120 s.
3. Tağıyeva S., Dolxanova Cəmil-Cahid, Əliqamət K. Əsas həndəsi anlayışlar və təkliflər. Bakı, 2023. s. 26



**E-mail:** elishaheyyubov@mail.com



**Redaksiyaya daxil olub:** 31.10.2024

*UOT 372.851*

***Musa Tapdıq oğlu Rzayev,***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*
*https://orcid.org/ 0000-0002-5141-177X*
*https://doi.org/10.69682/arti.2024.91(6).174-181*

***Aysel Akif qızı Mayılova***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*
*https://orcid.org/ 0009-0002-3974-9943*

## ÜÇBUCAQLARIN HƏLLİNDƏ SFERİK TRİQONOMETRİYADAN İSTİFADƏ VASİTƏ KİMİ

***Муса Тапдыг оглу Рзаев,***
*доктор философии по педагогике*
*Азербайджанский Государственный Педагогический Университет*

***Айсель Акиф гызы Маилова***
*Азербайджанский Государственный Педагогический Университет*

## ИСПОЛЬЗОВАНИЕ СФЕРИЧЕСКОЙ ТРИГОНОМЕТРИИ КАК СРЕДСТВА РЕШЕНИЯ ТРЕУГОЛЬНИКОВ

***Musa Tapdig Rzayev,***
*doctor of philosophy in pedagogy*
*Azerbaijan State Pedagogical University*

***Aysel Akif Mayilova***
*Azerbaijan State Pedagogical University*

## USING SPHERICAL TRIGONOMETRY AS A TOOL IN SOLVING TRIANGLES

**Xülasə.** Məqalədə orta ümumtəhsil məktəblərinin riyaziyyat təlimində əsas mövzulardan biri olan üçbucaqlar mövzusundan bəhs edilir. Üçbucaqların sferik triqonometriyadan istifadə edərək həlli yolları əlaqəli şəkildə öyrənilməsi nümunələr əsasında göstərilir. Qeyd etmək lazımdır ki, "Həndəsə" məzmun xəttində üçbucaqlar mövzusuna aid məsələlərin həllində sferik triqonometriyanın və ya məlum teoremlərin tətbiqi yollarından istifadə edərək öyrənilməsi bir daha təkrar mənimsənilir.

Məqalə elementar riyaziyyat və riyaziyyatın tədrisi metodikasından mühazirə deyən və seminar məşğələləri aparan ali məktəb müəllimləri, orta məktəb müəllimləri, habelə tədqiqatçılar üçün faydalı olacaqdır.

***Açar sözlər**: sfera, triqonometriya, bucaq, üçbucaq, dairə, qövs, çəpbucaqlı, teorem, isbat, sahə, anlayış, tərif.*

**Аннотация.** В статье рассматривается тема треугольников, которая является одной из основных тем в математическом образовании средней школы. На основе примеров показано соответствующее исследование решений треугольников с помощью сферической тригонометрии. Следует отметить, что по направлению «Геометрия» вновь осваивается изучение сферической тригонометрии или применение известных теорем при решении задач, связанных с темой треугольников.

Статья будет полезна преподавателям вузов, учителям средней школы, а также научным работникам, читающим лекции и ведущим семинары по элементарной математике и методике преподавания математики.

***Ключевые слова**: сфера, тригонометрия, угол, треугольник, круг, дуга, диагональ, теорема, доказательство, площадь, понятие, определение*

***Abstract.*** The article deals with the topic of triangles, which is one of the main topics in mathematics education of secondary schools. A related study of the solutions of triangles using spherical trigonometry is shown on the basis of examples. It should be noted that in the "Geometry" content line, the study of spherical trigonometry or the application of well-known theorems is mastered again and again in solving problems related to the topic of triangles.

The article will be useful for high school teachers, secondary school teachers, as well as researchers who give lectures and conduct seminars on elementary mathematics and mathematics teaching methodology.

***Keywords****: Sphere, trigonometry, angle, triangle, circle, sphere, arc, diagonal, theorem, proof, area, concept, definition.*

Sfera üzərində triqonometriya və ya sferik triqonometriya bildiyimiz müstəvi üzərində olan triqonometriyadan onunla fərqlənir ki, burada sfera üzərində götürülmüş və tərəfləri kürənin böyük dairə kəsiklərinin qövsləri olan üçbucaqların-sferik üçbucaqların həllindən danışılır.

Sferik triqonometriyan astronomiya, geodeziya və topoqrafiya elmlərində istifadə edilir.

$R$ radiuslu kürə üzərində bir istiqamətdə olmayan $A, B$ və $C$ nöqtələrini götürüb, bu nöqtələrin hər cütündən böyük dairə keçirək. Bu üç böyük dairənin kəsişməsindən kürənin üzərində müəyyən bir $ABC$ sferik üçbucağı alınır. Alınan bu üçbucağa eyni zamanda mərkəzi üçüzlü bucağın təpəsində olan kürə səthi ilə üçüzlü bucağın üzlərinin kəsişməsindən alınan üçbucaq kimi də baxmaq olar (şəkil 1).



*Şəkil 1*

Sferik üçbucaqda hər bir tərəf digər iki tərəfin cəmindən kiçik $a + b > c$, $a + c > b$, $c + b > a$ və hər bir tərəf digər iki tərəfin fərqindən böyükdür: $b > a - c$, $a > b - c$, $c > a - b$.

Sferik üçbucağın tərəfləri qövs olduğundan dərəcələrlə ölçülür və bu tərəflərin cəmi $360^0$-dən kiçikdir: $a + b + c < 360^0$

$a, b, c$ eyni zamanda sferik üçbucağı əmələ gətirən üçüzlü bucağın müstəvi bucaqlarıdır.

İstənilən sferik üçbucaqda daxili bucaqların cəmi $540^0$-dən kiçik və $180^0$-dən böyükdür: $180^0 < A + B + C < 540^0$

Müstəvi üzərindəki üçbucaqların bərabərliyinin üç əlaməti sferik üçbucaqlar üçün doğrudur.

Bundan başqa uyğun bucaqları bərabər və bir kürə üzərində olan sferik üçbucaqlar bərabərdir.



*Şəkil 2*

Sferik triqonometriyanın əsas düsturları. Sferik triqonometriyanın əsas düsturları sferik üçbucağın üç və ya dörd məlum elementinə görə qalan dördüncü və beşinci elementi tapmağa imkan verən riyazi ifadələrdir. $ABC$ sferik üçbucağını götürək.

$A, B$ və $C$ nöqtələrini $O$ mərkəzi ilə birləşdirək (şəkil 2).

$A$ nöqtəsindən sferik üçbucağın $AB$ və $AC$ tərəflərinə toxunan keçirək. $A$ bucağının qiyməti bu toxunanlar arasındakı bucağın qiymətidir. İsbatın aydınlığı üçün $b$ və $c$ bucaqlarının birini $90^0$-dən kiçik hesab edək. Belə olduqda $A$ nöqtəsinə toxunan düz xətlər $OC$ və $OB$ radiuslarının uzantısını $M$ və $N$ nöqtələrində kəsəcəkdir. Planimetriyadan bildiyimiz kimi AMN üçbucağından:

$$MN^2 = AN^2 + AM^2 - 2AN \cdot AM \cdot cosA \ (1)$$

$OMN$ üçbucağından isə:

$$MN^2 = OM^2 + ON^2 - 2OM \cdot ON \cdot cos\alpha \ (2)$$

olduğunu yaza bilərik. (1) və (2) bərabərliklərindən:

$AN^2 + AM^2 - 2AN \cdot AM \cdot cosA = OM^2 + ON^2 - 2OM \cdot ON \cdot cos\alpha$, və buradan da $2OM \cdot ON \cdot cos\alpha = OM^2 + ON^2 - AN^2 - AM^2 + 2AN \cdot AM \cdot cosA$ alınır. $OMA$ üçbucağından $OA^2 = OM^2 - AM^2$, $ONA$ üçbucaöından isə $OA^2 = ON^2 - AN^2$ olur. Axırıncı iki bərabərliyi nəzərə alsaq, $2OM \cdot ON \cdot cos\alpha = 2OA^2 + 2AN \cdot AM \cdot cosA$ olur. Hər iki tərəfi $2OM \cdot ON$ -ə bölsək $cosa = \frac{OA}{OM} \cdot \frac{OA}{ON} + \frac{AN}{ON} \cdot \frac{AM}{OM} \cdot cosA$ alınır. Şəkildən aydındır ki, $\frac{OA}{OM} = cosb, \frac{OA}{ON} = cosc, \frac{AN}{ON} = sinc, \frac{AM}{OM} = sinb.$

Bu qiymətləri sonuncu bərabərlikdə yerinə yazsaq:

$cosa = cosb \cdot cosc + sinb \cdot sinc \cdot cosA$ (3)

alarıq.

İndi fərz edək ki, $b$ və $c$ bucaqlarının hər biri $90^0$-dən böyükdür. Sferik üçbucağın $b$ və $c$ tərəflərini bir-biri ilə kəsincəyə qədər uzadaq (şəkil 3).



Şəkil 3

Bu tərəflər kürə üzərində $A_1$ nöqtəsində birləşəcəkdir.

Üçbucağın tərəfləri böyük dairənin qövsləri olduğu üçün $\angle A_1 = cosA$ olacaqdır. Alınmış ikinci $BCA_1$ sferik üçbucağında $(180^0 - b) < 90^0$, $(180^0 - c) < 90^0$ olacaqdır. $BCA_1$ sferik üçbucağı üçün (3) düsturunu yazaq:

$$cosa = cos(180^0 - b) \cdot cos(180^0 - c) + sin(180^0 - b) \cdot sin(180^0 - c) \cdot cosA_1$$

Burada $cos(180^0 - b) = cosb$ və ya $sin(180^0 - b) = sinb$ triqonometrik çevirmələrdən istifadə edərək yenə də (3) düsturunu alırıq. (3) düsturunu $b$ və $c$ tərəfləri üçün də uyğun olaraq yaza bilərik:

$$cosb = cosc \cdot cosa + sinc \cdot sina \cdot cosB \ (4)$$
$$cosc = cosb \cdot cosa + sinb \cdot sina \cdot cosC \ (5)$$

Sferik üçbucağın bir tərəfinin kosinusu qalan iki tərəfin kosinusları hasili ilə bu tərəflərin sinuslarının həmin tərəflər arasındakı bucağın kosinusu hasilinin cəminə bərabərdir.

(3), (4) və (5) düsturları sferik üçbucaq üçün kosinuslar düsturu adlanırlar. Bu düsturlardan istifadə edərək sferik üçbucaq üçün sinuslar düsturunu çıxaraq. (3) və (4) düsturlarından, $cosa - cosb \cdot cosc = sinb \cdot sinc \cdot cosA$; $cosb - cosc \cdot cosa = sinc \cdot sina \cdot cosB$ yaza bilərik. Bu iki bərabərliyin hər iki tərəfinin kvadratlarını götürək:

$cos^2a + cos^2b \cdot cos^2c - 2cosa \cdot cosb \cdot cosc = sin^2b \cdot sin^2c \cdot cos^2A$;

$cos^2b + cos^2a \cdot cos^2c - 2cosc \cdot cosb \cdot cosa = sin^2a \cdot sin^2c \cdot cos^2B$

Bunları tərəf-tərəfə çıxsaq:

$cos^2a - cos^2b + cos^2b \cdot cos^2c - cos^2c \cdot cos^2a = sin^2b \cdot sin^2c \cdot cos^2A - sin^2c \cdot sin^2a \cdot cos^2B$ və ya

$cos^2a \cdot (1 - cos^2c) - cos^2b \cdot (1 - cos^2c) = sin^2c \cdot (sin^2b \cdot cos^2A - sin^2a \cdot cos^2B)$

yaxud

$cos^2a \cdot sin^2c - cos^2b \cdot sin^2c = sin^2c \cdot (sin^2b \cdot cos^2A - sin^2a \cdot cos^2A)$ alaraq. Hər iki tərəfi $sin^2c$-yə ixtisar etsək, $cos^2a - cos^2b = sin^2b \cdot cos^2A - sin^2a \cdot cos^2B$ alarıq. Bu bərabərlikdə kosinusların hamısını sinuslarla əvəz edək;

$(1 - sin^2a) - (1 - sin^2b) = sin^2b \cdot (1 - sin^2A) - sin^2a \cdot (1 - sin^2B)$ və ya $-sin^2a + sin^2b = sin^2b - sin^2b \cdot sin^2b \cdot sin^2A - sin^2a + sin^2a \cdot sin^2B$ ixtisardan sonra isə $sin^2b \cdot sin^2A = sin^2a \cdot sin^2B$ və ya $\frac{sin^2a}{sin^2b} = \frac{sin^2A}{sin^2B}$ yaxud $\frac{sinA}{sina} = \frac{sinB}{sinb}$ alarıq.

Götürdüyümüz üçbucaqda tərəflərin uzunluğunu $90^0$-dən kiçik fərz etdiyimizdən kəsrin qabağında, kvadrat kök aldıqdan sonra bir işarə yazmadıq.

Yuxarıdakı qayda ilə $\frac{sinA}{sina} = \frac{sinC}{sinc}$ bərabərliyini də ala bilərik. Beləliklə,

$$\frac{sinA}{sina} = \frac{sinB}{sinb} = \frac{sinC}{sinc} \quad (6)$$

sinuslar düsturunu alırıq.

Sferik üçbucaqda, müstəvi üzərində olan üçbucaqdan fərqli olaraq, məlum daxili bucaqların vasitəsilə hər hansı tərəfin uzunluğunu tapmaq mümkündür.

(5) düsturundan $cosc$-nin qiymətini (3) və (4) düsturlarında yerinə yazaq:

$$cosa = cosb(cosa \cdot cosb + sina \cdot sinb \cdot cosC) + sinb \cdot sinc \cdot cosA \quad (7)$$

$$cosb = cosa(cosa \cdot cosb + sina \cdot sinb \cdot cosC) + sina \cdot sinb \cdot cosB \quad (8)$$

(7) düsturundan

$cosa = cosa \cdot cos^2 b + cosb \cdot sina \cdot sinb \cdot cosC + sinb \cdot sinc \cdot cosA,$

$cosa \cdot (1 - cos^2 b) = (cosb \cdot sina \cdot cosC + sinc \cdot cosA) \cdot sinb,$

$$cosa \cdot sin^2 b = (cosb \cdot sina \cdot cosC + sinc \cdot cosA) \cdot sinb$$

və ya

$$cosa \cdot sinb = cosb \cdot sina \cdot cosC + sinc \cdot cosA \quad (9)$$

Eyni qayda ilə (8) bərabərliyindən:

$$cosb \cdot sina = cosa \cdot sinb \cdot cosC + sinc \cdot cosB \quad (10)$$

alırıq.

Sinuslar düsturundan

$\frac{sina}{sinA} = \frac{sinb}{sinB} = \frac{sinc}{sinC} = m, sina = m \cdot sinA, sinb = m \cdot sinB, sinc = m \cdot sinC$

yaza bilərik. (9) və (10) ifadələrində sinusları əvəz edib, $m$-ə ixtisar etsək:

$$cosa \cdot sinB = cosb \cdot sinA \cdot cosC + sinC \cdot cosA \quad (11)$$

$$cosb \cdot sinA = cosa \cdot sinB \cdot cosC + sinC \cdot cosB \quad (12)$$

alarıq.

(12)-dən $cosb \cdot sinA$-nın (11)-də yazaq:

$cosa \cdot sinB = cosa \cdot sinB \cdot cos^2 C + sinC \cdot cosB \cdot cosC + sinC \cdot cosA,$

$cosa \cdot sinB \cdot (1 - cos^2 C) = sinC \cdot cosB \cdot cosC + sinC \cdot cosA,$

$$cosa \cdot sinB \cdot sin^2 C = sinC \cdot cosB \cdot cosC + sinC \cdot cosA$$

Hər tərəfi $sinC$-yə ixtisar etsək $cosa \cdot sinB \cdot sinC = cosB \cdot cosC + cosA$

buradan da

$$cosa = \frac{cosB \cdot cosC + cosA}{sinB \cdot sinC} \quad (13)$$

alarıq. Analoji olaraq:

$$cosb = \frac{cosA \cdot cosC + cosB}{sinA \cdot sinC} \quad (13')$$

$$cosc = \frac{cosA \cdot cosB + cosC}{sinA \cdot sinB} \quad (13'')$$

yazmaq olar.

Düzbucaqlı sferik üçbucağın həllinə aid düsturlar. Sferik üçbucaqda bucaqlardan biri, məsələn, $A = 90^0$ olsun. Bu zaman $cosA = 0$ olmaqla (3) düsturundan $cosa = cosb \cdot cosc$ (14) bərabərliyini alırıq. Bu bərabərlik sferik düzbucaq üçün Pifaqor teoremidir. Yəni düzbucaqlı sferik üçbucaqda hipetonuzun kosinusu katetlərin kosinusları hasilinə bərabərdir.

$A = 90^0$ olduqda $sinA = 1$ olur. Bu zaman sinuslar düsturundan: $\frac{sina}{sinb} = \frac{1}{sinB}$ olur. Buradan,

$$sinb = sina \cdot sinB \quad (15)$$

və eyni qayda ilə

$$sinc = sina \cdot sinC \quad (16)$$

yazırıq.

Hər hansı katetin sinusu hipetonuzun sinusu ilə bu katet qarşısındakı bucağın sinusu hasilinə bərabərdir.

Bundan başqa düzbucaqlı sferik üçbucağın həlli üçün aşağıdakı düsturlardan da istifadə edilir. Biz bu düsturları hazır veririk.

$$tgc = tga \cdot cosB \ (17)$$
$$tgb = tga \cdot cosC \ (18)$$

Düzbucaqlı sferik üçbucaqda hər katetin tangensi hipotenuzun tangensi ilə yanaşı bucağın kosinusu hasilinə bərabərdir.

$$tgc = sinb \cdot tgB \ (19)$$
$$tgc = sinb \cdot tgC \ (20)$$

Katetlərdən birinin tangensini o biri katetin sinusu ilə bu katetin qarşısındakı bucağın tangensi hasilinə bərabərdir.

$$cosa = ctgB \cdot ctgC \ (21)$$

Hipetonuz üzərindəki bucaqların kotengensləri hasili hipetonuzun kosinusuna bərabərdir.

$$cosB = sinC \cdot cosb \ (22)$$
$$cosC = sinB \cdot cosc \ (23)$$

Bucaqlardan birinin kosinusu digərinin sinusu ilə bu bucaq qarşısındakı tərəfin kosinusu hasilinə bərabərdir.

Sferik üçbucağın təpəsindən keçən və qarşıdakı tərəfinə perpendikulyar olan böyük dairənin qövsünə sferik üçbucağın hündürlüyü deyilir.

$ABD$ və $BCD$ düzbucaqlı sferik üçbucaqlardan (şəkil 4).



Şəkil 4

$$sinh_a = sinc \cdot sinA = sina \cdot sinC \ (24)$$
$$sinh_b = sinb \cdot sinC = sinc \cdot sinB \ (25)$$

(24) düsturunu $sinb$-yə (25) düsturunu $sina$-ya vuraq:

$$sinb \cdot sinh_b = sinb \cdot sinc \cdot sinA$$
$$sina \cdot sinh_a = sina \cdot sinb \cdot sinC$$

Alarıq. Sinuslar düsturundan $\frac{sina}{sinA} = \frac{sinc}{sinC}$; $sinc \cdot sinA = sina \cdot sinC$ nəzərə alsaq

$$sinb \cdot sinh_b = sinb \cdot sina \cdot sinC$$
$$sina \cdot sinh_a = sinb \cdot sina \cdot sinC$$

və ya

$$sinb \cdot sinh_b = sina \cdot sinh_a$$

bərabərliyini alarıq.

Deməli, hər hansı sferik üçbucaqda bir tərəfin sinusu ilə bu tərəfə endirilmiş hündürlüyün sinusu hasili sabitdir.

**Çəpbucaqlı sferik üçbucağın həlli üçün bəzi düsturlar**. Yuxarıdan məlum olan (3) nömrəli düstru götürək:

$$cosa = cosb \cdot cosc + sinb \cdot sinc \cdot cosA \ (3)$$

Buradan,

$$cosA = \frac{cosa - cosb \cdot cosc}{sinb \cdot sinc} \ (27)$$

eyni qayda ilə də

$$cosB = \frac{cosb - cosa \cdot cosc}{sinb \cdot sina} \ (28)$$
$$cosC = \frac{cosc - cosa \cdot cosb}{sinb \cdot sina} \ (29)$$

alarıq. Məlum, $sin\frac{A}{2} = \sqrt{\frac{1-cosA}{2}}$ düsturunu və $a + b + c = 2p$, $a + b - c = 2(p - c)$, $a - b + c = 2(p - b)$, $b + c - a = 2(p - a)$ bərabərliklərini nəzərə alsaq asanlıqla

$$sin\frac{A}{2}=\sqrt{\frac{\sin(p-b)\cdot\sin(p-c)}{sinb\cdot sinc}}\ (30)$$
$$sin\frac{B}{2}=\sqrt{\frac{\sin(p-c)\cdot\sin(p-a)}{sina\cdot sinc}}\ (31)$$
$$sin\frac{C}{2}=\sqrt{\frac{\sin(p-a)\cdot\sin(p-b)}{sinb\cdot sina}}\ (32)$$
tapırıq. Əgər $cos\frac{A}{2}=\sqrt{\frac{1-cosA}{2}}$ düsturundan istifadə etsək:
$$cos\frac{A}{2}=\sqrt{\frac{sinp\cdot\sin(p-a)}{sinb\cdot sinc}}\ (33)$$
$$cos\frac{B}{2}=\sqrt{\frac{sinp\cdot\sin(p-a)}{sinc\cdot sina}}\ (34)$$
$$cos\frac{C}{2}=\sqrt{\frac{sinp\cdot\sin(p-c)}{sinb\cdot sina}}\ (35)$$
alarıq.
(30), (31) və (32) düsturlarını uyğun olaraq (33), (34) və (35) düsturlarına tərəf-tərəfə bölsək:
$$tg\frac{A}{2}=\sqrt{\frac{\sin(p-a)\cdot\sin(p-c)}{sinp\cdot\sin(p-a)}}\ (36)$$
$$tg\frac{B}{2}=\sqrt{\frac{\sin(p-c)\cdot\sin(p-a)}{sinp\cdot\sin(p-b)}}\ (37)$$
$$tg\frac{C}{2}=\sqrt{\frac{\sin(p-a)\cdot\sin(p-b)}{sinp\cdot\sin(p-c)}}\ (38)$$
alınır.

Təyin ediləcək bucaqların hər biri $180^0$-dən kiçik olduğundan yarım bucaqlar da $90^0$-dən kiçik olacaqdır. Buna görə də köklərin işarələri həmişə müsbət götürülür. Bundan başqa köklərin altındakı vuruqlar da həmişə müsbətdir:
$$a+b+c<360^0, p<180^0, a+b>c, a+b+c>2c, 2p>2c, p>c,$$
$$p-c>0$$
Bu qayda ilə $p-a>0, p-b>0$ olduğundan bu bucaqların sinusları da həmişə müsbət olacaqdır.

(36) və (37) düsturlarını tərəf-tərəfə vursaq:
$$tg\frac{A}{2}\cdot tg\frac{B}{2}=\frac{\sin(p-c)}{sinp}\ (39)$$
və bu qayda ilə də
$$tg\frac{B}{2}\cdot tg\frac{C}{2}=\frac{\sin(p-a)}{sinp}\ (40)$$
$$tg\frac{C}{2}\cdot tg\frac{A}{2}=\frac{\sin(p-b)}{sinp}\ (41)$$
alarıq. (39), (40) və (41) düsturları sferik üçbucaqların həllində kontrol düsturlarıdır.

Burada aldığımız düsturlar sferik üçbucağın daxili bucağının tərəfləri vasitəsi ilə ifadələrdir.

İndi, əksinə, sferik üçbucağın tərəflərinin bu üçbucağın bucaqları vasitəsi ilə ifadəsini nəzərdən keçirək. (13) düsturundakı $cosa$-nın qiymətini $sin\frac{a}{2}=\sqrt{\frac{1-cosa}{2}}$ düsturunda yerinə yazaq:

$$sin\frac{a}{2}=\sqrt{\frac{sinB\cdot sinC-cosB\cdot cosC-cosA}{2sinB\cdot sinC}}=\sqrt{\frac{-|\cos(B+C)+cosA|}{2sinB\cdot sinC}}$$
$$=\sqrt{\frac{-2cos\frac{B+C+A}{2}-cos\frac{B+C-A}{2}}{2sinB\cdot sinC}}$$

alarıq və $\frac{B+C-A}{2}=P$ ilə işarə etsək $\frac{B+C-A}{2}=P-A,\frac{C+A-B}{2}=P-B,\frac{A+B-C}{2}=P-C$ nəticədə isə

$$sin\frac{a}{2}=\sqrt{\frac{-cosP\cdot\cos(P-A)}{sinB\cdot sinC}}\ (42)$$
$$sin\frac{b}{2}=\sqrt{\frac{-cosP\cdot\cos(P-B)}{sinA\cdot sinC}}\ (43)$$
$$sin\frac{c}{2}=\sqrt{\frac{-cosP\cdot\cos(P-C)}{sinB\cdot sinA}}\ (44)$$

alarıq. $cos\frac{a}{2}=\sqrt{\frac{1+cosa}{2}}$ düsturundan istifadə etdikdə isə

$$cos\frac{a}{2}=\sqrt{\frac{\cos(P-B)\cdot\cos(P-C)}{sinB\cdot sinC}}\ (45)$$
$$cos\frac{b}{2}=\sqrt{\frac{\cos(P-C)\cdot\cos(p-A)}{sinA\cdot sinC}}\ (46)$$
$$cos\frac{c}{2}=\sqrt{\frac{\cos(P-A)\cdot\cos(P-B)}{sinB\cdot sinA}}\ (47)$$

alarıq. (42), (43) və (44) düsturlarını uyğun olaraq (45), (46) və (47) düsturlarını tərəf-tərəfə bölsək

$$tg\frac{a}{2}=\sqrt{\frac{-\cos P\cdot\cos(P-A)}{\cos(P-B)\cdot\cos(P-C)}}\ (48)$$
$$tg\frac{b}{2}=\sqrt{\frac{-\cos P\cdot\cos(P-B)}{\cos(P-C)\cdot\cos(P-A)}}\ (49)$$
$$tg\frac{c}{2}=\sqrt{\frac{-\cos P\cdot\cos(P-C)}{\cos(P-A)\cdot\cos(P-B)}}\ (50)$$

alarıq. Bərabərliklərin sol tərəfləri həmişə müsbətdir, çünki sferik üçbucağın bir tərəfi həmişə $180^0$-dən kiçik, yarısı isə $90^0$-dən kiçik olmalıdır.

$P$ həmişə $90^0$-dən böyükdür, deməli, $\cos P$ həmişə mənfidir. Qalan bucaqlar da $90^0$-dən kiçikdir. Doğrudan da, $B+C-A<180^0$, $B+C+A<180^0+2A$, $\frac{B+C-A}{2}<90^0+A, P<90^0+A, P-A<90^0$ və s.

Odur ki, bu düsturlar da yuxarıdakı düsturlar kimi üçbucağın elementlərinin bütün qiymətlərində doğrudur. Gördüyümüz kimi düsturların çıxarılışında hər dəfə ikinci və üçüncü

düsturların yazılışı üç kəmiyyət arasında (istər A, B, C və istərsə a, b, c kəmiyyətləri arasında) dairə qanununun tətbiqi ilə başa çatdırılırdı. $a$-nı b ilə, b-ni c ilə, c-ni a ilə və s. əvəz etməklə, ikinci düsturu birincidən yenə bu qaydada əvəz etməklə üçüncü düsturu ikincidən alırıq. Bu qayda ilə bir ifadədən ikinci ifadəyə keçməyə, dairə qanunu ilə keçmə deyilir.

Sferik üçbucağın daxili bucaqların cəmi $180^0$-dən artıq olur. $A+B+C-180^0=E$, yəni üçbucaqda bucağın $180^0$-dən artıq olan qalıq qiymətinə üçbucağın ekssesi deyilir. (Eksses-latın sözü olmaqla artıqlıq və ya qalıq deməkdir).

Sferik üçbucağın elementləri onun qalan elementləri də ekssesindən asılı olaraq da təyin edilir. Bu zaman $P=\frac{A+B+C}{2}=90^0+\frac{E}{2}; P-A=90^0-\left(A-\frac{E}{2}\right)$, $P-B=90^0-\left(B-\frac{E}{2}\right)$, $P-C=90^0-\left(C-\frac{E}{2}\right)$ olur.

Bu qiymətləri yuxarıdakı düsturlarda yerinə yazmaqla sferik üçbucaq üçün ikinci bir qrup düsturlar almaq mümkündür.

**Problemin aktuallığı**: Orta ümumtəhsil məktəblərinin riyaziyyat təlimində tətbiq edilən fənn kurikulumunu nəzərə alaraq üçbucaqların həllində sferik triqonometriyadan istifadə edilməsi tədris materialının şagirdlər tərəfindən dərindən dərk edilməsinə müsbət təsir göstərir.

**Problemin elmi yeniliyi**: Riyaziyyat təlimində müasir təlim metodlardan istifadə edərək həndəsə elementlərinin öyrədilməsi şagirdlərin elmi-praktik vərdişlərinin yüksəldilməsinə, onların gələcək təhsillərini uğurla həyata keçirməsinə və yaxud mənimsəmənin optimallığını təmin etməyə müsbət təsir edir.

**Problemin praktik əhəmiyyəti:** Məqalə elementar riyaziyyat və riyaziyyatın tədrisi metodikasından mühazirə deyən və seminar məşğələləri aparan ali məktəb və orta ümumtəhsil məktəblərində çalışan müəllimlər, o cümlədən tədqiqatçılar üçün faydalıdır.

**Ədəbiyyat:**

1. Adıgözəlov A.S., Əliyeva T.M., Quliyev A.İ., Rzayev M.T. Elementar həndəsə. -Bakı, 2018.
2. Quliyev Ə.A., Quliyev Y.A, Riyaziyyat: Abituriyentlər üçün. -Bakı: Təbib, -2000.
3. Quliyev Ə.A., Quliyev Y.A. Planimetriyanın məsələ vasitəsilə təkrarı. -Bakı, 2008.
4. Mirzəyev S.S., Sadıqov Ş.M., Həndəsə - 8, Məsələ və tapşırıqlar həlli ilə. -Bakı: Çaşıoğlu, -2005.
5. Əliyev İ.F. Elementar həndəsə. -Bakı, 2009.
6. Əsgərov K.S., Adıgözəlov A.S., Məmmədov A.A. Həndəsədən məsələ həlli praktikumu: Dərs vəsaiti).-Bakı, V.İ. Lenin adına APİ-nin nəşri, -1986. - 117 s.
7. Əsgərov K.S., Axundov S.S. Elementar həndəsə. Bakı: APİ-nin nəşri, 1974. – 211 s.
8. Адамар Ж. Элементарная геометия. Ч.II. Стерометрия. -М., 1958, -787 с.
9. Аргунов Б.Ф., Балк М.Б. Элементарная геометия. -М., 1966.
10. Базылев В.Т. и.др. Геометрия, ч. I. -М., Просвешение, -1986, ч. II, 1987.

**E-mail:** mayilovaaysel981@gmail.ru
**Redaksiyaya daxil olub:** 28.11.2024

*UOT 372.857*

***Əliyənnağı Məhəmmədtağı oğlu Məhərrəmov,***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti*
*https://orcid.org/0000-0002-6752-7136*
*https://doi.org/10.69682/arti.2024.91(6).182-186*

***Aygül Elman qızı Mürsəlova***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

# BİOLOGİYANIN TƏDRİSİNDƏ TƏLİM VƏZİFƏLƏRİNİN VƏHDƏTDƏ ÖYRƏNİLMƏSİ, BU İSTİQAMƏTDƏ ELMİ-METODİK ƏDƏBİYYATIN TƏHLİLİ

***Алиянnаги Махаммадтаги оглы Магеррамов,***
*доцент Азербайджанского Государственного Педагогического Университета*

***Айгюль Эльман гызы Мурсалова***
*Азербайджанский Государственный Педагогический Университет*

# ОБУЧЕНИЕ В ЕДИНСТВЕ УЧЕБНЫХ ЗАДАЧ В ПРЕПОДАВАНИИ БИОЛОГИИ, АНАЛИЗ НАУЧНО-МЕТОДИЧЕСКОЙ ЛИТЕРАТУРЫ В ЭТОМ НАПРАВЛЕНИИ

***Aliyannaghi Mahammadtaghi Maharramov***
*associate professor*
*of Azerbaijan State Pedagogical University*

***Aygul Elman Mursalova***
*Azerbaijan State Pedagogical University*

# LEARNING IN THE UNITY OF EDUCATIONAL TASKS IN TEACHING BIOLOGY, ANALYSIS OF SCIENTIFIC AND METHODOLOGICAL LITERATURE IN THIS DIRECTION

**Xülasə.** Məqalədə ümumtəhsil məktəblərində biologiya dərslərində təlim vəzifələrinin vəhdətdə öyrənilməsi, təlimin tamlığı, bu istiqamətdə elmi-pedaqoji, metodik ədəbiyyat təhlil edilmişdir.

Pedaqoji ədəbiyyatlardan N.M.Kazımov, Ə.Ş.Həşimov. “Pedaqogika”, A.Həşimov, Ə.Ağayev. “Pedaqogika”, Məcid İsmixanov, Həsən Bayramov. “Pedaqogika” kitabları problem baxımından təhlil olunmuşdur. Adları çəkilən dərslik dərs vəsaiti müəlliflərinin təlim vəzifələri ilə bağlı fikirləri araşdırılmış, tədqiqatımızda istifadə edilmişdir. Pedaqoji ədəbiyyatlarda təlim vəzifələrinin əlaqəli öyrənilməsi fikrinə səthi yanaşmasına münasibət bildirilmişdir.

Metodik ədəbiyyatlardan Ə.M.Hüseynov, M.Ş.Balayev, Ə.M.Məhərrəmov, H.M.Hacıyeva, T.Q.Abdullayeva, G.N.Hacıyeva, P.M.Qafarovanın yazdıqları dərslik, dərs vəsaitləri, metodik vəsaitlərə problem baxımından münasibət bildirmiş, təhlil edilmiş, lazımlı fikirlərdən məqalədə istifadə olunmuşdur. Tədqiqatımızda belə bir fikri əsaslandırmışıq ki, biologiyadan təlim vəzifələrinə verilən tələblər nəzərə alınmalıdır.

***Açar sözlər:*** *təhsilləndirici, inkişafetdirici, tərbiyəedici, dünyagörüşü, təlim, anlayış, təhlil, bilik, bacarıq, vərdişlər.*

***Аннотация***: В статье проанализированы задачи обучения на уроках биологии в общеобразовательной школе, полнота преподавания, научно-педагогическая и методическая литература по этому направлению.

С точки зрения проблемы были проанализированы книги «Педагогика», Н.М.Казимова, А.Ш.Хашимова, А. Гашимова, А. Агаева, Маджида Исмиханова, Гасан Байрамова. В нашем исследовании были изучены и использованы мнения авторов указанных учебников относительно учебных задач. В педагогической литературе выражено отношение к поверхностному подходу, к идее связного обучения учебным задачам.

Из методической литературы, учебников, методических пособий, написанных А.М.Гусейновым, М.Ш.Балаевым, А.М.Магеррамовым, Х.М.Гаджиевой, Т.Г.Гаджиевой, П.М.Гафаровой, в статье были использованы проанализированы полезные идеи. В нашем исследовании мы обосновали мысль о необходимости учитывать требования к учебным задачам по биологии.

***Ключевые слова:*** *образовательный, развивающий, воспитательный, мировоззрение, обучение, понятие, анализ, знания, умения, навыки*

***Abstract:*** In the article, the study of teaching tasks in biology classes in secondary schools, completeness of teaching, scientific-pedagogical and methodical literature in this direction were analyzed.

N.M. Kazimov, A.Sh. Hashimov from pedagogical literature. "Pedagogy", A. Hashimov, A. Agayev. "Pedagogy", Majid Ismikhanov, Hasan Bayramov. "Pedagogy" books were analyzed in terms of problems. The opinions of the authors of the mentioned textbooks regarding the educational tasks were investigated and used in our research. Pedagogical literature has expressed an attitude towards the superficial approach to the idea of connected learning of educational tasks.

From methodical literature, textbooks, teaching aids, methodical aids written by A.M. Huseynov, M.Sh. Balayev, A.M. Maharramov, H.M. Hajiyeva, T.G. Abdullayeva, G.N. Hajiyeva, P.M. Gafarova were analyzed in the article from the point of view of problems, analyzed and useful ideas. has been used. In our study, we have substantiated the idea that the requirements for teaching positions in biology should be taken into account.

***Keywords:*** *educational, developmental, educational, outlook, training, understanding, analysis, knowledge, skills, habits*

Azərbaycanın sosial iqtisadi və mənəvi siyasi həyatında pedaqoji elmin əhəmiyyəti böyükdür. Pedaqoji proses, yəni təlim tərbiyə, təhsil və inkişaf pedaqogikanın əsas anlayışlarıdır. İctimai həyatın bütün sahələrində təlim tərbiyə və təhsil problemlərini öyrənib əsaslandırılmış tövsiyələr verməklə adamların mənəviyyatını zənginləşdirməyə, mədəniyyətini artırmağa, cəmiyyətin inkişafını sürətləndirməyə kömək edir. Gənc nəslin bəşəriyyətin əldə etdiyi elmi-texniki və əxlaqi mənəvi sərvətlərə yiyələnməsi bir vətəndaş kimi yetişməsi bir sıra mühüm amillərlə ölçülür. Bunların sırasında təlimin imkanları şəksizdir. Bu iş bilavasitə müəllimin, o cümlədən biologiya müəlliminin üzərinə düşür. Biologiya müəllimi şagirdin təhsili, tərbiyəsi və şəxsiyyətinin inkişaf etdirilməsi vəzifələrinin kompleks həllinə nail olmağı zəruri sayır. Biologiya təlimi prosesində üç funksiya yerinə yetirilir. Təhsil vermək, şəxsiyyəti (şagirdi) tərbiyə və inkişaf etdirmək. Təlimin bu üç funksiyası bir-birindən tədris olunmuş halda deyil, vəhdətdə həyata keçirilir.

Problemin elmi-metodik ədəbiyyatlarda qoyuluşunun keçmiş və müasir pedaqoq alimlərin, metodistlərin, əsər müəlliflərinin ona münasibətini öyrənilib təhlil edilməsinin əhəmiyyəti böyükdür. Bu səbəbdən pedaqoji, elmi-metodik ədəbiyyatları təhlil etməyi vacib hesab etdik. Problem baxımından elmi-metodik ədəbiyyata nəzər saldıqda aydınlaşdırdıq ki, bu əsərlərdə geniş məlumatlar var. Təlimin vəzifələrinin əlaqəli öyrənilməsinə səthi yanaşmışlar. Təlimin təhsilverici, inkişafetdirici, tərbiyəedici vəzifələrinin əlaqəli öyrənilməsinin üstünlüklərini əsaslandırmamışlar. Ayrı-ayrı aspektlərə münasibət bildirmişdilər. İlk növbədə pedaqogikadan dərslikləri təhlil etdik. N.M. Kazımov, Ə.Ş. Həşimov "Pedaqogika" dərsliyində (1) təlim haqqında geniş məlumat verilmişdir. Təlimin başlıca vəzifələri (1. s.102) işlənilmişdir. Müəlliflər yazırlar ki, təlimin təhsiləndirici vəzifəsi zamanı şagirdlər elmi bilikləri mənimsəyir, ümumi və xüsusi səciyyəli bacarıq və vərdişlər əldə edirlər. Elmi bilik deyəndə təbiət və cəmiyyətə aid şübhə doğurmayan, isbat olunmuş faktlar, anlayışlar, qanunlar qaydalar, nəzəriyyələr, teoremlər, ümumiləşmələr nəzərdə tutulur (1, s.103). Təlimin tərbiyəedici

vəzifəsi dedikdə təlimin hər cəhəti-təlimin məzminunda, tətbiq olunma üsullarında, təlimin təşkili forması da, təlimdə şagird-müəllim, şagird-şagird münasibətləri də tərbiyə edir.

Təlimin məzmunu şagirdlərdə əsasən dünyagörüşü formalaşdırır. Təlimin tərbiyələndirici vəzifəyə malik olduğunu aydın başa düşən və bu cəhəti öz işində nəzərə alan müəllimin dərslərinin tərbiyəvi təsir gücü xeyli artır. Təlimin təhsilləndirici və tərbiyələndirici vəzifələri biri-birini tamamlayır. Yerindəcə fikrimizi bildirək ki, ümumtəhsil məktəblərimizdə biologiya müəllimləri bu işin öhdəsindən gələ bilmirlər, əksər müəllimlər təhsilləndirici vəzifəni əsas hesab edərək, tərbiyələndirici vəzifədən yan keçirlər. Qeyd etdiyimiz müəlliflərin fikri yerinə yetirilmir. N.M. Kazımov, Ə.Ş. Həşimov təlimin inkişafetdirici vəzifəsinə münasibətləri belədir: Təlim prosesi obyektiv olaraq nəinki təhsil verir və tərbiyə edir, həm də şagird şəxsiyyətini inkişaf etdirir. Təlimin məzmununu və metodikasını dəyişməklə uşaqların inkişaf səviyyəsini yeniləşdirmək mümkündür.

Təlimdə şagirdlərin inkişafı onlarda nitq və təfəkkürün, hiss və həyəcanların, qabiliyyətlərin və s. psixi proses və xüsusiyyətlərin birlikdə inkişafı deməkdir (1, s.103).

Deyilənlərdən aydın olur ki, bütövlükdə fənnin tədrisi, ayrı-ayrı mövzuların öyrənilməsi planlaşdırılan zaman təlimin təhsilləndirici funksiyası ilə yanaşı, hökmən onun tərbiyələndirici və inkişafetdirici funksiyası da nəzərə alınmalıdır. Müəllimlər təlimin təhsilləndirici funksiyasını önə çəkirlər, bununla öz işlərini bitmiş hesab edirlər. Məsələnin qoyuluşu daha ciddi olmalıdır. Belə ki, təlimin hər üç vəzifəsinə müəllimlər eyni məsuliyyətlə yanaşmalıdırlar. Dərs prosesində hər üç vəzifə tam yerinə yetirilməli, birgə aparılmalıdır.

Ağahüseyn Həşimov, Əjdər Ağayev "Pedaqogika" adlı dərsliklərində (2) təhlilə cəlb olunmuş problemlə bağlı maraqlı fikirlər vermişdilər. Dərsliklərində yazırlar ki, təlimin mühüm vəzifələri elmləndirmək, təhsil vermək, şəxsiyyətin inkişafını təmin etmək, şəxsiyyəti tərbiyə etmək, qazanılmış biliklərin həqiqiliyinə inandırmaq və fəaliyyətin elmi icrasına alışdırmaqdan ibarətdir (2, s.119). Müəlliflərə görə təlimin vəzifələri sırasına daha iki mühüm vəzifə də daxil edilir. Təlimin qazanılmış biliklərin həqiqiliyinə tam inam yaratmaq (inandırmaq) və bilikləri fəaliyyətdə tətbiq etmək qabiliyyətinə alışdırmaq (alışdırma) vəzifələrini yerinə yetirməlidir. Bu vəzifələri yerinə yetirməyin təlim həmişə uğursuzluqla nəticələnir. Dərslikdə qeyd edilir ki, indiyə qədər inandırma və alışdırma anlayışları təlim vəzifələrinə daxil edilməmişdir. Çünki inandırma və alışdırma tərbiyənin üsulu hesab edilir. Müəlliflərə görə əgər təlim bütün hallarda tərbiyə etmək məqsədini həyata keçirirsə, deməli həqiqətən inandırma və alışdırma təlimin əsas vəzifələridir. Əgər təlim prosesində qazanılmış biliklər inandırıcı olmasa və tətbiqetmə fəaliyyətinə alışdırılmasa, onda təlimin tərbiyəedici vəzifəsini layiqincə yerinə yetirə bilməz. Məhz təlimin tərbiyəedicilik imkanlarını yüksəltmək məqsədilə "inandırma və alışdırma" nı təlimin mühüm vəzifələri kimi əsas götürürük (2, s.119). Müəlliflər təlimin vəzifələrini kitablarında hərtərəfli izah ediblər. Lakin orada təlim vəzifələrinin vəhdətdə öyrədilməsinin imkanlarını, əhəmiyyətini yetərincə verməmişdilər.

M. İsmixanov, H. Bayramov "Pedaqogika" adlı dərs vəsaitlərində göstərirlər ki, təlim üç başlıca funksiyaları yerinə yetirir: öyrənmək, tərbiyə etmək və inkişaf etdirmək (3, s.139). Müəlliflərə görə təlimin öyrədici funksiyası şagirdləri proqram dairəsində bilik, bacarıq və vərdişlərlə silahlandırmaqda ifadə olunur. Təlimin öyrədici funksiyasının yaratdığı bacarıqlara yiyələnən şagirdlər uğurla oxuyur, təlimdə az vaxt və qüvvə sərf etməklə daha yüksək nəticələrə nail olurlar. Təlimin tərbiyəedici funksiyasını izah edən müəlliflər göstərirlər ki, gənc nəsildə vətənpərvərlik, milli iftixar hissi, humanizm və digər ideya-mənəvi keyfiyyətlər tərbiyə etməkdə onlara yüksək hisslər aşılamaqda təlim əvəzsiz vasitədir. Təlimin inkişafetdirici funksiyası müəlliflərə görə təlim prosesində şagirdlərin ümumi inkişafında, psixi proseslərinin təşəkkülündə ifadə olunur. Təlim özlüyündə şagirdlərin diqqətinin, hafizəsinin, təfəkkür və təxəyyülünün inkişafını təmin edir. Bunun üçün təlimi xüsusi istiqamətləndirmək lazımdır. Məcid İsmixanov, Həsən Bayramov təlimin funksiyalarına onların vəhdətdə olmasına düzgün münasibət bildirirlər. Ancaq müəllimlərin qarşısında təlim funksiyalarının birgə öyrədilməsini bir vəzifə olaraq qoymurlar. Təlimin tərbiyəedici, inkişafetdirici funksiyalarında təhsilverici qədər önəminin vacibliyini xüsusi qeyd etmirlər. Bütün

fənn müəllimləri kimi biologiya müəllimləri də yayınır, yalnız öyrədici funksiyaya önəm verirlər.

Ə.M. Hüseynov "Orta məktəbdə biologiya tədrisinin nəzəri və metodiki əsasları" kitabında (4, s.184-185) biologiya təliminin vəzifələrini ayrıca izah etmir. Müəllif təlim funksiyalarını fənlərarası əlaqə baxımından verir. Problem baxımından, yəni biologiyada təlim vəzifələrinin əlaqəli öyrədilməsinin vacibliyinə toxunmur.

Ə.M. Hüseynov, M.Ş. Babayev, Ə.M.Məhərrəmovun nəşr etdirdikləri "Biologiya tədrisinin ümumi metodikası" adlı dərs vəsaitində (5) məktəbdə biologiyanın tədrisi xüsusiyyətləri mühazirə formasında verilir. Dərs vəsaitində qoyulmuş problem "Biologiya dərs sisteminin formaları", "Dərs-biologiya tədrisinin əsas formasıdır", "Biologiyanın tədrisində tərbiyə məsələləri", "Əmək mədəniyyətinin tərbiyə edilməsi" başlıqları altında qismən izah edilmişdir. Müəlliflər qeyd edirlər ki, təlim və tərbiyə daim vəhdət təşkil edir. Təlimsiz tərbiyə tərbiyəsiz təlim ayrı-ayrılıqda səmərəsiz bir şeydir. Hazırda cəmiyyətimizin yeniləşməsi ilə əlaqədar olaraq milli və vətənpərvərlik kimi tərbiyəyə daha geniş imkanlar açılmışdır. Hər bir gənc ilk növbədə inamlı, elmli və həyatı dərindən dərk edə bilən, təşəbbüskar və əməksevər olmalıdır (5, s.112).

Pərvin Qafarovanın nəşr etdirdiyi "Biologiyanın tədrisi metodikası" dərsliyi tədqiq etdiyimiz problem baxımından diqqətə layiqdir (6). Müəllif kitabında ümumtəhsil məktəblərində biologiyanın tədrisi prosesində bir sıra prinsipləri əsas götürür.

Birinci prinsip pedaqoji prosesin tamlığını qeyd edir. Bu prinsip şagirdlərin hərtərəfli inkişaf etmiş bir şəxsiyyət kimi formalaşmasını nəzərdə tutur. Təhsil öyrədici, inkişafetdirici və tərbiyəedici bir proses kimi götürülür. Biologiya fənninin tədrisi prosesində şagird canlılar aləmində baş verən hadisə və prosesləri, canlıların ətraf mühitlə əlaqəsi, insanın özünəməxsus həyat xüsusiyyətləri barədə bilik və bacarıqlara yiyələnir. Biologiya kurikulumda canlılara xas quruluş formalarının, onların həyat xüsusiyyətlərinin müqayisəli təqdim edilməsi müxtəlif aləmlərə aid canlı nümunələrin sadədən mürəkkəbə doğru müqayisəli təqdim edilməsi şagirdlərdə analitik düşüncə tərzinin formalaşması ilə yanaşı, canlılar barədə yığcam və lokanik məlumat almaq imkanı yaradır (6, s.124).

Biologiya dərslərində onun vəzifələri bir-biri ilə əlaqəli şəkildə həyata keçirilməsi vəsaitdə qeyd edilmişdir (7, s.117). Qeyd edilir ki, dərsin tipindən asılı olaraq hər hansı bir vəzifə daha qabarıq, digərləri özünü nisbətən zif göstərə bilər. Fikrimizcə müəlliflər dərsin vəzifələrini müəllimlərin qarşısında bir vəzifə olaraq qoysaydılar daha yaxşı olardı.

Dos. G.N. Hacıyevanın "Biologiyanın tədrisi metodikası" (ali məktəblər üçün dərslik) kitabını problem baxımından araşdırdıq (8). Müəllif XII bölümdə "Dərs təlimin əsas formasıdır" məsələlərinin izahını verir, təlimin üç vəzifəsini göstərir: təhsilləndirici dərs, inkişafetdirici dərs, tərbiyəedici dərs.

G.N. Hacıyeva təlimin vəzifələrinin əlaqəli öyrədilməsinin imkanlarından, müsbət tərəflərindən, vacibliyindən danışmayıb, qeyd etməyib. Bunlara baxmayaraq tədqiqatımız üçün yaxşı mənbələrdən biridir.

Tanış olduğumuz və təhlil etdiyimiz elmi pedaqoji əsərlərin araşdırılmasından belə bir nəticəyə gəldik ki, onların hər birində problemin həllinə yaxınlaşma, müəyyən fikirlərin izahına rast gəlinir. Təhlil etdiyimiz ədəbiyyatlarda bir başa olmasa da dolayısı ilə təlim vəzifələrinin vəhdətdə öyrənilməsinin vacibliyini göstərməyə çalışıblar, müəyyən fikirlər söyləyiblər. Apardığımız tədqiqat işimizdə həmin fikirlərdən faydalanmaq mümkündür. Təhlil etdiyimiz müəlliflərin əsərlərində təlimin təhsilverici, tərbiyəedici, inkişafetdirici vəzifələrinin tam həll olunmadığına əminlik yaratdı. Bu sahəyə elmi-pedaqoji, metodik ədəbiyyatlarda münasibətin hansı səviyyədə olduğu müəyyənləşdirildi. Təhlil zamanı boşluqların, nöqsanların xarakteri aşkar edildi, daha çox diqqət edilməli aspektlər aydınlaşdırıldı. Müəyyən edildi ki, biologiyadan təlim vəzifələri mövzular üzrə əvvəlcədən müəyyən edilməlidir. Biologiyada təlim vəzifələrinə verilən tələblər nəzərə alınmalıdır.

**Problemin aktuallığı**: Məqalədə ümumtəhsil məktəblərində biologiya dərslərində təlim vəzifələrinin vəhdətdə öyrənilməsi bu istiqamətdə elmi-pedaqoji ədəbiyyat təhlil edilmişdir. Adları çəkilən dərslik, dərs vəsaitləri, metodik vəsaitlərin müəlliflərin fikirləri araşdırılmış, mövzunun aktuallığı baxımından təhlili zəruri sayılmışdır. Elmi-pedaqoji, metodik ədəbiyyatlarda təlim vəzifələrinin öyrənilməsi haqqında fikirlər söylənmişdir. Məqalənin aktuallığı onunla

əsaslandırılır ki, biologiyadan təlim vəzifələrinin vəhdətdə öyrənilməsi müəllimlər qarşısında bir vəzifə kimi qoyulmalıdır. Biologiya müəllimi təhsilləndirici vəzifəni necə yerinə yetirirsə, tərbiyəedici və inkişafetdirici vəzifəyə də o qədər önəm verməlidir. Təlimin vəzifələrindən mövzuya uyğun necə istifadə edəcəyini biologiya müəllimi əvvəlcədən müəyyənləşdirməlidir. Təlim əsas götürülən üç vəzifəsinə verilən tələblər düzgün yerinə yetirilməlidir. Bütün bu deyilənlərin yerinə yetirilməsinin aktuallığı məqalənin işlənilməsini zəruri etdi.

**Problemin elmi yeniliyi**: Ümumtəhsil məktəblərində biologiya dərslərində təlim vəzifələrinin əlaqəli öyrədilməsinin vacibliyi əsaslandırılmışdır. Problem baxımından məqalədə elmi-pedaqoji, metodik ədəbiyyat təhlil edilmiş, müəlliflərin dəyərli fikirləri dissertasiyamızda istifadə olunacaq qənaətinə gəlmişdir. Biologiya müəllimlərinə dərslərində təlim vəzifələrinin imkanlarından istifadə etmələri tövsiyə olunmuşdur. Ümumtəhsil məktəblərimizdə şagirdlərin hərtərəfli inkişafı, geniş dünyagörüşlərinə malik olmaları, cəmiyyətin tələblərinə cavab vermələri, şəxsiyyət kimi formalaşmaları nəzərə alınmalıdır.

**Problemin praktik əhəmiyyəti**: Məqalədə təlim vəzifələrinin əlaqəli öyrənilməsi ilə bağlı görkəmli pedaqoq alimlərin, metodistlərin fikirləri təhlil edilmiş, yazdıqları dərsliklərə, dərs vəsaitlərinə münasibət bildirilmişdir. Süzgəcdən keçirərək üzə çıxardığımız dəyərli fikirlərdən biologiya müəllimləri faydalanacaqlar. Məqalədə verilmiş geniş material müəllimlər üçün çox faydalı olacaqdır. Məqalə yazılacaq dissertasiyanın aktuallığını bir daha ortaya qoyur. Ümumtəhsil məktəblərimizdə problemin həllinə tədqiqat işi köməklik göstərəcəkdir.

**Ədəbiyyat:**


1. N.M. Kazımov, Ə.Ş. Həşimov. Pedaqogika, Bakı, 1996, 413 s.
2. A. Həşimov, Ə. Ağayev. Pedaqogika (dərslik), Bakı, 2007, 493 s.
3. Məcid İsmixanov, Həsən Bayramov. Pedaqogika. Bakı, 2022, 420 s.
4. Ə.M. Hüseynov. Orta məktəbdə biologiya tədrisinin nəzəri və metodiki əsasları. Bakı, 2000, 266 s.
5. Ə.M. Hüseynov, M.Ş. Babayev, Ə.M. Məhərrəmov. Biologiya tədrisinin ümumi metodikası. Bakı, 2003, 138 s.
6. Pərvin Qafarova. Biologiyanın tədrisi metodikası. Dərslik. Bakı, 2024, 195 s.
7. H. Hacıyeva, T. Abdullayeva, E. Hacıbəyova. Ümumtəhsil məktəblərində biologiyanın fəal təlim metodları ilə tədrisi metodikası. Metodik vəsait. Bakı, 2014, 210 s.
8. Gülşən Hacıyev. Biologiyanın tədrisi metodikası. Ali məktəb üçün dərslik. Bakı, 2022, 424 s.



**E-mail:** ayqulmursalova02@gmail.com



**Redaksiyaya daxil olub:** 27.11.2024

UOT 372.857

***Xoşqədəm Qonaq qızı İbrahimova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti,*
*pedaqogika üzrə fəlsəfə doktoru*
*https://orcid.org/ 0000-0002-5987-3346*
*https://doi.org/10.69682/arti.2024.91(6).187-191*

# ÜMUMTƏHSİL MƏKTƏB BİOLOGİYASININ TƏDRİSİNDƏ FİTOTERAPEVTİK BİLİKLƏRİN ÖYRƏNİLMƏSİ İMKANLARI

***Хошгедам Гонак гызы Ибрагимова***
*доцент*
*Азербайджанского Государственного Педагогического Университета,*
*доктор философии по педагогике*

# ВОЗМОЖНОСТИ ИЗУЧЕНИЯ ФИТОТЕРАПЕВТИЧЕСКИХ ЗНАНИЙ ПРИ ПРЕПОДАВАНИИ БИОЛОГИИ В ОБЩЕОБРАЗОВАТЕЛЬНОЙ ШКОЛЕ

***Khoshgadam Gonag Ibrahimova***
*associate professor*
*of Azerbaijan State Pedagogical University,*
*doctor of philosophy in pedagogy*

# POSSIBILITIES OF STUDYING PHYTOTHERAPEUTIC KNOWLEDGE IN TEACHING SCHOOL BIOLOGY

**Xülasə.** Məqalə orta məktəblərdə biologiyanın tədrisi zamanı şagirdlərə fitoterapevtik biliklərin öyrədilməsi imkanlarına həsr edilmişdir. Problemin həlli imkanları dərsliklərdə və elmi-metodiki ədəbiyyatda araşdırılmışdır. Dərsliklərin təhlilindən belə qənaətə gəlinir ki, 7, 8-ci sinif dərsliklərində xəstəliklərin müalicəsində və profilaktikasında dərman bitkilərinin böyük əhəmiyyəti vardır. Belə məzmunlu bir çox mövzular dərsliklərdə öz əksini tapmışdır. Fənn kurikulumunun standartlarının həyata keçirilməsinə uyğun olaraq şagirdlərə fitoterapevtik biliklərin öyrədilməsinə imkan verən mövzular müəyyən edilmişdir.

Lakin problemlə bağlı mövzuların sayını artırmaq, xüsusən də 9-11-ci sinif dərsliklərinə belə mövzuları daxil etmək olar. Elmi-metodiki ədəbiyyatın təhlilindən məlum oldu ki, problemin həlli istiqamətində tədqiqatlar tam aparılmayıb, bu sahədə araşdırmalar azdır. Müəllimlərə problemlərin həllində metodik kömək üçün əsərlərin yazılması vacib məsələlərdən biridir.
***Açar sözlər:*** *fitoterapevtik bilik, flora, çobanyastığı, nanə, dərman bitkiləri, tədqiqat, xəstəlik, müalicə*

**Аннотация.** Статья посвящена возможностям обучения школьников фитотерапевтическим знаниям при преподавании биологии в общеобразовательной школе. Возможности решения проблемы исследуются в учебниках и научно-методической литературе. Из анализа учебников делается вывод, что в учебниках 7, 8 классов лекарственные растения имеют большое значение в лечении и профилактике заболеваний. Многие темы такого содержания нашли отражение в учебниках. В соответствии с реализацией нормативов предметного курикулума установлены темы, позволяющие обучать учащихся фитотерапевтическим знаниям. Однако можно несколько увеличить темы, связанные с проблемой, особенно включить такие темы в учебники 9-11 классов. Из анализа научно-методической литературы стало ясно, что исследования по решению проблемы проведены не в полной мере, работ в этой области немного. Написание работ, которые помогут учителям в решении задач, является одним из важных вопросов.
***Ключевые слова***: *фитотерапевтические знания, флора, ромашка, мята, лекарственные растения, исследование, болезнь, лечение*

**Abstract**. The article is devoted to the possibilities of teaching phytothera-peutic knowledge to students in the teaching of biology in secondary schools. Possibilities of solving the problem are investigated in textbooks and scientific-methodical literature. From the analysis of the textbooks, it is concluded that in the textbooks of the 7th, and 8th grades, medicinal plants and plants are of great importance in the treatment and prevention of diseases. Many topics in this content are reflected in textbooks. In accordance with the realization of the standards of the subject curriculum, the topics that allow students to be taught phytotherapeutic knowledge have been established. However, it is possible to slightly increase the topics related to the problem, especially to include such topics in the 9-11th grade textbooks. From the analysis of scientific-methodical literature, it became clear that the research on the solution of the problem has not been fully conducted, there are few works in this field. Writing works that will help teachers with problem solving is one of the important issues.

***Keywords***: *phytotherapeutic knowledge, flora, chamomile, mint, medicinal plants, research, disease, treatment*

Hazırda dünyada xəstəliklərin müalicə və profilaktikasında təbii müalicə vasitələrinə qayıdış sürətlənir. Dünyanın bir çox ölkələrində bitkilərin kimyəvi tərkibi öyrənilir, onların tərkibindəki təsiredici maddələrin, xüsusilə qlikozidlərin, alkaloidlərin, kumarinlərin, flavonoidlərin, izoflavonoidlərin, antosianların, xlorofil, karotinoid, vitaminlərin və çoxlu sayda bioloji aktiv maddələrin alınma üsullarının tədqiqi ilə məşğul olan çoxlu elmi tədqiqat institutları fəaliyyət göstərir. Azərbaycanda Biyan Sənaye Parkına aid Bitki Ekstrakı və Sirop Zavodunda 100% bitki mənşəli, yüksəkkeyfiyyətli, bioloji fəallığa malik qida əlavələri istehsal olunur. Onlar, tənəffüs yollarının iltihablarında, bronxit, traxeit, pnevmoniyaların müxtəlif növlərində, zökəmin və immun sisteminin fəsadlarında çox effektiv təsir göstərir. Dərman bitkiləri müxtəlif xəstəliklərin müalicəsi və profilaktikasında istifadə olunan geniş bitki qrupudur. Bu gün dünyada ənənəvi və xalq təbabətində istifadə olunan təxminən 12 000 dərman bitkisi müalicəvi xüsusiyyətlərə malikdir.

Azərbaycan florası tərkibində əvəzi olmayan, dünyanın heç bir yerində rast gəlinməyən fitosenozları ilə məşhurdur. Azərbaycan florasında tərkibində 1720 növ yabanı, 80 növ isə mədəni halda yayılmış 1800 qədər dərman əhəmiyyətli bitkilərə rast gəlinir. Bu da floramızın 40%-ni təşkil edir [4, s.399].

Xalq təbabətinin inkişafında Hippokratın, Qalenin, orta əsrlərdə isə İbn Sinanın böyük rolu olmuşdur və hal-hazırda da davam edən tədqiqatlar səmərəliyi ilə fərqlənir.

Əbu Əli İbn Sina məşhur əsərlərin müəllifi olmuş ("Təbiətin qanunu", "Anotomiya və fiziologiyaya giriş") və onun iki əsərindən - "Qanuni-tibb" və "Şəfa" əsərlərindən uzun illər Avropa universitetlərində dərslik kimi istifadə edilmişdir [4, s.38].

Sağlam nəslin yetişməsi tibbi-gigiyenik, ekoloji, o cümlədən fitoterapevtik biliklərin verilməsindən çox asılıdır. Fitoterapevtik biliklər müalicəvi əhəmiyyətli bitkilər, onların müalicəvi xüsusiyyətləri, istifadə qaydaları, qorunması və s. ibarət biliklərdir.

Sağlamlıq uzunömürlülüyün əsasını təşkil edərək, yaradıcı planların həyata keçirilməsi, cəmiyyətin inkişafına xidmət edən yüksək əmək fəallığı, normal münasibətli ailə qurmaqla, dünyaya sağlam uşaq gətirilməsi və tərbiyə edilməsinin vacib şərtlərindən biri olub, insanın fiziki və mənəvi keyfiyyətlərinin məcmusudur. Sağlam olmaq, uzun ömür yaşamaq istəyən insan sağlamlığın nə olduğunu, ona təsir edən müsbət və mənfi amilləri öyrənən, müsbət amillərdən yerində, düzgün istifadə edən, zərərli vərdişlərdən uzaq olanlardır [2, s. 46 ].

Ümumtəhsil məktəblərində biologiyanın tədrisində tibbi, fitoterapevtik biliklərin verilməsi baxımından geniş imkanlara malikdir. Bitkilərin xüsusiyyətləri, tərkibi, əhəmiyyəti, xəstəliklərin müalicəsində istifadə edilməsi kimi mövzular əsasən 7-ci siniflər üçün biologiya dərsliyində verilmişdir. 7-ci sinif biologiya dərsliyində fitoteprapevtik biliklərin verilməsi imkanı baxımından mövzular çoxdur. Bunlara aşağıdakıları misal göstərmək olar.

"Qatırquyruqlular və plaunlar. Qıjıkimilərin əhəmiyyəti" mövzusunda qıjıkimilərin kökümsovundan qurd xəstəliklərinin, çöl qatırquyruğundan isə böyrək xəstəliklərinin müalicəsində geniş istifadə edildiyi qeyd olunur. O, eyni zamanda qankəsici vasitə kimi də faydalıdır [3, s.75].

"İkiləpəlilər sinfi. Xaççiçəklilər və gülçiçəklilər fəsiləsi" mövzusunda qeyd olunur ki,

xaççiçəklilərin bir qismi müalicəvi xüsusiyyətə malikdir. Qüşəppəyinin yarpaqları C vitamini ilə zəngindir və o, qankəsici xüsusiyyətə malikdir. Dərman şüvərəni, ağ turpdan tənəffüs yollarının xəstəliklərinin müalicəsində istifadə olunur. Gülçiçəklilər fəsiləsindən itburnu, yemişan, dərman qaniçəni, dərman siçanotu, adi moruq, meşə çiyələyi, böyürtkəndən də geniş istifadə olunur [6, s. 37].

"İkiləpəlilər sinfi. Paxlalılar və badımcançiçəklilər fəsiləsi" mövzusunda da fitoterapevtik biliklərə yer verilmişdir. Orada qeyd olunur ki, fəsiləyə daxil olan bitkilərin (quşüzümü, bat-bat, qafqaz xanımotu, dəlibəng və s.) gövdəsində alkoloidlər toplanır ki, onlardan müxtəlif dərmanlar alınır [4, s. 260].

"İkiləpəlilər sinfi. Mürəkkəbçiçəklilər fəsiləsi" mövzusunda göstərilir ki, mürəkkəbçiçəklilərin üçbarmaq, andız, çoxillik qızçiçəyi, Qafqaz qurucası, qatlı quruçiçək, qumsal quruçiçək (solmazçiçək), adi pıtraq, yeralması, üçbölümlü yatıqqanqal, adi dağtərxunu, yovşan, dəvədabanı, gülümbahar, bozumtul sarı kosmos, adi çaqqalqanqalı, gözəl rapontikum, əkin göyçiçəyi (güləvər), boymadərən, əkilən kahı, sabahgülü, mollabaşı, qızılsəbət, zəncirotu kimi nümayəndələri dərman bitkiləri hesab olunur [3, s. 203].

Zanbaqkimilərdən qarğagözü, may inciçiçəyindən də dərman kimi və müxtəlif dərmanların hazırlanmasında xammal kimi istifadə olunur. [6.s.43].

"Dərman bitkilərinin müalicəvi xüsusiyyətləri və onlardan istifadə qaydaları" mövzusunda qeyd olunur ki, dərman bitkiləri xalq təbabətində, tibbi və ya baytarlıq praktikasında müalicəvi və profilaktik məqsədlə istifadə olunan geniş bitki qrupudur. Mövzuda moruq, kəklikotu, itburnu, nanə, çobanyastığı, bağayarpağı kimi bitkilərin şəkilləri verilir. Onlar haqqında məlumat axtarışı şagirdlərə təklif edilir. Burada mədəni və yabanı dərman bitkiləri haqqında məlumat da öz əksini tapır. Göstərilir ki, zəfərandan ürək-damar, sinir, ifrazat və cinsiyyət sistemi xəstəliklərinin müalicəsində geniş istifadə edilir. Balqabaq toxumu qurd xəstəliklərinə qarşı, şəkərli diabetin, ürək, böyrək xəstəliklərinin müalicəsində və profilaktikasında faydalıdır. Respublikamızda itburnu meyvələri, birəotu, kəklikotu, qaraqınıq, boymadərən, yemişanın çiçək və meyvələri, palıd qabığı və s. toplanaraq əczaçılıq müəssisələrinə göndərilir, onlardan müxtəlif dərmanlar hazırlanır. Mövzuların tədrisinin yaradıcı tətbiqetmə mərhələsində fitoterapevtik biliklərin möhkəmləndirilməsi üçün yaradıcı tapşırıqlar verilir [5, s.47].

Mətndə bir sıra dərman bitkilərinin (pişikotu (valerian), adi dazıotu, andız, gülümbahar, sürvə, kəklikotu, gicitkən, yemişan, biyan və s.) müalicəvi xüsusiyyətləri və şəkilləri verilir. Dərman bitkilərinin toplanması və saxlanması qaydaları göstərilir. Dərman bitkilərini toplayarkən ümumi qaydalara riayət etmək lazımdır.

Dərman bitkilərindən qurudulmuş halda tibbi-profilaktik məqsədlər üçün geniş istifadə olunur. Dərman bitkiləri mürəkkəb kimyəvi quruluşlara malikdir. Dərman bitkilərinin tərkibi müxtəlif quruluşlu maddələrdən – alkoloidlərdən, qlükozidlərdən, saponin, flavanoid, kumarin, fürokumarin, aşı və boyaq maddələri, vitamin, karotin, qətran, selik, yapışqanlı və s. ibarətdir. Bu maddələrə təsiredici maddələr deyilir. Lakin, bu maddələr bitkinin hər bir hissəsində bərabər miqdarda olmur.

Bəzi bitkilərin yarpağında təsiredici maddələr çox, kök hissəsində az, bəzən heç olmaya da bilər. Buna görə də dərman bitkisinin bütün hissələrini deyil, onun lazım olan hissələrini (yarpağını, çiçəyini, toxumunu, qabığını, meyvə və giləmeyvəsini, kökünü, kökümsovunu, soğanağını və s.) toplayırlar. Təsiredici maddələrin miqdarı bitkinin keçirdiyi inkişaf fazalarından asılı olaraq, dəyişir.

Bitkilərin müxtəlif hissələrində təsiredici maddələrin və inkişaf fazasının hansı dövründə daha çox toplanması tədqiqatlar nəticəsində müəyyən edilmişdir. Məsələn, yovşanın çiçəklərində təsiredici maddə santonin bitkinin müxtəlif inkişaf dövründə müxtəlif miqdarda olur.

Müəyyən edilmişdir ki, yovşanın çiçəkləri hələ qönçə ikən daha çox santoninə malik olur. Lakin, qönçələr açıldıqda sonra santoninin miqdarı azalmağa başlayır, çiçəklər solub tökülən zaman isə santonin yox dərəcəsinə çatır. Gülxətimi köklərində selikli maddə və nişasta bitki çiçək açan dövrdə ən az miqdarda olduğu halda, yazın əvvəllərində payız aylarında (yəni bitkinin çiçəkləri solub tökülən zaman) ən yüksək səviyyəyə çatır. Biyan bitkisinin kökünün tərkibindəki qlisirizin adlı təsiredici maddə isə ən çox bitki çiçək açan dövrdə olur. Tərkibində nikotin olan tütün və ya morfin alkaloidi – xaşxaş bitkiləri öz

inkişaf fazalarının son dövründə daha çox zəhərləyici xassəyə malik olur.

Bitkinin yerüstü hissəsindən istifadə etmək lazım gəldikdə onu yeni çiçək açmağa başlayan zaman, yarpaq, gövdə və çiçəkləri ilə birlikdə toplamaq lazımdır. Çiçəkləri isə bitki təzə çiçək açan vaxt toplamaq lazımdır. Bu, xüsusən daha çox mürəkkəbçiçəklilər fəsiləsindən olan bitkilərə aiddir. Çobanyastığı, solmazçiçək, gülümbahar və darçın bitkilərinin çiçəklərini isə tam çiçək açan dövrdə toplamağı məsləhət görürlər. Tumurcuqları yaz fəslində, onların tökülməsinə az qalmış, şişməyə başlayan zaman toplayırlar.

Dərman bitkilərinin toxumlarının, meyvə və giləmeyvələrini tam yetişdikləri vaxt toplamaq lazımdır. Onların yeraltı hissələrini, köklərini, kökümsov gövdələrini, soğanaqlarını və yeraltı yumru gövdələrini payızın son ayında, nadir hallarda yazın ilk aylarında toplamaq lazımdır. Çünki bu dövrə kimi bitkilərin yarpaqları tökülür və bitkisinin hasil etdiyi qida maddəsinin çoxu onun kökündə toplanır [4, s.395].

Kökləri toplayarkən aşağıdakı ümumi qaydaya riayət etmək lazımdır. Birillik dərman bitkilərinin kökləri bitki çiçək açmağa başladığı vaxtda, ikiillik bitkilərin kökləri ya payızda, ya da ikinci ilin yazında, çoxillik dərman bitkilərinin köklərinin əsas hissəsi payızda, bir qismi isə erkən yazda toplanmalıdır (altey, xammotu bitkisinin kökləri kimi).

Zoğlar payızın son və yazın ilk ayında, qabıqlar isə bitki şirə ilə zəngin olarkən–yazın ilk ayında toplanılmalıdır. Yazda bitkinin qabıq hissələrində təsiredici maddələr daha çox olur.

Toplanmış dərman bitkiləri çeşidlərə ayrıldıqdan sonra dərhal qurudulmalıdır. Tərkibində alkoloid və qlükozid olan dərman bitkilərini 50-60ºC də tərkibində vitamin olan bitkiləri isə (itburnu meyvəsini, novruzgülünü isə) tərkibindəki C vitamini oksidləşməsin deyə 80-100ºC temperaturda qurutmaq lazımdır. Qarağatın meyvəsinin tərkibində C vitaminindən başqa efir yağı da vardır. Bunun üçün qarağatın meyvəsini 50-60ºC temperaturda qurutmaq məsləhətlidir.

Dərman bitkisi hissələrini (ot, çiçək, qabıq və s.) 35-45ºC istilik olan sobalarda, çardaqlarda, dəmir örtüklü anbarlarda, nadir hallarda isə açıq havada brezent və həsir üzərində qurudurlar. Dərman otların daha yaxşı və keyfiyyətli qurutmaq üçün, onları dəstə-dəstə bağlayıb, asıb qurutmaq daha səmərəli üsuldur. Dərman bitkiləri qurudulan otağın havası daim dəyişdirilməlidir. Çünki belə şəraitdə temperatur kifayət qədər olub, 40-50 dərəcəyə çatır.

Bitki xammalı süni yollarla da qurudulur. Bu zaman temperaturu 40-60 dərəcəyə çatdıraraq qurutma prosesini daha da sürətləndirmək olar. Təzə dərilmiş giləmeyvələrin qurudulması üçün yüksək temperatur (70-80º) tələb olunur. Efir yağlı bitkilər qurudularkən temperatur 25-30ºC–dən aşağı olmalıdır [4, s.397].

Sıx parçalardan tikilmiş birqat kisələrdə tumurcuqları, hamar kökləri, quru giləmeyvələri, çətirçiçəklilər fəsiləsindən olan növləri meyvələrini (cirə, razyana, kəraviz, zirə və keşniş) gülxətmini, xardal toxumunu, çovdar mahmızını və s. qablamaq olar. İkiqat kisədən isə heyva və xaşxaş toxumlarının və digər bitkilərin qablanması üçün istifadə olunur. Uzunsov tənzif kisələrdən isə bir çox dərman köklərini, döyülmüş halda olan otları, məsələn xəşəmbül, kəklikotu, dazotu, boymadərən və s. bitki xammalını qablayarkən istifadə olunur [4, s.399].

Kəndələş, yemişan, itburnu, gülxətmi, sabahgülünü və s. isə ayrıca taxta qutulara qablamaq lazımdır. Faner qutularda əkilən nanə yarpağı, üsküktotu, çobanyastığı, inciçiçəyi, gicitkən, dəvədabanı və digərləri qablaşdırılmalıdır. Toz (poroşok) halında olan belə xammalı əvvəlcə çəkib kağız torbalara doldurduqdan sonra onları faner qablarda saxlamağı məsləhət görürlər. Tənəkə qablardan zəfəranı, sığırquyruğunu, novruzgülü çiçəyini və s. qablamaq üçün istifadə olunur.

8-ci sinif dərsliyindəki “Vitaminlər” mövzusunun tədrisində də fitoterapevtik biliklərin öyrədilməsi imkanları genişdir. Belə ki, vitaminlərlə zəngin bitkilərin xüsusiyyətləri, onların müalicə əhəmiyyəti izah olunur[5, s.101].

Dərsliklərdə müalicə əhəmiyyətli bitkilərə dair mövzuların yer alması, müəllimlərə fitoterapevtik anlayış və biliklərin öyrədilməsinə istiqamətlənmişdir. Həmin imkanlar əsasında müəllimlər şagirdlərə lazımi səviyyədə fitoterapevtik biliklər ötürə bilərlər. Klassik və müasir təlim metod və formalarının tətbiqi ilə istənilən mövzunun tədrisində fitoterapevtik biliklərin öyrədilməsi mümkündür. 8-ci sinifdə tədris olunan mövzuların beyin həmləsi, tədqiqat, təqdimat, rollu və əyləncəli oyun texnikalarının tətbiqi ilə öyrədilməsi müsbət nəticə verir. Belə ki, birləpəli və ikiləpəli sinifləri üzrə fəsilələrə dair krossvordun,

çaynvordun, müxtəlif rollu oyunların tətbiqi biliklərin asanlıqla mənimsənilməsini və uzun müddət yadda qalmasını təmin edir. "Dərman bitkilərinin müalicəsi xüsusiyyətləri və onlardan istifadə qaydaları" mövzusunun səhnəciklərin təşkili ilə tədrisi şagirdlərin fitoterapevtik biliklərinə müsbət təsir göstərir.

8-ci sinifdə "Vitaminlər" mövzusunun tədrisində şagirdlərin fitoterapevtik biliklərini daha da dərinləşdirmək məqsədilə şagirdlərə qruplar üzrə vitaminlərə dair təqdimatların hazırlanması tapşırılır [5, s.73].

Dərslərin belə canlı, yaradıcı tətbiqetmənin təşkili ilə aparılması dərsin keyfiyyətini yüksəldir, şagirdlərin fitoterapevtik biliklərini artıraraq onların dərman bitkilərinə şüurlu yanaşmasına, onlardan xəstəliklərin profilaktika və müalicəsində ağıllı istifadəsinə, şəfalı bitkilərin mühafizə işlərinə qoşulmasına zəmin yaradır.

**Problemin aktuallığı.** Ümumtəhsil məktəblərində biologiyanın tədrisində fitoterapevtik biliklərin verilməsi aktualdır. Elmi-metodik ədəbiyyatlarda şagirdlərə fitoterapevtik biliklərin verilməsinə dair tədqiqat işinə, xüsusilə əsərlərə az rast gəlinir.

**Problemin yeniliyi.** Ümumtəhsil məktəblərində biologiyanın tədrisində şagirdlərə fitoterapevtik bilik və bacarıqların verilməsi problemi az olsa məqalədə həllini tapır.

**Problemin praktik əhəmiyyəti.** Təlim prosesində mövcud olan bir sıra mövzuların tədrisi üçün praktik əhəmiyyətə malikdir.

**Ədəbiyyat**:


1. Azərbaycan Respublikasının ümumi təhsil müəssisələri üçün "Biologiya fənni üzrə təhsil proqramı (kurikulum)" (VII-XI siniflər). -Bakı: -2023. - 57s.
2. Əliyev, S.C. Tibbi biliklərin əsasları. Dərslik. / Əliyev S.C., Hacıyeva H.M, Mikayılzadə N.C.. -Bakı: Azərbaycan Tibb Universitetinin nəşriyyatı.- 2004. - 531s .
3. İbadullayeva, S.C. Dərman bitkiləri (etnobotanika və fitoterapiya). Medicinal plants (Ethnobotany and Phytoterapya). / S. C. İbadullayeva, R. Ələkbərov. -Bakı: Elm-Təhsil- 2012.- 331s.
4. Qasımov, M.Ə. XXI əsrin dərman bitkiləri. / M.Ə. Qasımov, T.A. Qasımova, G.S. Qədirova. -Bakı: -Elm,- 2006. -429 s.
5. Məmmədova, N. Ümumtəhsil məktəblərinin 8-ci sinfi üçün "Biologiya" fənni üzrə dərslik. / N. Məmmədova, B. Həsənova, L. Fətiyeva. -Bakı: Şərq-Qərb nəşriyyat Evi.- 2015. -176 s.
6. Seyidli, Y. Ümumtəhsil məktəblərinin 7-ci sinfi üçün "Biologiya" fənni üzrə dərslik. / Seyidli Y., Əhmədbəyli X., Əliyeva N. -Bakı: Bakınəşr, -2016. -144 s.



**E-mail:** xosqedem.ibrahimova59@gmail.com


**Redaksiyaya daxil olub:** 28.11.2024

*UOT 372.891*

***Namiq Tahir oğlu Ağaməmmədov***
*İsmayıllı rayonu Mücühəftəran kənd E. Həsənov adına tam orta məktəbin direktoru,*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun elmlər doktoru proqramı üzrə doktorantı*
*https://orcid.org/0000-0002-7183-9933*
*https://doi.org/10.69682/arti.2024.91(6).192-197*

# ÜMUMTƏHSİL MƏKTƏBLƏRİNDƏ COĞRAFİYANIN FƏNLƏRARASI İNTEQRATİV TƏDRİSİNİN MƏZMUNU

***Намиг Тахир оглу Агамамедов***
*директор средней школы имени Э. Гасанова села Муджухафтаран*
*Исмаиллинского района докторант по программе доктора наук*
*Института Образования Азербайджанской Республики*

# СОДЕРЖАНИЕ МЕЖПРЕДМЕТНОГО ИНТЕГРАТИВНОГО ПРЕПОДАВАНИЯ ГЕОГРАФИИ В ОБЩЕОБРАЗОВАТЕЛЬНЫХ ШКОЛАХ

***Namig Tahir Agamammadov***

*director of the secondary school named after*
*E. Hasanov in the village of Mujuhaftaran of the Ismayilli region*
*doctorial student in the program of doctor of philosophy*
*of the Institute of Education of the Republic of Azerbaijan*

# THE CONTENT OF THE INTERDISCIPLINARY INTEGRATIVE TEACHING OF GEOGRAPHY IN GENERAL EDUCATION SCHOOLS

**Xülasə.** Coğrafiya fənn kurikulumu müasir dövrdə ümumtəhsil məktəblərində tədris olunan fənlər içərisində inteqrasiyaya meylli olması ilə seçilir. İnteqrasiya coğrafiyanın pedaqoji və metodiki imkanlarını genişləndirir, ona yeni məzmun əlavə edir. Mövzuların tədrisində yeni inteqrativ elementlərin daxil edilməsində əsas məqsəd onların bütöv formada dərk edilməsini asanlaşdırmaqdır. Elmi araşdırmada coğrafiyanı fizika, kimya, biologiya, riyaziyyat və tarix fənləri ilə assosiasiyası təhlil olunur, onların inteqrativlik imkanları aşkara çıxarılır, fərqli pedaqoji yanaşmalar önə çıxarılır.
***Açar sözlər:*** *coğrafiya, inteqrasiya, məzmun, ümumtəhsil məktəbləri, elmi-texniki tərəqqi.*

**Аннотация:** Предметный курикулум по географии в современный период выделяется среди преподаваемых в общеобразовательных школах предметов тенденцией к интеграции. Интеграция расширяет педагогические и методические возможности географии, добавляет в нее новое содержание. Основная цель введения новых интегративных элементов в преподавание предметов – облегчить их понимание в целом. В научных исследованиях анализируется связь географии с такими предметами как физика, химия, биология, математика и история, раскрываются их интегративные возможности, выделяются различные педагогические подходы.
***Ключевые слова:*** *география, интеграция, содержание, общеобразовательные школы, научно-технический прогресс*

**Abstract.** The geography subject curriculum is characterized by its tendency to be integrated among the subjects taught in general education schools in the modern era. Integration expands the pedagogical and methodical possibilities of geography, adds new content to it. The main goal of introducing new integrative elements in the teaching of subjects is to facilitate their understanding as a whole. In the scientific research, the association of geography with physics, chemistry, biology, mathematics and history is analyzed, their integrative possibilities are revealed, and different pedagogical approaches are highlighted.

***Keywords:*** *geography, integration, content, general education schools, scientific and technical progress.*

Dünya təhsil sistemində geniş istifadə olunan təhsildə inteqrasiya prinsipi anlayışın semantik quruluşunu dərk etməyi tələb edir. İnteqrativ yanaşma-yeni məzmunun qarşılıqlı, obyektlə-subyektin bütöv formada əlaqələndirilməsidir. İqtisadi-coğrafi termin kimi inteqrasiya cəmiyyətin inkişaf yolunda baş verən dəyişiklikləri nizamlamaqla müasirliyi ifadə edir. İnteqrasiya termini XX əsrdə istifadə olunmağa başladığı üçün müasir sivilizasiya anlayışı kimi qəbul olunur. İnteqrativ təhsil prosesini anlamaq üçün onun etimoloji mənasını bilmək vacibdir. "İnteqrasiya" termini latın dilində "integer"-"bütöv", "bütövləşmə", "tamamlanan", "bərpa" mənalarını verir. Pedaqogika elmi sahəsində məşhur pedaqoqlar Y.A. Komenski, İ.F. Herbart, K.D. Uşinski və digərləri öz əsərlərində inteqrasiya barədə öz fikirlərini bildirmişdir. Pedaqoqlar öz elmi işlərində şəxsiyyətin harmonik inkişafı tezisini irəli sürür, təhsil kurikulumunun məzmununda inteqrasiyanın lazım olduğunu qeyd edir, dünyanın vahid obraz kimi pedaqoji prosesdə əks olunması zəruri sayır, tədqiqat obyektləri, predmet və hadisələri sistematik əlaqələndirməni təklif edirdilər. İ.F. Herbart ilk dəfə pedaqoji prosesin təşkilində inteqrativ yanaşma tövsiyə edir. O, yaxın və əlaqəsi olmayan fənləri inteqrasiya yolu ilə birləşdirib vahid formaya salmağı mümkün hesab edir.

T.Ə. Tağıyeva hesab edir ki, fənlərarası əlaqələrin reallaşdırılması probleminin aktuallığı-müasir elmi-texniki tərəqqi, o cümlədən elmlər arasında inteqrativ əlaqələrin intensivləşməsi şəraitində böyüməkdə olan gənc nəslin həyatın tələbləri səviyyəsində hazırlanmasından ibarətdir [4, s.3].

Ümumtəhsil məktəblərində tədris olunan coğrafiya fənn kurikulumunu araşdırdıqda aydın olur ki, inteqrativlik prinsipi didaktik prinsip olaraq təlim prosesinə əlavə olunmuşdur (Şəkil 1).




***Şəkil 1. Fənlərarası əlaqə növləri***

Yeni tədris kurikulumunda coğrafiyanın məzmun xətləri olan-coğrafi məkan, təbiət və cəmiyyət kateqoriyaları bir-biri ilə inteqrativ tədris olunur. Belə metodiki yanaşma nəticəyönümlü tədrisdə uyğun olan səmərəli variantlardan biridir. İnteqrativ təlimi coğrafiya elminə tətbiq etmək üçün ilk növbədə onun mahiyyətini, sahələrini, predmetini və obyektini dərk etməliyik. S.A. Kərimova "Təhsildə inteqrasiya" adlı məqaləsində göstərir ki, inteqrativlik şagirdlərə ətraf aləmin dərk edilməsinə idraki münasibətlər bəsləyən subyektlər kimi yanaşılmasına imkan verir [2, s. 99].

İnteqrativliyi dərs, sərgi, ekskursiya və s formalarda təşkil etmək olar. Belə multidissiplinar sərgi-dərslərdən birini 23.12.2023-cü il tarixində İsmayıllı rayonu Mücühəftəran kənd E. Həsənov adına tam orta məktəbdə təşkil etmişik (Şəkil 2).

Coğrafiya elminin obyektiv maddi aləmi bütöv varlıq formasında dərk etdiyini və coğrafi təbəqə daxilində baş verən proseslərin qarşılıqlı cərəyan etdiyini nəzərə aldıqda fənlərarası inteqrativ yanaşmanın təlim prosesində rolu aydın olur. Tədris prosesinin elmlərarası əlaqələr fonunda tədqiqi onların dərindən öyrənilməsini mümkün edir. Prosesin sonunda inteqrasiyada iştirak edən fənlər arasında əməkdaşlıq əmələ gəlir.



***Şəkil 2. Multidissiplinar-inteqrativ sərgi-dərs***

**Fənlərarası inteqrasiyanın tətbiqi üsulları.** Ümumiyyətlə, fənlərarası inteqrasiya iki üsulla reallaşır və həmin üsulları coğrafiyanın tədrisi zamanı analogiya quraraq tətbiq etmək olar:

I Fənlərin əlaqələndirilərək inteqrasiyası: 1.1. İki fənn arasında uyğunlaşdırma aparıb inteqrasiyaetmə. Bu üsul iki fənn arasında o vaxt tətbiq olunur ki, tədris proqramında inteqrasiya olunması planlaşdırılan mövzuların keçirilməsi vaxta görə üst-üstə düşsün. Məsələn, coğrafiyada "Küləklər" mövzusu ilə, fizikadan "Təzyiq" mövzusunun tədrisinin paralel aparılması. Bu zaman təhsilalanlar həm yerli, həm də daimi küləklərin formalaşmasında təzyiq fərqlərinin rolunu anlaya bilir və iki fənn arasında planlı baş verir. İkinci bir misal: coğrafiyadan "Təbii zonalar" mövzusu ilə biologiyadan "Canlılar və ətraf mühit" mövzularının tədrisini eyni vaxtda aparmaq olar. Təhsilalanlar bu formada təşkil olunmuş pedaqoji prosesdə üzvi aləmin öz biocoğrafi xüsusiyyətlərinə uyğun olaraq müvafiq təbii mühit şəraitində yaşaması fikrini anlaya bilir. Düzgün planlaşdırma aparmaqla coğrafiyanı paralel mövzular vasitəsi ilə elmi işimizdə tutduğumuz digər riyaziyyat, kimya, tarix fənləri arasında da aparmaq mümkündür.

1.2. Psixomotor, koqnitiv və affektiv bacarıqların inteqrasiyası. Müxtəlif fənlərin inteqrativ tədrisində səmərəli sayılır. Fənlərin inteqrasiyası zamanı psixomotor, koqnitiv və koqnitiv bacarıqlar eyni vaxtda formalaşdırılır. Təcrübi olaraq "Yerin forması və ölçüləri" mövzusunun izahı zamanı kürə və ellipsoid həndəsi fiqurlarının hazırlanması, radius, çevrə, diametr, sahə, çevrə uzunluğu kimi anlayışlarla inteqrasiyanı yerinə yetirmək olar.

Müasir təhsil sistemində inteqrasiya vacibdir, çünki təhsildə ənənəvi fənlərin "monoloji" təlim sistemi öz praktiki əhəmiyyətini itirir [5, s.144]

1.3. Sərbəst formada inteqrasiya. Coğrafiyadan hər hansı mövzunun izahı zamanı pedaqoq qəfil başqa fənnin mövzusuna keçid edir. Misal olaraq pedaqoq "Azərbaycanın iqlimi" mövzusunu izah edərkən təhsilalanlara Azərbaycan təbiətinin ədəbiyyatla uğurlu inteqrasiyasını tərənnüm edən poeziya nümunəsi təklif edə bilər. Məsələn, Aşıq Ələsgərin "Dağlar" qoşması və ya Məmməd Arazın "Arazın nəğməsi" şeirini qeyd etmək olar.

II Fənlərin birləşdirilərək inteqrasiyası.

2.1. Konkret mövzu əsasında: coğrafiya fənni üzrə dəqiqləşmiş mövzu üzrə inteqrasiya istiqamətləri analiz olunur və digər fənlərin məzmun xətləri ilə oxşarlıq vektorları müəyyən olunur. Misal olaraq "Süxurlar" mövzusuna kimya, biologiya, riyaziyyat fənlərinin məzmununa əsasən yanaşma ola bilər.

2.2. Xüsusi layihələr əsasında: coğrafiya fənninin məzmununu özündə ifadə edən layihələr hazırlayıb təhsilalanlara təqdim edib, onlarda multidissiplinar bilik, bacarıq və vərdişlərin formalaşmasını təmin etmək.

Fənlərüstü inteqrasiya üsulu. İnteqrativ prosesin ən ali səviyyəsi olmaqla tərkibində əsas və əlavə məzmun birləşir. Konkret halda təhsilalanların ümumtəhsil məktəblərində tanış olduqları məzmunla məktəbdən və sinifdən kənarda əldə etdikləri məzmun vəhdət halına gətirilir, təlim prosesində qazandıqları nəzəri bilik və bacarıqlar, onların həyati bacarıqları ilə eyniləşdirilir. Coğrafiyanın inteqrativ təliminin səmərəli təşkili üçün aşağıdakı didaktik prinsipləri məqsədəuyğun hesab edirik:

1. Şüurluluq;
2. Elmilik;
3. Sistematiklik;

4. Formal əyanilik;
5. Nəticəyönlülük;
6. Fərdi yanaşma və s.

Məhz didaktik prinsiplərin düzgün tətbiqi inteqrativ təlimdən gözlənilən nəticələri reallaşdıra bilər. P.M. Qədimova "İnteqrasiya və inteqrativlik pedaqoji anlayışlar kimi: mahiyyəti və ifadə formaları" adlı məqaləsində qeyd edir ki, ayrı-ayrı fənlərin tədrisi əvəzində bir neçə elmin qarşılıqlı əlaqəsi əsasında transdissiplinar fənlərin tədrisi daha məqsədəuyğundur [3,s.99].

Azərbaycan Respublikasının ümumtəhsil məktəblərində fənlərin əsasən müstəqil tədrisi təcrübəsi geniş yayılmışdır. Hazırda pedaqogika elmi qarşısında duran vəzifələrdən biri də çoxfənli sistemdən azfənli sistemə keçid etməkdir. Çünki icbari formada tədris olunan fənlərin çoxluğu təhsilalanların həddindən çox yüklənməsinə və öyrənilən materialların uzunmüddətli yadda saxlanılmasına maneə törədir. İnteqrasiya zamanı məktəbdaxili və məktəbdənkənar təlim fəaliyyətləri arasında fərqlər azalır və ya aradan qalxır. Burada əsas meyarlar məzmun komponentləri arasında struktur əlaqələri qurmaq, onları əlaqələndirməkdir. Ümumtəhsil bazasında öyrədilən fənlərin məzmununda inteqrasiya olunmuş bilik, bacarıq və vərdişlərin verilməsi zəruridir. Qazanılan əlaqəsiz biliklər gələcəkdə məzunların faydalı iş əmsalında, həyat fəaliyyətində mühüm bacarıqlara çevrilə bilmir. Elmi-texniki tərəqqi (ETT) dövründə insanların inteqrasiya olunmuş biliklər sisteminə bələd olması dövrün aktual tələbidir. Təlim-tərbiyənin nəzəriyyə və metodikasında yeni dövrün yanaşmaları ortaya çıxır. Ümumi pedaqoji kompetensiyalara nəzər saldıqda aydın olur ki, ümumi metodika dövrün tələbləri çərçivəsində inkişaf iki tərəfə meyil edir:

1. Məktəb coğrafiya kursunun tədrisi ilə əlaqədar olan resurslar-fənnin tədris planı, proqram, tədris avadanlığı, coğrafiya kabineti və meydançası, ekskursiya istiqamətləri müasir yanaşmalara uyğun təkmilləşdirilməli, elmi-nəzəri və metodiki baza formalaşdırılmalı, araşdırmalar bu istiqamətə uyğunlaşdırılmalıdır.

2. Coğrafiya fənn kurikulumlarına mütənasib olan məktəbşünaslıq elementləri yenilənməli, pedaqoji kadrların hazırlanması, təhsil müəssisəsinə adminstrativ rəhbərlik sistemi innovativ metodlarla dəstəklənməlidir. Fənləri tədris edən müəllimlərə tam sərbəstlik verilməli, onların fasilitator rolu açıq dəstəklənməlidir. Formalizm qaydaları-müəllimlərə günlük planlaşdırma tərtibinə məcburetmə tətbiqi, dərsdinləmənin cəza proseduruna çevrilməsi aradan qaldırılmalıdır. İnteqrativ-vahid fənləri tədris edən təhsilverənlərin əmək haqqı stimullaşdırılaraq saathesabı qaydasından gün-saat formasına keçirilməlidir. Coğrafiyanın tədrisi metodikasında inteqrativliyi əsas almaqla məktəbşünaslıq məsələləri xüsusi tədqiqat predmeti kimi təqdim olunmalıdır. Fənlərarası inteqrasiyaya istiqamətlənmiş bilik və bacarıqların formalaşması xüsusi metodik üsulların tətbiqini tələb edir. Ona görə də pedaqoji proses zamanı coğrafiya ilə nəzərdə tutulmuş fənlər arasında inteqrasiya üçün fənlərarası bilik və bacarıqların həcmi, kateqoriyası, konturları dəqiqləşdirilməli, müxtəlif bölmələrin, mövzuların, fiziki, iqtisadi, sosial hadisə və anlayışların, qanun və nəzəriyyələrin təhsilalanlar tərəfindən müstəqil öyrənilməsinə, onların inteqrativ coğrafiya elminin tədqiqatçıları kimi formalaşması üçün səmərələşdirici texnologiyalar işlənilməlidir.

1. Ümumtəhsil səviyyəsində öyrədilən coğrafiya kursunun məzmununda bütün nəzəri və təcrübi biliklərin mahiyyəti insanın həyat fəaliyyəti ilə uzlaşacaq, onun köməyinə çatacaq biliklərin formalaşmasına xidmət etməlidir. Elmi işin tədqiqat dövrü ərzində araşdırılmasına ehtiyac olan bir sıra mühüm mövzuların sıralanmasını aşağıda təqdim edirik:

1. Ümumtəhsil məktəbləri üçün coğrafiyadan münasib bilik, bacarıq və vərdişləri özündə cəmləyən inteqrativ məzmun;
2. Coğrafiya kursunda inteqrasiya və generalizasiya olunmuş teorik və praktiki bilik və bacarıqlar sistemi;
3. Coğrafiyadan propedevtik giriş kursunda əməkdaşlıqlı məzmun və sistem;
4. Coğrafiyadan fənlərarası inteqrasiya proqramlarının tərtibi prinsiplərinin öyrənilməsi;
5. Coğrafiya ilə inteqrativlik əmələgətirən fizika, kimya, biologiya, riyaziyyat, tarix fənləri üçün korporativ dərsliklərin tərtibi prinsipləri;
6. Təhsilalanlar üçün inteqrativ məzmunlu əlavə ədəbiyyatların hazırlanması zərurəti;
7. Müasir dövr üçün coğrafiya və inteqrativ fənlər üçün birgə fənn kabinetləri, laboratoriyaların təşkili və istifadəsi yolları;

8. Elektron coğrafiya, fizika, kimya, biologiya, riyaziyyat, tarix kitabxanası və onlardan istifadənin üsulları;

9. Coğrafiyanın assosiativ öyrədilməsinin metodoloji problemləri və tərbiyələndiici funksiyaları;

10. İnteqrativ əsaslarla təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi;

11. Coğrafiyanın fizika, kimya, biologiya, riyaziyyat, tarix fənləri ilə inteqrasiyası kontekstində yeni dünya görüşünün və təfəkkürünün formalaşdırılması;

12. İnteqrasiya olunmuş məzmunda ekskursiya, dərnək və gecələrin multidissiplinar formatda təşkili və keçirilməsi.

M.Ə. Vəliyeva "Coğrafiyanın tədrisində inteqrasiya məsələləri və onun əhəmiyyəti" adlı məqaləsində fəndaxili və fənlərarası münasibətlərin sadəcə əlaqə deyil, inteqrasiya xarakteri daşıdığını bildirir [6, s.102]

Fənlərarası inteqrasiya fonunda aktual problemlərin sayını artırmaq mümkündür. Lakin burada sistemləşdirmə, seçim etmək, məsələləri araşdırmaq tədqiqatçıdan güclü enerji və diqqət tələb edir. Biz də "Ümumtəhsil məktəblərində coğrafiyanın fənlərarası inteqrasiya kontekstində tədrisinin sistemi" adlı tədqiqat işimizdə yuxarıda qeyd etdiyimiz nüansları araşdırmışıq.

İnteqrativlik prinsipinin tətbiqi zamanı düzgün analiz, sintez etmək, konstruktiv qərarlar qəbul etmək, proqnozlaşdırma aparmaq qabiliyyət və bacarıqlarını vərdişlərə çevirmək qarşıya qoyulmuş əsas məqsədlərdir. Təbiətdə və cəmiyyətdə baş verən hadisələri inteqrativ formada öyrənmək və məntiqli mühakimə yürütmək, real nəticələr qazanmaq cəhətdən səmərəlidir. Təhsilverənlər coğrafiya dərslərində fənlərarası inteqrasiyadan istifadə etməklə təhsilalanlarda geniş dünyagörüşünün formalaşmasına, məzmun standartlarının dərindən mənimsənilməsinə nail ola bilər. K. Əliyeva "İnteqrativlik ədəbiyyat fənn kurikulumunun əsas prinsipidir" adlı məqaləsində göstərir ki, müasir kurikulumlarda inteqrativlik əsas prinsip kimi qəbul olunmuşdur [1].

Dərsin məzmun strukturuna innovativ yanaşmaların daxil olunması, zamanın tələbləri ilə ahəngdarlıq təşkil edən sintetik və inteqrasiyalı dərs modelinin təşkili vacib pedaqoji tələblərdəndir. Ümumtəhsil məktəblərində dövrün tələbləri nəzərə alınmaqla perspektiv dövr üçün yüksək bilik, bacarıq və vərdişlərə sahib olan gənclərin formalaşdırılmasına ehtiyac var:

1.Məktəb coğrafiya kursunun məzmununun təkmilləşdirilməsi, təlim metodlarının səmərəliliyinin artırılması;

2. Şagirdə şəxsiyyətyönlü münasibət bəslənməsi və həyata hazırlanması.

Ona görə ki, şagird məktəbdə təhsil aldığı dövr ərzində şəxsiyyət kimi formalaşır, fiziki, mənəvi-psixoloji, etik-estetik və zehni inkişaf edir. Azərbaycan Respublikası Təhsil İslahatı Proqramında məktəbdə interaktiv təlim metodlarının tətbiqi üçün tövsiyə olunan altı prinsipdən biri də inetrasiyadır (demokratikləşdirmə, humanistləşdirmə, diferensiallaşdırma, inteqrasiya, humanitarlaşdırma, fərdiləşdirmə).

**Problemin aktuallığı.** Tədris prosesində inteqrativlik prinsipi pedaqoji prosesin səmərəliliyini şərtləndirən amillərdən biridir. Fənlərarası inteqrasiyanın tətbiqi təhsilverənlərdən xüsusi bacarıq və səriştə tələb edir. Çoxfənli sistemdən komplekt fənn sisteminə keçid zamanı şagirdlərdə mövzulara bütöv yanaşmanın öyrədilməsi müasir dövrün mühüm pedaqoji problemlərindəndir. Hazırda ümumtəhsil məktəblərində təhsilin və təhsilverənlərin qarşısında duran problem kimi inteqrasiya prosesi birmənalı olaraq öz aktuallığını saxlayır.

**Problemin yeniliyi.** Məqalədə müəllimin pedaqoji prosesdə coğrafiyanın fənlərarası inteqrasiya prosesində rolu və inteqrasiyanın formalarına bir neçə aspektdən yanaşılmış, onun ümumtəhsil məktəblərində tətbiqinin vacibliyinin elmi parametrləri əsaslandırılmışdır.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə qarşıya qoyulmuş bir sıra müddəalar, təhsildə inteqrativliyin müəyyən elmi prinsipləri, inteqrativliyin tətbiqinin əsas meyarları, komponentləri, onun hədəfləri haqqında olan nəzəri və tətbiqi fikirlər, onun şagirdlərin həyati bacarıqlarına çevrilməsi şəxsiyyətyönlü təhsildə keyfiyyət dəyişikliyinin səs indikatorlarındandır. Gələcəkdə coğrafiyanın təkmilləşməsində onun digər fənlərlə assosiasiyası təməl prinsip ola bilər. Fənlər bir-birinin daxili imkanlarından istifadə etməklə öz obyektlərini genişləndirə bilir. İnteqrasiya prosesi şagirdləri motivasiya etməklə təlim prosesini daha səmərəli edə bilər.

**Ədəbiyyat:**

1. Əliyeva K. İnteqrativlik ədəbiyyat fənn kurikulumunun əsas prinsipidir //Azərbaycan müəllimi. -2012.- 28 sentyabr.- s.c10.

2. Kərimova S.A. Təhsildə inteqrativlik // Sumqayıt Dövlət Universitetini Elmi xəbərləri. Sosial və humanitar elmlər bölməsi.-2016.- c.12, № 3.- s. 98-102.
3. Qədimova P.M. İnteqrasiya və inteqrativlik pedaqoji anlayışlar kimi: mahiyyəti və ifadə formaları // Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi əsərləri. 2018.- № 5, s. .97-102.
4. Orucova, S.S. Riyaziyyatın informatika ilə əlaqəli tədrisində yeni informasiya texnologiyalarından istifadənin imkan və yolları (III-IV siniflər üzrə):/ pedaqogika üzrə fəlsəfə doktoru dis. avtoreferatı /- Naxçıvan, 2021.-26 s.].
5. Tağıyeva T.Ə. Təbiət fənlərinin tədrisində inteqrativlik // Bakı Qızlar Universitetinin Elmi əsərləri.- 2020.- № 1.- s.144-149.
6. Vəliyeva M.Ə. Coğrafiyanın tədrisində inteqrasiya məsələləri və onun əhəmiyyəti // Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi əsərləri. -2021.- C.88, №1.- S.101-103.

**E-mail:** naqamemmedov@mail.ru
**Redaksiyaya daxil olub:** 22.11.2024

*UOT 372.853*

***Vidadi Ömər oğlu Orucov,***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti,*
*pedaqogika elmləri doktoru*
*https://orcid.org/0000-0002-8589-2364*
*https://doi.org/10.69682/arti.2024.91(6).198-202*

***Aytən Elxan qızı Kərimova***
*Naxçıvan Dövlət Universitetinin fəlsəfə proqramı üzrə doktorantı*
*https://orcid.org/0009-00002-1232-5054*

## ÜMUMTƏHSİL MƏKTƏBLƏRİNDƏ FİZİKA TƏLİMİNİN BƏZİ PROBLEMLƏRİ

***Видади Омар оглы Оруджев,***
*доцент*
*Азербайджанского Государственного Педагогического Университета,*
*доктор педагогических наук*

***Айтен Эльхан гызы Керимова***
*докторант по программе доктора философии*
*Нахчыванского Государственного Университета*

## НЕКОТОРЫЕ ПРОБЛЕМЫ ПРЕПОДАВАНИЯ ФИЗИКИ В ОБЩЕОБРАЗОВАТЕЛЬНЫХ ШКОЛАХ

***Vidadi Omar Orujov,***
*associate professor at*
*Azerbaijan State Pedagogical University, of Teaching Physics,*
*doctor of pedagogical sciences*

***Aytan Elkhan Karimova***
*doctorial student in the program of doctor of philosophy*
*at Nakhchivan State University*

## SOME PROBLEMS OF TEACHING PHYSICS IN SECONDARY SCHOOLS

**Xülasə.** Məqalədə qloballaşan dünyada fizika təliminin ümumtəhsil məktəblərində üzləşdiyi aktual problemlər araşdırılır. Əsas məqsəd, respublikamızın ümumtəhsil məktəblərində fizika təliminin cari vəziyyətinə aydınlıq gətirməkdir. Müasir dövrdə fizika fənninə olan tələblərin artdığı bir zamanda, məktəblərdəki təlim texnologiyaları arasında kəskin fərqlərin mövcudluğu diqqəti çəkir. Elmi-texniki tərəqqinin sürətli inkişafı, respublikamızın məktəblərində fizika təliminin təkmilləşdirilməsi üçün təxirəsalınmaz tədbirlərin həyata keçirilməsini zəruri edir. Bu kontekstdə, yeni məzmunlu təhsil proqramlarının və müasir təlim texnologiyalarının tətbiqi aktual məsələ olaraq qalır. Məqalədə, ümumtəhsil məktəblərində fizika təliminin səmərəliliyini artırmaq məqsədilə müasir tələblərə uyğun bir sıra təkliflər irəli sürülür.
***Açar sözlər:*** *fizika təlimi, kurikulum, təlim texnologiyaları, ümumtəhsil məktəbləri, ali təhsil müəssisələri*

**Аннотация.** В статье рассматриваются актуальные проблемы, с которыми сталкивается преподавание физики в общеобразовательных школах в условиях глобализации. Основная цель — прояснить текущее состояние преподавания физики в общеобразовательных школах нашей

республики. В современных условиях, когда требования к преподаванию физики возрастают, наблюдаются значительные различия в учебных технологиях между школами. Быстрый прогресс в области науки и техники требует неотложных мер по улучшению преподавания физики в наших школах. В этом контексте реализация новых образовательных программ, насыщенных содержанием, и современных учебных технологий остается актуальной задачей. В статье предлагается ряд рекомендаций, направленных на повышение эффективности преподавания физики в общеобразовательных школах в соответствии с современными требованиями.

***Ключевые слова:*** *преподавание физики, курикулум, учебные технологии, общеобразовательные школы, высшие учебные заведения*

***Abstract.*** This article examines the current challenges faced by physics education in general education schools within a globalizing world. The main objective is to clarify the current state of physics education in our republic's general education schools. In a modern context where the demands for physics instruction are increasing, significant disparities in teaching technologies across schools have emerged. The rapid advancement of scientific and technological progress necessitates urgent measures to improve physics education in our schools. In this regard, the implementation of new content-rich educational programs and modern teaching technologies remains a pressing issue. The article proposes a series of recommendations aimed at enhancing the effectiveness of physics education in general education schools in line with contemporary requirements.

***Keywords:*** *physics education, curriculum, teaching technologies, general education schools, higher education institutions*

Bu gün dünyanın bir çox ölkələrində fizika elmi ilə bağlı biliklərin gənc nəslə öyrədilməsinin vacibliyinə böyük dəyər verilməklə yanaşı, onu informasiya cəmiyyətinin inkişafının hərəkətverici qüvvəsi kimi də qəbul edirlər. Fizika fənninin ümumtəhsil məktəblərində keyfiyyətli təlimi inkişafyönlü hər bir cəmiyyətin geniş maraqlarının təməli kimi dəyərləndirilir və onun keyfiyyətinin artırılması ilə bağlı bir sıra tədqiqatlar aparılır. Sadəcə olaraq hamı başa düşür ki, fizika bir elm olaraq elmi dünyagörüşün, elmi-texniki tərəqqinin, təbiətin ana dilinin əsasıdır. Bu baxımdan dünyanın inkişafyönlü ölkələri gənclər arasında fizika elminin populyarlaşması məqsədilə böyük sərmayələr yatırırlar. Yatırılan sərmayələr öz nəticələrini mütləq olaraq qısa zaman kəsiyində təsdiqini tapır. Belə ölkələrin sükunətdə olan sosial-iqtisadi mənzərəsi sürətlə inkişaf edərək dəyişir. Böyük yunan filosofu Arximedin: "Mənə dayaq nöqtəsi verin, Yer kürəsini çevirim" fikri bütün zamanlarda yeni fikir və ideya olaraq qalır. Bu gün elmi-texniki tərəqqinin inkişafında dayaq nöqtəsi ümumtəhsil məktəblərində Fizika fənninin səmərəli və nəticəyönlü təlimidir. Fizika elmi həm də elmi dünyagörüşün formalaşmasında təbiət elmləri sırasında birinci yerdə olmaqla dünyanın fiziki mənzərəsinin öyrədilməsinin də əsasını təşkil edir.

Fizika elmi insanın həm də mənəvi dünyasının formalaşmasına da həlledici təsir göstərir. Fizika təbiət elmi olmaqla yanaşı, insanın təbiət üzərində hakimiyyətini də gücləndirir. Bir sözlə fizika elmi təməl bilikləri təmin etməklə bütün istiqamətlərdə insan həyatını daha keyfiyyətli bir səviyyəyə qaldırmaqda davam edir. Bu baxımdan onun öyrədilməsinə olan tələbat hər gün, hər saat artmaqdadır.

Müasir dünyamıza nəzər salsaq fizika elminin nailiyyətlərini saymaqla bitmir. Fizika elmi ilə bağlı biliklər artıq həyatımızın bir hissəsinə çevrilmişdir. Onlara o qədər alışmışıq ki, bəzən fərqinə varmırıq. Sonsuz sayda elektriklə çalışan müxtəlif qurğular, fərqli işıq mənbələri, hərəkətə gələn maşın mexanizmləri, yeni enerji mənbələri, kosmosun öyrənilməsi və s. Bir sözlə fizika elminin nailiyyətləri insan fəaliyyətinin bütün sahələrində öz sözünü diktə etməkdədir. Nəticə etibarilə deyə bilərik ki, fizika elmi müasir dövrdə cəmiyyətin aparıcı qüvvəsi kimi qalmaqdadır.

Respublikamızda fizika elminin ümumtəhsil məktəblərində təliminin vəziyyəti ilə bağlı informasiya qıtlığı vardır. Daha etibarlı mənbə kimi Dövlət İmtahan Mərkəzinin uzun illərdi apardığı elmi-statistik təhlillərini qəbul etmək olar. 2022/2023-cü tədris ili üçün Dövlət İmtahan Mərkəzinin tərtib etdiyi Azərbaycan Respublikasının ali və orta ixtisas təhsili müəssisələrinə tələbə qəbulu və ümumtəhsil müəssisələri üzrə buraxılış imtahanları nəticələrinin elmi-statistik təhlilinə diqqət yetirsək, ümumtəhsil məktəblərində fizika təliminin müasir mənzərəsi ilə bağlı təəssüf doğuran məlumatlar əldə etmiş olarıq:

"- I və IV ixtisas qrupunda fizika fənnindən imtahan vermiş, attestat qiymətləri "əla" olan,

ümumilikdə 16255 şagirddən 4154-ü yəni 25,56%-i 0-20 bal, 3434-ü yəni 21,13%-i 20-40 bal, 2965-i yəni 18,24%-i 40-60 bal, 2783-ü yəni 17,12%-i 60-80 bal, 2919-u yəni 17,96%-i 80-100 bal aralığında nəticə göstərmişdir.

- Ali təhsil müəssisələrinə imtahan vermiş abituriyentlərin Azərbaycan və rus bölmələri üzrə ayrılıqda orta statistik portreti müəyyənləşdirilib. Belə ki, Azərbaycan bölməsində orta statistik abituriyent II mərhələdə fizika fənnindən test tapşırıqlarının 37,96%-nə düzgün cavab verib.

- Riyaziyyat, fizika, mühəndislik, memarlıq, dizayn, aqrar ixtisaslarına qəbul olmaq üçün fizikadan imtahan verən və (0) bal toplamış abituriyentlərinin statistikası belədir: Azərbaycan bölməsində 11,52%, rus bölməsində 8,97%.

- 2022-ci ildə əksər bölgələrdə Azərbaycan bölməsi üzrə məzun olan orta statistik abituriyentlərin II mərhələdə fizika fənnindən düzgün cavabları 36-39%, ən yüksək olan 9-bölgədə isə 48%-dən azdır."

Yuxarıda qeyd olunanlara diqqət yetirdikdə ilk diqqəti cəlb edən, fizika fənnin respublikamızın ümumtəhsil məktəblərində təliminin vəziyyətinin zəif olmasını təsdiqləyən məzunlarımızın nəticələridir. "Belə zəif nəticə göstərənlərin sayının çox olması fənlərin aşağı səviyyədə tədris olunması və qiymətləndirmədə standartlara əməl edilməməsi ilə əlaqədardır." Müəllimlərimiz qiymətləndirmə meyarlarını düzgün dəyərləndirə və tətbiq edə bilmirlər, məzunlarımız fizika fənnindən test tapşırıqlarının yarısından çoxunu düzgün cavablandıra bilmirlər. Digər fənlərlə müqayisədə fizika fənnin təliminin nəticələri və göstəriciləri üstün deyil, son sıralarda qərarlaşır, (0) bal toplamış abituriyentlərin faiz göstəricisi daha yüksəkdir, bölgələrimizdə fizikanın öyrədilməsi kəskin fərqlənir, üstün uğur qazanan bölgələrin sayı çox azdır və s. (1)

Fizika təliminin mövcud durumunun xoşagəlməz mənzərəsinin formalaşmasına təsir göstərən faktorları sadalamaqla bitməz. Onların sırasında ikisi xüsusilə daha böyük əhəmiyyətə malikdir: müəllimlərin metodiki ustalığı və dərsliklərin məzmun səviyyəsi. Statistik təhlildən göründüyü kimi, fizika fənninin ümumtəhsil məktəblərində təlimi ilə bağlı yaranmış mənzərənin ürək açan olmaması onun səviyyəsinin çox aşağı olmasını təsdiqləyir. Bunun əsas səbəbi bir başa müəllimlə əlaqəlidir. Müəllim hazırlığı və müəllim üçün yaradılmış iş şəraiti, sosial qayğı bu günün tələblərini ödəmir. Fizika müəllimliyi proqramları zaman-zaman yenilənsə də alınan nəticələr gözlənilənlərlə uyğun gəlmir. Bölgələrdə fizika təliminin səviyyəsinin daha da aşağı olması isə bir sıra məktəblərdə fizika müəllimlərinin olmaması və ya olanların profesionallıq səviyyəsinin çox aşağı olması ilə əlaqədardır.

Dövlət İmtahan Mərkəzinin müxtəlif illərdə apardığı elmi-statistik təhlillərinin nəticələri göstərdi ki, fizika təliminin nəticələrinin yaxşılaşması ilə bağlı görülən tədbirlər yetərli təsir göstərmir. Fizika təliminin səviyyəsinin yüksəldilməsi məqsədilə ara-sıra müəyyən tədbirlər görülür. Ancaq bunların lokal xarakterli olduğuna görə nəticələr ürək açan deyildir. Fizika müəllimi ilə bağlı məsələlərə kompleks şəkildə baxıldığı halda müsbət nəticə verə bilər.

Respublikamızın bəzi təhsil mütəxəssisləri hesab edirdilər ki, kurikulum kompleks xarakterlidir, bütövlükdə hər hansı bir fənnin bütün maraqlarını özündə birləşdirir. Yəni kurikulumun tətbiqi fizika fənninin təlimi ilə bağlı məsələləri həll etməlidir. Arxada qalan illərin təcrübəsi özünü tam doğrultmadı. Bunun səbəbini kurikulumun həyata keçirilməsi ilə bağlı mütəxəssislərin və ya ümumtəhsil məktəblərində müvafiq şəraitin yetərli olmamasında görmək olar.

2013-cü ildə Azərbaycan Respublikası Təhsil Nazirliyi, Azərbaycan Respublikası Təhsil İnstitutu Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün fizika fənni üzrə təhsil proqramı (kurikulumu) (VI-XI siniflər) qəbul etdilər. Fizika fənni üzrə təhsil proqramının (kurikulumun) hazırlanması üçün işçi qrupu da yaradıldı. İşçi qrupu tərəfinə təcrübəli alimlər və müəllimlər daxil edildi. Fizika fənni üzrə təhsil proqramı (kurikulumu) və onun xarakterik cəhətləri, əsas məqsədi belə müəyyənləşdirildi. "Azərbaycan Respublikasında ümumtəhsil məktəbləri üçün fizika fənni üzrə təhsil proqramı (kurikulumu) fizika təliminin əsas məqsəd və vəzifələrini müəyyənləşdirməklə ümumi təlim nəticələrinə nail olmaq istiqamətində bütün fəaliyyətləri əks etdirən cəmiyyətin ehtiyac və tələbləri nəzərə alınmaqla hər bir şagirdin imkan və maraqlarına yönəlmiş sənəddir." (2)

Artıq dünyada təhsillə bağlı belə bir fikir formalaşmışdır ki, hər bir ölkənin təhsil sisteminin keyfiyyəti onun müəllimlərinin keyfiyyətindən üstün ola bilməz. Respublikamızda hər zaman müəllim hazırlığının keyfiyyətinin yüksəldilməsi

ilə bağlı bir sıra tədbirlər görülmüşdür. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasında müəllim və təlim texnologiyalarına önəmli yer verilir. Müəllim hazırlığı və təlim texnologiyalarının təkmilləşdirilməsi məsələləri təxirə salınmaz tədbirlərdən hesab olunur. "Müəllim və tədris metodikaları. Səriştəyə əsaslanmayan, əmək bazarında yetərincə rəqabətli olmayan əmək haqqı sistemi və maddi stimullaşdırma mexanizmlərinin adekvat olmaması təhsildə müəllim amilinin inkişafına mənfi təsir göstərmişdir. Təhsil sisteminin bütün pillələrində müəllimlərin bilik, bacarıq və peşəkarlıq qabiliyyətləri müasir tələblərə uyğun yüksəldilməlidir. Müvafiq stimullaşdırıcı mexanizmlər və səmərəli monitorinq sistemi vasitəsilə müəllim fəaliyyətinin keyfiyyəti artırılmalıdır." (3)

Azərbaycan Respublikası Təhsil Nazirliyinin 913 nömrəli 22 avqust 2014-cü il tarixli əmri ilə geniş tərkibli komissiyalar yaradıldı və onlara müasirliklə səsləşən ali təhsil pilləsinin dövlət standartlarının hazırlanması tapşırıldı. Bakalavriat səviyyəsinin ixtisas üzrə Təhsil Proqramlarında qeyd olunduğu kimi: "Təhsil haqqında" Azərbaycan Respublikasının Qanununa, Azərbaycan Respublikasının Nazirlər Kabinetinin müvafiq qərarları ilə təsdiq olunmuş "Ali təhsil pilləsinin dövlət standartı və proqramı"na, "Bakalavriat təhsilinin məzmunu və təşkili Qaydaları"nın tələblərinə və "Ali təhsilin bakalavriat səviyyəsi üzrə ixtisasların Təsnifatı"na uyğun hazırlandı. (4) Ali təhsil pilləsinin dövlət standartlarında müasirliklə bağlı bir sıra istəklər olmasına baxmayaraq, gözləntilər yenə də yetərli olmadı.

2018-ci ildə "Fizika müəllimliyi-050104" ixtisası bakalavriat təhsil pilləsi üzrə Bakı Dövlət Universiteti tədris olunan fənlərin proqramlar toplusu dərc olundu. Sənədin yaranmasına ehtiyac əsaslı idi. Fizika fənnin təlimi və onun nəticələri hələ də ürək oxşayan deyildi. Bu sənəddə əsas məqsəd fizika fənninin keyfiyyətli təlimini təmin edən fizika müəllimlərinin hazırlanmasına yeni bir yanaşma idi. (5)

Azərbaycan Respublikası Təhsil Nazirliyinin 28 aprel 2022-ci il tarixli F-238 nömrəli əmri ilə "Tam orta təhsil səviyyəsinin təmayüllü X-XI sinifləri üçün fizika fənni üzrə kurikulum" yenidən təsdiq olundu. Qəbul olunan yeni sənəd daha əhatəlidir, bir sıra sosial dəyərlərin tərbiyəsinə də yer verilir. Fizika fənn kurikulumu və onun xarakterik cəhətləri belə şərh olunur: "Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün fizika fənn kurikulumu fizika təliminin əsas məqsəd və vəzifələrini müəyyənləşdirməklə ümumi təlim nəticələrinə nail olmaq istiqamətində bütün fəaliyyətləri əks etdirən, cəmiyyətin ehtiyac və tələbləri nəzərə alınmaqla hər bir şagirdin imkan və maraqlarına yönəlmiş sənəddir. Bu sənəd fənnin əhəmiyyətini, məqsəd və vəzifələrini, ümumi təlim nəticələrini, məzmun xətləri və onların əsaslandırılmasını, məzmun xətləri üzrə standartları, fəaliyyət xətlərini, təhsil pillələri üzrə ümumi təlim nəticələrini, hər bir sinif üzrə məzmun standartlarını əhatə edir. Bunlardan əlavə, orada təlim strategiyaları və qiymətləndirmə məsələləri öz əksini tapır. "Fizika təliminin daha keyfiyyətli həyata keçirilməsi üçün geniş imkanlar açıldı." (6) Azərbaycan Respublikası Təhsil Nazirliyinin təsdiq etdiyi Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün fizika fənni üzrə təhsil proqramı (kurikulumu) əsasında "Fizika" dərslik komplekti də hazırlandı. Dərslik komplekti bir sıra vacib pedaqoji tələbləri özündə birləşdirilən təməl sənədləri əsasında: fizika fənn kurikulumunda əks olunan məzmun standartları və təlim nəticələrinə, təlim prosesinin təşkili qaydalarına, eləcə də qiymətləndirmə konsepsiyasına uyğun hazırlandı.

"Dərsliyin hazırlanmasında prioritet istiqamət olaraq şagirdlərin məntiqi, tənqidi və yaradıcı təfəkkürlərinin inkişafı, ümumiləşdirmə və ideyaların təqdim olunması, təbiət və cəmiyyətdə baş verən hadisələrin təhlili və dəyərləndirilməsi, tədqiqetmə və proqnozlaşdırma vərdişlərinin formalaşdırılması müəyyən edilmişdir. "Dərslikdə təqdim olunan tapşırıqların çoxu qrup şəklində, yaxud cütlərlə yerinə yetirilməsini nəzərdə tutduğu üçün şagirdlərdə birgə qərar qəbuletmə və kommunikasiya bacarıqlarının inkişaf etdirilməsinə yönəlmişdir. Bununla yanaşı, şagirdlərdə İKT-dən istifadə bacarıqlarının formalaşdırılması da diqqət mərkəzində olmuşdur." (6)

Azərbaycan Respublikası Təhsil Nazirliyinin 21 avqust 2022-ci il tarixli F-381 nömrəli əmri ilə bakalavriat səviyyəsinin "050105-Fizika müəllimliyi" ixtisası üzrə Təhsil Proqramı yenidən təsdiq olundu. Yeni Fizika müəllimliyi ixtisası üzrə Təhsil Proqramı əvvəlkilərdən daha mükəmməl və geniş kompentasiyaları əhatə edir. Artıq bu proqram fizika müəllimliyi təhsil proqramlarını həyata keçirən ali məktəblərdə tətbiq olunmadadır. Bu da ümidverici haldır ki, bu proqram fizika müəllimi

hazırlığına və Azərbaycan Respublikasının ümumtəhsil məktəblərində fizika təliminin keyfiyyətinə öz töhfəsini verəcəkdir.

Ümumtəhsil məktəblərində fizika təliminin problemləri, yuxarıda qeyd olunduğu kimi həddindən çoxdur. Onların hər biri ayrı-ayrılıqda fizika təliminin keyfiyyətinin artırılmasında əhəmiyyətlidir. Ümumtəhsil məktəblərində fizika təliminin təkmilləşdirilməsi və səmərəliliyinin artırılması məqsədilə aşağıda qeyd olunanların aradan qaldırılmasını təklif edirik:

- fizika müəllimliyi təhsil proqramlarını həyata keçirən ali təhsil müəssisələrində "Fizikanın tədrisi metodikası" kursunun quruluş və məzmununun dövrün tələblərinə uyğunlaşdırılması;

-ümumtəhsil məktəbləri ilə ali təhsil müəssisələrinin, eləcə də Dövlət İmtahan Mərkəzinin fizika proqramlarına fərqli yanaşmalarının nəticəsi olaraq formalaşmış uyğunsuzluğun aradan qaldırılması;

- fizika kursunun müxtəlif mövzuları əsasında müasir dövrün tələblərinə uyğun nəzəri, təcrübi bilik və bacarıqların formalaşdırılmasını təmin edən yeni fəal təlim metodlarından, təlim texnologiyalarından, kompüterlərdən istifadə metodikasının işlənməsi və maarifləndirici proqramların əlçatanlığının təmin olunması;

-didaktik tələblər əsasında fizikadan nümayişin səmərəli yollarının müəyyən edilməsi və məktəb fizika eksperimentinin sistemli tətbiqinin təmin edilməsi;

-fizika müəllimlərinin ixtisas dərəcələrinin yüksəldilməsi, müəllim hazırlığı proqramlarının təkmilləşdirilməsi, tədris və metodiki vəsaitlə bağlı təminatın gücləndirilməsi.

**Problemin aktuallığı.** Gənclərin qloballaşan dünyanın tələblərinə uyğun yetişdirilməsi, müasir cəmiyyətlərin inkişafı və davamlılığı üçün kritik əhəmiyyət kəsb edən aktual məsələlərdən biridir. Bu proses, gənclərin qlobal mühitə inteqrasiyasını təmin etməklə yanaşı, onların sosial, mədəni və iqtisadi imkanlarını artırmaq üçün strateji bir rol oynayır. Fizika elminin nailiyyətləri, bu inteqrasiya prosesinin önündə gedərək gənclərə geniş imkanlar təqdim edir. Fizika təhsil proqramlarının müasirləşdirilməsi, təlimin keyfiyyətinin artırılması, müasir təlim metodlarının tətbiqi və qiymətləndirmə sistemlərinin effektivliyinin artırılması, gənclərin analitik düşüncə və problem həll etmə bacarıqlarını gücləndirmək məqsədilə sosial cəmiyyətin əsas tələbləri arasında yer alır. Bu yanaşmalar, gənclərin qlobal çağırışlara hazırlığını təmin etmək və onların müasir dünyada uğurlu və məsuliyyətli vətəndaşlar olmalarını dəstəkləmək üçün zəruridir.

**Problemin yeniliyi.** Məqalədə fizika təhsil proqramlarının və fizika müəllimlərinin pedaqoji səriştəliliyinin artırılması məsələsinə bir neçə istiqamətdən aydınlıq gətirilmişdir. Bu sahədəki problemlərin həlli üçün konkret yollar təqdim olunmuşdur. Ümumtəhsil məktəblərində fizika təliminin səmərəliliyinə və nəticəyönlülüyünə mane olan çətinliklərin aradan qaldırılması məqsədilə elmi-pedaqoji yanaşmalara əsaslanan innovativ təkliflər irəli sürülmüşdür. Bu yanaşmalar, fizika dərslərinin müasir tələblərə uyğunlaşdırılması və səmərəli təlim metodlarının tətbiqini əhatə edir. Fizika müəllimlərinin peşə inkişafını dəstəkləmək, onların pedaqoji bacarıqlarını artırmaqla yanaşı, tələbələrin analitik düşünmə və problem həll etmə qabiliyyətlərini gücləndirmək məqsədini güdür. Bu yanaşmaların tətbiqi, fizika elminin cəmiyyətin inkişafındakı rolunu daha da artıracaqdır.

**Problemin praktik əhəmiyyəti:** Fizika təhsil proqramlarının müasirləşdirilməsi və effektiv təlim metodlarının tətbiqi, ümumtəhsil məktəblərində fizikanın öyrənilmə keyfiyyətini artıracaq. Bu, tələbələrin daha dərin bilik və bacarıqlara yiyələnməsinə kömək edəcək. Gənclərin qloballaşan dünyada rəqabətqabiliyyətini artıraraq iş bazarında daha yaxşı imkanlar təqdim edəcək. Fizika elminin inkişafı, ölkənin innovasiya və texnoloji irəliləyişinə müsbət təsir edəcək. Müəllimlərin pedaqoji səriştəliliyinin artırılması, onların peşəkar inkişafını dəstəkləyərək, təhsil prosesinin keyfiyyətini yüksəldəcək. Eyni zamanda, fizika elminin güclənməsi, iqlim dəyişikliyi, enerji resurslarının idarə edilməsi və digər qlobal problemlərin həllində mühüm rol oynayacaq.

**Ədəbiyyat:**


1. https://dim.gov.az/upload/iblock/374/374a8d785b155421a6e91d0aab5ca47b.pdf
2. https://www.arti.edu.az/nodupload/editor/files/4_%20Fizika-kurikulum.pdf
3. "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası", Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 24 oktyabr tarixli nömrəli Sərəncamı ilə təsdiq edilmişdir.
4. Azərbaycan Respublikası Təhsil Nazirliyinin 913 saylı 22 avqust 2014-cü il tarixli əmri.
5. "Fizika müəllimliyi-050104" ixtisası bakalavriat təhsil pilləsi üzrə tədris olunan fənlərin proqramlar toplusu. -Bakı, "Bakı Universiteti" nəşriyyatı, -2018, -244 s.
6. Azərbaycan Respublikası Təhsil Nazirliyinin 28 aprel 2022-ci il tarixli F-238 nömrəli əmri.


**E-mail:** vidadi_orucov@mail.ru

**E-mail:** aytenkerimova567@gmail.com

***İNGİLİS DİLİNİN TƏDRİSİ METODİKASI***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ АНГЛИЙСКОГО ЯЗЫКА***
***METHODOLOGY OF TEACHING ENGLISH***

*UOT 372.881.111.1*

***Günay Xəzail qızı Şirəliyeva***
*Azərbaycan Dillər Universitetinin İngilis və fransız dilləri fakültəsi*
*Xarici ingilis dilinin tədrisi metodikası kafedrasının müdiri,*
*pedaqogika üzrə fəlsəfə doktoru, dosent*
*https://orcid.org/0009-0003-1075-2273*
*https://doi.org/10.69682/arti.2024.91(6).203-208*

# ALİ MƏKTƏBDƏ İNGİLİS DİLİNİN TƏDRİSİNDƏ QİYMƏTLƏNDİRMƏNİN APARILMASININ PEDAQOJİ ƏSASLARI

***Гюнай Хазаил гызы Ширалиева***
*заведующий кафедрой Методики преподавания английского языка*
*факультета Английского и французского языков*
*Азербайджанского Университета Языков,*
*доктор философии по педагогике, доцент*

# ПЕДАГОГИЧЕСКИЕ ОСНОВЫ ОЦЕНИВАНИЯ ПРИ ПРЕПОДАВАНИИ АНГЛИЙСКОГО ЯЗЫКА В ВЫСШЕЙ ШКОЛЕ

***Gunay Khazail Shiraliyeva***
*head of the 203epartament of English language teaching methodology*
*faculty of English and French languages*
*at Azerbaijan University of Languages,*
*doctor of philosophy in pedagogy, associate professor*

# PEDAGOGICAL BASIS OF ASSESSMENT IN ENGLISH LANGUAGE TEACHING IN HIGHER SCHOOL

**Xülasə.** Məqalədə ali məktəbdə qiymətləndirmənin aparılması yolları, onun məqsədi və vəzifələri araşdırılır. Pedaqoji prosesin bir hissəsi olan qiymətləndirmənin müxtəlif funksiyalarına diqqət yetirilir. Öyrənməni stimullaşdırılmasında qiymətləndirmənin rolu və əhəmiyyəti nəzəri cəhətdən dəyərləndirilir, qiymətləndirməyə verilən tələblər diqqətə çatdırılır.
***Açar sözlər:*** *qiymətləndirmə, obyektivlik, şəffaflıq, nailiyyət, mərhələ.*

**Аннотация.** В статье рассматриваются способы проведения оценивания в высшей школе, его цель и задачи. Акцент делается на различных функциях оценивания как части педагогического процесса. Теоретически оценена роль и значение оценивания в стимулировании обучения, доведены до сведения требования к оцениванию.
***Ключевые слова:*** *оценивание, объективность, прозрачность, достижение, этап*

**Abstract.** The article examines the ways of conducting assessment in the higher school, its purpose and tasks. Emphasis is placed on the various functions of assessment as part of the pedagogical process. The role and importance of assessment in stimulating learning is theoretically assessed and the requirements for evaluation are brought to attention.
***Keywords:*** *assessment, objectivity, transparency, achievement, stage*

Öyrənmə prosesində səmərəli qiymətləndirmə tədrisin və öyrənmənin mərkəzi və ayrılmaz hissəsidir. Bu, bir tərəfdən qiymətləndirmənin, digər tərəfdən isə öyrənmənin konseptuallaşdığı və ifadə olunduğu yollar haqqında bəzi nəzəri suallar doğurur. Qiymətləndirmə və anlayışlarımız arasında uyğunluq dərəcəsi mövcuddur

və sinifdə tətbiq edilən qiymətləndirmə təcrübəsinə bu haqda fərziyyələri də daxil olmaqla bir sıra müxtəlif yanaşmalar tətbiq edilmiş və onların əsasını təşkil edən öyrənmə prespektivləri təhlil edilmişdir.

Hazırda informasiya cəmiyyətinin tələblərinə cavab verən yeni təhsil modelinə keçid şəraitində qiymətləndirmənin funksiyası yeni məna kəsb edir, qiymətləndirmənin məqsədləri dəyişir. İndi qiymətləndirmə təkcə nöqsanların aşkarlanmasına deyil, təhsilin keyfiyyətinin yüksəldilməsi prosesinin fasiləsizliyini təmin edən mexanizmə çevrilməli, tədris prosesinin bütün subyektləri üçün konstruktiv əks əlaqə yaratmalıdır. Qiymətləndirmə yalnız əldə edilənləri yekunlaşdırmamalı, o, başlanğıc nöqtəyə çevrilməli, ardınca yeni inkişaf mərhələsinə, təhsilin keyfiyyətinin yeni səviyyəsinə yüksəlməlidir. Və burada söhbət, qiymətləndirmə vasitələrinin dəyişdirilməsindən deyil, qiymətləndirmənin məqsədlərini və qiymətləndirmə fəlsəfəsini dəyişdirməkdən gedir.

Gündəlik nitqdə müəllimlər, şagirdlər və onların valideynləri "qeyd almaq" və "qiymət almaq" ifadələri arasında fərq qoymurlar. İzahlı lüğətlərə görə, "qiymətləndirmə" və "qeyd" sözlərinin mənası sinonim deyil. Qiymətləndirmə insanın bir şeyin dəyərləri, səviyyəsi və ya keyfiyyəti haqqındakı fikridir. Qiymət, tələbənin bilik dərəcəsinin dövlət tərəfindən müəyyən edilmiş göstəricisidir. Orta və ali məktəb leksikonunda bu sözlər bir-birindən fərqlənməmək həddinə qədər yaxınlaşıb və müəllimlər Təhsil Nazirliyinin dili ilə tədrisin uğurları haqqında şəxsi fikirlərini bildirirlər.

Müasir tədqiqatlarda qiymətləndirmə metodu, ilk növbədə, təlimə fərdi yanaşmanı təmin edən, tələbələrin imkan və ehtiyaclarını nəzərə alan, onların müstəqil işləmək bacarığını inkişaf etdirən, tədris prosesində pedaqoji qiymətləndirmə texnologiyası kimi nəzərdən keçirilir. Qiymətləndirmə mexanizmləri informasiya mənbələrini və tədris materialını mənimsəyir və bütün prosesin sistemləşdirilməsinə kömək edir.

Pedaqoji ədəbiyyatda ali məktəblərin pedaqoji məkanında tələbənin özünüqiymətləndirmə və qarşılıqlı qiymətləndirilməsinin inkişaf etdirilməsi vasitəsi kimi tələbənin təhsil nailiyyətlərinin qiymətləndirilməsi metodunun nəzəri əsaslarının müəyyənləşdirilməsinə həsr olunmuş tədqiqatlar yer alır.

Elmi ədəbiyyatın və təhsil nailiyyətlərinin qiymətləndirilməsi sistemi üzərində işləyən müasir təhsil müəssisələrinin təcrübəsinin təhlili aşağıdakı ziddiyyətləri müəyyən etməyə imkan verir:

- təhsil nailiyyətlərinin qiymətləndirilməsi sisteminin tətbiqinə artan ehtiyac və onun özünə hörmət və tələbənin qarşılıqlı qiymətləndirilməsinin inkişafı üçün onun imkanlarının müəllimlər tərəfindən kifayət qədər təhlil edilməməsi;

- təhsil müəssisəsinin pedaqoji məkanında tələbənin özünəinamının inkişaf etdirilməsi zərurəti ilə tələbənin özünüqiymətləndirməsi və qarşılıqlı qiymətləndirilməsi vasitəsi kimi tələbənin təhsil nailiyyətlərinin qiymətləndirilməsi sisteminin nəzəri əsaslarının olmaması.

Müəyyən edilmiş ziddiyyətlər problemin bir sual şəklində qurulmasına səbəb olur: təhsil prosesində hansı şəraitdə tələbənin nailiyyətlərinin qiymətləndirilməsi sistemi tələbənin özünə hörmətini və qarşılıqlı qiymətləndirilməsini, onun xarici dil öyrənməkdə motivasiyasını inkişaf etdirmək vasitəsi ola bilər.

Təlim nəticələrinin qiymətləndirilməsinin əsas vəzifələrindən biri tələbələrin tədris və təlim fəaliyyəti keyfiyyətlərini yüksəltməkdir [3, s. 9]. Bu baxımdan qiymətləndirmə tələbənin nailiyyətlərindən xəbərdar olmağa, nöqsanlarını müəyyən etməyə və düzəltməyə, müəllimə isə ən səmərəli təlim texnologiyalarından istifadə etməklə tədris prosesini təkmilləşdirməyin yollarını axtarmağa imkan verən nəzarət kimi nəzərdən keçirilməlidir [4, s. 238]. Qeyd etmək lazımdır ki, qiymətləndirmə təkcə bilik, və bacarıqların üzərində deyil, səriştələrin formalaşması keyfiyyətinin yoxlanılması səviyyəsində də aparılmalıdır [2, s. 35]. Təhsil nailiyyətlərinin qiymətləndirilməsi ehtiyacı təhsil prosesinin bütün iştirakçıları – tələbələr, müəllimlər, valideynlər- tərəfindən qeyd olunur.

Qiymətləndirmə termininə ədəbiyyatlarda və lüğətlərdə müxtəlif izahatlar verilmişdir. Qiymətləndirmə bir şeyin dəyərinin və ya əhəmiyyətinin müəyyən edilməsidir. (Böyük psixoloji izahlı lüğət) Qiymətləndirmə, qiymətin verilməsi ilə tamamlanan hər hansı bir rəsmiləşdirilmiş və ya ekspert olan mürəkkəb bir prosesdir. Bu proses aşağıdakıları əhatə edir:

-təlim və təhsilin nəticələrinin keyfiyyəti və dinamikası haqqında məlumat toplamaq;

-bəzi qəbul edilən məlumatların işlənməsi və kontekstual şərhi;

-mühüm yekun təlim qərarları və məqsədləri.

Qiymətləndirmənin əsas vəzifələri isə bunlardır:

-mümkün nəticələri, metodoloji yanaşmaların həyata keçirilməsinin nəticələrini proqnozlaşdırmaq;

-rəy bildirmək;

-qarşıya qoyulan məqsədlərə çatma dərəcəsini qiymətləndirmək;

-müşahidə olunan dəyişikliklərin həyata keçirilən metodik tədbirlərlə necə və nə dərəcədə əlaqəli olduğunu qiymətləndirmək;

-metodoloji yanaşmaların gələcəkdə həyata keçirilməsi üçün sübuta əsaslanan məlumatı təmin etmək.

Qiymətləndirmə tələbələrin nəyi bilmədiklərini aşkar etmək üçün deyil, onların nəyə nail olduqlarını nümayiş etdirmək üçün aparılır. Tələbələr qiymətləndirilərkən təlim və təhsilin müxtəlif aspektləri, dərslik və dərs vəsaitləri, tələbələrin davamiyyəti və bütünlüklə təlim proqramı nəzərə alınır.

Qiymətləndirmənin funksiyalarına aşağıdakılar daxildir:

-stimullaşdırıcı – uğur və ya təcrübə vasitəsilə iradi sahəyə təsir edərək uğursuzluq, iddia və niyyətlərin, hərəkətlərin və əlaqələrin formalaşması;

- diaqnostik – şagirdlərin biliyinin keyfiyyətinin davamlı monitorinqi, təhsilin müxtəlif mərhələlərində bilik səviyyəsinin ölçülməsi, qarşıya qoyulan məqsədlərdən kənara çıxma səbəblərinin müəyyən edilməsi və tədris fəaliyyətinin vaxtında tənzimlənməsi;

-müəllimin özünün tədris fəaliyyətinin səmərəliliyinin yoxlanılması; monitorinqi və qiymətləndirməsi

-müəllimə işinə düzəlişlər etdiyini nəzərə alaraq, tədris prosesinin keyfiyyəti haqqında məlumat əldə etməyə imkan verməsi

-fərdi təhsil alan tələbələrdə adekvat özünə hörmətin formalaşması. Tələbələrin adekvat özünüqiymətləndirməsi müəllimin qiymətlərinin və dəyər mühakimələrinin təsiri altında formalaşır. Bu təsirlər neqativdirsə, aşağı səviyyədə olan özgüvənin formalaşmasına gətirib çıxarır, tələbədə özünə inamsızlıq aşılayır, nəticədə təlim motivasiyasının azalması və öyrənməyə marağının itməsi; tələbələrin öyrənmə fəaliyyəti üçün güclü motiv; sinif kollektivində şəxsiyyətlərarası münasibətlərdə dəyişikliklər, tələbələrin statusunun yüksəldilməsinə kömək edir. Qrup yoldaşlarının ayrı-ayrı tələbəyə müsbət və ya mənfi münasibəti ona nə dərəcədə müsbət və ya mənfi pedaqoji təsirlərin və qiymətləndirmələrin tətbiq olunmasından asılıdır. Qiymətləndirmə prosesinə aşağıdakı tələblər tətbiq edilir:

-əldə edilmiş təhsil nəticələrinin qiymətləndirilməsi;

-onların formalaşması prosesinin qiymətləndirilməsi;

-hər bir tələbənin öz təlim prosesinin inkişaf xüsusiyyətləri haqqında məlumatlılığının qiymətləndirilməsi.

Tələbələrin qiymətləndirilməsi müəllimlərə təlimin səmərəliyini yoxlamaq imkanı verir. Tələbələrin qiymət vasitəsilə biliklərinin yoxlanılması çox vacibdir, çünki bu yolla həm müəllimlər, həm də tələbələr təlim prosesində nəyə nail olduqlarını öyrənirlər.

Xarici dilin öyrənilməsi prosesinə və nəticələrinə nəzarət və monitorinq, qiymətləndirmənin əsas ümumi pedaqoji və xüsusi metodoloji prinsipləri əsasında təşkil olunur:

- qüvvədə olması prinsipi : nəzarət olunan hissələr təlim məqsədlərinə uyğundur;

- etibarlılıq: vahid göstəricilərin məcburi istifadəsi və nailiyyətlərin qiymətləndirilməsi meyarları;

- obyektivlik: əldə edilmiş nəticələrin müəyyən bir nəticəyə uyğunluğu üçün dil biliyi tələblərində olan standart öyrənmənin müxtəlif mərhələləri;

– inteqrasiya: nəzarət planlaşdırılır və təlim prosesinə inteqrasiya edir;

– tələbələri iş görülməzdən əvvəl açıq şəkildə qiymətləndirməinin meyarları və metodları haqqında məlumatlandırmaq;

- sistemlilik və müntəzəmlik;

- nəzarətin diferensial xarakter daşıması prinsipi;

- nəzarət forması olmalıdır;

- dilin yoxlanılan aspekti tapşırığın mətninin aydınlığına və ya nitq fəaliyyətinin növünə uyğun olmalıdır. [2, s. 34].

Təlim prosesində qiymətləndirmənin əsas amillərindən biri prosesin necə aparılmasına nəzarətin təşkil olunmasıdır. Qiymətləndirmə təlimin ayrılmaz hissəsidir və əsas iştirakçıları isə tələbələrədir. G. Viggins və C. Maktig

"Understanding by Design" kitabında auditoriyada çərçivələrdən istifadə edilməsini təklif edirlər, "Backward Design" adlandırdıqları bu dizaynı pedaqoji baxımından çox önəmli hesab edirlər. Müəllim və təlim planını tərtib edənlər konkret dərs və ya bölməni tərtib etməmişdən əvvəl ona qiymətləndirici kimi yanaşalar, tələbələrin planlaşdırılan məqsədə çatıb-çatmadıqlarını bu yolla öyrənə bilərlər [8, s. 228].

Təlim prosesində qiymətləndirmənin, əsasən iki növündən istifadə olunur: ilin, rübün və ya semestrin sonunda aparılan qiymətləndirmə (*summativ qiymətləndirmə*) və formativ qiymətləndirmə.

Summativ qiymətləndirmə təlim müddəti bitdikdə yekun olaraq həyata keçirilir. Əsas məqsədi il boyu və ya fənni keçdiyi dövrdə, kursun davam etdiyi müddət ərzində əldə etdiyi biliklərin nəticələrinin yekun qiymətləndirilməsinin meyarlar üzrə hesablanmasıdır.

Summativ qiymətləndirmə əvvəlcədən razılaşdırılmış və təsdiq olunmuş vaxtda həyata keçirilir və bu qiymətləndirmənin nəticələri, artıq keçirilən materialları və istifadə edilmiş strategiyaları, tətbiq olunmuş tələbələr və ya istifadə edən müəllimlər tərəfindən dəyişmək imkanı vermir. Sadəcə olaraq, summativ qiymətləndirmə müəllimə və təhsil proqramlarını tərtib edən səlahiyyətli şəxslərə nəticələrə uyğun təhlil aparıb uyğun metod seçməyə yardım edir [7, s.7]. Qiymətləndirmənin əsas komponentləri aşağıdakılardır:

1. Zaman ötdükcə təlimin inkişaf səviyyəsinin nəzərə alınması;

2. Tələbələrin təhsilə marağının oyadılması;

3. Təlimin strategiyalarının qiymətləndirilməsi;

4. Tələbələrin yaş qrupları üzrə inkişaf səviyyələri.

Formativ qiymətləndirmə prosesin gedişatında tələbələrin mütəmadi qiymətləndirilməsidir. Əsas məqsədi isə daha çox öyrədicidir, təlim prosesi müddətində tələbələrin təhsil səviyyəsini inkişaf etdirməkdir.

Qiymətləndirmə aşağıdakı məqsədlər üçün həyata keçirilə bilər:

-tələbələrin təhsilə motivasiya hissini gücləndirmək;

-təlimin inkişaf etdirilməsi və nəzarətin təşkil olunması;

-tələbələrə zəif və güclü tərəflərini aşkar etməyə imkan yaratmaq və hər bir tərəfə müvafiq addımlar atmaq;

- təlimin qarşısında duran məqsədlərə nə dərəcədə əldə olunmasını yoxlamaq.

Yuxarıda qeyd olunanlar, qiymətləndirmənin sadəcə tələbələrə qiymət verilməsi deyil, eyni zamanda təlimin yüksəlməsi və tələbənin inkişafını nəzərdə tutun bir proses olduğunu sübut edir. Tələbənin təlim səviyyəsini yoxlamaq üçün qiymətləndirmə çox vacib olsa da o, tələbənin təhsilinin keyfiyyətini artırmağa yönəlmiş ikinci bir fəaliyyət hesab edilir. Müvafiq qiymətin verilməsi prosesi mürəkkəbdir: müəllim bir sıra amilləri nəzərə almalıdır; bunlara zaman, tələbəyə verilmiş tapşırığın xarakteri, növü, məqsədi daxildir.

Təlim prosesində iştirak edən hər iki tərəf, yəni, müəllim və tələbələr bir sıra strategiyalar, materiallar, fəaliyyətlər istifadə edirlər. Lakin bəzən, planda nəzərdə tutulan fəaliyyətlərin heç də hamısı təcrübədə yerinə yetirilmir. Bu müxtəlif səbəblərdən baş verə bilər. Burada əsas önəmli tələbələr üçün nəzərdə tutulmuş tapşırıqların çətin olması və ya onlardan gözlənilən reaksiyanın baş verməməsidir. Ona görə də, qiymətləndirmə zamanı planda nəzərdə tutulan fəaliyyətlər deyil, faktiki olaraq tələbələrin praktik təcrübədə nə öyrəndikləri nəzərə alınmalıdır.

Tələbələrin biliklərinin qiymətləndirilməsində ən çox istifadə edilən müxtəlif metodlar və dil məqsədləridir. Qiymətləndirmənin obyektiv aparılmasına nail ola bilmək müəllimdən təlimin məqsədlərini yaxşı xəbərdar olmasını tələb edir. [6, s. 10].

Gensee və Apşura fikrincə, sillabusda tədris planına əsasən dil materialının necə və nə zaman tədris edilməsi öz əksini tapır. Düzgün tərtib edilmiş sillabusda təlimin bütün aspektləri barəsində məlumat verilir. Təlim planının qiymətləndirmədə yararlı olan əsas komponentlərini qısaca olaraq aşağıdakı şəkildə ifadə etmək olar: təlimin quruluşu, məzmunu, dərsdə istifadə edilən təchizat, material və müxtəlif fəaliyyət növü və rollar [5, s. 9].

Xarici dillərin tədrisi və öyrənilməsi prosesinə bir sıra faktorlar təsir edə bilər. Bu faktorlar sinifdənxaric faktorlardır. Auditoriyadan kənarda tələbənin yaşam tərzi, cəmiyyət, mühit, ətrafındakı insanlar, ehtiyacları, mədəni səviyyələri, təhsilə qədərki bilikləri, dünyagörüşləri,

müəllimlərin münasibəti, auditoriyadakı tələbələrin sayı və tərkibi, dərs müddəti, müəllimlərin professional hazırlığını bu faktorlara aid etmək olar. Başqa sözlə, təlim məqsədi, planı və təcrübəsi giriş amilləri ilə uyğunlaşmalıdır. Bu amilləri artıq məcazi mənada desək "daşlaşmış" olduqlarından onları dəyişmək heç də həmişə mümkün olmur. Alternativ olaraq müəllimlər tədrisin digər üç komponentində müvafiq dəyişikliklərapara bilərlər.

Pedaqoji baxımdan qiymətləndirmənin aparılması - müəllimin məqsəd qoyması, təlim fəaliyyətinin nəticələrini yoxlaması və təhlil etməsi, yoxlama tapşırıqları (suallar) hazırlaması yoxlama işləri və tələbəyə qiymət yazması və qeydlər etmək, şərh bildirmək kimi bir-birilə qarşılıqlı əməliyyatları həyata keçirməkdir.

Qiymətləndinnə – pedaqoji prosesin obyektivliyini, səmərəliliyini, real olduğunu, məqsədəuyğunluğunu və sistemliliyini aşkarlamağa, nəticələri yoxlamağa imkan verən mürəkkəb bir mərhələdir [1, s. 334].

Həm müəllim, həm də tələbə üçün çox vacib hesab olunan qiymətləndirmə prosesi təlimin nə səviyyədə baş verməsini, tələbənin isə necə öyrəndiyini göstərir. Beləliklə, qiymətləndirmə tələbə və müəllimləri uğura aparan bir "yol xəritəsi"dir. Burada əsas məqsəd təhsilin keyfiyyətini artırmaqdır. Ümumiyyətlə, qiymətləndirmə bir sıra məqsədlərə xidmət edir. Buna aşağıdakılar daxildir:

1. Diaqnostik yoxlanılma: bir tələbənin nə əldə etdiyini, anladığını və ya göstərdiyini müəyyən etmək;

2. Təlim prosesi: növbəti öyrədiləcək materialı və ya yenidən öyrədilməsi lazım olanları müəyyənləşdirmək;

3.Yekun hesabat: Şagirdin nailiyyətləri barədə hesabat vermək üçün məlumat toplamaq;

"Pedagogy and Assessment Guide" ("Pedaqogika və qiymətləndirmə təlimatı" kitabında pedaqogikanın qiymətləndirmə ilə sıx əlaqədə olması və onların bir-biri ilə vəhdətdə fəaliyyət göstərməsi haqqında fikirlər qeyd olunub. Mənbədə yazılanlar qiymətləndirməni pedaqoji nöqteyi-nəzərdən bu şəkildə səciyyələndirirlər:

1. Təlim müsbət şəraitdə aparılmalıdır. Bu da tələbələrə materialı kifayət qədər yaxşı mənimsəməkdə imkan yaradacaqdır ;

2. Fəal tələbələrin əvvəl qazandıqları bilik sayəsində müvəffəqiyyət əldə etmələri anlaması üçün təlim prosesində əvvəl qazanılmış biliklərə istinad edilməlidir

3. Tələbələrin özünü rahat idarə edə bilməsi üçün şərait yaradılmalıdır;

4. Tələbələr mütləq şəkildə öyrəndikləri bilikləri real həyati situasiyalarla əlaqələndirməyi bacarmalıdırlar;

Müəllim dərs prosesini qarşılıqlı iş kimi hər iki tərəfin iştirakı ilə təşkil etməlidir. Təlim prosesi müddətində müəllim təkcə hər hansı materialı tələbəyə öyrətmir, o, eyni zamanda həmin tələbəyə öyrənməyi öyrədir. Pedaqoji nöqteyi-nəzərdən təlim prosesi bir neçə mərhələdən ibarətdir:

1.Birinci mərhələ - motivasiya. Tələbədə xarici dili öyrənməyə həvəsin olub-olmamasından asılı olmayaraq, müəllim dərs prosesini elə qurmalıdır ki, o, tələbədə xarici dili öyrənməyə həvəs oyatsın.

2. İkinci mərhələ – oriyentasiya. Tələbə öyrənəcəyi material və məqsədəyönlü fəaliyyətin normaları ilə tanış olacaqdır.

3. Üçüncü mərhələ – material. Bu mərhələdə tələbə bilavasitə müəyyən fəaliyyətlər ilə (oxuma, tərcümə etmə, qrammatik materialın öyrənilməsi), müəllim isə bu fəaliyyətlərin düzgün yerinə yetirilməsini nəzarət etməklə məşğul olur.

4. Dördüncü mərhələ – nitq mərhələsidir. Bu mərhələdə tələbənin şifahi və yazılı nitq vərdişləri formalaşmağa başlayır.

5. Beşinci mərhələ – əqli fəaliyyətlər prosesi avtomatlaşır

Pedaqoji qiymətləndirmə bir sıra prinsiplərə uyğun şəkildə aparılmalıdır. Bu prinsiplər aşağıdakılardır: obyektivlik; ədalətlilik; hərtərəflilik; keyfiyyət və kəmiyyətcə müəyyən olması: dəqiqlik; etibarlılıq; müasirlik; məhsuldarlıq (səmərəlilik); bərabərlik; şəffaflıq; demokratiklik.

Tələbənin qiymətləndirilməsi zamanı müəllim obyektiv və ədalətli olmalı, hərtərəflilik prinsipinə əməl etməlidir. Tələbənin verdiyi cavablar tələb olunan meyarlara uyğun gələrsə, şəffaf, obyektiv şəkildə qiymətləndirmək lazımdır. Tələbələr arasındakı ayrı-seçkilik qoyulmamalı, bərabərlik prinsipi pozulmamalıdır.

Tələbənin qiymətləndirilməsi, həmçinin müasir formada demokratik həyata keçirilməlidir. Qiymətlindirmə prosesində əldə olunan nəticə tələbəni qane etmədikdə müəllim əlavə suallar verərək prosesi davam etdirə bilər. Nəticə tələb olunan meyarlara uyğun qənaətbəxş olarsa qiymətləndirmənin nəticəsi dəyişdirilə bilər.

Tələbələrdə özünü qiymətləndirmə və tələbələrin bir-birinin qiymətləndirməsini də inkişaf etdirmək məqsədəuyğundur. Belə olan halda tələbələr müəllim tərəfindən onlara verilən qiymətin obyektivliyinə, ədalətliliyinə şübhə ilə yanaşmayacaqlar.

Qiymətləndirmə metodu seçilərkən, aşağıdakılar nəzərə alınmalıdır;

• nəzarətin obyekti (təlimedici əməliyyat);

• nəzarətin predmeti (əməliyyatın gedişi və nəticələri);

• nəzarətin vasitələri (təlimedici əməliyyatın gedişi və nəticələrinin yoxlanması məqsədilə verilən tapşırıqlar);

• konkret tapşırıqların icrası zamanı tələbələrin cavabları;

• nəzarətin tezliyi və müntəzəmliyi; Nəzarət obyektinin qiymətləndirilməsi məqsədi ilə aşağıdakı metodlardan istifadə olunur:

• təlim materialının şərhi və izahı metodları;

• nəzarətin predmetinin qiymətləndirilməsi məqsədilə əməliyyatlara və onların nəticələrinə nəzarət metodları;

• nəzarətin vasitələrinin qiymətləndirilməsi məqsədilə biliklərin bərpa edilməsi (təlim materialının yazılı və ya şifahi şəkildə nəql edilməsi) metodları;

• tələbələrin cavablarına nəzarət məqsədilə konstruktlaşdırılmış metodlar;

• nəzarətin tezliyi və müntəzəmliyinə görə sistematik, epizodik, bütöv aralıq və yekun (son) nəzarət metodları;

Qeyd olunan əsaslara görə nəzarət metodlarının seçilməsi – əldə edilmiş (qazanılmış) nəticələrin səviyyəsini aşkarlamağa imkan verir [1, s. 338].

**Problemin aktuallığı.** Bu gün müasir təhsilin qarşısında duran əsas problemlərdən biri tələbə nailiyyətinin adekvat şəkildə dəyərləndirilməsi və qiymətləndirmənin düzgün aparılmasıdır. Qiymətləndirmənin yalnız birtərəfli, yəni sadəcə müəllim tərəfindən aparılması deyil, eyni zamanda tələbələrin öz fəaliyyətlərini dəyərləndiməsi də bu prosesin bir hissəsi olaraq qarşımıza çıxır. Məqalədə qiymətləndirmənin bu aspektlərinin araşdırlıması və nəticələrin təqdim edilməsi məsələnin aktuallığını təmin edir.

**Problemin elmi yeniliyi.** Xarici dillərin, o cümlədən ingilis dilinin tədrisi prosesində qiymətləndirməyə verilən tələblərin və tələbə fəaliyyətinə nəzarət mexanizminin müasir təhsil konstekstində araşdırlıması, həmçinin tətbiqi yollarının təqdim edilməsi problemin elmi yeniliyini əsaslandırır.

**Problemin praktik əhəmiyyəti** ondan ibarətdir ki, məqalədə göstərilən nəticələr qiymətləndirmənin təhsilin müxtəlif pillələrində məqsədəuyğun olaraq həyata keçirilməsində tətbiq edilə bilər, həmçinin də xarici dillərin tədrisini həyata keçirən ali təhsil müəssisələrində metodik cəhətdən istifadə edilə bilər.

**Ədəbiyyat:**


1. Минеева О.А., Борщевская Ю.М., Мададова К.Х., Пирогова А.А., Корнева Т.А. Из опыта формирования фонда оценочных средств учебной дисциплины // Известия Балтийской государственной академии рыбопромыслового флота: психологопедагогические науки, 2017. № 4. -С. 33-39
2. Abbasov, A.N. Pedaqpgika nəzəriyyəsi və tarixi: Ali təhsil müəssisələri üçün dərslik / A.N. Abbasov, L.A. Məmmədli, İ.B. Əmirəliyeva. -Bakı: Mütərcim, 2022. - 464 s.
3. Смирнова Ж.В., Красикова О.Г. Современные средства и технологии оценивания результатов обучения // Вестник Мининского университета. 2018. Т. 6. № 3. -С. 9.
4. Цветкова С. Е., Минеева О. А. Методическая система, цели и средства иноязычной подготовки бакалавров в сфере экономики и бизнеса // Азимут научных исследований: педагогика и психология. 2018. Т. 7. № 4. -С. 235-240
5. Bialystok E. Communication Strategies: a psychological analysis of second language use. -Oxford, B. Blackwell, -1990.
6. Genesee, F. and J. Upshur Classroom-Based Evaluation in Second Language Education. Cambridge University Press. 1996.
7. Maki, Peggy L. “Developing an Assessment Plan to Learn about Student Learning.” The Journal of Academic Librarianship 28.1. 2002.
8. Selinker L. Tomlin R.S. An Empirical look at the integration and separation of skills / ELT Journal, 1986, pp. 227-23



**E-mail:** g.shiraliyeva@adu.edu.az



**Redaksiyaya daxil olub:** 09.12.2024.

*UOT 372.8*

***Maya Zahir qızı Heydərova***
*Azərbaycan İdman Akademiyasının baş müəllimi,*
*pedaqogika üzrə fəlsəfə doktoru*
*https://orcid.org/0009-0006-36-42-4894*
*https://doi.org/10.69682/arti.2024.91(6).209-212*

## VOLEYBOLDA ZƏDƏLƏNMƏLƏRİN SƏBƏBLƏRİ VƏ ONLARIN PROFİLAKTİKASI

***Мая Загир гызы Гейдарова***
*старший преподаватель Азербайджанской Спортивной Академии,*
*доктор философии по педагогике*

## ПРИЧИНЫ ТРАВМ В ВОЛЕЙБОЛЕ И ИХ ПРОФИЛАКТИКА

***Maya Zahir Heydarova***
*head teacher of Azerbaijan Sports Academy,*
*doctor of philosophy in pedagogy*

## REASONS OF INJURES IN VOLLEYBALL AND THEIR PREVENTION

**Xülasə.** Məqalə voleybolçuların zədələnmələrinin profilaktikasına həsr edilmişdir. Burada onların spesifik zədələnmələrinin səbəbləri açıqlanır, onların qarşısının alınması yolları təhlil edilir. Qeyd edilir ki, voleybolçuların ən çox rast gəlinən zədələri yuxarı və aşağı ətrafların əzilmələri, bağların, vətərlərin, ayaq, əl əzələlərinin, gövdənin dartılmaları, çiyin, baldır oynaqlarının çıxığı, ayaq pəncələrinin aşınmaları, əzələ qıc olmalarıdır. Voleybol oynayarkən təhlükəsizliyi təmin etmək və zədələrin qarşısını almaq üçün müəyyən təhlükəsizlik qaydalarına riayət etməyin vacibliyi vurğulanır. Qeyd edilir ki, rəqibin hərəkətinə diqqət etmək və vaxtında cavab vermək, əzələlərin qızışması üçün istiləşməyə zərurəti təmin etmək, oynaqların hərəkətliyini və amplitudasını artırmaq, texniki hərəkətlərin və texnikanı düzgün yerinə yetirilmək, düzgün, xüsusi seçilmiş geyim forması və ayaqqabılardan istifadə etmək, - bütün bunlar zədələnmələrin qarşısını almaq üçün zəruri olan hərəkətlərdir.
***Açar sözlər:*** *voleybolçuların zədələnmələri, topuq zədələri, diz zədəsi, çiyin və bel zədələri, bağların burxulması, oynağın yerindən çıxması, profilaktika.*

**Аннотация.** Статья посвящена профилактике травматизма волейболистов. Тут раскрываются причины их специфических травм, и пути профилактики. Отмечается, что для волейболистов наиболее характерны такие травмы, как ушибы верхних и нижних конечностей, растяжения связок, сухожилий, мышц ног, рук, туловища, вывих плечевых, голеностопных суставов, потертости стоп ног, судороги мышц. Для обеспечения безопасности и в целях профилактики травматизма необходимо соблюдать такие правила техники безопасности, как концентрация на действии соперника и своевременность ответных действий, необходимость в разминке для разогрева мышц (повышение подвижности в суставах и амплитуды), правильное выполнение технических действий и приемов, правильная специально подобранная форма и обувь.
***Ключевые слова:*** *травмы волейболистов, повреждения лодыжки, повреждения колена, повреждения плеча и спины, растяжение связок, вывих сустава, профилактика.*

**Abstract.** The article is devoted to the prevention of injuries of volleyball players. The reasons for their specific damage and prevention ways are being analyzed. It is noted that volleyball players' most common

injuries are upper and lower limbs, ligaments, tendons, feet, hands sprains of muscles, torso, shoulder, calf joints, foot their claws are worn, muscle spasms. To ensure safety and prevent injuries while playing volleyball the importance of following certain safety rules is emphasized. It is highlighted that while paying attention to the movement of the opponent and responding in time, warming up muscles, joint mobility and to increasing the amplitude, performing technical movements and technique correctly, using correct, specially selected uniform and shoes-all these are actions necessary to prevent injury.

***Keywords:*** *injuries of volleyball players, ankle injuries, knee injuries, shoulder and back injuries, ligament sprains, joint dislocations, prevention.*

Voleybol haqlı olaraq ən təhlükəsiz idman oyun növlərindən biri kimi tanınır. Ancaq hər bir idman növündə olduğu kimi, voleybolda da zədələnmələr olur. Statistikaya görə, voleybolçular ən çox ayaq biləklərindən, həmçinin barmaq və dizlərdən əziyyət çəkirlər.

Voleybolçuların ən çox rast gəlinən zədələri bunlardır: yuxarı və aşağı ətrafların əzilmələri; bağların, vətərlərin, ayaq, əl əzələlərinin, gövdənin dartılmaları, çiyin, baldır (bəzi hallarda dirsək, bilək, diz) oynaqlarının çıxığı, ayaq topuqlarının burxulmaları; əzələ qıc olmaları (əsasən baldır və bud). Bu məqalədə biz voleybolda ən çox görülən zədələri, onların səbəblərini, növlərini, qarşısının alınması tədbirlərini və ilk tibbi yardımı nəzərdən keçirəcəyik.

**Voleybolda zədələrin səbəbləri.** Voleybolda rəqiblər arasında birbaşa əlaqə olmamasına baxmayaraq, idmançılar oyun zamanı zədə ala bilərlər. Bu idman oyununda zədə nisbəti digər komanda oyunlarına nisbətən xeyli aşağıdır. Voleybolda zədələrin səbəbləri ilk növbədə torun altındakı manevrlərdir. Çox vaxt oyunçular hücum edərkən və blok edərkən zədələnirlər. Voleybolda ən şiddətli döyüş torun altında baş verir, bu zaman oyunçular zədələnə bilərlər. Araşdırmalara görə, voleybolda topuq zədələrinin 70%-dən çoxu bir oyunçunun digər oyunçunun ayağına enməsi səbəbindən baş verir. Voleybolda zədələrin növlərinə və onların ümumi səbəblərinə baxaq:

**Ayaq bilək zədələri.** Statistikaya görə, voleybolda bilək zədələri ümumi zədələrin təxminən 30%-ni təşkil edir. Ayaq biləyinin zədələnməsi kəskin hərəkətdən və ya yorğunluqdan ola bilər. Birinci növ zədə sağlam toxumanın ilkin zədələnməsi, ikincisi xroniki xarakter daşıyan köhnə zədələrdir. Voleybolda ayaq topuğunun zədələnməsinin səbəbləri arasında oyun zamanı ayağın düzgün yerləşdirilməməsi və başqa oyunçunun ayağın enməsidir.

**Barmaqların zədələnməsi.** Bu zədələr voleybolda ümumi zədələrin təxminən 22%-ni təşkil edir. Barmaqların zədələnməsi ən çox blok həyata keçirərkən baş verir. Daha çox rast gəlinən barmaq zədələri burulma və burxulmalardır. Sınıqların nisbəti təxminən 25% -dir.

**Diz zədələri.** Voleybolda diz zədələri bütün zədələrin təxminən 19%-ni təşkil edir. Dizlər ən çox hücum zamanı zədələnir. Bu zədələrin 90%-i periartikulyar bağların burxulması və orta ağırlıqdakı zədələrə aid edilir.

**Çiyin və bel zədələri**. Bu tip zədələr voleybolda ən az rast gəlinənlərdir. Onların əsas hissəsi hücum edən oyunçuların üzərinə düşür. Araşdırmalara görə, oyunçuların ən çox kəskin zədələri yarış zamanı baş verir. Torun altında gərgin oyun anlarında idmançılar tez-tez fiziki imkanlarından kənar işləyirlər və nəticədə sağlam toxuma zədələnir. Məşq zamanı "yorğunluq zədələri" özünü hiss etdirir. Məhz bu səbəbdən hər bir idmançının voleybolla bağlı sığortaya ehtiyacı var və o, təkcə yarışlar və təlim-məşq toplanışları zamanı deyil, bütün məşq dövrü üçün sığortalanmalıdır. Yorğunluq xəsarətlərinin qarşısını almaq üçün idmançı kəskin zədələr zamanı yüksək keyfiyyətli və vaxtında ilk tibbi yardım almalı, həmçinin tam müalicə və reabilitasiya kursundan keçməlidir.

**Voleybolda zədələrin növləri – ilk yardım**. İlk tibbi yardımın vaxtında göstərilməsi çox vaxt idman zədələrinin uğurlu müalicəsində həlledici amildir. Tibbi yardım həkimlər tərəfindən göstərilməlidir, lakin ilk yardımı komanda həkimi, məşqçi və ya hətta komanda yoldaşı göstərə bilər. Bir voleybolçu bu və ya digər zədə alırsa, nə etmək lazım olduğunu nəzərdən keçirək:

**Əzələləri və bağların burxulması.** Əzilmələr voleybolda ən çox rast gəlinən zədələrdən biridir. Bu cür xəsarətlərin səbəbləri əzələ qruplarının qeyri-adekvat istifadəsi, anormal birgə hərəkətlər və ani yüklərdir. Burxulma zamanı ilk yardım əzanın hərəkətsizləşdirilməsi və zədələnmiş yerə soyuq sarğı tətbiq edilməsini nəzərdə

tutur. Burxulma halında, zədə sahəsini masaj etmək qəti şəkildə qadağandır. Ağrı şiddətlidirsə, zərərçəkmişi təcili olaraq tibb müəssisəsinə aparmaq lazımdır.

**Oynağın yerindən çıxması.** Çox vaxt voleybolçular barmaqlarının, çiyinlərinin, dizlərinin və baldırlarının oynaqlarının yerindən çıxması ilə qarşılaşırlar. Bu cür xəsarətlər hücumlar və blokların yerləşdirilməsi zamanı anomal birgə hərəkətlər nəticəsində yaranır. Çıxıq baş verərsə, zərərçəkmiş dərhal fiksasiya bandajını tətbiq etməli və zədələnmiş oynağa soyuq kompress tətbiq etməlidir. Zərərçəkmişə ağrıkəsici tablet də vermək olar, bundan sonra o, təcili yardım otağına aparılmalıdır. Omba yerindən çıxdıqda, zədələnmiş əzanın sağlam olana sarılması vacibdir. Omba çıxığı olan xəstə yalnız üfüqi vəziyyətdə daşına bilər.

**Sınıqlar.** Sınıq halında zərərçəkənə dərhal ilk tibbi yardım göstərmək və onu xəstəxanaya çatdırmaq vacibdir. Açıq sınıq varsa, sümüyü yerinə oturtmağa ehtiyac yoxdur, qanaxmanı dayandırmaq üçün əzanı zədənin üstündən sarğı etmək, bundan sonra yaraya təmiz bir sarğı tətbiq etmək və təcili yardım çağırmaq lazımdır. Həkimləri çağırmaq mümkün olmadıqda, zərərçəkmişin əzasına şin qoyulmalı və təcili olaraq xəstəxanaya aparılmalıdır. Şin tətbiqi zamanı aşağıdakı qaydalara əməl edilməlidir: şin sınıq yerindən 2 oynaq yuxarı və aşağı qoyulur. Şin altına parça qoyulmalıdır. Şin möhkəm bağlanmalıdır. Onurğa sütunu sınıbsa, zərərçəkmişi əvvəlcədən faner və ya taxta qoyaraq xərəyə qoymaq və xəstəxanaya aparmaq lazımdır.

**Əziklər.** Qançırların ciddi xəsarət olmamasına baxmayaraq, düzgün və ya vaxtında yardım göstərilmədikdə fəsadlarla nəticələnə bilər. İlk növbədə, qançır olan, zədələnmiş nahiyəyə soyuq sürtmək, sonra təzyiq bandajı tətbiq etmək lazımdır. İkinci gün istiləşmə təsiri olan məlhəmlərdən istifadə edilməlidir. Əgər qançırdan sonra şişkinlik və ağrı ikinci və ya üçüncü gün də keçmirsə, həkimə müraciət edilməlidir. Zərərçəkənə ilk tibbi yardım göstərildikdən sonra o, həkimə göstərilməlidir. Həkim adekvat terapiya, sonra isə bir sıra reabilitasiya prosedurlarını təyin edəcək. Oyunçu yalnız tam reabilitasiyadan sonra komandaya qayıda bilər, çünki müalicə olunmayan zədələr asanlıqla xroniki olur, bu isə gələcəkdə tam hüquqlu idman karyerası imkanını istisna edir. Voleybolda zədədən necə qorunmaq olar? Voleybol oynayan zaman zədələrdən tamamilə qaçmaq təbii ki, mümkün deyil. Ancaq mütəxəssislər yaralanma riskini əhəmiyyətli dərəcədə azaltmağa kömək edəcək bir neçə məsləhət verir, yəni:

- Rahat idman geyimi almaq lazımdır. Voleybol oynayarkən ayaqqabılara xüsusi diqqət yetirilməlidir. İdman ayaqqabıları bu idman növü üçün xüsusi olaraq hazırlanmalıdır. Aşağı keyfiyyətli idman ayaqqabısı almaqdan çəkinmək lazımdır.
- Məşqçinin tövsiyələrini dinləmək lazımdır, çünki idmanda nizam-intizam sağlamlığın açarıdır. Çox vaxt idmançılar idman zalında məşqçi olmadıqda təsadüfi xəsarət alırlar. Təlim-məşq toplanışlarında və yarışlarda zədə riski də artır, çünki məşqçi sadəcə bütün uşaqlara nəzarət edə bilmir;
- Tam reabilitasiya kursunu keçmək vacibdir. Çox vaxt idmançılar zədənin xarici təzahürləri keçən kimi oyuna qayıtmağa çalışırlar. Məşqçi voleybolçuların bütün zədələrinin tam müalicə olunduğuna aydın şəkildə nəzarət etməlidir, çünki düzgün müalicə olunmaması və ya vaxtından əvvəl oyuna qayıdılması müalicəsi olduqca çətin olan xroniki və ya yorğunluq zədələrinə səbəb ola bilər. Bundan əlavə, mütəxəssislər məşqçiləri uşaqların voleybol oynaması üçün sığorta etdirməyə çağırırlar. Sığorta vəsiqəsi, əlbəttə ki, zədələrdən qorumayacaq, lakin o, idmançının müalicəsi və reabilitasiyası ilə bağlı maliyyə xərclərini azaltmağa kömək edəcək.

**Voleybolda zədələrin qarşısının alınması.** Voleybolda zədələrin qarşısını alınması digər idman növlərindəki profilaktikadan heç də fərqlənmir. Yaralanma riskini azaltmaq üçün bədəni hər məşqə hazırlamaq vacibdir. Məşq həmişə isinmə və dartınma hərəkətləri ilə başlamalıdır ki, əzələlər isinsin və yükə hazırlaşsın. Bundan əlavə, oyunçular tullanma, enmə, vurma və bloklama üçün düzgün texnikaları mənimsəməlidirlər. Həmçinin, zədələrin qarşısının alınması düzgün yıxılma texnikasını öyrənməkdən ibarətdir. Voleybolçular olduqca tez-tez yıxılırlar, lakin yıxılma düzgün aparılarsa, zədə riski çox az olar. Məşqçilər yıxılmaların öyrədilməsinə böyük diqqət yetirməli, texnikalar ilk dərslərdən bölmələrdə tətbiq edilməlidir. Hazırda voleybol populyar idman növünə çevrilib. Əvvəlcə voleybol istirahət və sağlam həyat tərzini qorumaq

üçün bir oyun idi. 20-ci əsrdə voleybol adi bir əyləncə oyunundan Olimpiya idman növünə çevrildi.

Bundan çıxış edərək başa düşmək lazımdır ki, oyunçulara olan tələblər daim dəyişir və onlardan daha atletik, texniki və psixoloji hazırlıq tələb olunur. Onlar həmçinin daha möhkəm və fiziki cəhətdən sürətli olmalıdırlar. Fiziki məşq zamanı zədələnmənin əsas ümumi səbəbləri aşağıdakılardır:

1) fiziki məşqlərin prinsiplərinə əməl edilməməsi: davamlılıq, dövrilik, yüklərin tədricən artması;

2) həddindən artıq yorğunluq, sinir və fiziki yorğunluq fonunda dərslər;

3) gücü çatmayan, tanış olmayan, mürəkkəb hərəkətləri yerinə yetirmək;

4) qeyri-kafi istiləşmə və ya isinmə olmadan məşq;

5) tələbələr arasında konsentrasiyanın olmaması;

6) xəstəlikdən sonra dərslərə vaxtından əvvəl başlamaq.

Voleybol təmassız yarış üsulu ilə səciyyələnən komanda idman növüdür və nəticədə zədələnmə səviyyəsi aşağıdır. Lakin buna baxmayaraq, voleybol oynayarkən təhlükəsizliyi təmin etmək və zədələrin qarşısını almaq üçün müəyyən təhlükəsizlik qaydalarına riayət etmək lazımdır:

1) konsentrasiya və soyuqqanlılıq (rəqibin hərəkətinə diqqət və vaxtında cavab vermək);

2) əzələlərin qızışması üçün istiləşməyə zərurət (oynaqların hərəkətliyini və amplitudasını artırmaq);

3) texniki hərəkətlərin və texnikanın düzgün yerinə yetirilməsi;

4) düzgün, xüsusi seçilmiş geyim forması və ayaqqabılar (zərbə yükünü bərabərləşdirmək üçün tullanarkən sabitliyi və amortizasiyanı təmin etmək üçün nəzərdə tutulmuş voleybol ayaqqabıları);

5) məşq yüklərinin metodologiyasına riayət edilməsi (yüklərin ardıcıllıq və tədricən artırılması, sistemli təlim, sadədən mürəkkəbə prinsipinə uyğunluq);

6) müntəzəm tibbi monitorinq (bədənin fiziki inkişafının və funksional vəziyyətinin sistemli tibbi müayinəsi).

Voleybolda torun altında yaranan oyun vəziyyətləri ən gərgin və təmasda olan vəziyyətlərdir, buna görə də ən çox zədələr topun hücumu və bloklanması zamanı alınır. Topun qarşısını kəsərkən, blokdan sonra eniş zamanı ayaq biləklərin zədələnməsi tez-tez baş verir. Hücum hərəkətləri zamanı zədələr ən çox çiyinlərdə və dizlərdə olur. Araşdırmalara görə, zədələrin 89%-i torun altında oynayarkən baş verir (bunun 54%-i blokda, 35%-i hücum zamanı zədələrdir).

**Nəticə etibarı** ilə qeyd etməliyik ki, idman oyunlarında zədələnməni tam olaraq aradan qaldırmaq mümkün deyil. Voleybol da idmançıdan güc, sürət, çəldlik, çeviklik, iti reaksiya, yıxılmalar, sıçrayışlar tələb edən bir idman oyunu olduğu üçün burada zədələnmələr qaçılmazdır. Bunun qarşısını almaq, onları minimuma endirmək üçün voleybolçunun yaxşı fiziki hazırlığı olmalı və o, oyunun texnikasına bələd olmalıdır.

**Problemin elmi yeniliyi** ondan ibarətdir ki, oyunun spesifikasına uyğun olaraq voleybolçuların ala biləcəyi zədələr sistemli şəkildə təhlil edilmiş, onların səbəbləri açıqlanmış və profilaktikası göstərilmişdir.

**Problemin praktik əhəmiyyəti** və tətbiqi ondan ibarətdir ki, burada irəli sürülən müddəalardan və verilən tövsiyələrdən bəhrələnməklə müəllim və məşqçilər öz işlərini daha yaxşı qura bilər və zədələnmələrin qarşısını qismən də olsa ala bilərlər.

**Ədəbiyyat:**


1. Ağayev, O.M. Voleybol. Dərslik. / O.M. Ağayev, E.N. Qədəşov. -Bakı: Mətbəə, - 2003. -256 s.
2. Məcidov, N.B., Bədən tərbiyəsinin nəzəriyyəsi və metodikası: Dərslik. III hissə idmançının hazırlıq sistemi. / N.B. Məcidov. -Bakı: 2022. -218 s.
3. Hacıyev, Z.C. Voleybolçu hazırlığının ümumi əsasları, dərs vəsaiti. / Z.C. Hacıyev. - Bakı: Ecoprint, -2023. -218 s.
4. Hacıyev, Z.C. Əliyev S. Voleybol oyununun texnikası, metodik vəsait. -Bakı: Ecoprint, -2023. – 75 s.
5. Quliyev, B.S. Məktəbdə fiziki tərbiyənin nəzəri-metodik və praktik işlərinin əsası: Dərs vəsaiti / B.S. Quliyev. -Bakı, -2010. -660 s.



**E-mail:** Geydarova.maya@mail.ru



**Redaksiyaya daxil olub:** 22.10.2024.

UOT 372.8

**Həmid Elnur oğlu Əliyev**
fəlsəfə doktoru proqramı üzrə doktorant
Azərbaycan Dövlət Bədən Tərbiyəsi və İdman Akademiyası
https://orcid.org/0009-0004-8802-357X
https://doi.org/10.69682/arti.2024.91(6).213-217

## V-VI SİNİFLƏR ÜZRƏ FİZİKİ TƏRBİYƏNİN TƏDRİSİ MƏQSƏDLƏRİ VƏ FİZİKİ İNKİŞAF SAHƏLƏRİ

**Гамид Эльнур оглы Алиев**
докторант по программе доктора философии
Азербайджанская Государственная Академия Физического Воспитания и Спорта

## ЦЕЛИ ОБУЧЕНИЯ И СФЕРЫ НАПРАВЛЕНИЯ ФИЗИЧЕСКОГО РАЗВИТИЯ ФИЗИЧЕСКОГО ВОСПИТАНИЯ ДЛЯ V-VI КЛАССОВ

**Hamid Elnur Aliyev**
doctorial student in the program of doctor of philosophy
of Azerbaijan Sports Academy

## TEACHING OBJECTIVES AND AREAS OF PHYSICAL DEVELOPMENT OF PHYSICAL EDUCATION FOR GRADES V-VI

**Xülasə.** Məqalədə V-VI siniflər üzrə fiziki tərbiyənin tədrisi məqsədləri və fiziki inkişaf sahələrindən bəhs olunub. Fiziki tərbiyə fənninin əsas məqsədlərinə ilk öncə, şəxsi inkişafı təmin edən fiziki inkişaf, sağlamlıq, sinir-əzələ koordinasiyası, emosional inkişaf, mental inkişaf və sosial inkişaf daxildir. Bu məqsədlər idmanın ümumi inkişaf konsepsiyasını anlamaq onun həyata keçirilməsində rol oynayır və spesifik fəaliyyətləri təyin edən proqram və tədris prosesinin əsas strategiyasını təyin edir. Bu fənnin tədrisi təhsilin müxtəlif səviyyələrində şagirdlərin fiziki inkişafı ilə bağlı müxtəlif xüsusiyyətləri əks etdirir.
***Açar sözlər:*** *V-VI siniflər, fiziki tərbiyə dərsləri, tədris, fiziki inkişaf, fiziki qabiliyyət, sağlamlıq*

**Аннотация.** В статье рассмотрены цели преподавания физического воспитания в V-VI классах и направления физического развития. К основным целям физического воспитания относятся физическое развитие, здоровье, нервно-мышечная координация, эмоциональное развитие, умственное развитие и социальное развитие, обеспечивающие развитие личности. Понимание общей концепции развития спорта играет роль в ее реализации и определяет основную стратегию программы и педагогического процесса, определяющую конкретную деятельность. Преподавание этого предмета отражает различные особенности, связанные с физическим развитием учащихся на разных уровнях образования.
***Ключевые слова:*** *V-VI классы, уроки физического воспитания, обучение, физическое развитие, физические способности, здоровье*

**Abstract.** In the article, the goals of teaching physical education for grades V-VI and the areas of physical development were discussed. The main goals of physical education include physical development, health, neuromuscular coordination, emotional development, mental development and social development, which ensure personal development. Understanding the general development concept of sports plays a role in its implementation and determines the main strategy of the program and teaching process that determines the specific activities. The teaching of this subject reflects different features related to the physical development of students at different levels of education.
***Keywords:*** *grades V-VI, physical education lessons, teaching, physical development, physical ability, health*

Fiziki tərbiyənin tədrisi məqsədləri fiziki inkişafı, sağlamlığı və rifahı təşviq etmək, fərdlərdə fiziki fəaliyyətə və sağlam həyat tərzinə müsbət münasibət formalaşdırmaqdır. Aydındır ki, fiziki tərbiyə orta məktəb şagirdləri üçün strateji prioritetdir, çünki o, gələcək nəslin sağlamlığını və fiziki hazırlığını özündə ehtiva edir. Təhsildə fiziki tərbiyə şagirdlərə inteqrativ şəkildə müxtəlif fiziki qabiliyyətləri formalaşdıran mühit təmin edir ki, bu da onların ümumi həyat tərzini yaxşılaşdırır və müntəzəm olaraq fiziki aktivliyini saxlayır.




***Şəkil 1. Fiziki tərbiyənin tədrisi məqsədləri (2014)***

Şəkildən (şəkil 1) göründüyü kimi, fiziki tərbiyə fənninin əsas məqsədlərinə ilk öncə, şəxsi inkişafı təmin edən *fiziki inkişaf, sağlamlıq, sinir-əzələ koordinasiyası, emosional inkişaf, mental inkişaf və sosial inkişaf* daxildir. Bu məqsədlər idmanın ümumi inkişaf konsepsiyasını anlamaq onun həyata keçirilməsində rol oynayır və spesifik fəaliyyətləri təyin edən proqram və tədris prosesinin əsas strategiyasını təyin edir. Aydın olur ki, bu simmetrik və ya kompleks bacarıqlar toplusu kimi insan fəaliyyətinin əsas mənbəyinə çevrilir.

Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün fiziki tərbiyə fənni üzrə təhsil proqramında (kurikulum) qeyd olunduğu kimi fənnin tədrisinin digər əsas məqsədi şagirdlərin ahəngdar fiziki inkişafını, hərəkət mədəniyyətinin formalaşmasını, əxlaqi-iradə xüsusiyyətlərinin inkişafını təmin etməkdir [1; 2; 3]. Çünki, bu insanın ümumi, harmonik fiziki inkişafına təsir etməklə yanaşı, dözümlülüyü artırır və yüksək emosiyalar yaradır. Bu fənnin tədrisi təhsilin müxtəlif səviyyələrində şagirdlərin fiziki inkişafı ilə bağlı müxtəlif xüsusiyyətləri əks etdirir. Bundan əlavə, "Fiziki tərbiyə" fənninin tədrisi nəzəriyyəsi və metodikası yeni və inkişaf etməkdə olan tədris intizamıdır. Burada bədən tərbiyəsi nəzəriyyəsi, fiziki tərbiyə üzrə bilik və bacarıqlar, metodlar, idman hazırlığı, sağlamlıq və adaptiv bədən tərbiyəsi pedaqoji elmin bir sahəsi kimi tanınır [2; 3; 4; 5].

F. Hüseynov, S. Bağırov, İ. Əliyev, E. Quliyev, K. Əliyeva, S. Yolçiyev və Azərbaycanda ümumtəhsil məktəblərinin V-XI siniflərində fiziki tərbiyə fənn üzrə təhsil proqramına (kurikulum) əsasən, bədən tərbiyəsi təlimi hərəkət qabiliyyətlərinin planlı, ahəngdar inkişafını, əxlaqi və iradi xüsusiyyətlərin formalaşmasını, hərəkat mədəniyyətinin inkişafını nəzərdə tutur [1; 2; 3]. Bundan əlavə, təhsilin bu mərhələsi şagirdin idrak, fiziki, mədəni və psixomotor inkişafının həyata keçirilməsində kritik bir dövrü əhatə edir. Bu mərhələdə fənnin tədrisinin xüsusiyyətləri aşağıdakılardır:

- *sağlamlığın yaxşılaşdırılması, hərəkətlər və onların məqsədləri, idman növləri, performans üsulları, motor bacarıqları və üsulları haqqında məlumat əldə etmək;*
- *planlı motor bacarıqlarının inkişafı üçün təminat;*
- *müxtəlif idman növlərinin elementlərinin bədən tərbiyəsinə daxil edilməsi;*

*- fərdi idman növlərinin texniki-taktiki aspektlərinin öyrədilməsi və praktiki icra üsullarının mənimsənilməsi, habelə bu idman növləri üzrə zəruri fiziki hazırlığın təmin edilməsi;*

*- hərəkət mədəniyyətinin inkişafı;*

*- əxlaqi və könüllü xüsusiyyətlərin formalaşması;*

*- şəxsi sağlamlıq, bədənin möhkəmləndirilməsi, mütənasib bədən quruluşunun inkişafında şəxsi məsuliyyət hissinin aşılanması.*

Ümumtəhsil məktəblərində təhsilalanlarda, xüsusilə də ümumi orta təhsil səviyyəsində (V-VI siniflər) uyğunlaşma qabiliyyəti, punktuallıq, məsuliyyət, yaradıcılıq, eləcə də vətəndaşlıq, özünüidarəetmə və ünsiyyət yaxşılaşdırılmalıdır.

Beləliklə, bu qeyri-sabit mühitdə uşaqlar bilikdən daha çox elementar bacarıqları öyrənməli və həyatları boyu bu bacarıqları inkişaf etdirməyə sövq edilməlidirlər. Başqa sözlə, məktəb şagirdləri davamlı olaraq inkişaf etməyə maraqlı olmalıdırlar.

Bu məqsədlə məktəblərdə tədris olunan fiziki tərbiyə dərsləri digər fənlərlə inteqrativ olaraq müxtəlif qabiliyyətlərin formalaşmasına və inkişaf etdirilməsinə istiqamətlənir. Fiziki tərbiyəsi dərslərində bütün uşaqlar məktəb şəraitində təşkil edilən fiziki fəaliyyətdə iştirak edə bilməlidirlər.

Bədən tərbiyəsinin digər məqsədi fiziki inkişafı, sağlamlığı və rifahı təşviq etmək, fərdlərdə fiziki fəaliyyətə və sağlam həyat tərzinə müsbət münasibət formalaşdırmaqdır. Fiziki bacarıqları və hazırlığı inkişaf etdirməklə yanaşı, bədən tərbiyəsi də sosial bacarıqları, komanda işi və liderlik bacarıqlarını təkmilləşdirməyə kömək edə bilər. Bir çox idman assosiasiyaları bədən tərbiyəsini sağlam aktiv həyat tərzi, fiziki hazırlıq, idman bacarığı, özünü effektivlik və emosional intellektlə bağlı motor bacarıqları, bilik və davranışlarını inkişaf etdirmək üçün nəzərdə tutulmuş planlı, ardıcıl kurikulum kimi müəyyən edirlər.

Qeyd olunanları nəzərə alaraq, son on ilin istinadları bədən tərbiyəsi, fiziki fəaliyyət və sağlamlıqla bağlı 1000-dən çox məqalə və tezislərin nəşr olunduğunu göstərir. Ədəbiyyat nümunələrinin təhlili fiziki tərbiyə fənninin tədrisi metodikasının bir sıra məqsədlərini aşağıdakı kimi təqdim edir:

*- fiziki fəaliyyətin, bədən tərbiyəsinin uşaqların və yeniyetmələrin qısa və uzunmüddətli fiziki, koqnitiv, beyin və psixososial sağlamlığına və inkişafına təsiri;*

*- motor qabiliyyətin və idraki fəaliyyətin formalaşması;*

*- fiziki inkişaf sahəsində yeni yanaşmaların tətbiqi üzrə mövcud sübutların toplanması;*

*- potensial fiziki fəaliyyət və bədən tərbiyəsi siyasətləri və proqramlarının təkmilləşməsinin müəyyən edilməsi.*

Nəticələr göstərir ki, idmanla məşğul olmaq, hərəki fəaliyyətə üstünlük vermək idrak və emosional funksiyalara müsbət təsir göstərir. Bu cür biliklər, həm tədqiqatçılara, həm də təcrübəçilərə fiziki fəaliyyətdən əldə edilən geniş faydalara münasibətdə istiqamət verə bilir və idrak funksiyalarını təkmilləşdirməyə yönəlmiş bir sahədir.

S.İ. Mixaylok, C.B. Ovçinnikova, A.E.Pojkova, Y.A. Kopılov, T.C. Usmanxojaev, S.Q. Arzumanov məktəblərdə gündəlik fiziki tərbiyəni tədris etmək üçün şagirdlərə ömür boyu fiziki cəhətdən aktiv olmaq bacarığı və inamını təmin edən sahələri təklif edirlər [6; 7]. Bu məqsədlə, nəzəri tədqiqatlar fiziki tərbiyənin 11-14 yaşlı uşaqlar arasında inkişaf sahələrini aşağıdakı kimi təsvir etmişlər:



*Şəkil 2. Fiziki tərbiyənin inkişaf sahələri*

V-VI siniflər üzrə fiziki tərbiyə *reproduktiv sağlamlıq* dövründə *fiziki fəaliyyətin* başlanması, uşaqlarda *sürət və gücün* müəyyən edilməsi, *dinamik, mütəhərrik oyunların* tətbiq edilməsi ilə *sağlamlığa* əsaslanan *hərəki fəaliyyətin* formalaşması və sonda hər bir fərddə fiziki mədəniyyətin inkişaf etdirilməsidir (şəkil 2).

*Fiziki fəaliyyətin inkişafı* – fiziki fəaliyyətə bütün hərəkətlər aiddir və burada aktiv olmağın ən çox yayılan yollarına *gəzinti, velosiped sürmə, təkər sürmə, idman, aktiv istirahət və oyun* daxildir ki, hər bir bacarıq səviyyəsində başa düşülür.

Fiziki fəaliyyət inkişafına *üzvi inkişaf; sinir-əzələ inkişafı; intellektual inkişaf və sosial-emosional* inkişaf daxildir.

*Reproduktiv sağlamlığın* fiziki tərbiyədə xüsusi rolu vardır. J. Viley reproduktiv sağlamlıqda təhsilli gənclərin reproduktiv sistemini başa düşmələrini təmin etmək üçün bir sıra təkliflər təqdim etmişdir [8, s.1713]. Alim qeyd etmişdir ki, idmanla məşğul olan idmançı şagirdlərin sağlam cinsi həyatları üçün məlumatlı şəkildə qərarlar qəbul etmələri çox vacibdir. Aydındır ki, V-VI sinif şagirdlərinin bu yaş dövründə reproduktiv sağlamlığa qədəm qoyurlar və onlarda fiziki inkişafı əsas vacib amil hesab edilir. Türkoloq alim D. Üstün, A. Ersoy qeyd edir ki, şagirdlərin bu dövrdə sosial-psixoloji dəyişikliyi, fizioloji və bioloji inkişafı fiziki tərbiyənin prinsipləri ilə sıx əlaqədədir [9 s, 16]. Bu baxımdan həm müəllimlər, həm valideynlər, həm də şagirdlərin özləri reproduktiv sağlamlıq dövründə düzgün istiqamətlənməli və şagirdlərin hərtərəfli idraki və motorik bacarıqlarının inkişafında uğurlar əldə etməsinə nail olmalıdırlar.

*V sinif* tədris standartları proqramı (kurikulumu) hərəki fəaliyyətlərin mənimsənilməsində fəaliyyətin təşkili və idarə olunmasına dair ilkin bilikləri təşviq edir. Yeni fiziki biliklər, sıra hərəkətlərinə dair ilkin məlumatlar, ümumi inkişaf hərəkətləri barədə informasiyaları ötürmək, hərəki qabiliyyətləri oyunlarla, kombinə edilmiş estafetlərdə nümayiş etdirmək, fəaliyyətləri yerinə yetirərkən özünənəzarət üsullarından istifadə etmək, təhlükəsizlik və tibbi yardım qaydaları haqqında müvafiq bilikləri mənimsəmək və onlardan istifadə etməkdir [10; 11; 12].

Nəticədə şagirdlər oyunlar zamanı hərəki fəaliyyətlər sayəsində hərəki qabiliyyətlər, çeviklik, bədənin əyilmə qabiliyyətini nümayiş etdirirlər. Hərəkətlərin icrası zamanı tezlik tələb edən sürət nümayiş etdirərək, məhdud vaxt intervalında maksimum qüvvə sərfi ilə güc nümayiş etdirməyə nail ola bilərlər. Aydındır ki, təkrar və davamlı icra zamanı dözümlülük nümayiş etdirilir.

*VI sinif* üzrə şagirdlər hərəki fəaliyyətin təşkili və idarə olunmasına cəlb olunmaq üçün uyğun biliklər qazanır və onları fəaliyyətlərdə nümayiş etdirməyə həvəsləndirirlər. Bu nümayişlərə *sıra hərəkətləri, oyunlar və kompleks hərəkətləri* aid edilərək təyinatına görə asanlıqla fərqləndirə bilirlər. Şagirdlərə eyni zamanda bu hərəkətlərin nəbz vurğularına, tənəffüz tezliyinə təsiri barədə geniş məlumat verə bilirlər. Şagirdlər bu hərəkətləri icra edərkən müvafiq təhlükəsizlik qaydalarına əməl edir, özünümühafizə və ilk tibbi yardım haqqında geniş informasiya əldə edərək onları qarşı tərəfə ötürə bilirlər [3; 4; 5; 13].

Aydın olur ki, fiziki tərbiyə mədəniyyəti sosiallaşma prosesinin təhsil prosesinə daxil edilən geniş ənənəvi formasıdır. Bu mədəniyyət bədən tərbiyəsi ilə məşğul olan insanın və bütövlükdə cəmiyyətin mədəniyyətinin bir hissəsi kimi təqdim olunur, onun fiziki və intellektual qabiliyyətlərinin ahəngdar inkişafına nail olmaq yollarını qazanmağa imkan verir. Sağlam həyat tərzi kimi formalaşan fiziki mədəniyyət simvolu müntəzəm fiziki hazırlığı olan və fiziki inkişaf yolu ilə sosial uyğunlaşmağa meylli olan insanlardır. Uşaqların bu mədəniyyətə gətirilməsi ənənəvi olaraq yalnız dərslərlə yox, digər təsiredici vasitələrlə əlaqələndirilməlidir. Məktəblərdə fiziki mədəniyyətin qazanılması üçün cəlbedici bir mühit yaradılmalı, şagirdlərdə emosional və intellektual düşüncəni formalaşdırmalıdır. Beləliklə, fiziki tərbiyə mədəniyyəti ümumi mədəniyyətin tərkib hissəsi kimi, sağlamlıq dəyərinin mənimsənilməsi, təkmilləşdirilməsi, qorunması, insanın fiziki inkişafı, şəxsi və sosial əhəmiyyətli nəticələrin əldə edilməsinə töhfə verən insan fəaliyyətini əks etdirir.

**Problemin əsas aktuallığı** təhsilalanların fiziki inkişafının sosial amillərinin insan şəxsiyyətinin inkişafının hərtərəfli istiqamətinin dəyişməsinə təsiri haqqında olmasıdır.

**Problemin elmi yeniliyi** V-VI sinif şagirdlərinin fiziki inkişafında zəruri keyfiyyətlərin əldə olunması üçün yeni üsul və vasitələrin seçilməsidir.

**Problemin praktiki əhəmiyyəti isə** ondan ibarətdir ki, şagirdlərin fiziki tərbiyəsinin hərtərəfli hazırlanmasında faydalı bir resurs kimi istifadə oluna bilər.

**Ədəbiyyat:**


1. Azərbaycan Respublikasının Ümumtəhsil Məktəbləri üçün fiziki tərbiyə fənni üzrə təhsil proqramı (kurikulumu) (I-XÍ siniflər) – 2013. - 121 s.
2. Hüseynov, F, Bağırov, S, Əliyev, İ, Ümumtəhsil məktəblərinin 5-ci sinfi üçün dərsliyin metodik vəsaiti. -Bakı, 2018.
3. Hüseynov, F. Fiziki Tərbiyə: Ümumtəhsil məktəblərinin 6-cı sinfi üçün "Fiziki tərbiyə" fənni üzrə dərslik / F. Hüseynov. -Bakı: «XXI» Yeni nəşrlər evi, -2018. -164 s.
4. Quliyev, B.S. Fiziki tərbiyə dərsinin səmərəliliyini yüksəltməyin bəzi şərtləri. Bax: Azərbaycan Dövlət Pedaqoji Universitetinin professor-müəllim heyətinin 82-ci elmi konfransının materialları. III buraxılış, -Bakı: ADPU, -2002. s .298-299,
5. Quliyev B.S. Tələbələrin orta məktəbin I-VIII siniflərində bədən tərbiyəsi və kütləvi idman işlərinin təşkilinə hazırlanması məsələləri.- Bakı: ADPU-nun nəşri, -1994.
6. Михайлюк С.И., С.В. Овчинникова, А.Е. Рожкова и др. Физическая культура (5 класс).Учебное пособие для общеобразовательных учебных организаций. -Донецк, 2017.
7. Усманходжаев Т.С., Арзуманов С.Г. Физическое воспитание – Учебное пособие для 5–6 классов школ общего среднего образования. -Ташкент, 2015.
8. Wiley J. Youth knowledge of physical activity health benefits: A Brazilian case study. The Scientific World Journal, 6, 2006 – p.1713-1721.
9. Üstün Ü.D, Ersoy A, Sosyolojik ve Psikolojik Açılardan Rekreasyon, 1st Edition, Ergün Yayınevi, İzmir, p.16, 2016.
10. Quliyev E., K. Əliyeva, S. Yolçiyev. Ümumtəhsil məktəblərinin 5-cı sinfi üçün "Fiziki tərbiyə" fənni uzrə metodik vəsait /- Bakı: «Şərq-Qərb» Açıq Səhmdar Cəmiyyəti, -2020. -164 s
11. Quliyev E., K. Əliyeva, C. Yolçiyev Ümumtəhsil məktəblərinin 6-cı sinfi üçün "Fiziki tərbiyə" fənni üzrə dərslik / -Bakı: «Şərq-Qərb» Açıq Səhmdar Cəmiyyəti, -2021. -164 s
12. Quliyev E., K. Əliyeva, S. Yolçiyev Ümumtəhsil məktəblərinin 6-cı sinfi üçün "Fiziki tərbiyə" fənni üzrə metodik vəsait / -Bakı: «Şərq-Qərb» Açıq Səhmdar Cəmiyyəti, -2021. -164 s.
13. Quliyev E., K. Əliyeva, S. Yolçiyev Ümumtəhsil məktəblərinin 5-cı sinfi üçün "Fiziki tərbiyə" fənni üzrə dərslik / -Bakı: «Şərq-Qərb» Açıq Səhmdar Cəmiyyəti, -2020. -164 s.


**E-mail:** hamidaliyev@sport.edu.az
**Redaksiyaya daxil olub:** 09.12.2024

*UOT 372.851*

***Rasim Yusif oğlu Şükürov,***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti,*
*pedaqogika üzrə fəlsəfə doktoru*
*https://orcid.org/0009-0002-9344-5422*
*https://doi.org/10.69682/arti.2024.91(6).218-222*

***Cəmilə Vasif qızı Əsgərova***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*
*https://orcid.org/0009-0005-2874-5690*

# MODUL TƏLİM TEXNOLOGİYASININ MAHİYYƏTİ, MƏZMUNU, TƏSNİFATI VƏ PRİNSİPLƏRİ

***Расим Юсиф оглы Шукюров,***
*Азербайджанского Государственного Педагогического Университета,*
*доктор философии по педагогике, доцент*

***Джамиля Васиф гызы Аскарова***
*Азербайджанский Государственный Педагогический Университет*

# ОСОБЕННОСТИ СУЩНОСТИ, СОДЕРЖАНИЯ, КЛАССИФИКАЦИИ И ПРИНЦИПОВ ТЕХНОЛОГИИ МОДУЛЬНОГО ОБУЧЕНИЯ

***Rasim Yusif Shukurov,***
*associate professor*
*at Azerbaijan State Pedagogical University,*
*doctor of philosophy in pedagogy*

***Jamila Vasif Asgarova***
*Azerbaijan State Pedagogical University,*

# THE ESSENCE, CONTENT, CLASSIFICATION AND PRINCIPLES OF MODULAR TRAINING TECHNOLOGY

**Xülasə.** Məqalədə modul təlim texnologiyasının mahiyyəti, məzmunu, təsnifatı və prinsiplərinin xüsusiyyətləri araşdırılır, modul təlim texnologiyasının məqsədləri göstərilir. Həmçinin modul texnologiyasından istifadənin təhsil prosesinin təşkilinə müasir yanaşma olduğu, bu yanaşmanın müasir öyrənənlərin ehtiyaclarını ödəmək üçün çeviklik və fərdi öyrənmə tələb etdiyi, modul təlim texnologiyasının əsas ideyasının öyrənənlərə təhsil yolunu seçməkdə daha çox çeviklik aşılamaq və materialın mənimsəmə sürətini təmin etdiyi qeyd edilir.
***Açar sözlər:*** *texnologiya, təlim, dərs, məzmun, təsnifat, prinsiplər*

**Аннотация.** В статье рассматриваются особенности сущности, содержания, классификации и принципов технологии модульного обучения, показывается цель технологии модульного обучения. Также отмечается, что использование модульной технологии – это современный подход к организации учебного процесса, данный подход требует гибкости и индивидуальности обучения для удовлетворения потребностей современных учащихся, основная идея модульной технологии обучения – привить

больше гибкость в выборе образовательной траектории обучающимся и обеспечение скорости усвоения материала.
***Ключевые слова:*** *технология, обучение, урок, содержание, классификация, принципы*
**Abstract.** In the article, the classification of content and principles of technology is searched, the goals of modular technology are indicated. It is also noted that the use of modular technology is a modern approach to the organization of the educational process, this approach requires flexibility and individual learning to meet the needs of modern learners, the main idea of modular learning technology is to instill more flexibility in choosing the educational path to learners and ensure the speed of mastering the material.
***Keywords:*** *technology, learning , lesson, content , classification, principles*

Təhsil dövlətin, cəmiyyətin mühüm bir tərkib hissəsidir. Ölkəmizdə təhsil sürətlə inkişaf edir. Təhsildə daim yenilik axtarışları vardır. Həmin axtarışlar təlimin məzmununu həm də öyrətmə və öyrənmə prosesini əhatə etmişdir . “Pedaqoji texnologiyalar”, “Təlim texnologiyaları” “innovasiya” və s. terminlərə, anlayışlara müasir pedaqogika və psixologiya ədəbiyyatlarında kifayət qədər çox rast gəlmək olar. Müasir dövrdə təhsildə və təlimdə gedən dəyişikliklər texnologiyaların canlanmasını, yenilənməsini tələb edirdi. Texnologiya sözü elmi termin kimi yunan sözü olub, ***teche*** – incəsənət***, loqos*** – elm deməkdir. Texnologiyanın bir sıra aşağıdakı üstünlükləri vardır:

- Materialın müstəqil şəkildə mənimsənilməsi üçün şagirdə şərait yaradılmalıdır.
- Şagirdlər müxtəlif informasiya mənbələrdən istifadə edərək mövzunu mənimsəməlidirlər.
- Şagirdləri müxtəlif üsullarla fəaliyyətlərə motivləndirməlidir.

Təlim texnologiyası anlayışı çox genişdir və buna görə də bəzi alimlərin, pedaqoqların baxışları üst-üstə düşmür. Məsələn, V.P. Bespalkonun fikrincə, pedaqoji texnologiya tədris məqsədlərini uğurla həyata keçirməyə imkan verən nəzəri cəhətdən əsaslandırılmış tədris və tərbiyə proseslərinin, vasitə və üsullarının məcmusu, eləcə də, praktikada olan pedaqoji sistem layihəsi kimi hesab edilir (3, s. 6).

G.K. Selevko “pedaqoji texnologiya”da üç aspekti müəyyən edir:

-elmi-pedaqoji texnologiyalar – tədris məqsədlərini, məzmununu metod və vasitələrini öyrənən, inkişaf etdirən, pedaqoji prosesləri layihələndirən pedaqoji elmin bir hissəsidir;

-prosessual-təsviri – prosesin təsviri, nəzərdə tutulan təlim nəticələrinə nail olmaq üçün qarşıya qoyulan məqsədin, məzmunun, metod və vasitələrin məcmusu kimi;

- prosessual – effektiv – pedaqoji prosesin həyata keçirilməsi və onların praktik şəkildə pedaqoji vasitələrlə istifadəsi (4, s. 16).

Yəni müasir təhsil sistemində öyrənənlərin verdiyi cavab üçün irəli sürülən şərtlərin əsasını öyrədilən elmi biliklərin yadda saxlanılması və praktik şəkildə həyata keçirilməsi təşkil edir. Öyrənənlərdə dərsə maraq artır, idrak prosesi fəallaşır, sərbəstlik müstəqillik yaranır.

Hal-hazırda dünyanın bütün ölkələrində pedaqoji texnologiyalardan uğurla istifadə olunur. Pedaqoji texnologiyaların inkişafını, tarixini öyrənən bir çox azərbaycanlı pedaqoqlar, psixoloqlar – Əbdül Əlizadə, Yəhya Kərimov, Əmrulla Paşayev, Ənvər Abbasov, Akif Əliyev və s. olmuşdur.

Son üç onillikdə ali təhsil müəllimləri təlimin fərdiləşdirilməsi, öyrənənlərin fəallığını, müstəqilliyini artırmaq üçün ilkin şərtlər yaradılmışdır. İlk olaraq proqramlaşdırılmış təlim olmuşdur.

Azərbaycan Respublikasının Prezidenti Cənab İlham Əliyevin 24 oktyabr 2013- cü il tarixli sərəncamı ilə təsdiq etdiyi “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası” layihəsində əsas istiqamətlərdən biri də pedaqoji prosesdə yeni təlim texnologiyalarından istifadə olunması zəruriliyi irəli sürülmüşdür (1). Çünki ümumtəhsil məktəblərində müasir texnologiyalardan istifadə edilməsi vacib amillərdən biridir.

Azərbaycanın gələcəyi məktəblə, tədrislə, təhsillə bağlı olduğundan təhsil sistemi müəllimin qarşısına bir sıra vəzifələr qoyur:

- Hər bir tədris olunan fənnə aid şagirdlərdə bilik, bacarıq, vərdişləri formalaşdırmaq;
- Şagirdlərdə böyüklərə hörmət hissi, vətənpərvərlik hissini oyatmaq;
- Şagirdlərdə dünyagörüşünü artırmaq;
- Onlarda mühakimə qabiliyyətini yaratmaq və inkişaf etdirmək.

Yəni geniş dünyagörüşə malik, hadisələri və əşyanı qavrayan, hərtərəfli şəxsiyyət yetişdirmək, təlimin səmərəliyinin artırılması müəllimin vəzifəsinə düşür.

Təlim texnologiyalarının tətbiqi, prinsipləri, metodları, priyom və vasitələri hər bir tədris fənninin spesifikasına uyğun istifadə olunur. Texnologiyanın sürətlə inkişaf etdiyi müasir dünyada təhsil metodları da transformasiya, dəyişilmə mərhələsindədir. Təhsil inkişaf etdikcə ənənəvi təlim texnologiyaları, öz əhəmiyyətini itirir və getdikcə yeni təlim texnologiyalarına ehtiyac yaranır (2).

Müasir təlim texnologiyalarından biri də modul təlim texnologiyasıdır. Təhsildə modul texnologiyasından istifadə təhsil prosesinin təşkilinə müasir yanaşmadır və dünyanın müxtəlif təhsil müəssisələrində fəal şəkildə tətbiq olunur. Bu yanaşma müasir öyrənənlərin ehtiyaclarını ödəmək üçün çeviklik və fərdi öyrənmə tələb edir. Modul təlim texnologiyasının əsas ideyası öyrənənlərə təhsil yolunu seçməkdə daha çox çeviklik aşılamaq və materialın mənimsəmə sürətini təmin etməkdir.

Modul təlim texnologiyasının tarixi B.Qoldşmid, C. Russel və S.N. Posiletveyt tərəfindən yaradılmış xarici konsepsiyaların yaranması ilə bağlıdır. Bu konsepsiyanın əsas mahiyyəti tədris materialının kiçik bir hissəsinin müstəqil mövzu kimi götürülməsi, təlim kursunun məqsədəuyğun olmasından ibarətdir.

C. Russelin fikrincə, modulların mövcudluğu hər bir öyrənənlərə öz bilik və bacarıqlarına uyğun modul seçməyə, şəxsi imkanlarına uyğun olaraq təhsil almağa imkan verir (5).

XX əsrin 60-cı illərində öyrənmə prosesini səmərəli etmək, optimallaşdırmaq üçün intensiv axtarışlar başlanıldı. Müxtəlif tədqiqatçılar modul təliminə müxtəlif məqsədlərə görə yanaşırdı. Bir qrup tədqiqatçı öyrənənlərin rahat tempdə işləməsinə imkan yaratmağa, ikinci qrup tədqiqatçılar – bilik əldə etmənin səmərəli yolunu müəyyən etməyə kömək etməyə, üçüncü qrup təlimin məzmununu çevik şəkildə qurmağı, dördüncü qrup təlim formalarını inteqrasiya etmək, beşinci qrup peşəkar fəaliyyətə nail olmaq məqsədi ilə yanaşırdı. Modul təlimi ideyası elə həmin dövrə təsadüf edir. S. Postulayt məzmunun öyrənilməsi konsepsiyası təklifində müəyyən tədris materialının kiçik hissəsini ayrı, yəni müstəqil mövzu hesab edilməsini və asan şəkildə inteqrasiya oluna bilməsi haqqında ideya irəli sürmüşdür. İlk olaraq həmin bölmə "mikrokurs", sonra isə "mini kurs" adlandırmışdır. Həmin mini kurslar ilk dəfə ABŞ-da Purdue universitetində tətbiq edildi və sürətli olaraq digər universitetlərə və kolleclərə yayıldı. Beləliklə modul anlayışı və modul təlim texnologiyası anlayışı formalaşdırılmağa başladı.

Modul sözü latın dilində olan "modulus" sözündən götürülüb və mənası ölçü deməkdir. Modul anlayışı əsasən riyazi elmlərdə istifadə edilir.

Modul təlimi – təhsil proqramlarını fərdiləşməyə və hər bir şagirdin qabiliyyət və maraqlarından asılı olaraq mənimsəməyə imkan verən perspektivli pedaqoji texnologiyadır. Modul təliminə bunlar daxildir: plan, məlumat bankı, metodik rəhbərlik.

Plan tərtib etmək üçün optimal təlim modelini təyin etmək, ilkin konstruksiyasını tərtib etmək, bütün kursun məzmununun əyani təsviri, hərtərəfli məqsəd formalaşdırmaq lazımdır .

Məlumat bankı dedikdə, təhsilin məzmunu başa düşülür. O, səmərəli şəkildə məqsədlərə uyğun əhatəli olmalı, tapşırıqlar təfəkkürün inkişafına istiqamətləndirilməlidir.

Metodiki rəhbərlik – müəllimin öyrənənlərə yazılı məsləhətləridir. Bu məsləhətlərə müəllim tapşırıqları necə yerinə yetirə bilər, hansı materiallardan istifadə edilə bilər kimi tövsiyələr daxildir.

Modul təlim texnologiyasından istifadə edərkən məqsəd və bu məqsədə nail olmaq üçün modullar toplusundan ibarət modul proqram hazırlanır. Bu texnologiyanın əsasını bloklar təşkil edir. Yəni modul təlimində materiallar dərslərlə deyil, 3-12 saatlıq kiçik mövzulara bölünür. Proqramı tərtib etmək üçün kursun əsas məqsədi, məzmunu müəyyən edilir və bloklarda strukturlaşdırılır. Bu da diqqəti konkret mövzu üzərində cəmləşdirməyə və materialı uğurla mənimsəmək üçün bir sıra tapşırıqları yerinə yetirməyə kömək edir ki, təhsilin keyfiyyəti, səviyyəsi inkişaf etsin. Şagird bu zaman müstəqil işləməyi, öz işini düzgün planlaşdırmağı, özünüidarəetməni öyrənir. Nəticədə təlim prosesində şagird yaradıcı fəaliyyəti yerinə yetirməyə cəhd göstərir. Öyrənənlər təhsil müstəqilliyini inkişaf etdirirlər. Müəllim daha çox şagirdləri motivasiya edən bələdçi rolunda çıxış edir. Bu zaman təlim elə qurulmalıdır ki, şagirdin dərsə marağı daimi olsun. Modulun sonunda şagirdlər təhsil nəticələrini test, layihə şəklində təqdim edirlər.

Əgər şagird lazımi biliklərə yiyələnə bilməyibsə, müəllim məqsədə çatana kimi həmin mərhələ təkrarlanır.

Özünüidarəetmə ilə öyrənmə, öyrənənlərə öz tempində öyrənməyə şərait yaradır. Hər bir modulun müəyyən məqsədə nail olması üçün təyin edilmiş tapşırıqları vardır.

Modul təlimi texnologiyasının başlıca xüsusiyyətlərinə aşağıdakılar aiddir:

- Yeni materialı öyrənərkən müstəqil işləməyə diqqət yetirmək lazımdır. Çünki bu xüsusiyyət şagirdlərdə fəaliyyətlərini planlaşdırmağa və şagirdlərin özünü qiymətləndirilməsində kömək edir.
- Təhsil prosesi şagirdin iş tempinə, onun bilik və bacarıqlarına, ehtiyaclarına uyğun olmalıdır.
- Təlim məzmunu aydın struktura, konkret məzmuna malik bloklar qurulur.
- Öyrənməyə fərqli yanaşmadan istifadə etmək dərsə maraq oyadır.

Modul təlim texnologiyasının təşkilinin əsas məqsədi bunlardır:

- Hər bir öyrənəni şüurlu təlimə cəlb etmək;
- Öyrənənlərin fəal fəaliyyəti prosesində tədris materialının öyrənilməsi;
- Özünüidarəetmə və müstəqillik bacarıqlarının inkişaf etdirilməsi;
- Şagirdlərdə idrak marağının artırılması;
- Şagirdlərinin fəaliyyətlərini planlaşdırılma bacarığının inkişaf etdirilməsidir.

Digər texnologiyalardan fərqli olaraq modul texnologiyası:

- Təlimin məzmununu tam müstəqil komplekslərdə təqdim olunur, məzmunu mənimsəmə qarşıya qoyulmuş məqsədə uyğun olaraq həyata keçirilir.
- Müəllim – şagird ünsiyyəti fərdi ünsiyyət şəklində olur.
- Şagird müstəqil şəkildə işləyərək öz işini planlaşdırmağı, qarşısına məqsəd qoymağı və özünənəzarəti öyrənir.

Digər texnologiyalarda olduğu kimi modul təlim texnologiyasının özünəməxsus prinsipləri vardır. Bunlar aşağıdakılardır:

1. Başlıca olaraq modulluq prinsipi. Tədris metodları ilə ifadə olunan modul yanaşmaları təzahür edir. Bu prinsipin həyata keçirilməsi üçün tədris materialı qarşıya qoyulmuş məqsədlərə çatmaq üçün tərtib olunmalı, təlimin müxtəlif növləri, üsulları, formaları ilə inteqrasiya olunmalıdır.

2. Dinamiklik prinsipi. Modulların sərbəst dəyişməsinə şərait yaradır. Modullar elə qurulur ki, şagirdin bilik, bacarıq və vərdişlərinə uyğun olaraq dəyişikliklər aparıla bilsin. Çünki elmi tərəqqi sürətlə inkişaf edir və yeni biliklər meydana çıxır. Buna görə də hər il tədris materialı yenilənir. Hazır olan modullar əsasında yeni modullar yaranır.

3. Bilik sisteminin səmərəliliyi və operativliyi prinsipi. Bu prinsipdə əsas məqsəd şagirdlərin biliklərinin əlverişli şəkildə formalaşdırılmasıdır. Prinsipə əsasən fəaliyyət növləri ilə yanaşı, həm də fəaliyyət üsulları öyrədilir.

4. Fəaliyyət metodu prinsipi. Səmərəli biliklərə əsaslanır və yeni biliklərin mənimsənilməsini tələb edir. Bu prinsipdə əsas tələb təlimin məqsədyönlüyüdür. Məqsədyönlü təlim həm təlim motivasiyasını formalaşdırır, həm də tədris prosesinin motivasiyasına yönəlmişdir. Məqsədlər idrak, praktik, əqli olaraq tərtib olunmalıdır və bu məqsədə çatmaq üçün modullar fənlərarası təşkil olunmalıdır.

5. Çeviklik prinsipi. Təlimin məzmunu və onun mənimsənilməsi şagirdin fərdi xüsusiyyətlərinə uyğun olmalıdır. Bu prinsipə əsasən:

- İlkin diaqnostik qiymətləndirilmə keçirilməli;
- Şagirdin fərdi inkişaf tempi müəyyənləşdirilməli;
- Məqsədə çatmaq üçün və məqsədə nail olduqdan sonra özünənəzarət təşkil edilməlidir.

6. Şüurlu perspektivlik prinsipi. Şagird əvvəlcədən modul proqramı ilə tanış olur. Həmin modul proqramın daxilində dəqiq didaktik məqsəd, nəticə qeyd edilir.

7. Çoxşaxəlilik prinsipi. Şagirdin təfəkkür, idrak fəaliyyətində, pedaqoji fəaliyyətdə peşəkarlığa riayət olunmalıdır. Əsas şərtlərindən biri təlim məzmununun şagirdin imkanına uyğun olmasıdır. Bu prinsipə əsasən materialın mənimsənilməsini asanlaşdıran izahlı metod, üsullardan, vasitələrdən istifadə olunmalıdır .

8. Bərabərlik prinsipi. Müəllim şagird arasında subyekt-subyekt qarşılıqlı əlaqəni əks etdirir. Bu proses şəxsiyyətyönlü texnologiyalar kateqoriyasına aiddir və fərdi xüsusiyyətlərlə uyğunlaşdırılmalıdır.

Bu günə qədər modul təlim texnologiyasının bir çox müxtəlif variantları hazırlanmış və

müvəffəqiyyətlə təhsildə istifadə olunur. Getdikcə daha müasir, dövrün tələblərinə uyğun modul təlim texnologiyası proqramları, tədris materialları, təlim kursları hazırlanır .

**Problemin aktuallığı.** Müasir dövrdə modul təlim texnologiyasından istifadə olduqca aktual məsələdir.

**Problemin yeniliyi.** Məqalədə modul təlim texnologiyasının mahiyyəti, məzmunu, təsnifatı və prinsiplərinin xüsusiyyətləri diqqət mərkəzinə gətirilir.

**Problemin praktik əhəmiyyəti.** Məqalə tələbələr, mütəxəssislər və gənc tədqiqatçılar üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**


1. https://president.az/az/articles/view/9779
2. https://tehsiljurnali.az/ mektebmuellim / 48-tlm-proses-nn-v-masrlk.html
3. Беспалько В.П. Слагаемые педагогической технологии. -Москва: Педагогика, - 1989. – 191 с.
4. Селевко Г.В. Современные образовательные технологии. - Москва: Народное образование, - 1998. - 256 с.
5. https://multiurok.ru/files/tiekhnologhiia-blochno-modul-nogho-obuchieniia-i-ieie-primienieniie-v-protsiessie-priepodavaniia-biologhii.html



**E-mail:** rasimshukurov53@gmail.com
**E-mail :** camaskerova@gmail.com


**Redaksiyaya daxil olub:**18.10.2024.

UOT 37.01.

***Şəfiqə Veyis qızı Zülfüqarova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Ümumi pedaqogika kafedrasının dosenti, pedaqogika üzrə fəlsəfə doktoru*
*https://orcid.org/0000-0002-1272-3682*
*https://doi.org/10.69682/arti.2024.91(6).223-226*

# UŞAQLARLA MƏŞĞƏLƏLƏRDƏ YENİ İNTERAKTİV TEXNOLOGİYALARDAN İSTİFADƏNİN ƏSAS İSTİQAMƏTLƏRİ

***Шафига Вейс гызы Зульфугарова***
*доцент кафедры Общей Педагогики Азербайджанского Государственного Педагогического Университета, доктор философии по педагогике*

# ОСНОВНЫЕ НАПРАВЛЕНИЯ ИСПОЛЬЗОВАНИЯ НОВЫХ ИНТЕРАКТИВНЫХ ТЕХНОЛОГИЙ НА ЗАНЯТИЯХ С ДЕТЬМИ

***Shafiga Veyis Zulfugarova***
*associate professor*
*of the department of General pedagogy of the Azerbaijan State Pedagogical University, doctor of philosophy in pedagogy*

# THE MAIN DIRECTIONS OF USING NEW INTERACTIVE TECHNOLOGIES IN CLASSES WITH CHILDREN

**Xülasə.** Elmi məqalədə uşaqlarla məşğələlərdə aparılan təlim prosesində interaktiv metod və texnologiyalardan istifadə imkanları üzə çıxarılmışdır. İnnovativliyi və tamlığı qorunmaqla istifadə olunan iş formaları və üsulları göstərilmişdir. Məktəbəqədər yaşlı uşaqlarda məşğələlərdə istifadə olunan ən fəal təlim metodu, rollu oyunlar və onlardan istifadə imkanları göstərilmişdir. Əqli hücum və bu metoddan məşğələlərdə uşaqların fəallığının artırılması, konkret problemin həlli və qoyulan suala cavabın axtarılması zamanı istifadəsinin əhəmiyyəti açıqlanmışdır. Söz assosiasiyaları, Klaster və bu metodları tətbiq edərkən məşğələdə tərbiyəçinin uşaqlarla dərsi aparmaq metodikası öyrənilmişdir.
***Açar sözlər:*** *təlim, inkişafetdirici, metod, texnologiya, tərbiyəçi, uşaqlar*

**Анотация.** В научной статье раскрыты возможности использования интерактивных методов и технологий в учебном процессе, проводимом на занятиях с детьми. Показаны используемые формы и методы работы при сохранении их новаторства и завершенности. У детей дошкольного возраста показаны наиболее активный метод обучения, ролевые игры и возможности их использования. Объяснено значение мозговой атаки и использования этого метода в упражнениях для повышения активности детей, решения конкретной задачи и поиска ответа на заданный вопрос. На занятиях изучались словесные ассоциации, Кластер, методика воспитателя проведения урока с детьми при применении этих методов.
***Ключевые слова:*** *обучение, развивающий, метод, технология, воспитатель, дети.*

**Abstract.** In the scientific article, the possibilities of using interactive methods and technologies in the training process conducted in the exercises with children have been revealed. The work forms and methods used are shown while preserving their innovativeness and completeness. The most active learning method, roleplaying games and the possibilities of using them are shown in preschool children. The importance of mental attack and the use of this method in the exercises to increase the activity of children, to solve a specific problem and to search for an answer to a given question has been explained. Word associations, Cluster, and the method of the educator to teach the child while applying these methods were studied in the lesson.
***Keywords:*** *training, developer, method, technology, educator, children*

Şəxsiyyətyönlü təhsildə pedaqoji prosesin mərkəzində dayanan tərbiyəçi-müəllim və uşaqların vəzifələri o an dəyişir. Onların fəaliyyəti necə qurulur? Əlbəttə ki, əvvəlcədən müəyyən olunmuş nəticələrə əsasən qurulur. Tərbiyəçi-müəllim dərs zamanı yeni texnologiyaların içərisindən ən önəmlisini seçir. Bu texnologiyaların müəyyən olunmasında tərbiyəçi-müəllim və uşaq şəxsiyyəti təlimin aparıcı subyekti kimi çıxış edir. Münasibətlər "subyekt-subyekt" formuluna uyğun qurulur. Bu zaman uşaqlar öz təfəkkürünün, düşüncəsinin, tərbiyəçi-müəllimlər isə uşağın inkişafı üçün şəraitin təşkilatçısı olur. Tərbiyəçi-müəllimlərin rəhbərlik vəzifəsi dəyişir, məlumat vermək sahəsindəki fəaliyyəti məhdudlaşır. O daha çox qrupda təlim fəaliyyətini əlaqələndirən, istiqamətləndirən məsləhətçi kimi uşaqların müstəqil idraki fəaliyyətini, yaradıcılığını təşkil edən subyektə çevrilir. Uşaqlar isə müstəqil axtarışlar aparmağa, yaradıcı fəaliyyət göstərməyə motivə edilir.

Şagird və müəllimin yaradıcı fəallığını nəzərdə tutan, hər bir məktəblinin özünü komfort hiss etdiyi, öyrənilən problem üzrə öz fikrini bildirmək imkanı olan, öz şəxsi maraqlarını, sərbəstliyini, işdə tədqiqatçılıq bacarığını büruzə verən, əməkdaşlıq atmosferini, uğurlarını hiss edən və yaşayan dərs hazırlayıb keçmək hər bir müəllimin arzusudur.

Dərsə verilən əsas tələblərdən danışarkən məktəblilərin idrak fəallığı üçün şəraitin yaradılmasını onun əsas məqsədi hesab edirlər. Belə dərsdə uğur qazanmağa imkan verən vasitələri, metod və üsulları isə müəllim özü fikirləşməli və seçməlidir. Bu zaman o öz şagirdlərinin yaş, psixoloji, fərdi xüsusiyyətlərini, sinfin hazırlıq səviyyəsini bilməli, peşəkarlığını, intuisiya və yaradıcılıq potensialını işə salmalıdır.

Təlim mühiti planlaşdırılmış və plansız şəkildə fəaliyyət göstərə bilər. Planlaşdırılmış fəaliyyət günün əsas hissəsini təşkil edir. Rejim anlarında təlimdən kənar fəaliyyətlərə məktəbəqədər yaşlı uşaqlar üçün zəruri olan stabillik və tanışlıq, öyrənmə fəaliyyətləri məzmun sahələrinə və böyüklər tərəfindən planlaşdırılan xüsusi məqsədlərə malikdir. Planlaşdırılmış və plansız fəaliyyətlər üçün xoş, təhlükəsiz mühit, sağlam, təmiz, isti və stimullaşdırıcı sahələr yaradılır ki, bu sahələrdə tənqidi düşüncə bacarıqları, müxtəliflik, çoxmədəniyyətlilik kimi məsələlər formalaşdırılır və öyrənmə bacarıqlarının genişləndirilməsi və formalaşdırılması üçün şərait yaradılır.

Erkən dövrdə mühit inkişafetdirici xarakter daşımalıdır. "İnkişafetdirici və dəstəkləyici mühitin yaradılması üçün məktəbəqədər təhsil müəssisələrində müxtəlif guşələr (fəaliyyət mərkəzləri) təşkil olunur. Bu guşələr inkişaf sahələri üzrə qurulur və uşağın inkişafını təmin edir." (l, s. 35)

Müəllifin dediyi fəaliyyət mərkəzləri (guşələr) dedikdə, əsasən, aşağıdakılar nəzərdə tutulur: riyaziyyat guşəsi; kitab guşəsi; stolüstü oyunlar guşəsi; elm guşəsi; təsviri fəaliyyət guşəsi; qum və su guşəsi və s.

Uşaqlarla (1-3 yaş) öyrənmə prosesində onun innovativliyi və tamlığı qorunmaqla aşağıdakı iş formalarından istifadə edilir: fərdi, yarımqruplarla, kollektiv.

Uşaqlarla (3-6 yaşa qədər) iş formaları fərdi, cütlərlə, qruplarla və kollektiv iş nəzərdə tutulur. Pedaqoji proses ətraf mühitin və əşya aləminin fəal tədqiqi prosesində uşağın bütün inkişaf sahələri üzrə fəaliyyət növlərinin kompleks inkişafı üzərində qurulmalıdır. Müxtəlif fəaliyyət növlərinin qarşılıqlı əlaqəsi şəraitində təşkil olunmalıdır. Pedaqoji proses şəxsiyyətyönlülük prinsipi əsasında təşkil olunmalıdır. 3-6 yaşa qədər uşaqlarla iş zamanı təhsildə yaradıcı düşünən, müstəqil mühakimə yürüdə bilən demokratik dünyagörüşünə malik şəxsiyyət formalaşdırmaqda geniş imkanları olan əqli hücum, tap-tapmaca, nağıletmə, müzakirə, şaxələndirmə (klaster), problemli vəziyyət, oyunlar, suallar, söz assosiasiyası kimi təlim üsullarından istifadə edildikdə müsbət nəticələr əldə etmək mümkündür.

İnteraktiv təlim metodları uşaqlarda inam hissi tərbiyə etməklə yanaşı, yaradılan mühit onlarda tədqiqatçılığa, təşəbbüskarlığa maraq oyadır. Bundan başqa interaktiv təlim metodları uşaqlarda əməkdaşlıq etməyi, başqalarını dinləməyi, təhlil etmək qabiliyyətini inkişaf etdirir. Məşğələ zamanı interaktiv təlim metodlarının tətbiqi uşaqlarda müstəqil düşünmək, sərbəst rəy söyləmək, hər hansı problem barədə başqalarının fikrinə münasibət bildirmək, çoxluğun qərarını qəbul etmək kimi keyfiyyətlər yaradır. İnteraktiv təlim zamanı daha çox istifadə olunan qruplarla iş formasıdır. Bu iş forması uşaqlarda problemin birgə həll edilməsini, müstəqil işləməyi,

əməkdaşlıq etməyi və sərbəst fikir söyləmək kimi keyfiyyətləri tərbiyə edir. Tərbiyəçi uşaqları onların bilik səviyyəsini, xarakterini nəzərə alaraq 4-5 nəfərdən ibarət kiçik qruplara ayırır. Qabiliyyətli uşaqlar rəqib kimi deyil, qrupun lideri kimi qəbul olunurlar.

Qruplarda iş aşağıdakı qaydada aparılır:

1. Hər bir qrup bir masanın arxasında əyləşir;

2. Uşaqlar gördükləri işi təqdim etmək üçün öz aralarında 1 nəfəri lider seçirlər. Həmin uşaq qrupun işinin nəticəsini təqdim edir.

3. Tərbiyəçi mövzu ilə əlaqədar tapşırıq verir, işin görülməsi müddətini müəyyən edir.

4. Tərbiyəçi qruplar arasında gəzib, işləri müşahidə edir, suallara cavab verir, ehtiyac olduqda əlavə məlumat verir.

5. Müəyyən edilmiş müddət başa çatdıqdan sonra tərbiyəçi işi dayandırır və nəticələri bildirməyi xahiş edir.

6. Tərbiyəçi qrup liderlərinin təqdimatını dinləyib ümumiləşdirir.

Qruplarla iş formasını müxtəlif variantlara ayırmaq olar:

1. Bütün qruplar ümumi mövzu ətrafında müxtəlif materiallarla işləyirlər;

2. Bütün qruplar eyni vaxtda bir tədris materialı üzərində işləyirlər;

3. Eyni material üzərində qruplar növbə ilə işləyirlər.

Müasir təlim texnologiyalarının, interaktiv təlim metodlarının tətbiqi təcrübəsi göstərir ki, bu metodlar uşaqların idrak fəallığının və məntiqi təfəkkürünün inkişafına zəmin yaradır. Bu gün məktəbəqədər təhsil müəssisələrində istifadə olunan interaktiv təlim uşaqlardan çox tərbiyəçidən böyük məharət tələb edir. Tərbiyəçi elə fəal olmalıdır ki, uşaqları istiqamətləndirə bilsin. İnteraktiv təlim metodları bütün məşğələlərdə tətbiq olunduğu kimi sadə riyazi təsəvvürlərin inkişafı məşğələlərində də geniş tətbiq olunur. İnteraktiv təlimin əsas xüsusiyyəti olan problem situasiyanın yaranması riyaziyyat məşğələlərində müxtəlif məsələlərin həllində, əyləncəli, düşündürücü testlərin, inkişafetdirici təlim tapşırıqlarının, hesablamaların aparılmasında məntiqi əyləncəli tapşırıqların yerinə yetirilməsində həyata keçirilir. Sadə riyazi təsəvvürlərin inkişafı məşğələlərində daim problemli suallar olur, uşaqların diqqəti bu sualların həllinə yönəldilir. İnteraktiv təlim məntiqi təfəkkürə əsaslanan təlim metodudur. Riyaziyyat məşğələlərində uşaqların məntiqi təfəkkürü daha yaxşı inkişaf edir. Əşyaları uzunluğuna, eninə görə ölçmək, müqayisə etmək, oxşar olanları qruplaşdırmaq, əşyaları rənginə, formasına, ölçüsünə görə fərqləndirmək kimi verilən inkişafetdirici tapşırıqlar məntiqi təfəkkürün inkişafına müsbət təsir edir. Kompleks məşğələlərdə verilən idrakı inkişaf etdirən çalışmalar uşaqların fəallığını xeyli artırır. Müqayisə metodu ilə uşaqlar "azdır, çoxdur, bərabərdir, uzundur, qısadır, ucadır, alçaqdır, hündürdür, enlidir, ensizdir, tamdır hissədir" kimi anlayışları öyrənirlər. Uşaqlar əşyaları, həndəsi fiqurları rənginə, ölçüsünə, formasına görə qruplaşdıra bilirlər. İstifadə olunan əqli hücum, beyin həmləsi, yeni mövzunun izahından əlavə çalışmaların yerinə yetirilməsi zamanı tətbiq olunur.

Sadə riyazi təsəvvürlərin inkişafı məşğələlərində əsasən aşağıdakı interaktiv təlim metodlarından istifadə olunur: ***rollu oyunlardan***, demək olar ki, bütün məşğələlərdə istifadə etmək olar. Rolları ifa edən uşaqlar yaşlıları təqlid edirlər. Məsələn, "Gəlinciyə məktəb forması alaq" oyununda uşaqların bəziləri satıcı, bəziləri isə alıcı rolunda oynayırlar və s. ***Əqli hücum.*** Bu metoddan məşğələlərdə uşaqların fəallığının artırılması, konkret problemin həlli və qoyulan suala cavabın axtarılması zamanı tez-tez istifadə edilir. Əqli hücum daha çox yeni mövzunun öyrənilməsinə başlanarkən giriş müsahibəsində motivasiya yaradılarkən və ümumiləşdirmə aparılarkən təşkil olunur. ***Söz assosiasiyaları***. Bu metodu tətbiq edərkən məşğələnin əvvəlində tərbiyəçi öyrəniləcək mövzu ilə əlaqədar bir söz deyir, sonra uşaqlara tapşırır ki, sözü eşitdikdə ağıllarına gələn sözləri dərhal desinlər. Məsələn, hündür-uşaqların cavabı: bina, ağac, ev, hasar və s. ***Klaster (şaxələndirmə)***. Hər hansı bir mövzu və ya fikrin müəyyən qədər açılmasına, uşaqların bu mövzu ətrafında geniş, sərbəst düşünmələrinə şərait yaradan metoddur. Məs. Həndəsi fiqurlar.

Beləliklə, sadə riyazi təsəvvürlərin inkişafı məşğələlərində tətbiq olunan interaktiv təlim metodları 5 yaşlıların keyfiyyətli məktəb təlimində müvəffəqiyyət qazanmalarına imkan verir.

**Problemin aktuallığı** Bütün məktəbəqədər yaşlı uşaqların məktəbəqədər təhsillə əhatə edilməsi, onların hərtərəfli inkişafı, uşaqların idraki fəallığı, inteqrativ və interaktiv təlimi, tərbiyəçi-müəllimin səriştəliliyi, təhsilin demokratik prinsiplərlə idarə edilməsi qanunauyğunluqları şəxsiyyətyönlü təhsil

sistemində pedaqoji prosesin mərkəzində dayanan tərbiyəçi-müəllim və uşaqların funksiyalarını dəyişir. Bu baxımdan elmi məqalə aktualdır.

**Problemin elmi yeniliyi** ondan ibarətdir ki, burada məktəbəqədər yaşlı uşaqların hərtərəfli inkişafına, bütün həyatı boyu ona lazım olacaq sosial kompetensiyaların formalaşmasına təsir edən yeni texnologiyalar, bu texnologiyaları həyata keçirməkdən ötrü bizə lazım olan üsul və metodlar üzə çıxarılmışdır.

**Problemin praktik əhəmiyyəti** ondan ibarətdir ki, irəli sürülən ideya və təkliflərdən məktəbəqədər təhsil işçiləri, pedaqoq-müəllimlər və məktəbəqədər tərbiyə sahəsində təhsil alan bakalavrlar bəhrələnə bilərlər.

**Ədəbiyyat:**


1. Ağayev, Ş.O. Məktəbəqədər kurikulum: nəzəriyyə və təcrübə. / Ş.Q. Ağayev, S.S. Rzayeva. - Bakı: MM-S, -2017. -304s
2. Həsənova, P. Məktəbəqədər təhsildə pedaqoji ünsiyyət və onun müasir problemləri // -Bakı: Məktəbəqədər və ibtidai təhsil, -2022. №2, -s.48-56.
3. Məktəbəqədər təhsilin kurikulumu ( Layihə). / -Bakı: Azərbaycan Respublikası Təhsil İnstitutu, - 2017, - 117s.
4. Nəzərov, A. Müasir təlim texnologiyaları (Mühazirə xülasələri): Dərs vəsaiti. / A. Nəzərov. -Bakı: ADPU, -2012, -103 s.
5. Uşağınızın dünyasına bələdsinizmi? / tərt. Ed. B. Mikayıllı. -Bakı: -2008.- 46 s.



**E-mail:** safiqazulfuqarova@gmail.com



**Redaksiyaya daxil olub:** 27.11.2024.

UOT 378.

***Ramiz Cəlal oğlu Əliyev***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin müəllimi,*
*pedaqogika üzrə fəlsəfə doktoru*
*https://orcid.org/0009-0000-2707-1018*
*https://doi.org/10.69682/arti.2024.91(6).227-231*

# TƏLƏBƏNİN MÜSTƏQİL İŞİNDƏ YENİ TƏLİM TEXNOLOGİYALARINDAN İSTİFADƏ İMKANLARI

***Рамиз Джалал оглы Алиев***
*преподаватель Азербайджанского Государственного Педагогического Университета,*
*доктор философии по педагогике,*

## *ВОЗМОЖНОСТИ ИСПОЛЬЗОВАНИЯ*

## НОВЫХ ОБУЧАЮЩИХ ТЕХНОЛОГИЙ В САМОСТОЯТЕЛЬНОЙ РАБОТЕ СТУДЕНТОВ

***Ramiz Jalal Aliyev***
*teacher at Azerbaijan State Pedagogical University,*
*doctor of philosophy in pedagogy*

## POSSIBILITIES OF USING NEW EDUCATIONAL TECHNOLOGIES IN STUDENTS' INDEPENDENT WORK

**Xülasə.** Müasir dövrdə İKT-nin inkişaf etdirilməsi hər bir ölkənin intellektual və elmi potensialının vacib göstəricilərindən biridir. Bu prosesin zəruriliyi indiki qloballaşan dövrdə daha çox hiss olunur. Texnologiyaların sürətlə inkişafı və yayılması bəşəriyyətin inkişafı üçün böyük imkanlar yaradır. Bu gün informasiya cəmiyyətinin və dünya ölkələri ilə rəqabətə girə biləcək yüksək texnologiyalı milli iqtisadiyyatın yaradılması bir çox ölkələrin dövlət siyasətinin əsas istiqamətinə çevrilmişdir.
***Açar sözlər:*** *təlim texnologiyaları, təhsil müəssisələri, təhsilin idarə olunması, tələbələr, yeni informasiya texnologiyaları*

**Аннотация.** В наше время развитие ИКТ является одним из важных показателей интеллектуального и научного потенциала каждой страны. Необходимость этого процесса ощущается еще больше в нынешнюю эпоху глобализации. Стремительное развитие и распространение технологий создает огромные возможности для развития человечества. Сегодня создание информационного общества и высокотехнологичной национальной экономики, способной конкурировать со странами всего мира, стало основным направлением государственной политики многих стран.
***Ключевые слова***: *технологии обучения, образовательные учреждения, образовательный менеджмент, студенты, новые информационные технологии.*

**Abstract.** Nowadays, the development of ICT is one of the important indicators of the intellectual and scientific potential of each country. The need for this process is felt even more in the current era of globalization. The rapid development and spread of technologies creates enormous opportunities for the development of humanity. Today, the creation of an information society and a high-tech national economy capable of competing with countries around the world has become the main direction of state policy in many countries.
***Keywords:*** *learning technologies, educational institutions, educational management, students, new information technologies.*

Müasir tədqiqatlar göstərir ki, təhsilalanların müstəqilliyinin təmin edilməsində onların təlim texnologiyalarını düzgün seçib tətbiq etmələrindən çox asılıdır.

Təlim texnologiyası dedikdə qarşıya qoyulmuş məqsəd baxımından təlimin təşkili və idarə edilməsinə yönəlmiş əməliyyatlar sistemi başa düşülür. Bu zaman təlimin bütün komponentləri məqsəddən nəticəyə və onun qiymətləndirilməsinə qədər bir sistem halında götürülür.

İKT-nin təhsil sahəsinə tətbiqi bir sıra vacib olan şərtlərin təminatına, o cümlədən :

- təhsilə geniş şəkildə yanaşmaya;
- mütəmadi təhsilə və praktiki aşkarlıq prinsipinin reallaşdırılmasına;
- təhsil prosesinə yardımçı vasitələrin, ayrı-ayrı müəssisələrin və fərdi vətəndaşların müasir elektron təhsil informasiya resurslarına girişinin təmin edilməsi hesabına təhsilin effektivliyinin artırılmasına;
- ali təhsil müəssisələrinin tabeliyində olan təcrübə-layihələndirmə işlərinin və elmi tədqiqatların inkişafı prosesinin müasirləşdirilməsinə;
- təhsil sahələrinin idarə olunması effektivliyinin artırılmasına;
- təhsil və elm sahələrinin xalqlararası kooperasiyasını inkişaf etdirməklə.

İnformasiya texnologiyası aşağıdakı əsas əlamətləri ilə səciyyələnir: prosesin işlənməsi obyektin verilənləri ilə həyata keçir; prosesin məqsədi məlumatların alınmasını təmin etməkdir; prosesin həyata keçirilməsində əsas vasitələr proqram, qurğu və proqramlı qurğular hesab edilən hesablama kompleksləridir; verilənlərin işlənmə prosesləri verilmiş əşya və obyekt sahəsinə uyğun əməliyyatlara bölünür; prosesin optimallıq meyarı informasiyaların istifadəçiyə vaxtında təqdim edilməsi, onun etibarlığı, doğruluğu və tamlığı hesab edilir. İnformasiya texnologiyasında ilkin material kimi informasiya çıxış edir. Son məhsul kimi də həmçinin informasiya çıxış edir. Lakin, bu zaman obyektin, prosesin və ya hadisənin vəziyyəti haqqında keyfiyyətcə yeni informasiya alınır. Bununla bərabər informasiya texnologiyalarının əsas komponentləri bunlardır: verilənlərin toplanması (ilkin informasiya), verilənlərin emalı, yekun informasiyaların əldə olunması və onun istifadəçiyə göndərilməsi. Bu gün tədris prosesində idarəetmə texnologiyalarının tətbiqi aşağıdakı qaydada həyata keçirilməsinə imkan verir.

1. Şagirdlərin maraq və tələblərini, hazırlıq səviyyələrini, bacarığını, mənimsəniləcək materialın fərditipoloji xüsusiyyətlərinin nəzərə almaqla, tədris-tərbiyə prosesini fərdiləşdirir;
2. Şagirdlərin təfəkkür fəaliyyətlərini daha çox müstəqil axtarıcılıq istiqamətində dəyişdirir;
3. Şagirdlərin özlərini təkmilləşdirərək, müstəqil bilik əldə etmələri üçün stimul verir;
4. Təlimdə fənlərarası əlaqəni gücləndirməklə, hadisə və proseslərin kompleks öyrənilməsini təmin edir;
5. Tədris prosesinin mobilliyini, möhkəmliyini yüksəltməklə, dinamik yeniləşməsini təmin edir;

Təhsil sisteminin informasiyalaşdırılmasının əsas məqsədi müasir informasiya cəmiyyətinə layiq olan şəxslər yetişdirmək, ölkədə vahid təhsil və informasiya mühitini yaratmaqdır. Bunun üçün yeni informasiya texnologiyalarından istifadə etməklə aşağıdakılar təmin edilməlidir:

1. təhsilin keyfiyyətinin artırılması;
2. müasir informasiya mədəniyyətinin formalaşdırılması;
3. bütün yaş dövrlərində olan insanların təhsil alma hüquqlarının bərabərləşdirilməsi;
4. Milli təhsil sisteminin dünya informasiya, mədəniyyət və təhsil sisteminə inteqrasiyasının təmin edilməsi.

Bu gün müasir informasiya və kommunikasiya texnologiyalarını-internet, elektron poçt və qlobal rabitə imkanları olmadan təsəvvür etmək mümkün deyil. Texnologiyalar cəmiyyətin inkişafına müsbət təsir etmək imkanlarına malik olan mühüm bir vasitədir. Bir çox inkişaf etmiş və inkişaf etməkdə olan ölkələr İKT-nin təhsildə tətbiqi nəticəsində böyük nailiyyətlər əldə etmişlər. Dünya təcrübəsi aydın şəkildə göstərir ki, informasiya və kommunikasiya texnologiyalarından geniş istifadə olunması ölkənin hərtərəfli inkişafına xidmət edir. Buna görə də inkişafı gücləndirmək məqsədilə ölkə potensialından istifadə etmək üçün hər bir ölkənin öz milli İKT strategiyasının

işlənib hazırlanması mühüm əhəmiyyət daşıyır. Hazırda respublikamızda bütün mütəxəssislər İKT ilə işləmək və onlardan düzgün istifadə etmək bacarığına çox böyük önəm verirlər. İKT biliyinə yiyələnməyin ən yaxşı yolu isə elə orta məktəbdən başlayır. Ümumilikdə, təhsil sisteminin İKT əsasında təkmilləşdirilməsi informasiya cəmiyyətinin əsas məqsədlərindəndir. Dünya təcrübəsi göstərir ki, idarəetmə texnologiyalarından istifadə etməklə qurulan yeni təhsil modeli məktəbin pedaqoji heyəti qarşısında da yeni tələblər və vəzifələr qoyur. Müəllimlərin tək öz seçdikləri sahə üzrə olan biliklər, pedaqogika və psixologiya sahəsində deyil, həm də informasiya sahəsində yenidən təlim almaları lazım gəlir. Artıq yeni nəslin müəllimlərindən öyrətdikləri fənnin strukturuna uyğun, uşaqların fərdi xüsusiyyətlərini nəzərə alan və onlarda mütəmadi inkişafa xidmət edən texnologiyaları seçib tədris zamanı tətbiq etmələri tələb olunur.

Müəllimlər texnologiyaların köməyi ilə dərs prosesində müxtəlif səviyyəli təhsilalanlara fərqli yanaşma və öyrətmə sistemini tətbiq etməklə qavrama qabiliyyətlərinə uyğun müxtəlif tapşırıqlar verə bilərlər. Müxtəlif fənlər üzrə məsələlərin, tədqiqat tipli çalışmaların həllində kompüterdə optimal iş rejimi qurmaqla tələbələrlə qruplaşdırmaq xüsusi effekt verir. Kompüter qarşısında təhsil alan şəxslər öz sürət rejimində işləməsi yaxşı nəticə verir, onun özünə inamı artır, bu isə təlimi daha da səmərəli edir. Müəllimin verdiyi sualı kompüter vasitəsilə cavablandırmaqla tələbələrin hamısı dərs prosesində aktiv iştirak edir, müəllimlər isə dərs boyu onların aktivliyini qoruyub saxlaya bilirlər. Tədrisdə qlobal internet şəbəkəsinin imkanlarından istifadə olunmalı, vahid təhsil informasiya mühiti formalaşdırılmalı, təhsil yönümü vahid informasiya məlumat bazası yaradılmalı, açıq təhsil sisteminin imkanlarından geniş istifadə olunmalıdır. İnternet şəbəkəsinin əsas didaktik xüsusiyyətləri və funksiyalarına məlumatların yüksək sürətlə ötürülməsi və interaktivliyi təmin edən telekommunikasiya sistemlərinin çoxtərəfli mübadilə imkanları, multimedia proqramları, hipermətnlərlə işləmə imkanlarının geniş olması aiddir.

Təhsil müəssisələrinin kompüterləşdirilməsi təhsil sistemində çox ciddi dəyişikliklər yaradır. İnformasiya texnologiyalarından bu gün nəinki təhsil müəssisələrinin idarə olunmasında, həm də müəssisədən kənar tədbirlərin həyata keçirilməsində də geniş istifadə olunur. Xüsusən də internetin yaranması, gənclər arasında onun çox populyar olması, təhsilin çox müxtəlif sahələrində yeni istiqamətlər yaradır. Bu günə qədər pedaqoqlar fərdi kompüter kimi güclü təlim vasitəsinə tarixən heç vaxt malik olmamışlar. Təlimdə elə texniki vasitə yoxdur ki, didaktik imkanlarına görə, onunla müqayisə edilə bilsin. İnformasiyaların sürətli artımı şəraitində təhsilin məzmunu və təşkilinə verilən tələblər də dəyişir. Bu günün təhsili şagirdlərə daha çox informasiya yadda saxlamaq yox, tənqidi və məhsuldar düşünməyi, öyrənməyi, problem xarakterli məsələləri sərbəst həll etməyi öyrətməlidir.

Müasir dərsin bütün mərhələləri şagirdin maraq dairəsinə, yaş səviyyəsinə uyğun qurulmalıdır. Müasir dərsi İKT-siz təsəvvür etmək çətindir. Müasir dərs dedikdə, ilk növbədə, göz önündə İKT bacarıqları olan müəllim və kompüter, proyektorla təchiz olunmuş, müasir tələblərə cavab verən auditoriya canlanır. İnformasiya və kommunikasiya vasitələrinin köməyi ilə tələbələrdə həm intellektual və yaradıcılıq bacarıqları, həm də müxtəlif informasiya növləri ilə işləmək bacarıqları inkişaf edir. Müasir şəraitdə müəllimdən tələbələrin şəxsi keyfiyyətlərinə arxalanan üsullardan istifadə edilməsi tələb olunur. Müasir müəllim tədris zamanı müasir tələblərə cavab verən dərs hazırlamaq üçün İKT-ni effektli tətbiq etməlidir.

Həmçinin dərsin gedişi zamanı internet resurslarından istifadəyə üstünlük verərək tələbələri internetdən düzgün istifadə etməklə kreativ biliklərə yiyələnməyə sövq etməlidir. Elektron əyani metodik vəsaitlər fənn müəlliminin resursudur, ona dərsə hazırlıq zamanı metodik kömək göstərir. Elektron dərsin üstünlüklərindən biri də odur ki, dərsin bütün mərhələləri slaydlarda öz əksini tapır. Bu da dərsin operativliyini və marağını artırır. Dərs zamanı İKT-nin son yeniliklərindən biri olan "ağıllı" lövhədən istifadə edilməsi isə tələbələrin dərs prosesinə diqqət və marağını artırır, onları axtarışa sövq edir. Qeyd etmək lazımdır ki, rəqəmsal tədris resursları yazılı vəziyyətdə təqdim oluna bilməz. Əks halda onun didaktik

keyfiyyəti itirilmiş olar. Ənənəvi metodikada müəllim müəyyən bilikləri verməyə və onları tələb etməyə vərdiş idi, lakin interaktiv tədrisin istifadəsində fərqli olaraq tələbə özü əsas rol oynayır və biliklərin mənimsənilməsinə özü yol açır. Bu da onların tədris motivasiyasına təsir edir. Müəllim bu situasiyada aktiv köməkçi kimi çıxış edir və onun başlıca funksiyası tədris prosesinin təşkili və stimullaşdırılmamasıdır. Təhsilin informasiyalaşması, yeni pedaqoji texnologiyalardan istifadə ənənəvi təhsili yeni çalarlarla zənginləşdirir. Ənənəvi təlimdə əks-əlaqənin həyata keçirilməsi baxımından informasiya qarşılıqlı əlaqə yaradılmasında 2 fəal tərəf var: öyrədən və öyrənən. İdarəetmə texnologiyalarının əsaslı təlim prosesində isə operativ əks-əlaqə baxımından öyrədən və öyrənənin yeni interaktiv tərəfdaşı meydana gəlir. Artıq müəllim tələbə üçün informasiya mənbəyi deyil. Müəllimin əks-əlaqə yaratmaq, tələbənin biliyini qiymətləndirmək imkanı tədricən məhdudlaşır, bu imkanların bir qismi texnologiya vasitələrinə transfer olunur. Bu zaman öyrədən daha çox məsləhətçi tyutor funksiyası daşıyır. Müəllim tələbələrinə informasiya ötürülməsinə vaxt sərf etmir. Tədris materialının şagirdlərə nəql edilməsi, fərdi qaydada mənimsənilmiş tədris materialının onlardan qəbul edilməsi (tapşırıqların yoxlanılması, dərsin sorğusu və s.) kimi mərhələlərə vaxt itirilmir. Qazanılan əlavə vaxt ərzində tələbələr digər yaradıcı məsələlərin həllinə imkan qazanırlar. Beləliklə, tədris–informativ qarşılıqlı əlaqənin strukturu tədricən dəyişir, informasiya–təhsil mühiti formalaşdıqca öyrədən, öyrənən və İKT vasitələri arasında yeni səviyyəli informasiya mübadiləsi imkanları yaranır.

Yeni pedaqoji texnologiyaların tətbiqində əsas məqsəd demokratikləşdirmə, humanistləşdirmə, fərdiləşdirmə, inteqrasiya və humanitarlaşdırma prinsiplərini həyata keçirə bilən, müasir tələblərə cavab verən məktəblilərin yetişdirilməsi, intellektual zənginliyə və potensial gücə malik olan nəslin formalaşdırılmasıdır.

Ölkəmizdə aparılan islahatların, təhsil quruculuğunun indiki mərhələsində əsas diqqət qarşıya qoyulan vəzifəyə uyğun olaraq təhsilin məzmununun yeniləşməsinə, yeni pedaqoji texnologiyalar əsasında həyata keçirməsinə yönəlmişdir. Qabaqcıl pedaqoqlar dünya təcrübəsinə əsaslanaraq yeni pedaqoji texnologiyaların şəxsiyyətə yönəlmiş təlim, fəal idrak, inkişafetdirici təlim, qabaqlayıcı təlim, təlim-tərbiyə sisteminin çevikliyi, əməkdaşlıq, dialoji təlim prinsiplərini tədris prosesinə gətirmişlər. Pedaqoji texnologiyalardan istifadənin əsas istiqamətləri innovasiyalarla əlaqədar biliyin, müvafiq anlayışların düzgün mənimsənilməsi, müasir təlim prinsipləri, təlim metodlarından öz yerində maksimum səmərəli istifadə olunması ilə bağlıdır. Yeni pedaqoji texnologiyalardan istifadə edən müəllimin novatorluğu, onun yenilikçi kimi dünya təcrübəsindən istifadə edərək, yeni tədris metodları, dərs tiplərini müəyyənləşdirməsi təhsildə inkişaf üçün geniş imkanlar yaradır. Yeni pedaqoji texnologiyalar fəal (interaktiv) təlimə əsaslanır. Fəal təlim müəyyən olunan komponentlərlə şərtlənir. Bura fəal təlimin məzmunu, metodları, öyrədici mühit, qiymətləndirmə daxildir. Fəal təlim müəllim və şagird işgüzarlığının, şagird təfəkkürünün inkişafında əsas rol oynayan təlim metodudur. Şagirdlərdə inkişafedici mühitə yol açır. Tədris prosesinin səmərəsini artırır, yeniliklərdən istifadə etməklə nəticənin əldə edilməsində köməkçi vasitə rolunu oynayır, tələbələri maraq və fəaliyyətə yönəldir, məqsədə çatmaqda aparıcı mövqeyə malik olur. Dərs zamanı tələbələrdə qazanılmış bilik və bacarıqların tətbiq edilməsi, öz fikrini əsaslandırıb müdafiə etməsi, sərbəst düşünmə qabiliyyətinin formalaşdırılması təmin olunur. Tələbələrin fəallığı, müstəqil olaraq bilikləri əldə edib mənimsəmələri, öz qabiliyyətlərinin gerçəkləşməsi və təşəbbüskarlığa cəhd etmələri fəal təlimin əsas üstünlüklərindən sayıla bilər.

Təhsil sistemində aparılan islahatlar müasir dərsin məzmununun təkmilləşdirilməsi, yeni təlim texnologiyalarının tətbiqini tələb edir. İnteraktiv təlim metodlarından istifadə təhsilin keyfiyyətinə öz müsbət təsirini göstərir. Bu gün təlim-tərbiyə prosesində tələbələrə daha çox müstəqillik verilməli, öz fikirlərini sərbəst, çəkinmədən söyləməyə, arzu və istəklərinə müvafiq məşğuliyyətlər seçməyə şərait yaradır. Təhsildə yeni təlim metod və texnologiyalardan istifadə daha yüksək nəticələrin əldə edilməsinə gətirib çıxarır, tələbələrdə müstəqillik, işgüzarlıq, təfəkkür fəallığı, məsuliyyət kimi

keyfiyyətləri formalaşdırır. Yeni təlim texnologiyalarının tətbiqi ilə keçirilən müasir dərslər ənənəvi dərslərdən bir çox üstün cəhətləri ilə fərqlənir.

**Problemin aktuallığı.** Tələbə müstəqil işinin təşkilində və idarə edilməsində həm idarəetmə texnologiyalarından, həm də aktuallığı ilə diqqəti cəlb edən təlim texnologiyalarından istifadə ümumi işə fayda gətirə bilər.

**Problemin yeniliyi.** Müasir dövrdə yeni informasiya və kommunikasiya texnologiya məhsulları ortaya çıxır və bununla da dünya iqtisadiyyatının tələbləri dəyişikliyə məruz qalır.

**Problemin praktik əhəmiyyəti.** Fəal təlim texnologiyası tələbələrin zehni və əməli fəallığına, müstəqilliyinə əsaslanan, tədqiqatlılıq fəallığına, müstəqilliyinə əsaslanan, tədqiqatçılıq və əməkdaşlıq şəraitində həyata keçirilən təlim texnologiyasıdır. O, tələbəni təlim prosesinin subyektinə, fəal iştirakçısına çevirir.

**Ədəbiyyat:**


1. Ağayev Ə. Pedaqoji fikrimiz: dünənimiz, bu günümüz. - Bakı, 2000. -300 s.
2. Bəşirov B. Ali məktəb didaktikası. -Bakı, Maarif, -1992, -477 s.
3. Mehdizadə M.N. Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları. -Bakı: Maarif, -1982. -706 s.
4. Rüstəmov F., Dadaşova T. Ali məktəb pedaqogikası -Bakı: Maarif, -2007. -488 s.
5. Гаврилов М. Совершенствование самостоятельной работы студентов. -Ростов, 2020, -310 с.
6. Немаров О. Формирование индивидуального стиля самостоятельной учебной деятельности студентов. -Киев, 2019. -273 с.



**E-mail:** ramizeliyev905@gmail.com



**Redaksiyaya daxil olub:** 28.11.2024

*UOT 37.01.*

***Minayə İntiqam qızı Sadıxova***
*Bakı Slavyan Universitetinin*
*Riyaziyyat və İnformatika kafedrasının müəllimi,*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun*
*fəlsəfə doktoru proqramı üzrə doktorantı*
*https: // orcid.org/0000-0001-5423-1937*
*https://doi.org/10.69682/arti.2024.91(6).232-235*

# İNNOVASİYA FƏALİYYƏTİNİN STİMULLAŞDIRILMASININ ƏSAS XÜSUSİYYƏTLƏRİ

***Миная Интигам гызы Садыхова***
*преподаватель кафедры Математики и информатики*
*Бакинского Славянского Университета,*
*докторант по программе доктора философии*
*Института Образования Азербайджанской Республики*

# ГЛАВНЫЕ ОСОБЕННОСТИ СТИМУЛИРОВАНИЯ ИННОВАЦИОННОЙ ДЕЯТЕЛЬНОСТИ

***Minaya Intigam Sadykhova***
*lecturer at the department of Mathematics and informatics at Baku Slavic University,*
*doctorial student in the program of doctor of philosophy*
*at the Institute of Education of the Republic of Azerbaijan*

# MAIN FEATURES OF STIMULATING INNOVATION ACTIVITIES

**Xülasə.** Məqalədə innovasiya fəaliyyətinin stimullaşdırılmasının əsas xüsusiyyətlərindən bəhs olunur. İnnovasiya fəaliyyəti, bu mərhələlərin bir-birini izləməsi və mütəmadi olaraq yenilənməsi yolu ilə həyata keçirilir. Bu yanaşma, müəssisələrin və dövlətlərin rəqabət qabiliyyətini artırmağa, iqtisadiyyatın inkişafını sürətləndirməyə və cəmiyyətin rifahını yüksəltməyə imkan tanıyır. İnnovasiya, yalnız iqtisadi inkişafın deyil, həm də sosial və ekoloji mühitin müasirləşdirilməsi üçün vacib bir prosesdir. Bu anlayışın dərinləşdirilməsi və tətbiqi, cəmiyyətin bütün sahələrində irəliləyişin təmin olunmasında əhəmiyyətli rol oynayır.

***Açar sözlər:*** *innovativ fəaliyyətlər, iqtisadi inkişaf, texnologiyaların tətbiqi, innovativ ideya, elmi-texniki əsaslar*

**Аннотация.** В статье рассмотрены основные особенности стимулирования инновационной деятельности. Инновационная деятельность осуществляется путем следования друг за другом и регулярного обновления этих этапов. Такой подход дает возможность повысить конкурентоспособность предприятий и государств, ускорить развитие экономики и повысить благосостояние общества. Инновации – важный процесс не только экономического развития, но и модернизации социальной и экологической среды. Углубление и применение этого понимания играет важную роль в обеспечении прогресса во всех сферах жизни общества.

***Ключевые слова:*** *инновационная деятельность, экономическое развитие, применение технологий, инновационная идея, научно-технические основы.*

**Abstract.** The article discusses the main features of stimulating innovation. Innovation is carried out by following each other and regularly updating these stages. This approach makes it possible to increase the competitiveness of enterprises and states, accelerate economic development and improve the welfare of society. Innovation is an important process not only of economic development, but also of modernization of the social and environmental environment. Deepening and applying this understanding plays an important role in ensuring progress in all spheres of society.

***Keywords:*** *innovation, economic development, application of technology, innovative idea, scientific and technical foundations.*

Respublikamızın innovasiya siyasətinin başlıca məqsədi istehsalın texnoloji səviyyəsinin yüksəldilməsi və rəqabət qabiliyyətli məhsullar istehsalının həcminin artırılmasıdır. Ölkənin

iqtisadi inkişafını, beynəlxalq bazarda rəqabət qabiliyyətini və vətəndaşlarının həyat səviyyəsini artırmaq üçün dövlətin rolu və dəstəyi çox önəmlidir. İlk mərhələdə innovativ fəaliyyətləri dəstəkləmək və stimullaşdırmaq üçün dövlət tərəfindən müəyyən tədbirlərin həyata keçirilməsi vacibdir. Bu tədbirlər aşağıdakı aspektlərə yönələ bilər:

**Dövlət dəstəyi və stimullaşdırıcı tədbirlər**. İlkin mərhələdə dövlət innovasiya fəaliyyətlərini dəstəkləməli və bu sahədə təkanverici addımlar atmalıdır. Bu dəstək müxtəlif proqram və layihələrin maliyyələşdirilməsi, startaplara maliyyə yardımı, yeni texnologiyaların təşviqi və yerli müəssisələr üçün vergi güzəştlərinin tətbiqi ilə həyata keçirilə bilər.

**İnnovasiya infrastrukturunun inkişafı.** Tədqiqat və inkişaf (TƏİ) mərkəzlərinin, texnoloji parkların və innovasiya laboratoriyalarının qurulması və genişləndirilməsi innovasiya fəaliyyətini dəstəkləyən mühüm amillərdəndir. Dövlətin bu sahələrdə investisiya qoyması innovativ fəaliyyətlər üçün zəmin yaradır və yerli sahibkarları texnoloji yeniliklərə cəlb edir.

**Təhsil və kadr hazırlığı.** İnnovasiyaların həyata keçirilməsi üçün yüksək ixtisaslı kadrların hazırlanması vacibdir. Dövlət universitetlərdə və peşə təhsil mərkəzlərində texnologiya və mühəndislik sahələrinə xüsusi diqqət yetirməli, beynəlxalq təhsil proqramları vasitəsilə gəncləri dünya səviyyəsində təhsil almağa təşviq etməlidir.

**İnvestisiya və kredit mexanizmlərinin yaradılması**. innovativ layihələrin maliyyələşdirilməsi üçün xüsusi fondlar və kredit mexanizmləri yaradılmalıdır. Dövlət innovativ layihələrə investisiya qoymaq istəyən sahibkarlara faizsiz və ya aşağı faizli kreditlər təklif edə bilər.

**Tənzimləyici çərçivə**: İnnovativ iqtisadiyyatın inkişafı üçün hüquqi bazanın gücləndirilməsi, əqli mülkiyyət hüquqlarının qorunması və innovasiya fəaliyyəti üçün daha əlverişli şəraitin təmin edilməsi vacibdir. Dövlət tənzimləyici tədbirlər vasitəsilə ölkədə innovativ fəaliyyətin hüquqi bazasını dəstəkləməlidir [1, s. 121-128].

İnnovasiya siyasətinin uğurlu həyata keçirilməsi, iqtisadiyyatın inkişafını sürətləndirir, iş yerlərinin yaradılmasına, məhsuldarlığın artırılmasına və müasir dövrün tələblərinə cavab verən məhsul istehsalına imkan tanıyır. Bu yanaşma, ölkələrin qlobal bazarda daha güclü mövqeyə sahib olmasına və müasir texnologiyaların tətbiqi ilə rəqabət üstünlüyü qazanmasına kömək edir. Dövlətin bu prosesdəki rolu, müvafiq dəstək və tənzimləmə vasitələri ilə, innovasiyaların inkişafını sürətləndirmək, ölkə iqtisadiyyatının davamlı inkişafını təmin etmək və əhalinin rifahını yüksəltməkdir. İnnovasiya fəaliyyətinin məqsədyönlü dövlət müdaxiləsi ilə gücləndirilməsi, Azərbaycanın qlobal iqtisadiyyatda müsbət mövqeyini gücləndirəcək və müasir dövrün tələblərinə uyğun inkişaf etməsinə imkan verəcək.İqtisadi ədəbiyyatlarda innovasiya anlayışına dair fərqli fikirlər və yanaşmalar mövcuddur.

"İnnovasiya" latın sözü olan "innovato"dan götürülmüşdür və "yeniləşmə" və ya "yaxşılaşma" mənalarını ifadə edir. İnnovasiyanın tarixi kökləri nisbətən dərin olsa da, onun iqtisadi proseslərlə bağlılığı müxtəlif dövrlərdə fərqli şəkildə şərh olunmuşdur. İnnovasiya anlayışının formalaşması, elmi, iqtisadi və texnoloji inkişaflarla sıx bağlıdır. XVIII əsrdən başlayaraq, innovasiyaların cəmiyyətin bütün aspektlərini təsir etməsi, bu anlayışın müasir dövr üçün əhəmiyyətini artırmışdır. O dövrdə fransız maarifçisi Jan Kondorse, elmin inkişafı ilə sənaye istehsalının artması arasında bir əlaqə olduğunu göstərərək, elmi biliklərin tətbiqinin iqtisadi inkişafa müsbət təsir etdiyini vurğulamışdır. Kondorse, elmi nailiyyətlərin sənaye istehsalına tətbiqinin iqtisadi inkişafın sürətlənməsinə və məhsuldarlığın artmasına şərait yaratdığını vurğulamışdır. Onun baxışları, elmin inkişafı ilə sənayenin məhsuldar güclərinin artırılması arasında möhkəm bir əlaqə olduğunu göstərir. O, innovasiyaların yalnız yeni məhsul və xidmətlərin yaradılması ilə məhdudlaşmadığını, eyni zamanda iqtisadi sistemlərin ümumi inkişafına və müasir texnologiyaların tətbiqinə də yönəldiyini qeyd edir. İnnovasiya anlayışının tarixi kökləri və onun iqtisadi proseslərlə bağlılığı, müasir dövrdə daha da aktual hala gəlmişdir [1, s. 121-128]. Jan Kondorse nəzəriyyələri, elmin və sənayenin qarşılıqlı təsirinin vacibliyini vurğulayaraq, innovasiyanın iqtisadi inkişafın təməl daşı olduğunu ortaya qoyur. Bu anlayışın dərindən tədqiqi, innovasiyaların tətbiqi və inkişafının müasir cəmiyyətdəki rolunu daha yaxşı anlamağa kömək edir. Bu baxımdan, innovasiyaların iqtisadi sistemlərdəki əhəmiyyəti,

yalnız məhsuldarlığı artırmaqla yanaşı, həm də cəmiyyətin ümumi inkişafına xidmət edir. İnnovasiya, yalnız yeni məhsul və xidmətlərin yaradılması deyil, həm də mövcud biliklərin və texnologiyaların yeni şəraitdə tətbiqi deməkdir. Bununla yanaşı, innovasiya ilə bağlı əsas anlayışlar hələ də fərqli şərh olunur. Bəzi mütəxəssislər innovasiyanı yalnız məhsul və xidmətlərlə əlaqələndirirsə, digərləri onu təşkilati və proses dəyişiklikləri ilə də genişləndirir.

İnnovasiya fəaliyyəti, insan kollektivinin yeni elmi biliklər, ideyalar, kəşflər və ixtiralar, eləcə də mövcud və sınanmış elmi texnologiya, sistem və avadanlıqların istifadəsi və tətbiqi əsasında innovasiyaların tam həcmdə ictimai realizəsinə yönəldilmiş sistemli fəaliyyət növüdür. Bu, həm fərdi, həm də kollektiv səviyyədə yeni fikirlərin, yanaşmaların və texnologiyaların tətbiqini əhatə edir. İnnovasiya fəaliyyəti müxtəlif mərhələlərdən ibarət olan sistemli bir prosesdir. Bu mərhələlər, yeni ideyaların yaradılmasından onların tətbiqinə qədər uzanır. Aşağıda innovasiya fəaliyyətinin əsas mərhələləri sadalanır:

**İdeya yaratma.** Bu mərhələdə yeni fikirlərin, konsepsiyaların və innovativ yanaşmaların ortaya çıxması baş verir. İdeya yaradılması, tədqiqatlar, beyin fırtınası, ehtiyacların analizi və mövcud problemlərin müəyyən edilməsi yolu ilə gerçəkləşir. Eyni zamanda, son tendensiya və texnoloji yeniliklər də ideya yarada bilər.

**Tədqiqat və inkişaf.** İdeyaların inkişaf etdirilməsi və təhlili mərhələsidir. Bu mərhələdə elmi tədqiqatlar aparılır, yeni texnologiyalar və məhsul prototipləri hazırlanır. Tədqiqat və inkişaf, ideyanın tətbiq edilmədən əvvəl texniki və elmi aspektlərinin öyrənilməsini tələb edir.

**Prototipləşdirmə.** Bu mərhələdə, innovativ ideyanın ilk versiyası hazırlanır. Prototiplər, ideyanın reallaşması üçün nəzərdə tutulmuş funksiyaları və xüsusiyyətləri əks etdirir. Prototiplərin sınaqdan keçirilməsi, məhsulun daha da inkişaf etdirilməsi üçün vacibdir.

**Sınaq.** Prototipin sınaqdan keçirilməsi mərhələsidir. Bu mərhələdə ideya və ya məhsulun tələblərinə uyğunluğunu, funksionallığını və etibarlılığını yoxlamaq üçün testlər aparılır. Sınaq nəticələrinə əsasən, düzəlişlər edilir və məhsulun son versiyası hazırlanır.

**Tətbiq.** İstehsal prosesinin başlandığı mərhələdir. Bu mərhələdə strategiyalar hazırlanır, istehsal prosesi üçün resursların və avadanlıqların hazırlanması tələb olunur.

**Təqdimat.** Məhsulun təqdim edilməsi mərhələsidir. Məqsəd, innovativ məhsulun tanıdılmasıdır.

**Geri bildirim.** Məhsul təqdim edildikdən sonra geri bildirimlər toplanır. Bu mərhələdə performans analizi əsasında məhsulun təkmilləşdirilməsi üçün tədbirlər görülür. İnnovasiya prosesinin dövri xarakteri, daima yenilənmə və inkişafı təmin edir.

**Yenilik və dəyişiklik**. Müəssisə ehtiyaclarına və texnoloji inkişaflara uyğun olaraq, innovativ məhsulun və xidmətin yenilənməsini həyata keçirir. Bu mərhələ, uzunmüddətli müvəffəqiyyət üçün vacibdir və daimi innovasiya mədəniyyətinin yaradılmasına kömək edir [2, s. 258-266].

Elmi-texniki innovasiyalar, məhsul inkişafından tutmuş istehsal proseslərinin optimallaşdırılmasına qədər geniş bir spektri əhatə edir. Onlar, həmçinin, yeni məhsul və xidmətlərin istehsalında müasir texnologiyaların istifadəsini təşviq edir [2, s. 258-266].

Gələcəkdə elmi-texniki inkişaf, ölkələrin müstəqil və dayanıqlı şəkildə inkişaf etməsi, innovativ iqtisadiyyatların qurulması və qlobal çağırışlara effektiv cavab verməsi üçün kritik əhəmiyyət kəsb edəcəkdir. Klimatik dəyişikliklər, qlobal səhiyyə problemləri və sosial-iqtisadi bərabərsizliyin aradan qaldırılması kimi çağırışlara cavab vermək üçün innovativ yanaşmaların tətbiqi vacibdir. Bu çərçivədə, elmi tədqiqatlar və texnoloji inkişaflar, cəmiyyətin dayanıqlı inkişafını təmin etməyə kömək edəcəkdir. İnnovasiyaların fasiləsiz tətbiqi, dövlətin istənilən sahəsinin inkişafında mühüm rol oynayır. Azərbaycan Respublikası iqtisadiyyatının gələcək perspektivləri də innovasiya fəaliyyətinin inkişafına bağlıdır. İnnovasiyaların tətbiqi, yalnız iqtisadi inkişafı deyil, eyni zamanda əhalinin həyat səviyyəsini, sosial-iqtisadi artım tempini, rəqabətqabiliyyətliyi və digər vacib göstəriciləri əhəmiyyətli dərəcədə təsir edir. İnnovativ yanaşmalar, Azərbaycan iqtisadiyyatının qlobal bazarda rəqabətqabiliyyətliyini artırır. Yeni məhsul və xidmətlərin təqdimatı, müasir texnologiyaların tətbiqi, istehsal proseslərinin optimallaşdırılması və müştəri tələblərinə uyğunlaşma, ölkənin dünya bazarındakı mövqeyini gücləndirir.

Rəqabətqabiliyyətlik, eyni zamanda, xarici investisiyaların cəlb edilməsinə də təsir edir.

İnnovasiya siyasətinin reallaşdırılması üçün özəlləşdirmə, innovasiya infrastrukturunun yaradılması, resursların ayrılması və istifadə olunmayan avadanlıqların innovasiya subyektlərinə verilməsi kimi strateji addımlar atılmalıdır. Bu yanaşmalar, ölkənin iqtisadi inkişafını stimullaşdırmaq, müasir texnologiyaların tətbiqini artırmaq və innovativ mühitin yaradılmasına kömək edir. Dövlətin bu prosesdəki aktiv rolu, innovasiyaların reallaşmasına və ölkənin beynəlxalq rəqabət qabiliyyətinin artırılmasına müsbət təsir göstərəcəkdir [6].

Nəticə olaraq innovativ inkişafın elmi-texniki əsasları, müasir cəmiyyətin tələblərinə cavab verən, dayanıqlı və ətraf mühitə uyğun həllərin inkişafını təmin edən mühüm amillərdir. Bu sahədə atılacaq addımlar, həm iqtisadiyyatın inkişafına, həm də insanların həyat keyfiyyətinin yüksəlməsinə əhəmiyyətli töhfələr verəcəkdir. Dövlət, innovasiya fəaliyyətini stimullaşdırmaq üçün uyğun tənzimləyici çərçivə yaratmalıdır. Bu çərçivə, innovativ fəaliyyətin həyata keçirilməsi üçün qanunvericilik və siyasətlərin inkişafını əhatə edir. İnnovasiyaların tətbiqinə mane olan bürokratik əngəllərin aradan qaldırılması da vacibdir. İnnovasiya fəaliyyətinin stimullaşdırılması üçün yuxarıda sadalanan xüsusiyyətlər, müasir iqtisadiyyatın inkişafında əhəmiyyətli rol oynayır. Bu yanaşmalar, ölkələrin və müəssisələrin innovativ potensialını artırmağa, yeni məhsul və xidmətlərin istehsalını təmin etməyə və iqtisadi artımı sürətləndirməyə imkan tanıyır. Beləliklə, innovasiyaların effektiv şəkildə həyata keçirilməsi, cəmiyyətin ümumi inkişafına və rifahına müsbət təsir göstərir.

**Problemin aktuallığı.** İnnovativ inkişaf, müasir cəmiyyətin dinamik və dayanıqlı inkişafını təmin etmək üçün əsas faktorlardan biridir. Bu proses, yeni ideyaların, məhsul və xidmətlərin, elmi-texniki nailiyyətlərin tətbiqi ilə xarakterizə olunur. İnnovasiyalar, iqtisadiyyatda məhsuldarlığı artırmaq, yeni iş yerləri yaratmaq və insanların həyat keyfiyyətini yüksəltmək məqsədini güdür. Elmi-texniki əsaslar, innovativ inkişafın həyata keçirilməsində mühüm rol oynayır.

**Problemin yeniliyi.** Dövlətin innovasiya siyasətinin əsas vəzifələri və prinsipləri, ölkənin iqtisadi inkişafını müasirləşdirmək, rəqabət qabiliyyətini artırmaq və əhalinin sosial rifahını yüksəltmək məqsədinə xidmət edir. Bu vəzifələrin həyata keçirilməsi, innovasiyaların səmərəli tətbiqi və inkişaf etdirilməsi üçün vacibdir, eyni zamanda, ölkənin beynəlxalq bazarda müsbət mövqeyini gücləndirir.

**Problemin praktik əhəmiyyəti.** İnnovativ inkişafın elmi-texniki əsasları, araşdırmalar, yenilikçi düşüncə və texnologiyaların tətbiqi ilə bağlıdır. Bu kontekstdə elmi tədqiqatlar, yeni biliklərin yaradılması və mövcud biliklərin tətbiqi üçün zəruri olan əsasdır.

**Ədəbiyyat:**


1. Desmarchelier B., Fang E.S., National culture and innovation diffusion. Exploratory insights from agent-based modeling. Technological Forecasting and Social Change, 2016, 105, 121-128 p.
2. Ho C., Wu W., The role of innovativeness of consumer in relationship between perceived attributes of new products and intention to adopt. International Journal of Electronic Business Management, 2011, № 9, p. 258-266
3. Gorodnikova N.V., Gokhberg L. M., Indicators of innovative activity: statistical collection/. - M.: HSE, 2018. – 344 p.
4. Redding, S. (2013, May). Building a better statewide system of support. In B. Gross & A. Jochim (Eds.), Leveraging performance management to support school improvement: The SEA of the future, 2013, 9–18 p..
5. San Antonio, TX: Building State Capacity & Productivity Center at Edvance Research, Inc.l of Management Reviews, Vol. 12 No. 4, pp. 435-452, available at: http://onlinelibrary. wiley.com/doi/10.1111/j.1468-2370.2009.00272.x/full
6. https://compcenternetwork.org/sites/default/files/archive/Stimulating_Innovation_SA.pdf
7. https://audit-journal.az/en/articles/69
8. https://strategica-conference.ro/wp-content/uploads/2022/05/47-2.pdf


**E-mail:** esadixova.minaya@mail.ru

**Redaksiyaya daxil olub:**09.12.2024.

*UOT 376.3*

***Humay Dilman qızı Səfərova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*ümumi pedaqogika kafedrasının müəllimi*
*https: // orcid.org/0009-0003-2853-4610*
*https://doi.org/10.69682/arti.2024.91(6).236-239*

## İNKLÜZİV ANLAYIŞININ TƏHSİL PROSESİNDƏ İNKİŞAF MƏSƏLƏLƏRİ

***Хумай Дильман гызы Сафарова***
*преподаватель кафедры общей педагогики*
*Азербайджанского Государственного Педагогического Университета*

## ВОПРОСЫ РАЗВИТИЯ КОНЦЕПЦИИ ИНКЛЮЗИИ В ОБРАЗОВАТЕЛЬНОМ ПРОЦЕССЕ

***Humay Dilman Safarova***
*teacher of the department of General pedagogy of the*
*Azerbaijan State Pedagogical University*

## DEVELOPMENT ISSUES OF THE CONCEPT OF INCLUSION IN THE EDUCATIONAL PROCESS

**Xülasə.** Məqalədə təhsil prosesinə daxil olma konsepsiyasının inkişafı təhlil edilir. İstər məktəbəqədər, istərsə də orta məktəb çağında həyata keçirilən bu işin mahiyyəti haqqında ətraflı məlumat verilir.

Eyni zamanda, məqalədə inklüziv konsepsiyanın yaranma tarixi haqqında məlumatlar yer alır.
***Açar sözlər:*** *inklüziv təhsil, bacarıq, inkişaf, uşaq, cəmiyyət*

**Аннотация.** В статье анализируются вопросы развития концепции инклюзии в образовательном процессе. Подробно представлена информация о сути данной работы, которая проводится как в дошкольном, так и в старшем школьном возрасте.

В то же время статья содержит информацию об истории инклюзивного понятия.
***Ключевые слова:*** *инклюзивное образование, навыки, развитие, дети, общество*

**Abstract.** The article analyzes the issues of development of the concept of inclusion in the educational process. Detailed information is provided about the essence of this work, which is carried out both in preschool and in high school.

At the same time, the article contains information about the history of the inclusive concept.
***Keywords:*** *inclusive education, skills, development, children, society*

Müasir cəmiyyətdə fiziki anlamda sağlam olanlarla fiziki imkanları məhdud olan şəxslər ətrafında fikirlər müxtəlif mövcuddur. Bəziləri bu qəbildən olan kəsləri (xüsusən uşaqları) normal bir şəraitdə yetkinləşməsini, boya-başa çatmasını, bəziləri isə bu işi “alın yazısı”, “çarəsizlik sindromu” kimi qarşılayırlar. Bu mövzuda aparılan müzakirələr, qazanılan hər bir təcrübə yeni nəzəriyyələr üçün yol açmaqla cəmiyyətdə inklüzivləşmə prosesini sürətləndirir.

Bu gün fiziki cəhətdən sağlamlıq imkanı normal olan uşaqlarla, fiziki bacarıq və qabiliyyətləri ahəngdar olmayan uşaqların eyni prosesdə, eyni münasibətdə bərabərlik prinsipi əsasında formalaşmasının hüquqi bazasını bilməklə yanaşı, onun mənəvi sağlamlıq xüsusiyyətlərini də bir vəzifə olaraq bilməyin əhəmiyyəti böyükdür.

Xüsusi qayğıya ehtiyacı olan uşaqların tipik yaşıdları ilə təhsilə birgə hazırlanması üzrə

məsuliyyət mahiyyət etibarı ilə daha çox psixoloq və tərbiyəçi-müəllimlərin üzərinə düşür. Ümumiyyətlə, korreksiyaedici xidmət dedikdə, öncə onların təhsilə daha tez uyğunlaşması, uşaqlarla effektiv ünsiyyət qura bilməsi nəzərdə tutulur. Məsələn, uşaq bağçalarında, yaxud məktəbəqədər hazırlıq müəssisələrində tərbiyəçi-müəllimlərin əsas rolu aşağıdakı funksiyaları həyata keçirməkdən ibarətdir: uşaqlarda kollektivçilik, əmək vərdişləri, davranış, etik və əxlaqi keyfiyyətlərin inkişaf etdirilməsi, dünya haqqında ilkin təsəvvürlərin yaradılması və s. Bir sözlə, məktəbəhazırlıq prosesində pedaqoq uşağı fiziki və mənəvi cəhətdən tərbiyə edir, cəmiyyət tərəfindən müəyyən edilmiş vəzifələrə uyğun şüurlu fəaliyyətə hazırlayır.

İnklüziv təhsil son 10 il müddətində Avropa, Asiya və Birləşmiş Ştatlardakı aparıcı təhsil mütəxəssisləri arasında razılaşdırılmış əsas ideyaya çevrilmişdir. İnklüziv təhsilin fəlsəfəsi xüsusi qayğıya ehtiyacı olan uşaqların cəmiyyətin daha dəyərli üzvlərinə çevrilməsinə yardım etməkdən ibarətdir. Valideynlər inklüziv təhsilin icrasında və onun inkişafında aparıcı qüvvədir. Valideynlər bütün uşaqlar üçün nəzərdə tutulmuş bu yeni yanaşmanın həyata keçirilməsinin vacibliyini qəbul etməli və ona uyğun davranmalıdırlar. Bütün uşaqların eyni hüquqlara malik olmaları valideynlər tərəfindən hörmətlə qarşılanmalıdır. Hər bir valideyn məktəbin fəaliyyətində fəal iştirak etməli, uşaqların keyfiyyətli təhsil almalarına yardım göstərməlidirlər.

“Müasir tədqiqatçılar qeyd edirlər ki, bu istiqamətdə mükəmməl qanunvericiliyə malik ölkələr sırasına Kanadanı, Kipr, İsveç, Norveç, İspaniya, ABŞ və Böyük Britaniya kimi ölkələri aid etmək olar. Amma mükəmməl qanunvericiliyin olması heç də bu təhsilin dəstəklənməsi və işləməsi demək deyil. Təcrübə göstərir ki, yalnız mükəmməl qanunvericiliyin mövcudluğu kifayət etmir. Məsələn, Almaniya mükəmməl qanunvericilik bazasına malikdir, amma əksər intellektual pozuntulu uşaqlar xüsusi məktəblərdə oxuyurlar.

Zamanla səsləşən inklüziv təhsilin hamı üçün aydın və anlaşıqlı olması ilə yanaşı, onun prioritetliyinin yeniləşən, modern inkişafa güclü təsiri olduğuna da haqq qazandırılır. Bu baxımdan inkuliziv təhsilin bir çox komponentləri vardır. Bunlara inkluziv təhsillə əməkdaşlıq; qiymətləndirmə; fərdi tədris proqramı; inkluziv təhsildə reabilitasiya xidmətinin təşkili; inkluziv təhsildə pedaqoq və psixoloqların rolu; inkluziv təhsildə valideynlərlə işin təşkili və s. məqamlar aiddir.

İnkluziv təhsilin məktəbəqədər müəssisə və eyni zamanda məktəblərdə uğurlu inteqrasiyanın təmin olunması zamanı intellekt və emosional sahənin inkişafı; stressə qarşı dözümlülüyün və özünəinamın inkişafı kimi məsələlər vacib olması ilə seçilir. Məktəbəqədər uşaq müəssisələri xüsusi qayğıya və təhsilə ehtiyacı olan uşaqları qəbul edir, sosial status, irqi, fiziki, emosional və intellektual inkişaf səviyyələrinə görə diferensasiya etmədən onlar üçün tələbata uyğun xüsusi psixopedaqoji şərait yaradır.

İnklüziv siniflərdə işləyən müəllim və müəllim köməkçiləri, eləcə də, praktik psixoloqlar üçün mütəmadi olaraq seminar və treninqlər keçirilir.

İnklüziv uşaqlarla işin təşkili səviyyəsi öncədən müəyyənləşdirilir. İnklüziv siniflərdə maksimal psixoloji şərait yaradılır. Fiziki cəhətdən öz yaşıdlarından geri qalan şagirdlərdə əqli inkişaf izlənilir və məşğələlər aparılır.

Pedaqoji kollektiv inklüziv uşaqlarla bağlı işləri məktəbdə vaxtaşırı müzakirə edir. Əldə olunan nəticələrlə valideynlər tanış edilir. Bu baxımdan bağça-məktəb-lisey kompleksinin inklüziv təhsil üzrə iş təcrübəsini nümunə göstərmək olar. Burada inklüziv təhsil keyfiyyətinin meyarları müəyyənləşdirilmiş və onların həyata keçirilməsinə çalışılır. Meyarlara daxil edilmişdir:

1. Korreksiya işinin yüksək səviyyədə təşkili;

2. Uşağın normal tədris fəaliyyətinə qoşulması;

3. İnklüziv təhsilə cəlb olunmuş uşaqlarla işin müvafiq təhsil ocağında aparılması üçün şəraitin yaradılması;

4. Tədris prosesində tərbiyə amilinin diqqətdə tutulması;

5. Müəllim və müəllim köməkçisi tərəfindən tədris fəaliyyətinin təşkili və idarə olunması;

6. Şagirdlərin inteqrativ təlimə qoşulmasının təmin edilməsi.

İnklüziv təhsil həyata keçirilən digər məktəblərdə də təlimin keyfiyyət meyarlarına əməl edilir.

Bildiyimiz kimi, qayğıya ehtiyacı olan uşaqlar mümkün dairəsində normal uşaqlarla birlikdə təhsil alırlar. Bu prosesdə sağlam uşaqlar isə tolerantlıq, başqalarının problemlərini başa

düşmək və onlara yardım etmək hissinə yiyələnirlər.

2023–2024-cü tədris ilində ölkə üzrə 40 ümumi təhsil müəssisəsində 245 sağlamlıq imkanları məhdud uşaq inklüziv siniflərdə təhsilə cəlb olunub. Əlil uşaqların inkluziv təhsilə cəlb olunması üçün valideynlər arasında maarifləndirmə işi aparılmalıdır. Çünki valideynlərin bəzisi öz əlil uşaqlarını təhsilə cəlb etmirlər. Lakin sağlamlıq imkanları məhdud olan uşaqların inkluziv təhsilə cəlb olunmasının bir sıra üstünlükləri vardır:

"1. Xüsusi qayğıya ehtiyacı olan uşaqlar kollektivə uyğunlaşır, cəmiyyətə inteqrasiya olunur. 2. Onlarda özünə inam hissi formalaşır. 3. Onlar cəmiyyətin digər üzvləri kimi bərabər hüquqlu şəxsiyyət kimi formalaşır. 4. Gələcəkdə onların məşğulluq kimi problemi də aradan qaldırılmış olur" (3).

Yalnız müəllim və məktəbləri təmin etməklə keyfiyyətli tədris mühitinə tam zəmanət vermək olmaz. Şagirdlərin günün əsas hissəsini evdə keçirdiklərini nəzərə alsaq, bu mühitin yaradılmasında valideynlərin necə böyük rol oynadığını görə bilərik.

İnkluziv təhsilin inkişaf səviyyəsinə valideynlərin aktivliyi təsir edir. Belə ki, Niderlandda Daun sindromlu uşaqların valideynlərinin dövlətin təhsil siyasətinə ciddi etirazları olmuşdur. Və hazırki dövrdə məhz onlar övladlarının ümumtəhsil məktəblərinin ibtidai siniflərinə qəbul olunmasına nail olmuşlar" (4).

İnklüziv təhsil – pedaqoji fəaliyyətin ən önəmli və örnək bir sahəsi olub, hamı üçün bərabər səviyyəli təlim-tərbiyə və inkişaf mühitinin yaradılması zəminində başa düşülən anlayış kimi qəbul edilməlidir. Yəni inklüziv təhsil dedikdə, "xüsusi qayğıya ehtiyacı olan (sağlam imkanları məhdud) uşaqların" sosiallaşması və təhsil hüquqlarının yerinə yetirilməsi ilə bağlı inteqrasiyalı təlimə keçidin reallaşdırılmasına yönələn təhsil forması nəzərdə tutulur. İnklüziv təhsil xüsusi kateqoriyadan olan uşaqlar üçün bərabər təhsilalma şəraitinin yaradılmasına, onların sosiallaşmasına xidmət edir.

İnklüziv təhsil formasını korreksion – inkişafetdirici təlim təşkil edir. Şəraiti olan ümumtəhsil məktəblərində sağlamlıq imkanları məhdud uşaqlar üçün (ya ayrıca, ya da adi siniflər tərkibində) korreksion-inkişafetdirici siniflər yaradılır.

Ölkəmizdə "İnklüziv təhsil layihəsi"nin icrasına 2005-ci ildən başlanılıb. Azərbaycan Respublikası Nazirlər Kabinetinin 3 fevral 2005-ci il tarixli qərarına əsasən "Azərbaycan Respublikasında xüsusi qayğıya ehtiyacı olan (sağlamlıq imkanları məhdud) uşaqların təhsilinin təşkili üzrə İnkişaf Proqramı (2005-2009-cu illər)" təsdiq olunub.

Respublika Prezidenti İlham Əliyevin 14 dekabr 2017-ci il tarixli sərəncamı ilə təsdiq olunan "2018-2024-cü illərdə Azərbaycan Respublikasında sağlamlıq imkanları məhdud şəxslər üçün inklüziv təhsilin inkişafı üzrə Dövlət Proqramı"nda məhz bu istiqamətdən həyatımızda humanist münasibətlərə daha nəcib keyfiyyətlərə alışmağın inkişaf strategiyaları öz əksini tapıb.

Məktəbəqədər təhsil müəssisələrində mövcud psixoloji durum mühüm əhəmiyyət kəsb edir. Müəllim kollektivinə mənəvi və metodiki dəstək təlim-tərbiyənin düzgün təşkilində vacib məsələlərdəndir. Bağçada oyuncaqla oynamayan uşaq inkişafdan geri qalır. Ona görə də balacalara oyuncaq və əşyalar vasitəsilə manipulyasiya etməyi öyrətmək lazımdır. Bu proses onlara əşyalarla bağlı əsas hərəkətləri (vurmaq, silkələmək, dartmaq, itələmək və s.) öyrədir. Daha çox "reaksiya" verən (məsələn, səs çıxaran və ya şəklini dəyişən) oyuncaqlar tövsiyə olunur. Oyun prosesində ehtiyac olarsa, pedaqoq yardım edə bilər.

XI əsri "texnologiyalar əsri" adlandıran müəlliflərin fikirlərini doğru hesab edirik. Artıq müasir təhsil inkluzivlikdən uzaq olmaq, texnologiyadan qaçmaq, insanı əhatə edən sistemləri inkar etmək mümkün deyil. Xüsusi ilə də böyük şəhərlərdə siz istəməsəniz də süni intellektin bir hissəsi olursuz. Çünki hal-hazırda insan həyatını texnologiyalarsız təsəvvür etmək qeyri-mümkündür. Qeyd edək ki, İnformasiya cəmiyyətinin inkişafını yeni texnologiyalar olmadan təsəvvür edə bilmərik. Dəyişməyən tək şey dəyişimdir. Burada xüsusilə süni intellekt sistemlərini qeyd etmək yerinə düşərdi. Belə ki, Bernard Marr öz kitabında dünyanı əsaslı dəyişə biləcək 9 texnoloji meqatrendin adını sadalayıb. Bu sadalanan texnoloji meqatrendlərdən dördüncüsü "Süni intellekt sistemlərinin sürətli inkişafı" adlanır. Süni intelekt olması azdı onun sürətli olması vacibdi. Bu anlayış ilk dəfə 1956-cı ildə Rockefeller İnstitutu tərəfindən

maliyyələşdirilən Dartmouth Kollecindəki konfransda Con Makkarti tərəfindən işlədilib. O, bu termini Alan Türinq tərəfindən verilmiş kompüter intellekti anlayışı əsasında irəli sürmüşdür. Buna görə də süni intellekt artıq o dərəcədə inkişaf etmişdir ki, süni intellektlə bağlı elmi-tədqiqat mərkəzləri fəaliyyətə başlayıb. Məsələn nəhəng "Google" şirkətinin Nyu-Yorkda, Torontoda, Londonda və Sürixdə süni intellektlə bağlı elmi-tədqiqat mərkəzləri fəaliyyət göstərir. Bu mərkəzlərin beşinci süni intellekt elmi-tədqiqat mərkəzi isə Pekində fəaliyyətə başlayıb. Süni intellekt insan kimi düşünən və qərar qəbul edə bilən texniki qurğuların yaradılmasını, insan məntiqinin maşınlarda tətbiqini nəzərdə tutur. Həmçinin süni intellekt insanların düşüncə tərzini, onun psixologiyasını, real intellektini modelləşdirən və müasir dövrdə reallaşdırılan süni yaradılmış sistemdir. İnsan tərəfindən yaradılan bu sistem Süni intellektin yaranmasının əsas məqsədi əvvəllər ənənəvi olaraq insanlar tərəfindən həll olunan məsələlərin maşınlar tərəfindən həll olunmasını təmin etmək olmuşdur və bu problem bəşəriyyət qarşısında duran mürəkkəb elmi-praktik problemlərdən biridir.

"Uşaqlar təhsildən məhrum edildikdə cəmiyyət bütövlükdə uğursuzluğa düçar olur. Təhsil hüquqdan daha çox şey ifadə edir. Təhsil həm də vasitədir. İqtisadi böhran, münaqişələr və yoluxucu xəstəliklərlə əhatə olunan dünyada təhsil inkişafa yol, ictimai sağlamlığa təkan və sülhə tərəf atılan addım ola bilər"- Kraliça Rania.

Hər bir uşaq düzgün sosisal mühitdə təhsil alınmalıdı. Müasir dövrdə psixologiya insan haqqında ən mühüm elmlərdən biri kimi diqqəti cəlb edir. Təsadüfü deyildir ki, hazırda insan həyatı və fəaliyyətinin elə bir sahəsi yoxdur ki, psixologiya elmi ora nüfuz etməsin. Xüsusi ilə də insan şəxsiyyətinin inkişafında psixologiyanın danılmaz rolu vardır. Lakin insanın ruhuna toxunmaq üçün genetikasını, ətrafını, ona təsir edən amilləri, özü ilə gətirdiklərini diqqətdə saxlamalıyıq. Bunun üçün süni intellekt hal hazırda bizim köməyimizə çatır. Hətta süni intelekt insanın əhval-ruhiyyəsinin müəyyənləşdirərək onu uyğun video və materialları onun qarşısına çıxara bilir. Əgər biz gələcək nəsillərə heç nə saxlamadan bütün resurslarımızı israf və ya istifadə ediriksə, bu zaman inkişaf dayanıqlı olmur. Dayanıqlı inkişaf insanların düşüncə tərzinin yaxşılaşması (dəyişməsi) və ətraf mühitə psixoloji təmaslarını hörmətlə yanaşmasını birlikdə inkişafıdır. İnsan dayanıqlı inkişafı təmin etmək üçün biz dünyanı daha ədalətli və bərabərhüquqlu cəmiyyətə çevirən ciddi dəyişikliklərin həyata keçirilməsi üzərində birgə işləməliyik. Bunun üçün psixologiya həyatımızda əsas təşkil etməlidir. Biz həmçinin digər insanlara və planetimizə hörmətlə yanaşaraq, şəxsi həyatımızda pozitiv hərəkətlərə təşəbbüs etməklə dayanıqlı inkişafa töhfəmizi verməliyik.

Beləliklə, inkluziv təhsil istər sağlam, istərsə də əlillərin bərabər təhsilalma hüquqlarını təmin edir və bu, cəmiyyətdə sosial bərabərliyin qorunmasına, əlil uşaqların təhsil və başqa xüsusi ehtiyaclarının ödənilməsinə şərait yaratmış olur.

**Problemin aktuallığı.** İnklüziv anlayışının təhsil prosesinin hər pilləsində inkişaf məsələləri düzgün şəkildə tətbiq edilməlidir. Məqalədə problemin bu cəhəti diqqət mərkəzinə çəkilir, yanaşma və təhlillər bu baxımdan təhlilə cəlb olunur.

**Problemin elmi yeniliyi.** Məqalədə müxtəlif təhsil pillələri əsas götürülərək, təhlil olunur.

**Problemin praktik əhəmiyyəti və tətbiqi.** Əldə olunmuş müxtəlif məlumatlardan həm bağçada tərbiyəçi-müəllimlərin, həm də orta məktəbdə müəllimlərin istifadəsi üçün tövsiyə edilir. İşdən əldə edilmiş nəticələrdən dərsliklərin, dərs vəsaitlərinin, elmi-metodik ədəbiyyatın və elmi-tədqiqat işlərinin hazırlanmasında istifadə oluna bilər.

**Ədəbiyyat:**


1. Əliyeva, Ş.Q. Həmidova X.A. Mustafayeva S. İnkişafetdirici, dəstəkləyici və təhlükəsiz mühitin yaradılması / Ş.Q, Əliyeva, X.A. Həmidova, S. Mustafayeva. - Bakı, 2020. – 84 s.
2. http://az.wikipedia.org/wiki/İnkuliziv_təhsil
3. http://www.kelaminfo.az/article/a-6331.html



**E-mail:** humay.safarova@mail.ru



**Redaksiyaya daxil olub:** 21.11.2024.

*UOT 37.015.3*

***Elxan Bəylər oğlu Bəylərov***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun*
*Psixologiya və xüsusi təhsil şöbəsinin müdiri,*
*psixologiya elmləri doktoru*
*https//orcid.org/0000-0002-6799-5511*
*https://doi.org/10.69682/arti.2024.91(6).240-243*

***Raziyə Elxanovna Quliyeva***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun aparıcı elmi işçisi,*
*psixologiya üzrə fəlsəfə doktoru*
*https://orcid.org/0000-0002-4762-6778*

# ŞAGİRDLƏRİN PEŞƏ SEÇİMİNƏ DƏSTƏK PROSESİNDƏ FƏRDİ PSİXOLOJİ XÜSUSİYYƏTLƏRİN NƏZƏRƏ ALINMASI

***Эльхан Бейлер оглы Бейлеров***
*доктор психологических наук*
*заведующий отдела психологии и специального образования*
*Института Образования Азербайджанской Республики*

***Разия Эльхановна Гулиева***
*ведущий научный сотрудник Института Образования Азербайджанской Республики,*
*доктор философии по психологии*

# УЧЕТ ИНДИВИДУАЛЬНЫХ ПСИХОЛОГИЧЕСКИХ ОСОБЕННОСТЕЙ УЧЕНИКОВ В ПРОЦЕССЕ ПОДДЕРЖКИ ПРИ ВЫБОРА ПРОФЕССИИ

***Elkhan Baylar Baylarov***
*head of the department of Psychology and special education at*
*the Institute of Education of the Republic of Azerbaijan,*
*doctor of psychology*

***Raziya Elkhanovna Guliyeva***
*leading researcher at the Institute of Education of the Republic of Azerbaijan,*
*doctor of philosophy in psychology*

# CONSIDERATION OF INDIVIDUAL PSYCHOLOGICAL TRAITS IN THE PROCESS OF SUPPORTING CAREER CHOICE OF STUDENTS

**Xülasə**. Məqalədə şagirdlərin peşə seçiminə dəstək prosesində fərdi psixoloji xüsusiyyətlərin nəzərə alınması, müəllimlərin, məktəb psixoloqlarının və valideynlərin rolunun araşdırılması məqsəd qoyulmuşdur. Məqalə, bu şəxslərin şagirdlərin peşə seçimi zamanı diqqət etməli olduğu məsələləri təhlil edir. Bu məqalənin məqsədi, şagirdlərə peşə seçimində dəstək vermək üçün müəllim, məktəb psixoloqu və valideynlərin fəaliyyətinin səmərəliliyinin artırılmasıdır.
***Açar sözlər:*** *peşəseçimi, şagirdlər, məktəb psixoloqu, peşələr, valideynlər, müəllimlər*

**Аннотация.** В статье рассматривается роль учителей, школьных психологов и родителей в процессе поддержки учащихся при выборе профессии с учетом индивидуальных психологических особенностей. В статье анализируются вопросы, на которые этим людям следует обращать внимание в ходе данного процесса. Цель данной статьи — повышение эффективности деятельности учителей, школьных психологов и родителей в поддержке учащихся при выборе профессии.

***Ключевые слова:*** *выбор профессии, учащиеся, школьный психолог, профессии, родители, учителя*

**Abstract.** In the article, the role of teachers, school psychologists, and parents in the process of supporting students in career choice, with consideration of individual psychological traits, is explored. The article analyzes the issues that these individuals need to pay attention to during this process. The purpose of this article is to enhance the effectiveness of teachers, school psychologists, and parents in supporting students in their career choices.

***Keywords:*** *Career choice, students, school psychologist, professions, parents, teachers.*

Müasir dövrün dinamizmi və çağırışları, bazar iqtisadiyyatına keçid, ölkəmizdə baş verən sosial-iqtisadi dəyişiklər, gənc nəslin məşğulluq məsələləri, fərdin peşə fəaliyyətində öz müqəddəratını təyin etməsi, müəyyən qabiliyyət və meyllərə uyğun olaraq adekvat peşə seçimi, peşədə şəxsi imkanların tətbiqi məsələlərinin həllinə yeni yanaşma tələb edir.

Məsələnin aktuallığını nəzərə alaraq, Psixologiya və xüsusi təhsil şöbəsi rəhbərliyin tapşırığı əsasında "Şagirdlərin peşə seçiminə dəstək prosesində fərdi psixoloji xüsusiyyətlərin nəzərə alınması" mövzusunda tədqiqat aparılmış və bu məqalədə alınan nəticələrdən müəyyən maraq kəsb edən məsələlər şərh ediləcəkdir. Tədqiqatla bağlı keçirilən sorğularda 190 müəllim, 454 valideyn, 824 şagird və 6 psixoloq iştirak etmişdir.

Tədqiqat çərçivəsində keçirilən sorğular aşağıdakıları müəyyən etməyə imkan vermişdir: "Məktəbi bitirdikdən sonra nə planlaşdırırsınız? (övladınızın gələcək təhsilini necə görürsünüz?)" sualı həm valideynlərə, həm də şagirdlərə verilmişdir. "Ali təhsil almaq" cavab variantı valideynlərin 84%, şagirdlərin isə 79%-i tərəfindən seçilmişdir, yəni hər iki qrup respondent ali təhsilə üstünlük vermişlər. Orta ixtisas təhsilinə şagirdlərin və valideynlərin meyli müvafiq olaraq 10% və 5% nisbətində təşkil edir. "Digər" variantını şagirdlərdən 21%, valideynlərdən isə 2%-i seçib, bu da şagirdlərin peşə seçimində daha çevik olmalarından xəbər verir.

"Peşə seçiminə hansı amillər təsir edir?" sualına cavab verərkən, şagirdlərin 81%-i və müəllimlərin 74%-i peşə seçimində əsas yeri şəxsi marağa ayırmışlar. Bu onu göstərir ki, peşə seçimində fərdi potensial və şəxsi üstünlüklər böyük rol oynayır. Müəllimlərin 56%-i peşə seçimində valideynlərin rolunu yüksək qiymətləndiriblər, şagirdlərin isə 35%-i şəxsi maraqları daha üstün tutmuşlar. Dost və tanışların peşə seçiminə təsirini həm şagirdlər (9%), həm müəllimlər (11%), demək olar ki, eyni qiymətləndiriblər.

Şagirdlərin qərarlarında həmyaşıdları və sosial mühit müəyyən rol oynayır. Sosial qarşılıqlı əlaqələrin və dost dairəsinin şagirdlərin peşə seçimlərinə necə təsir etdiyi nəzərə alınmalıdır.

Növbəti sualda şagirdlər məktəbdə peşə seçiminə dair psixoloq tərəfindən aparılan işə, psixoloqlar isə həmin bu sahədə gördüyü işə münasibət bildirməliydilər. Ümumi qeyd edək ki, psixoloqlar öz fəaliyyətini daha yüksək qiymətləndirdikləri halda, şagirdlər onların fəaliyyətini daha aşağı qiymətləndirmişlər. Belə ki, şagirdlər peşələrlə bağlı psixoloqun apardığı maarifləndirmə işini 35% kimi, psixoloqlar isə 67% kimi qiymətləndiriblər. Ailələrlə işi şagirdlər 15%, psixoloqlar isə 50% qənaətbəxş hesab edirlər – rəqəmlər, demək olar ki, müqayisə edilməzdir. Psixoloqlar şagirdlərin diaqnostikası və konsultasiyaların aparılmasını 33% kimi göstərdikləri halda, şagirdlər psixoloqun bu işini iki dəfə az rəqəmlərlə bildirmişlər. Şagirdlər informasiyaya və müxtəlif amillərə daha çox önəm verərkən, psixoloqlar məlumat və ailə əməkdaşlığına daha çox önəm verirlər.

“Peşə seçiminə təsir edən amillər” sualı şagirdlərə və valideynlərə verilmişdir və çox fərqlənən cavablar alınmışdır. Şagirdlərin peşə seçimində əsas yeri yüksək gəlir və karyera

yüksəlişi imkanlarına müvafiq olaraq 59% və 47%-lə ayırd ediblərsə, valideynlərin bu variantlara müvafiq olaraq 28% və 27% nisbətindədir. Şəxsi motivasiyanın peşə seçiminə təsirini şagirdlər və valideynlər çox fərqli qiymətləndirmişlər. Belə ki, 27% şagirdlər və 69% valideynlər cavablarda şəxsi motivasiyanı peşə seçimi zamanı rəhbər tutmuşlar. Peşənin cəmiyyətdə yüksək nüfuzu 20% şagird və 16% valideyn üçün əhəmiyyətlidir.

Şagirdlər və valideynlər arasında qavrayışdakı fərqlər onların peşə seçimində hansı amillərin daha vacib olduğuna dair fərqli baxışlara malik olduğunu göstərir. Şagirdlər daha çox maddi təminat və karyera inkişafına diqqət yetirərkən, valideynlər uşaqlarının şəxsi motivasiyasına və xoşbəxtliyinə daha çox diqqət yetirirlər.

“Peşə seçimində əsas motivasiya nədir?” sualı şagirdlərə, müəllimlərə, valideynlərə və psixoloqlara verilmişdir. Cavablardan belə nəticəyə gəlmək olar ki, peşə seçimində əsas hərəkətverici motivasiya peşədə uğur qazanmaq istəyidir. Şagirdlərin 42%-i, valideynlərin 30%-i, psixoloqların 67%-i və müəllimlərin 41%-i bu variantı seçmişdir. Şagirdlərin 16%-i peşə seçərkən cəmiyyətə faydalı olmağı nəzərdə tuturlar. Müəllimlərin isə şagirdlərdən gözləntiləri daha yüksəkdir - onların 27%-i ümid edir ki, şagirdlər peşə seçərkən cəmiyyətə faydalı olmağı da nəzərdən qaçırmırlar.

“Fərdi xüsusiyyətlərə uyğun səmərəli fəaliyyət üçün hansı iş forması daha uyğundur?” sualı şagirdlərə və onların valideynlərinə verilmişdir. Şagirdlərin 42%-i və valideynlərin 34%-i fərdi iş formasına üstünlük vermişdir. Bu, müstəqil işləməyin və fərdi məsuliyyəti təşviq etməyin vacibliyini göstərir. Şagirdlərin 30%-i və valideynlərin 43%-i kollektiv işə müsbət yanaşmışlar. Qrupda iş və cütlükdə iş eyni dərəcədə 12% şagirdə cəlbedici görünür. Şagirdlər arasında daha az üstünlük verilsə də, valideynlər daha yüksək nisbətdə kollektiv işi dəstəkləyirlər. Bu, valideynlərin əməkdaşlıq və sosial bacarıqların inkişafına verdiyi əhəmiyyəti əks etdirir. “Cütlükdə iş” həm şagirdlər, həm də valideynlər tərəfindən aşağı nisbətdə üstünlük verilir. Bu onu göstərir ki, ikili iş üsulu effektivlik və səmərəlilik baxımından sual altındadır.

Şagirdlər, valideynlər və müəllimlər peşədə uğurlu olmaqda səmərəli ünsiyyətin rolunu yüksək qiymətləndirdikləri halda (müvafiq olaraq 55%, 52% və 61%), psixoloqlar bu məsələyə ümumiyyətlə münasibət bildirməmişlər. Əksinə, əgər səmərəli ünsiyyətin rolunu olduqca vacib kimi şagirdlərin 21%-i, valideynlərin və müəllimlərin 19%-i qeyd etmişlərsə, bu cavab variantını psixoloqlar 100% kimi göstərmişlər. Səmərəli ünsiyyətin rolunu qismən vacib hesab etməkdə şagirdlər, valideynlər və müəllimlər həmrəy olduğu halda (müvafiq olaraq 13%, 18%, 14%), psixoloqlar fərqlənib və bu cavabı 0%-lə qeyd ediblər.

**Nəticə.** Maddi təminat və karyera perspektivləri şagirdlərin peşə seçimində əsas rol oynayır, lakin valideynlər daha çox şəxsi motivasiya və övladlarının xoşbəxtliyinə diqqət yetirirlər.

Məktəb psixoloqları şagirdlərə peşə seçimində dəstəklə bağlı öz fəaliyyətlərini yüksək qiymətləndirsələr də, lakin bu fəaliyyət şagirdlər tərəfindən qənaətbəxş hesab edilmir. Bu, peşə seçiminə dair maarifləndirməni və ailələrlə işin təkmilləşdirilməsinin vacibliyini göstərir.

Müəllimlər və valideynlər peşə seçimində motivasiyaedici amil kimi böyük əhəmiyyətə malikdirlər, lakin onların yanaşmaları arasında bəzi ziddiyyətlərin mövcudluğu şagirdlərin seçimini mürəkkəbləşdirir.

Psixoloqlarının peşə seçimi ilə bağlı maarifləndirmə işinin aparılması və şagirdlərə fərdi yanaşmanın təşviqi vacibdir.

Şagirdlərin maraq və qabiliyyətlərinin müəyyənləşdirilməsi üçün müasir diaqnostik vasitələrin tətbiqi və bütün iştirakçıların bu prosesdə əməkdaşlığı vacibdir.

**Problemin aktuallığı** aşağıdakı hüquqi-normativ sənədlərdə öz əksini tapmışdır: “Təhsil haqqında” Azərbaycan Respublikasının Qanununa əsasən, ümumi orta təhsilin məqsədləri sırasında təhsilalanlara öz gələcək həyat yolunu və fəaliyyət istiqamətlərini müəyyənləşdirmək, müstəqil öyrənmə və qərar qəbuletmə bacarığını, peşə seçiminə və əmək fəaliyyətinə hazırlığını təmin etmək də yer alır. Peşəyönümü xidmətinin vacibliyi “Peşə təhsili haqqında” qanunda da təsbit olunmuşdur. Eləcə də, Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2020-ci il 12 may tarixli 167 nömrəli qərarı ilə “Ümumi təhsil müəssisələrində peşəyönümü xidmətinin həyata keçirilməsi qaydası” təsdiq olunmuşdur.

**Problemin yeniliyi**. Tədqiqatda şagirdlərin peşə seçiminə dəstək prosesində fərdi psixoloji xüsusiyyətlərin nəzərə alınması ilə bağlı mövcud problemlər araşdırılmış, onların aradan qaldırılması ilə bağlı təklif və tövsiyələr verilmişdir. Xüsusilə, şagirdlərin şəxsi maraqları, psixoloji potensialı, və sosial mühitin təsiri, peşə seçiminin daha səmərəli və məqsədli şəkildə aparılmasını təmin edə bilər. Bu tədqiqat, həmçinin, psixoloqların, müəllimlərin və valideynlərin şagirdlərə düzgün peşə yönümü vermələrinə kömək edəcək praktiki yanaşmalar təqdim edir.

**Problemin praktik əhəmiyyəti.** Tədqiqatın nəticələrindən şagirdlərin peşə seçiminə dəstək prosesində valideynlər, müəllimlər və məktəb psixoloqları düzgün seçim formalaşdırmaq və şagirdlərə daha məqsədyönlü peşə yönümü vermək üçün faydalana bilərlər.

**Ədəbiyyat:**


1. Бондарев В.П. Выбор профессии /В.П. Бондарев. –М.: Знание, 1989. – С. 93–97.
2. Гриншпун С.С. Организация профориентации школьников в Великобритании / С.С. Гриншпун // Педагогика. – 2005. – № 7. – С. 100–105.
3. Dehaas J. Students like diploma-degree option at Guelph-Humber // The Maclean’s Guide to Universities. August 2014. Available at: http://www.macleans.ca/education/university. (Translated from English) 1
4. Shamsutdinova I. G., Pavlova O. I. Professionalnaja orientacija uchashhihsja vo Francii. [Professional orientation teaching in France]. Pedagogika. [Pedagogy]. 2007. № 4. P. 101–111. (In Russian)



**E-mail:** e.beylerov@arti.edu.az



**Redaksiyaya daxil olub:** 09,12.2024.

UOT 37.015.3

**_Elxan Bəylər oğlu Bəylərov_**
_Azərbaycan Respublikasının Təhsil İnstitutunun_
_Psixologiya və xüsusi təhsil şöbəsinin müdiri,_
_psixologiya elmləri doktoru_
_https//orcid.org/0000-0002-6799-5511_
_https://doi.org/10.69682/arti.2024.91(6).244-247_

**_Raziyə Elxanovna Quliyeva_**
_Azərbaycan Respublikasının Təhsil İnstitutunun aparıcı elmi işçisi,_
_psixologiya üzrə fəlsəfə doktoru_
_https://orcid.org/0000-0002-4762-6778_

**_Ayna Abuş qızı Hümbətova_**
_Azərbaycan Respublikasının Təhsil İnstitutunun_
_aparıcı elmi işçisi, psixologiya üzrə fəlsəfə doktoru_
_https://orcid.org/0000-0001-8038-8962_

# ŞAGİRD ASPEKTİNDƏ NEYROELM ƏSASLI TƏHSİL

**_Эльхан Бейлер оглы Бейлеров_**
_заведующий отдела психологии и специального образования_
_Института Образования Азербайджанской Республики,_
_доктор психологических наук_

**_Разия Эльхановна Кулиева_**
_ведущий научный сотрудник Института Образования Азербайджанской Республики,_
_доктор философии по психологии_

**_Айна Абуш гызы Гумбатова_**
_ведущий научный сотрудник Института Образования Азербайджанской Республики,_
_доктор философии по психологии_

# ОБРАЗОВАНИЕ НА ОСНОВЕ НЕЙРОНАУКИ С ТОЧКИ ЗРЕНИЯ УЧАЩИХСЯ

**_Elkhan Baylar Baylarov_**
_head of the department of Psychology and special education_
_at the Institute of Education of the Republic of Azerbaijan, doctor of psychological sciences_

**_Raziya Elkhanovna Guliyeva_**
_leading researcher at the Institute of Education of the Republic of Azerbaijan,_
_doctor of philosophy in psychology_

**_Ayna Abush Humbatova_**
_leading researcher at the Institute of Education of the Republic of Azerbaijan,_
_doctor of philosophy in psychology_

# NEUROSCIENCE-BASED EDUCATION FROM THE STUDENT PERSPECTIVE

**Xülasə.** Məqalədə təhsildə neyroelm əsaslı yanaşmaların şagirdlərin öyrənmə təcrübələrinə təsiri araşdırılmışdır. Tədqiqatın əsas məqsədi, şagirdlərin beyin fəaliyyətinin öyrənmə prosesindəki rolu, psixoloji amillərin təsiri və bu yanaşmaların səmərəliliyini müəyyən etməkdir. Bu məqsədlə sorğu keçirilmiş və şagirdlərin öyrənmə vərdişləri, emosional vəziyyətləri, yuxu və stress kimi faktorlarla bağlı rəyləri

toplanmışdır. Təhlillər göstərmişdir ki, şagirdlər fərdi öyrənmə tələblərini qarşılayan, beynin funksiyalarını nəzərə alan metodlara üstünlük verirlər.
***Açar sözlər:*** *neyroelm, təhsil, öyrənmə prosesi, beyin fəaliyyəti, emosional rifah, koqnitiv inkişaf, psixoloji amillər, stress, fərdi öyrənmə ehtiyacları.*

**Аннотация:** Статья исследует влияние нейронаучных подходов в образовании на учебный опыт учащихся. Основная цель исследования — изучить роль активности мозга в процессе обучения, влияние психологических факторов и эффективность таких подходов. С этой целью был проведен опрос и собраны отзывы учебных навыках учащихся, их эмоциональном состоянии, и о таких факторах как сон и стресс. Анализ показывает, что учащиеся предпочитают методы, учитывающие индивидуальные потребности и функции мозга.
***Ключевые слова:*** *нейронаука, образование, учебный процесс, мозговая деятельность, эмоциональное благополучие, когнитивное развитие, психологические факторы, стресс, индивидуальные потребности в обучении.*

**Summary.** The article explores the impact of neuroscience-based approaches in education on students' learning experiences. The primary objective of the study is to examine the role of brain activity in the learning process, the influence of psychological factors, and the effectiveness of these approaches. A survey was conducted to gather students' opinions on learning habits, emotional states, sleep, and stress. The analysis reveals that students prefer methods that address individual learning needs and consider brain functions.
***Keywords:*** *neuroscience, education, learning process, brain activity, emotional well-being, cognitive development, psychological factors, stress, individual learning needs.*

Təhsil müasir dünyada biliklərin əldə edilməsi və şəxsiyyətin potensialının üzə çıxarılması üçün əsas vasitələrdən biridir. Təlim prosesində əldə edilən məlumatların qavranılması və yadda saxlanılması üçün beynin rolu əvəzsizdir. Son dövrlərdə neyroelmlə bağlı tədqiqatlar göstərir ki, beynin funksiyaları, xüsusilə onun müxtəlif hissələrinin fəaliyyəti, öyrənmə prosesinin keyfiyyətinə birbaşa təsir göstərir. Bu baxımdan, təhsildə neyroelmə dair araşdırmaların tətbiqi, şagirdlərin öyrənmə vərdişlərinin mahiyyətini daha yaxşı anlamağa və onların təlim mühitini təkmilləşdirməyə imkan yaradır. Bu məqalənin məqsədi, təhsildə neyroelmin əhəmiyyətini, şagirdlərin təsəvvürlərini və fərdi öyrənmə ehtiyaclarını nəzərə alaraq təlim prosesini optimallaşdırma yollarını araşdırmaqdır.

Tədqiqat, müxtəlif yaş (12-17 yaş) qrupundan olan şagirdlər arasında sorğu keçirilməklə həyata keçirilmişdir. Respondentlərin seçilməsi zamanı müxtəlif siniflərdən və məktəblərdən (Bakı şəhəri 96, 129, 7, 18, 29 nömrəli məktəblərdə və İ. Əfəndiyev adına Elitar gimnaziya) olan şagirdlər iştirak etmişdir ki, bu da məlumatların müxtəlifliyini təmin etmişdir.

Tədqiqatda kəmiyyət (statistik təhlillər) metodları tətbiq olunmuşdur. Kəmiyyət metodu əldə edilən məlumatların strukturlaşdırılmasına və ümumiləşdirilməsinə kömək etmişdir.

Neyroelmin təhsil təcrübələrinə inteqrasiyası psixi prosesləri tənzimləyən əsas sinir mexanizmlərini dərk etməklə öyrənmə prosesinin keyfiyyətini artırmaq məqsədi daşıyır. Neyroelm və təhsilin qarşılıqlı əlaqəsi müxtəlif öyrənmə ehtiyaclarına cavab verən səmərəli təlim strategiyalarının hazırlanması üçün çox əhəmiyyətlidir.

Neyroelmə əsaslanan təhsilin əsas cəhətlərindən biri onun şagirdləri ən yaxşı öyrənmə metodları ilə məlumatlandırmaqdır. Febrialismanto vurğulayır ki, neyroelm müəllimlərə ən təsirli təlim strategiyalarını müəyyən etməkdə rəhbərlik edə bilər və bununla da şagirdlərə öyrənmə mühitlərindən daha səmərəli istifadə etməyə imkan verir (2).

Təlim prosesində problem əsaslı öyrənmənin tətbiqi şagirdlərin fəallığını və mürəkkəb anlayışları başa düşməsini təmin etdiyi müəyyən edilmişdir. Quillermo və digərləri vurğulayın ki, problem əsaslı öyrənmə şagirdlərin mənimsəmə prosesində fəal iştirak etməyə təşviq edir və bu məlumatın daha yaxşı yadda saxlanmasına, başa düşülməsinə gətirib çıxaran neyroelm prinsipləri ilə dəstəklənir (4). Bu, neyroelm əsaslı təhsildə fəal təlim metodlarının vasitəsilə təhsil təcrübəsini əhəmiyyətli dərəcədə yaxşılaşdıra biləcəyini qeyd edən Ruisoto və Juanesin gəldiyi nəticələr ilə üst-üstə düşür (7). İnteraktiv təlim mühiti yaratmaqla

pedaqoqlar şagirdlərə tənqidi düşünmə bacarıqlarını inkişaf etdirməyə və mövzunu daha dərindən dərk etməyə kömək edə bilər.

Öyrənmədə emosional və sosial amillərin rolunu da nəzərdən qaçırmaq olmaz. Qoldberq şagirdlərin ömür boyu öyrənənlər kimi inkişafını dəstəkləmək üçün emosional cəhətdən təhlükəsiz və koqnitiv cəhətdən mürəkkəbliyin saxlanmasının vacibliyini qeyd etmişdir (3). Təhsilə bu vahid yanaşma emosional rifahın koqnitiv performansla sıx bağlı olduğunu və şagirdlərin özlərini təhlükəsiz hiss etdiyi və dəstəkləyici mühitlərdə inkişaf etdiyini qəbul edir. Neyroelmin təhsil təcrübələrinə inteqrasiyası müəllimlərə belə mühitlər yaratmağa kömək edə bilər. Nəticədə bu, şagirdlərin akademik və şəxsi inkişafına fayda verəcəkdir.

Bundan əlavə, bu təhsil strategiyalarının uğurla həyata keçirilməsi üçün müəllimlərin neyroelmlə bağlı yeniliklərdən xəbərdar olması və maariflənməsi onların peşəkar inkişafında vacib amildir. Haçem və digərləri, pedaqoqların müxtəlif şagird populyasiyalarını effektiv şəkildə dəstəkləmək üçün beyin inkişafı və fəaliyyətinə dair biliklərlə təmin edilməli olduğunu vurğulayırlar (6). Müəllimlərin neyroelm haqqında biliklərini artırmaqla, onlar öz təlim metodlarını şagirdlərinin müxtəlif ehtiyaclarını ödəmək üçün daha yaxşı uyğunlaşdıra və bununla da ümumi təhsil nəticələrini yaxşılaşdıra bilərlər.

Öyrənmə prosesinin səmərəliliyi bir çox amillərin təsiri altında formalaşır. Bu tədqiqatda əldə edilən nəticələr göstərir ki, şagirdlərin əksəriyyəti beynin hissələrinin öyrənmə prosesində mühüm rol oynadığını qəbul edir. Sorğuda iştirak edən şagirdlərin 58%-i beynin müxtəlif hissələrinin funksional fəaliyyətinin öyrənməni səmərəli etdiyini düşünür, lakin müəyyən bir qrup əlavə məlumatın əldə edilməsinin vacibliyini qeyd edib. Bu, insanların öyrənmə zamanı beyinin iş mexanizmləri ilə bağlı maarifləndirməyə ehtiyacın olduğunu göstərir.

Yuxu ehtiyacının ödənilməsi öyrənmə prosesindəki əhəmiyyəti faktorlardan biridir. Şagirdlərin 74%-i yuxu ehtiyacının ödənilməsinin öyrənməni artırdığını qəbul edib. Bu, düzgün yuxu rejiminin təlim prosesində nəzərə alınmasının vacibliyini vurğulayır. Stress isə öyrənmə üçün ən böyük maneələrdən biridir. Sorğu nəticələrinə görə, iştirakçıların 73%-i stressin öyrənməni çətinləşdirdiyini bildirib. Bu göstəricilər emosional sağlamlıq və stressin idarə edilməsi mövzusunda şagirdlər və müəllimlər üçün dəstək proqramlarının hazırlanmasının zəruriliyini ortaya qoyur.

Motivasiya və emosional vəziyyət də öyrənmə prosesinin mühüm aspektlərindəndir. Şagirdlərin 77%-i motivasiyanın öyrənməyə müsbət təsir etdiyini qeyd edib. Emosional vəziyyətin təsirinə gəldikdə isə, 66%-i yüksək əhval-ruhiyyənin daha yaxşı öyrənməyə səbəb olduğunu bildirib. Bu nəticələr göstərir ki, təlim prosesində müsbət emosiyaların və şagirdlərin motivasiyasını artıran metodların istifadəsi çox əhəmiyyətlidir.

Ümumilikdə, əldə edilən nəticələr göstərir ki, öyrənmə prosesinin səmərəliliyini artırmaq üçün düzgün yuxu rejimi, emosional balans və motivasiyanı dəstəkləyən tədris mühitinin yaradılması vacibdir. Stressin azaldılması və beyinin iş prinsipləri ilə bağlı maarifləndirmə də bu prosesdə əhəmiyyətli rol oynaya bilər.

Eyni zamanda şagirdlərin 70%-i dərsdə müxtəlif öyrənmə üslublarının nəzərə alınmasının vacib olduğunu bildirib. Bu, fərdi yanaşmaların və interaktiv metodların tətbiqinin, şagirdlərin tədris materialını daha yaxşı mənimsəməsinə kömək etdiyini göstərir. Sorğuda iştirak edənlərin yalnız 42%-i 45 dəqiqəlik dərs müddətinin diqqəti cəmləmək üçün uyğun olduğunu düşünüb. Əksəriyyət isə daha qısa və dinamik dərs strukturlarının daha səmərəli olacağı qənaətindədir. Bu nəticə dərs müddətinin şagirdlərin diqqət və motivasiya səviyyəsinə uyğun tənzimlənməsi üçün vacibdir. 67%-i şagird eyni anda bir neçə işin yerinə yetirilməsinin öyrənməni çətinləşdirdiyini qeyd edib. Bu, fokuslanmanın və təlim mühitində sadə, konkret məqsədlərin önəmini göstərir.

Sorğu iştirakçıları arasında öyrənmə üslubları ilə bağlı maraqlı bir tendensiya ortaya çıxıb. Şagirdlərin 35%-i vizual öyrənməni, 37%-i isə qarışıq metodları daha effektiv hesab edir. Bu, vizual və müxtəlif üsulların birləşdirildiyi tədris proqramlarının öyrənmə nəticələrini yaxşılaşdıra biləcəyi qənaətinə gəlməyimizə əsas verir.

**Nəticə və təkliflər.** Sorğudan alınan nəticələrə əsasən qeyd edə bilərik ki, öyrənmə prosesinin keyfiyyətini artırmaq üçün yuxu rejimi, emosional balans və motivasiya kimi əsas faktorların nəzərə alınması zəruridir. Stress öyrənməyə əhəmiyyətli dərəcədə mənfi təsir göstərir, bu da stressin idarə edilməsi

proqramlarının hazırlanması və tətbiqini zəruri edir. Bundan əlavə, fərdi öyrənmə üslublarına uyğun təlim proqramlarının və daha dinamik dərs strukturlarının tətbiqi şagirdlərin diqqət, motivasiya səviyyəsinin artırılmasına kömək edə bilər. Vizual və qarışıq öyrənmə üslublarının daha faydalı qəbul edilməsi isə təlim proqramlarının hazırlanmasında interaktiv və çoxşaxəli yanaşmaların əhəmiyyətini ön plana çıxarır.

Belə ki, bu problemləri həll etmək üçün müxtəlif təkliflər irəli sürətlə bilər. Beyin fəaliyyətinin öyrənmə prosesinə təsiri ilə bağlı maarifləndirmə proqramlarının həyata keçirilməsi şagird və müəllimlər üçün əhəmiyyətlidir. Təhsil sistemində stressin idarə olunması üçün xüsusi proqramların tətbiqi, müəllimlərin motivasiyanı artıran tədbirlərin həyata keçirilməsi və fərdi yanaşmalara əsaslanan tədris proqramlarının hazırlanması təklif olunur. Eyni zamanda, müəllimlərin, psixoloqların neyroelm sahəsində biliklərini artırmaq üçün ixtisasartırma kursları təşkil edilməlidir.

**Problemin aktuallığı.** Öyrənmə prosesinin faydalılığını artırmaq təhsil sisteminin prioritetlərindən hesab edilir. Beyin fəaliyyətinə dair neyroelmlə bağlı araşdırmaların təhsilə inteqrasiyası, şagirdlərin fərdi öyrənmə ehtiyaclarını daha yaxşı başa düşmək və onlara uyğun təlim proqramları hazırlamaq üçün geniş imkanlar yaradır. Son dövrlərdə beynin funksiyalarının öyrənilməsi, təhsildə emosional və sosial amillərin rolunun müəyyən edilməsi, həmçinin fərdi öyrənmə üslublarına diqqət artmaqdadır. Təhsil mühitinin şagirdlərin emosional rifahını, motivasiyasını və koqnitiv bacarıqlarını dəstəkləməsi zərurəti bu tədqiqat sahəsini daha da aktuallaşdırır.

**Problemin yeniliyi.** Tədqiqatda əldə edilən nəticələr göstərir ki, təlim prosesində müasir yanaşmaların tətbiqi, məsələn, problem əsaslı öyrənmə, fərdi öyrənmə üslublarına uyğunlaşma və emosional təhlükəsiz mühitin yaradılması, ənənəvi metodlardan kənara çıxaraq yeni imkanlar açır. Bundan əlavə, yuxu rejimi, stressin və motivasiyanın öyrənməyə təsirinin statistik təhlillərlə təsdiqlənməsi problemin yeniliyini daha da vurğulayır.

**Problemin praktik əhəmiyyəti.** Neyroelmin təhsilə tətbiqi şagirdlərin öyrənmə qabiliyyətini artırmaq və akademik nəticələri yaxşılaşdırmaq üçün səmərəli metodların hazırlanmasına şərait yaradır. Müəllimlər, psixoloqlar, valideynlər və məktəb heyəti bu biliklər vasitəsilə şagirdlərin fərdi ehtiyaclarına uyğunlaşa bilər və emosional balansı dəstəkləyən təlim mühiti yarada bilərlər. Bu yanaşma həm təhsilin keyfiyyətini yüksəldəcək, həm də şagirdlərin həyat keyfiyyətinə müsbət təsir göstərəcəkdir.

**Ədəbiyyat:**


1. Antonopoulou, H., Halkiopoulos, C., & Gkintoni, E. (2023). Educational neuroscience and its contribution to math learning. Technium Education and Humanities, 4, 86-95. https://doi.org/10.47577/teh.v4i.8237
2. Faizah, U. (2023). Phenomenology studies: college student experience in early childhood learning based on neuroscience studies. Wisdom Jurnal Pendidikan Anak Usia Dini, 4(2). https://doi.org/10.21154/wisdom.v4i2.7442
3. Febrialismanto, F. (2023). International journal of neuroscience-based learning in schools: a bibliometric analysis. Proceedings Series on Social Sciences & Humanities, 12, 255-262. https://doi.org/10.30595/pssh.v12i.802
4. Goldberg, H. (2022). Growing brains, nurturing minds—neuroscience as an educational tool to support students' development as life-long learners. Brain Sciences, 12(12), 1622. https://doi.org/10.3390/brainsci12121622
5. Guillermo, J., Romero, A., Sandoval, R., Espinoza, J., & Arenas, R. (2022). Problem-based learning and its relationship to neuroscience in undergraduate university students. Journal of Pharmaceutical Negative Results, 13(4), 645-651. https://doi.org/10.47750/pnr.2022.13.04.086
6. Guillermo, J., Romero, A., Sandoval, R., Espinoza, J., & Arenas, R. (2022). Problem-based learning and its relationship to neuroscience in undergraduate university students. Journal of Pharmaceutical Negative Results, 13(4), 645-651. https://doi.org/10.47750/pnr.2022.13.04.086
7. Hachem, M., Daignault, K., & Wilcox, G. (2022). Impact of educational neuroscience teacher professional development: perceptions of school personnel. Frontiers in Education, 7. https://doi.org/10.3389/feduc.2022.912827
8. Ruisoto, P. and Juanes, J. (2019). Fostering student's engagement and active learning in neuroscience education. Journal of Medical Systems, 43(3). https://doi.org/10.1007/s10916-019-1192-x



**E-mail:** e.beylerov@arti.edu.az



**Redaksiyaya daxil olub:** 10.12.2024.

*UOT 159.9.*

***Limunət Şəfi qızı Əmrahlı***
*psixologiya üzrə fəlsəfə doktoru, dosent*
*https://orcid.org/0009-0003-3152-873X*
*https://doi.org/10.69682/arti.2024.91(6).248-255*

## YENİYETMƏLƏRİN KOQNİTİV FƏALİYYƏTİNDƏ PSİXOLİNQVİSTİK SİSTEMİN ROLU

***Лимунет Шафи гызы Амрахлы***
*доктор философии по психологии, доцент*

## РОЛЬ ПСИХОЛИНГВИСТИЧЕСКОЙ СИСТЕМЫ В КОГНИТИВНОЙ ДЕЯТЕЛЬНОСТИ ПОДРОСТКОВ

***Limunat Shafi Amrahli***
*doktor of philosophy in psychology, associate professor*

## THE ROLE OF THE PSYCHOLINGUISTICS SYSTEM IN THE COGNITIVE ACTIVITY OF ADOLESCENTS

**Xülasə.** Məqalədə göstərilir ki, təlim prosesində yeniyetmələrin koqnitiv fəaliyyətinin daha yaxşı formalaşmasında onların psixolinqvistik sistemi mühüm əhəmiyyət daşıyır. Bu sistem, həm yeniyetmələrin öz fəaliyyətini fikirdə qurmaq, həm də onu mərhələlər üzrə icrası prosesində iştirak edir. Bu amil nəzərə alınaraq məqalədə qeyd edilir ki, yeniyetmələrin koqnitiv fəaliyyətində psixolinqvistik sistemin rolunu artırmaq üçün alqoritmli tapşırıqlara geniş yer verilməlidir. Bu zaman yeniyetmələr alqoritmlərin köməyindən istifadə edərək həm psixolinqvisitk sistemi, həm də koqnitiv fəaliyyəti fəallaşdıra bilirlər. Həmçinin onlarda dil duyumunun və d. bu kimi imkanların formalaşdırılması da anlama və mənimsəmə bacarıqlarını, onlar da öz növbəsində koqnitiv fəallığı artırır.
***Açar sözlər:*** *yeniyetmələr, koqnitiv fəaliyyət, psixolinqvistik sistem, nitq, dil kodları, dilduyumu, slenq, alqoritm, intellektual labillik.*

**Аннотация.** В статье показано, что для лучшего формирования познавательной деятельности подростков в процессе обучения важное значение имеет их психолингвистическая система. Эта система участвует как в процессе обдумывания собственной деятельности подростками, так и в ее поэтапной реализации. Учитывая этот фактор, в статье утверждается, что для повышения роли психолингвистической системы в познавательной деятельности подростков большое место следует уделять алгоритмическим задачам. В это время подростки могут с помощью алгоритмов активировать как психолингвистическую систему, так и познавательную деятельность. Кроме того, у них есть языковое восприятие и и следовательно формирование таких возможностей также увеличивает навыки понимания и усвоения, а они, в свою очередь, повышают познавательную активность.
***Ключевые слова:*** *подростки, когнитивная деятельность, психолингвистическая система, речь, языковые коды, языковое восприятие, сленг, алгоритм, интеллектуальная лабильность*

**Abstract.** The article shows that their psycholinguistic system is important in the better formation of cognitive activity of teenagers in the training process. This system is involved in the process of both thinking of the teenagers' own activity and its implementation by stages. Taking this factor into account, the article states that in order to increase the role of the psycholinguistic system in the cognitive activity of teenagers, a large place should be given to algorithmic tasks. At this time, young people can activate both the psycholinguistic system and cognitive activity using the help of algorithms. Also, they have language perception and d. The formation of such opportunities also increases understanding and mastering skills, and they, in turn, increase cognitive activity.

***Keywords:*** *teenagers, cognitive activity, psycholinguistic system, speech, language codes, language perception, slang, algorithm, intellectual lability.*

Təcrübələr göstərir ki, təlim prosesində yeniyetmələr koqnitiv fəaliyyət zamanı üzərində işlədikləri informasiyaların qavranılması və mənimsənilməsi ilə yanaşı, onların təqdimatında da (prezentasiyasında) bir sıra çətinliklərlə üzləşirlər. Belə çətinliklərdən biri də informasiyanın məzmunu ilə bağlıdır. Çünki onlar üzərində işlədikləri informasiyanı yazılı və şifahi nitqdə sözlə ifadə etməli olurlar. Əslində, yeniyetmələr yaş imkanları baxımından artıq dilin müxtəlif imkanlarına kifayət qədər yiyələnmiş olurlar. Təcrübə də göstərir ki, onların nitqi ümumilikdə yaşın dil normalarına uyğun gəlir. Bunu yeniyetmə qruplarındakı ünsiyyətin məzmunu da təsdiq edir.

Təcrübədə üzləşdiyimiz daha bir məsələ digər yeniyetmələrin koqnitiv sahənin komponentləri ilə müqayisədə həm yazılı, həm də şifahi nitqində üzləşdiyi çətinliklərlə daha çox maraqlanmalarıdır. Belə ki, yeniyetmələr yaxşı dil imkanlarına yaxşı təhsilalmanın, müvəffəqiyyətin və inkişafın əsas amili kimi yanaşırlar. Məsələn, onlar nitq qüsurlarından xüsusilə xəcalət çəkirlər. Məzmunla bağlı yazılı və şifahi nitqdə onları çətinliyə salan problem isə yeniyetmə üçün yeni və mürəkkəb olan dil ifadələrinin (məs., anlaşılmayan mətnlərin, fikirlərin, təqdimatlardakı informasiyaların və s.) öz sözləri ilə izah edilməsi olur. Məhz bu kimi səbəblərdən koqnitiv fəaliyyətdə yeniyetmə üçün vacib olan quruluşlardan biri də psixolinqvistik sistem, onun əsas mövzusu olan dil və nitqdir. N. Purba belə izah edir ki, *"nəzəri linqvistika – fonetika, diksiya, sintaksis, intonasiya və d. bu kimi proseslərlə bağlıdır. İnkişaf linqvistikasında dilin mənimsənilməsi ilə əlaqədardır. Bu sahə fonoloji, semantik və sintaktik mənimsəməni mərhələlərlə, tədricən və inteqrasiyanı araşdırır" [8, s. 47].*

Psixologiyada koqnitiv fəaliyyətlə psixolinqvistik sistem arasındakı əlaqələrin öyrənilməsi tarixi o qədər də çox deyil. Əsasən XX əsrin II yarısından başlayaraq koqnitiv psixologiyada bu mövzuya maraq artmağa başlamışdır. Psixolinqvistik quruluşa koqnitiv yanaşma bizə onun bir çox incə məqamlarını aydınlaşdırmağa imkan verir: *"Koqnitiv yanaşma nitq fəaliyyətinin dərkolunma prosesləri ilə bağlıdır. XX əsrin 70-ci illərindən başlayaraq koqnitiv psixologiyanın inkişafı psixolinqvistikanın üçüncü nəslinin meydana gəlməsinə səbəb oldu. U. Kinqə görə, nitq komponentləri üzrə əməliyyat apararkən, onu anlayarkən, təhlil edərkən onların əsasında situasiyanın məzmununun abstrakt anlayışı, təsəvvür durur" [3, s. 97].*

Əgər məsələyə koqnitiv aspektdən yanaşsaq, nitqin quruluşu iki mühüm xarakterə malikdir:

a) dil ifadələrindəki obrazların qorunmasını təmin edir;

b) koqnitiv fəaliyyətin keyfiyyətlə qurulmasını nizamlayır.

J. Piaje intellekti tədqiq edərək dilin obyekt və hadisələri mənalandıran simvollardan ibarət olduğunu göstərmişdir. Bu baxımdan, obrazlar bir sıra hallarda bizə dil vasitəsi ilə təqdim olunur. Belə metaforik təqdimetmə şüurda obyektin simvollarının yaradılmasını və keçmiş obrazların çağırışını, oyadılmasını təmin edir. Məlum olduğu kimi, psixolinqvistikanın əsas tədqiqat predmeti də yalnız səs kodlarının strukturu və ya siqnal deyil, həm də kodlaşdırma və dekodlaşdırmada psixika ilə bağlı olan proseslərdir [5].

Siqnalların qavranılması fikri mexanizm olduğundan, burada diqqəti daha çox qavrama və nitq siqnalları arasındakı əlaqə cəlb edir. Yeniyetməlik yaşında ayrı - ayrı səslərin, sözlərin, cümlələrin deyil, mətnlərin qavranılması nəzərdə tutulur. İnformasiya texnologiyalarına yiyələnmə imkanları baxımından yeniyetmələrdə işarələrin dili daha çox inkişaf edir. İşarələrin dili şüur forması olaraq şeyləri bildirən kodların, işarələrin, əşya xassələrinin, hərəkət və münasibətlərin dilidir. Ona görə də müasir təhsildə işarələrin dilinə şüurun reallaşmasının səmərəli vasitəsi kimi baxılır. Yeniyetmə isə öz nitqində söz və söz birləşmələrindən asanlıqla istifadə edərək şeyləri, hərəkəti, keyfiyyət və münasibətləri ifadə edirlər. Onlar öz nitqində söz birləşmələrindən fikirlərin üz qabığı, onu qaydaya salan örtük kimi yararlanırlar. Bilirlər ki, bu örtük olmadan fikirlər itir, dağılır, ondan istifadə etmək mümkün olmur. Belə aydın olur ki, yeniyetmənin nitqində iki əlaqə yaranır:

1) nə düşündüyünü ifadə etmək üçün istifadə etdiyi sözə diqqət yetirir;

2) istifadə etdiyi sözlə düşüncə arasında əlaqənin olub-olmadığını müəyyənləşdirir.

Ə.Ə. Əlizadə, H.Ə. Əlizadə psixolinqvistik sistemin koqnitiv fəaliyyətdəki roluna, hər şeydən əvvəl, daxili nitqdə konstruksiyalaşması kimi yanaşırlar. "Fəlsəfi və koqnitiv araşdırmalarda, epidemiologiyada koqnitivistikada biliyin yeni formaları açıqlanıb. Koqnitiv ənənələrlə "anlama-bilik" konsepsiyası formalaşıb. *" [1, s.171]*. Ş. Hüseynov, F. Şiriyev və C. Muradov həmin prosesi belə izah edirlər: "*Danışan üçün bütöv mətn subyektiv olaraq bütövdür. O, dinləyicinin qavraması baxımından optimal şəkildə qurulur. Nitqin qurulması həm optimal, həm də nöqsanlı ola bilər. Mətnin qavranılması bağlama sözlərdən, onların düzgün seçilməsindən asılıdır" [3, s.100].*

Yeniyetmələrin ünsiyyətində həm də onlara xas olan müraciət kodları və səs işarələrindən ibarət xüsusi dil formaları vardır. Həmin formalardan istifadə edilərək simvolik dil oyunları mahiyyəti daşıyan informasiya ötürücülüyündən yalnız həmyaşıdlar qrupunda istifadə olunur. Simvolik oyunlardan biri deyilən fikrilərin anaqrammlar qismində, sözdəki hərflərin yerlərini irəlidən-geriyə dəyişərək çatdırılmasıdır. Bu tipli oyunların özləri də yeniyetmələrin dil vərdişlərini, cümlənin alt mənasını, sözün səs tərkibini, nitqin koqnitiv quruluşunu daha yaxşı dərk etməyə imkan verir. Məsələn, yoldaşına: "Axşam kinoya gedəkmi?" demək əvəzində fikrini: "Maşxa ayonik midəkədeg?" kimi anaqrammla ifadə edirlər.

Elmi ədəbiyyatda yeniyetmələrin bu dil üslubu "slenq" adlanır. Slenq- (ingiliscə - special) yeni sözlər, yaxud artıq mövcud olan sözlər naborudur. Slenq müxtəlif insan (sosial, peşə) qruplarında özünəməxsusdur. M.Q. Çeporuxina "slenq" anlayışını belə xarakterizə edir: *"Ümumi ədəbi lüğət vahidlərinin danışıq dilində qəsdən üslubi məqsədlər üçün istifadə edilir: yenilik, qeyri-adilik effekti yaratmaq, tanınan nümunələrdən fərqlənmək, danışanın xüsusi əhval-ruhiyyəsini çatdırmaq, fikri konkretləşdirmək, emosional boya, obrazlılıq, ifadəlilik, dəqiqlik, konkretlik vermək, həmçinin, qeyri-adilik effekti yaratmaq, natiqin xüsusi əhval-ruhiyyəsini çatdırmaq, ifadəyə konkretlik, canlılıq, ifadəlilik, dəqiqlik, qısalıq, obrazlılıq vermək, həmçinin şablonlardan qaçmaq"* [6, s. 117].

Nitqin belə dinamik inkişafı, bir tərəfdən koqnitiv fəaliyyətin genişlənməsi (müstəqil axtarıcılıq prosesində əldə etdiyi yeni informasiyalar, anlayışlar, ədəbi dil nümunələri, bədii obrazlardakı ifadələr), digər tərəfdən özünün şəxsi əlaqələri, tanışlıqlar, həmyaşıdlarla çoxtərəfli ünsiyyət və münasibətlər (yalnız sinif yoldaşı kimi deyil, maraq sahələri üzrə birgə tərəfmüqabil, əməkdaş, əks cinslər arasındakı sosial-rol münasibətləri, ideallara identifikasiya cəhdindən yaranan rol konstruktları və s.) sayəsində baş verir.

Psixologiyada dünyada çox məşhur olan "Siseron metodu" anlayışı var. Siseron metodunda koqnitiv fəaliyyətin ilkin mərhələsi olan sensor-perseptiv hərəkətlərdən başlayaraq, bu prosesdə iştirak edərək koqnitiv prosesləri hərəkətə gətirən bütün quruluşlar bir-biri ilə qarşılıqlı əlaqədə çıxış edir. Natiqlik məharətinə yiyələnmək üçün Siseron bu metoddan istifadə etmişdir. Metodun mahiyyəti ondan ibarətdir ki, yadda saxlanılacaq informasiya vahidliyi fikrən ciddi qaydada nizamlanaraq otaqda saxlanılır. Çıxışına başlamazdan əvvəl Siseron öz evində gəzərək çıxışının əsas məqamlarını otaqlarla əlaqələndirirdi [9].

Analoji olaraq biz də hansısa sxemi açarkən, qrafik təsvirləri izah edərkən hafizədə onlarla bağlı informasiya sisteminə müraciət edirik. Bu zaman köməyimizə alqoritmlər gəlir. Alqoritm müəyyən bir xüsusiyyətə, növə aid olan hər hansı bir problemin həllinə aparan əməliyyatların konkret bir ardıcıllıqla icrası üçün dəqiq, birmənalı başa düşülən təlimat, resept və ya qaydadır. Alqoritmlərin funksiyası oxşar obraz, fikir və hərəkət sistemlərinin təkrarların köməyi ilə oyadılmasıdır. Alqoritm hərəkətin təlim materialına uyğun olan planını daxildə qurmağa və onu reallaşdırmağa kömək edir. V.P. Bespalkoya görə, alqoritmin əsas xassələri bunlardır:

*1) müəyyənlik - əməliyyatların sadəliyi və mükəmməlliyi;*

*2) spesifiklik - problemlərin hər kəsə tətbiq edilməsinin və alqoritmik əməliyyatların aparılmasının mümkün olması;*

*3) səmərəlilik - nəticələrdə əldə edilmiş cavabların qanunauyğunluqlar əsasında ümumiləşdirilməsinin mümkünlüyü;*

*4) ayrı-ayrı hissələrin ümumi məzmunda birləşmiş olması, elementar mərhələlərə bölünməsi (diskretlik*) [10, s.15*]*.

Məsələn, alqoritmlərə müəllimin fasilitator fəaliyyətində verdiyi istiqamətə görə şagirdin özü tərəfindən daxili planda aparılan axtarışlar, icra edilən hərəkətlər aiddir:

a) tapşırığın şərtlərinə uyğun hərəkət planı qurmaq;

b) biliyin prosedura köçürülməsi üçün hərəkət vasitələri seçmək;

c) məsələlərin həlli yollarını müəyyənləşdirmək;

d) kimyəvi reaksiyaların, fiziki hadisələrin səbəblərini araşdırmaq və s.

Bu zaman həm şagird, həm də müəllim baş verən proseslərdən xəbərsiz olurlar.

Hazırda yeniyetmələr müasir İTK vasitələrinə hədsiz maraq göstərdiklərinə görə kompüter elmlərində daha çox işlədilən alqoritmlərə üstünlük verilir. Bizə öyrənmə nəzəriyyələrindən məlum olan alqoritm anlayışı pedaqoji praktikada da geniş yayıldığından, proqamlaşdırılmış təlim üçün də əlverişlidir. Bu halda, ondan koqnitiv fəaliyyətin inkişafı üçün proqramlaşdırılmış təlimdə istifadə etməyin üstünlüklərindən yararlanmaq mümkündür.

M.A. Kobozeva nitq proseslərinin məhz alqoritmlər kimi baş verdiyini göstərir. Beyin mərkəzlərinə oyandırıcı təsir göstərərək fikri fəaliyyəti sinxronlaşdıran alqoritmlər sayəsində aşağıdakı koqnitiv proseslər gedir:

- *tapşırığın qavranılması;*
- *qoyulmuş şərtlərin başa düşülməsi;*
- *tapşırığın şüurlu şəkildə dərk olunması;*
- *əsas biliklərin daxili reprezentasiyası;*
- *optimal həll yolunun axtarılması;*
- *öz hərəkətlərinin gedişini idarə etmək;*
- *nəticələri müəyyənləşdirmək* [4, s. 7].

Deyilənlərə rəğmən, yeniyetmələrin koqnitiv sahəsinin psixolinqvistik sistemlə əlaqəsində zəifliklər də vardır. Yaş böhranı ilə əlaqədar senzitiv olduqlarına görə, hansısa bir fəaliyyətə mərkəzləşərkən yeniyetmələrə digər siqnallarla təsir etdikdə, yaxud onlar üçün ən zəif siqnallarla belə yeni olan situasiya yaratdıqda, diqqət dərs üçün vacib olan fəaliyyətdən başqa bir qıcığa yönəlir. Bu amil Bakı şəhəri Suraxanı rayonu 285 saylı və Qax rayonu Cəlayır kənd məktəblərinin IX siniflərində apardığımız təcrübələrdə öz təsdiqini tapdı. Təcrübədə yeniyetmələrə yazılı sınaq tapşırığı verilərək nəticələrin böyük summativ qiymətlərə təsir göstərəcəyi bildirildi. Tapşırığın mahiyyəti bundan ibarət idi ki, şagirdlər onlara riyaziyyatdan verilən sualların seçilmiş variantlarını şifahi şəkildə əsaslandırmalı idilər. Daha yaxşı oxuyan, koqnitiv bacarıqlarına görə üstün olan şagirdlər belə danışarkən verdiyimiz tapşırıq əsasında ondan arxada oturan şagird əlləri ilə partanı tıqqıldadırdı. Danışan şagirdlər həmən nitqini dayandıraraq fasilə verir, bəziləri arxaya çevrilib ona acıqla baxırdılar.

Daha bir sınağı bütöv siniflər üzrə keçirdik. VII, VIII və IX siniflərdə şagirdlərə yazdıqlarını danışmaq üçün hazır olmaları tapşırıldı. Kimin könüllü danışmaq istədiyini onlardan soruşduq. Şagirdlərin əksəriyyəti əllərini qaldırmışdılar. Şagirdləri dinləməzdən əvvəl yazdıqları cavablarda səhvlərin ola biləcəyi barədə ehtimallarımızı bildirdik. Bəzu sualların, hətta düzgün tərtib edilməsində belə yanlışlıqların ola biləcəyi barədə izahat verdik. Bir sözlə, onlarda cavabların doğruluğuna şübhə yaratdıq. Bundan sonra yenidən kimin cavab verməyə hazır olduğunu soruşduq. Bu dəfə könüllülərin sayı iki dəfə azaldı. Onlar yenidən suallar üzərində düşünməyə başladılar. Səbəbini soruşduqda isə, yazdıqlarını ifadə etməkdə çətinlik çəkmələri ilə əlaqələndirdilər. Halbuki, bu dəfə çətinlik koqnitiv sahə ilə psixolinqvistik sistem arasında əlaqənin qurulmasında deyildi. Onların emosional sahəsinə şübhə toxumu səpilərək özgüvənlikləri zəiflədilmişdi.

Bunun ardınca yeniyetmələrin koqnitiv fəaliyyətində dərketmə və psixolinqvistik sistemlərin qarşılıqlı əlaqəsini müəyyənləşdirmək üçün "İntellektual labillik" (intellektin dayanıqlığı) testi ilə təcrübə apardıq [2, s. 206]. Apardığımız bu sınaqlarda onun 2 variantını hazırladıq.

I variant - V-VII siniflər.

II variant - VIII-IX siniflər.

Tərəfimizdən modifikasiya edilmiş bu metodikadan yeni fəaliyyət növünü mənimsəmək, fonetik eşitmə, eşitdiklərini qavrama və tətbiqetmə təcrübənin keyfiyyətini qiymətləndirmək üçün istifadə etdik. Testin metodikası sınanılanlardan diqqətini yüksək səviyyədə mərkəzləşdirməklə koqnitiv əməliyyatlar aparmaq tələb edir. Sınanılan çox qısa müddət ərzində (bir neçə saniyədə) mürəkkəb olmayan tapşırıqları yerinə yetirir, nəticələri hesablayır. Biz intellektual labilliyin tədqiqatını qrup halında apardıq. Hər bir sınanılana tapşırıq üzrə xüsusi blank verildi. Əvvəlcə onlara təlimat izah olundu. Bununla belə, yenə suallar verir, dinlədiklərini qavramada çətinlik çəkdiklərini bildirirdilər. Testin özəlliyi də bunda idi. Testin təlimatı sınanılanlardan diqqətli olmağı,

informasiyanı dəqiq qavramağı, aparılacaq əməliyyatların koqnitiv konstruksiyalarını qurmağı tələb edirdi.

**Cədvəl 1.**

**10-13 yaşlı yeniyetmələrlə keçirilən "İntellektual labillik" testinin nəticələri**

| Yaşlar | Səviyyələr | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | aşağı qərarsızlıq, səmərəli kopqnitiv fəaliyyət | | aşağı qərarsızlıq, koqnitiv fəaliyyətdə bir qədər çətinliklər | | yuxarı qərarsızlıq, koqnitiv fəaliyyətdə çətinliklər | | koqnitiv fəaliyyətdə qabiliyyət-sizlik | | yekun | |
| Kontrol siniflər | n. | faiz | n. | faiz | n. | faiz | n. | faiz | n. | faiz |
| 10-11 yaş - V sinif | 4 | 20,00 % | 11 | 55,00 % | 5 | 25,00 % | 0 | 0 | 20 | 100 % |
| 11-12 yaş - VI sinif | 6 | 31,57 % | 10 | 52,63 % | 3 | 15,78 % | 0 | 0 | 19 | 100 % |
| 12-13 yaş – VII sinif | 6 | 31,57 % | 12 | 57,14 % | 3 | 14,28 % | 0 | 0 | 21 | 100 % |
| Siniflər üzrə nəticələr | 16 | 26,66 % | 33 | 55,00 % | 11 | 18,33 % | 0 | 0 | 60 | 100 % |
| Eksperimental siniflər | | | | | | | | | | |
| 10-11 yaş - V sinif | 4 | 26,66 % | 7 | 46,66 % | 2 | 13,33 % | 2 | 13,33% | 15 | 100 % |
| 11-12 yaş - VI sinif | 5 | 33,33 % | 6 | 40,00 % | 4 | 26,66 % | 0 | 0 | 15 | 100 % |
| 12-13 yaş – VII sinif | 6 | 33,33 % | 9 | 50,00 % | 3 | 20,00 % | 0 | 0 | 18 | 100 % |
| Siniflər üzrə nəticələr | 15 | 31,25 % | 22 | 45,83% | 9 | 18,75% | 0 | 13,33% | 48 | 100 % |
| Ümumi nəticələr | 31 | 29,52 % | 55 | 52,38 % | 20 | 19,04 % | 2 | 13,33% | 105 | 100 % |

10-13 yaşlı yeniyetmələrlə "İntellektual labillik" testini keçirərkən vaxt amili və yaş imkanları nəzərə alındı. Yuxarı yaşlara getdikcə saniyələrin sayı 1/1 nisbətində, hər yaşda 1 saniyə artırıldı. Eləcə də, izahlarda daha detallı təlimatlandırma aparıldı. Nəticələr göstərdi ki, əslində, 4-5 il aralıqla (məsələn, 14-18 və ya 18-21 yaş) fərqli dövrlər üçün nəzərdə tutulmuş bu test intellektin və koqnitiv sahənin yaş imkanlarından daha çox fərdi imkanları aşkara çıxarır. Əlbəttə, yaş xüsusiyyətlərini də nəzərə almaq vacibdir. Bu mənada, sınanılanların intellektual dayanıqlığını və linqvistik sistemlə koqnitiv sistem arasındakı əlaqəni aydınlşdırmaq baxımından testin nəticələri əsasında bir sıra məsələlər aydınlaşdı.

11-13 yaşlı yeniyetmələrin nəticələrində ən yüksək göstərici kontrol və eksperimental məktəblərin VI-VII sinifləri üzrə oldu (kontrol-31,57%, eksperimental 33,33%). Ən aşağı nəticə isə məktəbin V (25,00%) və eksperimental məktəbin VI sinfinə aid idi (26,66%). Ümumilikdə siniflər üzrə eksperimental məktəbin göstəriciləri 2,86% yüksəkdir. Eyni zamanda, aşağı nəticələr də bu məktəbdə bir qədər yüksəkdir. Bundan başqa, kontrol məktəbdə koqnitiv fəaliyyətdə qabiliyyətsizliyi olan şagirdlər olmadığı halda, eksperimental məktəbin V sinfində bacı-qardaş olmaqla 2 nəfər belə şagird vardı. (İlkin diaqnostik araşdırmada onlarda intellektual əlillik aşkar edilmişdi).

**Cədvəl 2.**

**14-15 yaşlı yeniyetmələrlə keçirilən "İntellektual labillik" testinin nəticələri**

| Yaşlar | Səviyyələr | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | aşağı qərarsızlıq, səmərəli koqnitiv fəaliyyət | | aşağı qərarsızlıq, koqnitiv fəaliyyətdə bir qədər çətinliklər | | yuxarı qərarsızlıq, koqnitiv fəaliyyətdə çətinliklər | | koqnitiv fəaliyyət də qabiliyyətsizlik | | yekun | |
| Kontrol siniflər | n. | faiz | n. | faiz | n. | faiz | n. | faiz | n. | faiz |
| 13-14 yaş - VIII sinif | 4 | 20,00 % | 11 | 55,00 % | 5 | 25,00 % | 1 | 5,00% | 20 | 100 % |
| 14-15 yaş - IX sinif | 6 | 31,57 % | 10 | 52,63 % | 3 | 15,78 % | 0 | 0 | 19 | 100 % |
| Siniflər üzrə nəticələr | 10 | 25,64 % | 21 | 53,84 % | 8 | 20,51 % | 1 | 2,56% | 39 | 100 % |
| Eksperimental siniflər | | | | | | | | | | |

| | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| 13-14 yaş - VIII sinif | 4 | 26,66 % | 7 | 46,66 % | 3 | 20,00 % | 1 | 6,66% | 15 | 100 % |
| 14-15 yaş - IX sinif | 5 | 33,33 % | 6 | 40,00 % | 4 | 26,66 % | 0 | 0 | 15 | 100 % |
| Siniflər üzrə nəticələr | 9 | 60,00 % | 13 | 43,33% | 7 | 23,33 % | 0 | 0 | 30 | 100 % |
| Ümumi nəticələr | 19 | 27,53 % | 34 | 49,27 % | 15 | 21,73 % | 2 | 2,89% | 69 | 100 % |

Sınanılanların bir qismi nəinki testin işlənilməsində, onun icrası ilə bağlı məlumatın qavranılmasında belə dil kodlarını və simvolları çətin mənimsədiklərini, o cümlədən işə çətin mərkəzləşdiklərini əyani olaraq göstərirdilər. Nəticələrə görə, aşağı göstəricilərin əsas səbəbi psixolonqvistik sistemin zəifliyi idi. Orta və aşağı nəticələr göstərən sınanılanlar "Səncə daha yaxşı göstəricilərin olması üçün nə lazımdır?" sualına belə cavablar verirdilər: "Bir neçə dəfə təkrarlansa yaxşı olar", "Daha yaxşı izah edilməlidir", "Tapşırıqları anlamaq olmur", "Tapşırıq yazılı olaraq bizə verilsin", "Kvadratların nömrələri bir neçə dəfə təkrarlansın" və s. "İntellektual labillik" testinin nəticələri əsasında 10-15 yaşlı yeniyetmələrin koqnitiv fəaliyyətində psixolinqvistik sistemin müstəsna rolu bir daha aydınlaşdı. Bu məsələni bir neçə istiqamət üzrə ümumiləşdirdik.

- Linqvistik sistemlə iş (verbal tapşırıqların qavranılması, onları anlamaq, koqnitiv konstruksiyalar quraraq icra etmək).
- Verilən informasiya əsasında kodlaşdırılmış həndəsi formalar, fəza təsəvvürləri üzərində çalışmalar etmək, əməliyyatlar yerinə yetirmək.
- Verilən informasiya əsasında təsəvvürdə xətti sistemlərin vizual istiqamətlərini müəyyənləşdirmək, bu obrazları praktik fəaliyyətə tətbiq etmək
- Verilmiş ədədi və d. işarə simvolları üzərində hesablama əməliyyatları aparmaq.
- İşarə, simvol, ədəd, rəqəm, vizual - məkan və zaman təsəvvürləri ilə bağlı qarışıq əməliyyatları icra etmək.

Bu testin ardınca yeniyetmələrdə yenə eyni qaydada modifikasiya variantından istifadə edərək eyniadlı "Bu, axtardığın sözdür" testini keçirdik.

Metodika özünütestləşdirmə yolu ilə daxili hissləri, söz ehtiyatını, yaradıcı təxəyyülü, ən nəhayət, sözlərlə oynamaq bacarığını aydınlaşdırmaq üçün nəzərdə tutulur. Elə bu səbəbdən test bəzi mənbələrdə "Söz oyunu" da adlandırılır.

Proses rahat şəraitdə təşkil edilir. Onun əsas ideyası insanın istəklərini, daxili təhrik və arzularını ümumiləşdirərək izah edə bilən açar söz tapmaqdır. Həmin açar söz fikir qarışıqlığını açaraq işin sonunda tapılacaq yekun söz olur. Biz testi yaş imkanlarına görə iki variantda təqdim etdik. V sinifdə başlanğıc sözlərin sayı 8, VI sinifdə 10, VII sinifdə 12 söz təyin edirdi.

Təlimata görə A4 ölçüdə təmiz kağız götürülərək eninə təqdim edilir. Sol tərəfdən qələm, yaxud flomasterlə müvafiq sayda (8,10,12) nöqtə qoyulur. Bundan sonra hər nöqtənin qarşısında fikrə gələn bir söz yazılır. Bu, tək haldakı isim olmalıdır. Təsadüfi sözlər seçilir, ağla nə gəlirsə, yaxşı-pis, nə oldu yazılır. Yeganə şərt testləşdirmə boyu heç bir sözü təkrarlamamaqdır. Növbəti mərhələdə sözlər cütləşdirilir: 1-2; 3-4; 5-6, 7-8. Cütlər eyni sözdə birləşdirildikdə 4 söz, daha sonra 2, ən sonda 1 söz qalır. Bu, axtardığımız açar söz olur. Testin nəticələri analitik təhlil əsasında işlənilərək aşağıdakılar əsas götürülür:

a) yazılan sözlərin hansı məna yükü daşıması;

b) sözlər arasında əlaqəlilik;

c) sözləri birləşdirən açar sözlərin məna baxımından hər ikisinə yaxın olması;

d) yekun (açar) sözün sınanılanın fəaliyyət motivləri və ya "Mən-obraz" ilə əlaqəsi, onu aydınlaşdırma dərəcəsi;

e) qoyulan vaxta əməl etməsi;

f) fikirlərini əsaslandırması.

Testin nəticələri bizə bir sıra ümumiləşdirmələr aparmağa imkan verir.

"Bu, axtardığın sözdür" testinin nəticələri göstərdi ki, yeniyetmələrin sözlərə münasibəti, söz seçimi və onlar arasında əlaqələrin qurulması onların aparıcı fəaliyyətinin yaratdığı tələbatlarla bağlı olub, koqnitiv bacarıqlardan biri kimi çıxış edir. Bu koqnitiv bacarıq - sözlərin bir tərkibdə birləşdirilməsidir. Həmçinin, bu təcrübə əsasında deyə bilərik ki, kiçik yeniyetmələrdə fikirləri inkişaf etdirərək onu süjet ətrafında mərkəzləşdirmək bacarıqları kifayət qədər inkişaf etmiş olur. Burada əsas şərt onlara tapşırığın aydın və konkret əməliyyatlar baxımından izah edilməsidir. Əks halda, onların nəticələri yaş səviyyəsindən aşağı olacaqdır. Bu tapşırıq üzrə 13 yaşlı yeniyetmələrin (VII sinif)

nəticələri digər siniflərdən daha üstün olmuşdur. Buna həm yaş amili, həm də böhran yaşında artan özünüaxtarış, özünümüəyyənləşdirmə, eləcə də özünidentifikasiya tələbatı təsir göstərə bilər.

Bundan sonra VIII və IX siniflərlə tərəfimizdən hazırlanmış "Dilduyumu bacarıqlarının təyini" testini keçirdik *[2, s. 206]*. Test Azərbaycan ədəbiyyatından götürülmüş 21 kiçik sitatlardan ibarətdir. Hər bir sitatda bir söz buraxılır. Sınanan həmin sözü tapmalıdır. Sitatlar xüsusi şəkildə götürülmüşdür. Tapşırıqda müxtəlif dərəcəli çətinliklər vardır. Testin spesifikliyi sınanılanın düz cavablarının təsadüfi ola bilməsidir. Yaş həddi 14+

Testin təyinatı. Dilduyumu anlayışı altında ana (Azərbaycan) dilinin mənasını anlamaq, onun incəliklərinə sahib olmaq başa düşülür. Bilirik ki, dil duyumu mədəni zənginləşmə və duyma kommunikasiyası təcrübəsi əsasında formalaşır. Test sınananlarda dil və ya ədəbiyyat üzrə qabiliyyətlərin deyil, dil duyumunun koqnitiv səviyyəsini öyrənmək üçün nəzərdə tutulur. Bu testin köməyi ilə həm də sınanılanın psixolinqvisitk və kommunikativ bacarıqları müəyyənləşdirilir.

İşin gedişi. Sınanılana sözlər buraxılmış sitatlardan ibarət tapşırıq blankı verilir. Sözlər yazmaq üçün kifayət qədər yer buraxılır. Testin keçirilmə müddəti - 15 dəqiqədir.

**Cədvəl 3.**

**14-15 yaşlı yeniyetmələrdə "Dilduyumu" testinin nəticələri**

| Yaşlar | Səviyyələr | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | dilduyumu bacarığının yuxarı səviyyəsi, psixolinqvistik qabiliyyət | | dilduyumu bacarığının orta səviyyəsi, psixolinqvistik fəallıq | | dilduyumu bacarığının aşağı səviyyəsi, psixolinqvistik zəiflik | | dili duymada məhdud luq, linqvitik sistemin zəifliyi | | yekun | |
| Kontrol siniflər | n. | faiz | n. | faiz | n. | faiz | n. | faiz | n. | faiz |
| 13-14 yaş - VIII sinif | 5 | 25,00 % | 8 | 40,00 % | 5 | 25,00 % | 2 | 10,00 % | 20 | 100 % |
| 14-15 yaş - IX sinif | 5 | 26,31 % | 10 | 52,63 % | 3 | 15,78 % | 1 | 5,20% | 19 | 100 % |
| Siniflər üzrə nəticələr | 10 | 25,64 % | 18 | 46,15 % | 8 | 20,51 % | 3 | 10,00 % | 39 | 100 % |
| Eksperimental siniflər | | | | | | | | | | |
| 13-14 yaş - VIII sinif | 5 | 33,33 % | 7 | 46,66% | 2 | 13,22 % | 1 | 6,66% | 15 | 100 % |
| 14-15 yaş - IX sinif | 6 | 40,00 % | 5 | 33,33 % | 4 | 26,66% | 0 | 0 | 15 | 100 % |
| Siniflər üzrə nəticələr | 11 | 36,66 % | 12 | 40,00% | 6 | 20,00 % | 1 | 3,33% | 30 | 100 % |
| Ümumi nəticələr | 21 | 30,43 % | 30 | 43,47 % | 14 | 20,28 % | 4 | 5,79 | 69 | 100 % |

Nəticələrə görə, kontrol və eksperimental qruplardakı 15 yaşlı (IX sinif) yeniyetmələrin nəticələri qismən üstün olmuşdur. Bununla belə, hər iki qrupda ümumi göstəricilər qənaətbəxş sayıla bilməz. "Dilduyumu" testi üzrə sınanılanların 30,33% - i yuxarı, 43,47%-i orta, 20,28%-i aşa nəticə göstəriblər. 3,79% (4 nəfər) sınaılanda dil duyumunda qabiliyyətsizlik müəyyən edildi.

Paraqraf üzrə apardığımız araşdırmada bunları müəyyən etdik. Belə ki, psixolinqvistik sistem koqnitiv sisteminin bir hissəsi olub, üstün intellekt tipi ilə əlaqəli şəkildə təzahür edir. Hər bir fərdin daşıdığı dilin anadangəlmə, real obraz-işarə sistemi vardır. Hər kəs bu sistemə sahib olaraq ünsiyyətə, dərketmə və yaradıcı fəaliyyətə yol tapır, işarələr sistemini mənimsəyərək, onu dil mədəniyyətinə gətirərək özünüdərketməyə istiqamətlənir. Yeniyetmələrin koqnitiv fəaliyyətində psixolinqvistik sistemin iştirakı bu prosesdə iştirak edən psixoloji quruluşlarda qarşılıqlı əlaqələrə əsaslanır. Proses aşağı yaşlardan, sensor-perseptiv hərəkətlərdən başlanır. Psiolinqvisitk sistem yeniyetməlik dövründə

koqnitiv fəaliyyətin gedişinə fəal şəkildə qoşulur. On beş yaşlı yeniyetmə artıq koqnitiv fəaliyyəti də dildən, onun şifahi və yazılı formalarından səmərəli qaydada istifadə edir. Yaşlılara xas olan mürəkkəb linqvistik bacarıqlar nümayiş etdirir.

Yeniyetmələrin koqnitiv fəaliyyətində psixolinqvistik sistemin iştirakını aydınlaşdırarkən müəyyən etdik ki, bu əlaqə verbal tapşırıqların qavranılması, onları anlamaq, koqnitiv konstruksiyalar quraraq icra etmək kimi əməliyyatlar əsasında qurulur. Yeniyetmələr verilən informasiya əsasında kodlaşdırılmış həndəsi forma, həcm, məkan, miqdar, fəza təsəvvürləri və digər perseptiv-məntiqi əməliyyatlarla bağlı çalışmalar edir, müxtəlif alqoritmik əməliyyatları yerinə yetirirlər. Eləcə də, verilən informasiya əsasında təsəvvürdə xətti sistemlərin vizual istiqamətlərini müəyyənləşdirir, bu obrazları praktik fəaliyyətə tətbiq edirlər. Bunlardan başqa, işarə simvolları üzərində hesablama əməliyyatları aparır, ədəd, rəqəm, vizual - məkan və zaman təsəvvürləri ilə bağlı qarışıq əməliyyatları həll edirlər.

**Problemin elmi yeniliyi**. Tədqiqatda qoyulan problem ümumtəhsil sistemində kurikulumların daha səmərəli şəkildə həyata keçirilməsini təmin edə biləcək əhəmiyyətli elmi faktları aydınlaşdırmağa imkan verir. Təlim proseində yeniyetmələrin koqnitiv fəaliyyətində baş verənləri daha konkret, aydın izah etməyə imkan yaradır. Bu məsələlər detallı şəkildə nəzərdən keçirilir.

**Problemin praktik əhəmiyyəti.** Tədqiqatda qoyulan məsələlər təlim prosesində yeniyetmələrin koqnitiv fəaliyyətində psixolinqvistik sistemi fəallaşdıra biləcək yolları müəyyənləşdirməyə imkan verir. Fənn müəllimləri və məktəb psixoloqları burada qoyulan məsələləri nəzərə alaraq yeniyetmələrin koqnitiv fəaliyyətini daha səmərəli təşkil edə bilərlər.

**Ədəbiyyat:**


1. Əlizadə Ə.Ə. Pedaqoji psixologiya/ Ə.Ə. Əlizadə, H.Ə. Əlizadə. -Bakı: ADPU-nun mətbəəsi, - 2010. – 600 s.
2. Əmrahlı L.Ş. Psixodiaqnostika. /L.Ş. Əmrahlı. – Bakı: MBM, - 2014. -304 s.
3. Hüseynov, Ş., Şiriyev F., Muradov C. Psixolinqvistika/ Ş. Hüseynov, F. Şiriyev, C. Muradov. - Bakı: Bakı universiteti, - 2011. - 214 s.
4. Кобозева, М.А. Когнитивные и речевые стратегии ввода темы в научно-популярном дискурсе// Автореф. дисс. на соискание ученой степени кандидат психологических наук наук / - Ставрополь: - 2011. - 24 с.
5. Пиаже, Ж. Психология интеллекта / Ж. Пиаже. - СПб.: Питер, - 2004.-192 с.
6. Чепорухина, М.Г. К разграничению терминов «дисфемизм», «сленг», «вульгаризм» и «инвектива» // Вестник Самарского университета. История, педагогика, филология, Т. 25, № 4, - 2019. - с. 116-126.
7. Хромов, А.И. Динамика когнитивного развития у детей и подростков при эндогенной психической патологии: / автореферат дисс… медицинской психологии/ - СПб.: Российской академии медицинских наук, 2017. – 23 с.
8. Purba N. The role of psycholingustics in language learning and teaching // Tell Journal, Volume 6, Number 1, 2018 – p. 47-54.
9. http://upgradememory.ru/pghtm // Тренировка памяти. Метод Цицерона.
10. https://indigotech.ru/forum/index.php?/topic//Автоматизация методологии. В.П. Беспалько (уровни усвоения).



**E-mail:** limunet@mail.ru



Redaksiyaya daxil olub: 21.10.2024


*UOT 37.015.3.*

***Gülnarə Həmzəbəyovna Əlixanova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin baş müəllimi,*
*psixologiya üzrə fəlsəfə doktoru*
*https://orcid.org/0000-0002-5241-0250*
*https://doi.org/10.69682/arti.2024.91(6).256-259*

# PEDAQOJİ ÜNSİYYƏT PROSESİNDƏ PSİXOLOJİ TƏSİR VASİTƏLƏRİNDƏN İSTİFADƏ

***Гюльнара Гамзабековна Алиханова***
*старший преподаватель*
*Азербайджанского Государственного Педагогическог Университета,*
*доктор филасофии по психологии*

# ИСПОЛЬЗОВАНИЕ СРЕДСТВ ПСИХОЛОГИЧЕСКОГО ВОЗДЕЙСТВИЯ В ПРОЦЕССЕ ПЕДАГОГИЧЕСКОГО ОБЩЕНИЯ

***Gulnara Hamzabekovna Alikhanova***
*senior lecturer of*
*Azerbaijan State Pedagogical University,*
*doctor of philosophy in psychology*

# USE OF PSYCHOLOGICAL INFLUENCE TOOLS IN THE PROCESS OF PEDAGOGİCAL COMMUNICATION

**Xülasə.** Pedaqoji ünsiyyət tədris və tərbiyənin metod və üsullarının strukturuna daxildir. Pedaqoji ünsiyyətdə aparıcı yeri insanların bir-birini qavraması və başa düşməsi prosesi olan sosial qavrayış tutur. Müəllimin sinif ilə fəaliyyəti və ünsiyyəti təhsil situasiyasının əsas elementləridir. Pedaqoji ünsiyyət prosesində həm müsbət, həm də mənfi, həm qeyri-verbal, həm də verbal ola bilən və təklif, inandırma, təqlid və şəxsi nümunə vasitəsilə həyata keçirilən istiqamətləndirilmiş və təbii qarşılıqlı təsir baş verir.

Qrup dərsləri zamanı müəllim ünsiyyətinin özünəməxsus tələbləri vardır. Belə ki, sinif kollektivi ilə birbaşa təmasda olan müəllim psixoloji təsir gücü ilə səmərəlilik, xeyirxahlıq, inam, konsentrasiya və təşkilatçılıq nümunəsi nümayiş etdirir. Bu cür şərait işgüzar canlanma yaradır.

Bu məqsədlə səsin gücündən, nitqin tempindən rasional istifadə etmək, şagirdlərin təcrübə və biliklərini üzə çıxarmaq üçün suallar vermək, təhsil müəssisəsinin həyatı epizodlarından, film və bədii əsərlərdən istifadə edilir. Müəllim auditoriyanın emosional vəziyyətini müşahidə etməklə öz davranışını, semantik fasilələri yenidən qurur, əsas olanı aydın şəkildə vurğulamaqla, misallar və faktlar vasitəsilə qarşılıqlı anlaşmanı əlaqəli qurmağa çalışır. Müəllimin nitq mədəniyyəti, onun aydınlığı, başa düşülməsi və düzgünlüyü auditoriyanın fəallığı və idrak marağı ilə dəstəklənir.

***Açar sözlər:*** *pedaqoji ünsiyyət, davranış, şagird, qarşılıqlı əlaqə, təsir vasitələri, mimika, dinləmə mədəniyyəti*

**Аннотация.** Педагогическое общение входит в структуру методов и приемов обучения и воспитания. Ведущее место в педагогическом общении занимает социальное восприятие, которое представляет собой процесс восприятия и понимания людьми друг друга. Деятельность и общение учителя с классом являются основными элементами учебной ситуации. В процессе педагогического общения происходит направленное и естественное взаимодействие, которое может быть как положительным, так и отрицательным, как невербальным, так и не вербальным и осуществляется посредством внушения, убеждения, подражания и личного примера.

Общение учителей во время групповых занятий предъявляет уникальные требования. Таким образом, учитель, находящийся в непосредственном контакте с классным коллективом, демонстрирует пример работоспособности, доброты, уверенности, сосредоточенности и организованности, обладающий силой психологического воздействия. Такие условия создают оживление.

Для этого используются рациональное использование силы голоса, скорости речи, постановка вопросов, раскрывающих опыт и знания учащихся, эпизоды из жизни учебного заведения, фильмы и произведения искусства. Наблюдая за эмоциональным состоянием аудитории, педагог реконструирует его поведение, смысловые паузы, четко подчеркивает главное, пытается через примеры и факты построить взаимопонимание. Культура речи преподавателя, ее ясность, понятность и правильность поддерживаются активностью и познавательным интересом аудитории.
***Ключевые слова:*** *педагогическое общение, поведение, ученик, взаимодействие, средства воздействия, мимика, культура слушания*

**Abstract**. Pedagogical communication is included in the structure of methods and methods of teaching and education. The leading place in pedagogical communication is occupied by social perception, which is the process of people's perception and understanding of each other. The activity and communication of the teacher with the class are the main elements of the educational situation. In the process of pedagogical communication, there is a directed and natural interaction, which can be both positive and negative, both non-verbal and verbal and is carried out through suggestion, persuasion, imitation and personal example.

Teacher communication during group lessons has unique requirements. Thus, the teacher who is in direct contact with the class collective demonstrates an example of efficiency, kindness, confidence, concentration and organization with the power of psychological influence. Such conditions create a business revival.

For this purpose, rational use of the power of the voice, speed of speech, asking questions to reveal the experience and knowledge of students, episodes of the life of the educational institution, films and works of art are used. By observing the emotional state of the audience, the teacher reconstructs his behavior, semantic breaks, clearly emphasizes the main thing, tries to build mutual understanding through examples and facts. The culture of the teacher's speech, its clarity, comprehensibility and correctness are supported by the activity and cognitive interest of the audience.
***Keywords:*** *pedagogical communication, behavior, student, interaction, means of influence, mimicry, listening culture.*

Pedaqoji ünsiyyət, elmi təhlilin digər kateqoriyaları kimi, məsələn, tədris-pedaqoji fəaliyyət, təlim fəaliyyəti, pedaqoji fəaliyyət, şagird və müəllim şəxsiyyəti təkcə təhsil psixologiyasının predmeti deyil. Problemin həllində müxtəlif metodoloji yanaşmalar, təhsil və pedaqoji fəaliyyətin əlaqəsi problemi, xüsusən də bu fəaliyyətlə bağlı əhəmiyyətli psixoloji - pedaqoji təsir vasitələri iştirak edir.

Təcrübə göstərir ki, bəzən müəllimlərlə şagirdlər arasında ünsiyyət prosesində yaranan çətinliklərin əksəriyyəti qarşılıqlı əlaqənin birinci mərhələsində, yəni müəllimin hər hansı məlumatı izah etdiyi zaman baş verir. Bu çətinliklərin iki səbəbi var: Birincisi, qarşılıqlı anlaşmanın olmaması, ikincisi isə şagirdin müəllim mövqeyindən razı olmamasıdır (konflikt). Müəllim və şagird arasında şəxsiyyətlərarası qarşılıqlı anlaşmanın pozulması semantik maneə səbəbindən baş verə bilər. Konkret müəllimə münasibətdə onun hansı tələblər qoymasından asılı olmayaraq, konkret tələblə bağlı isə bu tələbi kimin qoymasından asılı olmayaraq semantik maneə yarana bilər.

Bu zaman müəllimlərin öz şagirdlərinin xasiyyətini öyrənə bilməsi üçün bəzi psixoloji üsullardan istifadə edilir:

1.“Şəxsi adım” texnikası - şagird ilə ünsiyyət qurarkən ona öz adı ilə müraciət etmək, insanın öz adının səslənməsi həmişə şüurlu olmayan xoşluq hissi oyadır.

2.“Münasibət güzgüsü” texnikası - üz "münasibətlərin güzgüsüdür" və mehriban, yumşaq təbəssümü olan insanlar, bir qayda olaraq, şəxsiyyətlərarası qarşılıqlı əlaqə ilə iştirakçılarını cəlb edə bilirlər. Lakin bu o demək deyil ki, müəllimin üzündə həmişə təbəssüm olmalıdır.

3.“Qızıl sözlər” texnikası - insanın müsbət keyfiyyətlərini bir qədər şişirtməkdir. Ən təsirli isə antikomplimentin fonunda özünə qarşı edilən komplimentdir.

4.“Səbirli dinləyici” texnikası – həmişə şagirdlə ünsiyyət zamanı müəllim səbirli və diqqətli dinləyici kimi çıxış etməlidir.

5.“Şəxsi həyat” texnikası - şagirdlərlə ünsiyyət qurarkən onların dərsdənkənar şəxsi qayğıları, düşüncələri ilə maraqlanaraq bu biliklərdən təhsil və öyrənmə motivasiyası üçün istifadə etmək.

Təhsil müəssisəsindəki praktik psixoloqa müəllim - şagird münasibətlərinin daha etibarlı mənzərəsini əldə etmək üçün qiymətləndirmə sorğusunu keçirə bilər. Şagirdlərlə uğurlu ünsiyyət qurmaq üçün qarşılıqlı əlaqə haqqında fikirlərin nə dərəcədə üst-üstə düşdüyünü bilmək faydalıdır.

**Qiymətləndirmə sorğusu**

| 1. Dost | Bədxah |
|---|---|
| 2. Təşəbbüsü stimullaşdıran, öz fikrini ifadə etməyə, sərbəst davranışa imkan verən. | Etirazlara, şəxsi fikirlərə, sərbəst davranışa dözməyən, şagirdləri hər zaman ciddi nəzarətdə saxlayan. |
| 3. Maraqlanan və aktivdir | Laqeyd, “öz fikrində”. |
| 4. Hisslərini açıq şəkildə ifadə etməkdən çəkinmir; çatışmazlıqlarını göstərir. | İlk növbədə prestij haqqında düşünür və nəyin bahasına olursa olsun sosial roluna uyğun gəlməyə çalışır. |
| 5. Dinamik, ünsiyyətdə çevik, ortaya çıxan problemləri asanlıqla əhatə edir və həll edir. | Yaranan münaqişələri vaxtında görmür, bu mövzuda davranışını dəyişə bilir. |
| 6. Şagirdlərlə nəzakətli və mehribandır, onların ləyaqətinə hörmət edir, ünsiyyətini onların fərdi xüsusiyyət-lərindən asılı olaraq qurur. | Ünsiyyət hamı ilə eynidir, “Mən müəlliməm” – “Sən şagirdsən” məsafəsini qoruyur. |
| 7. Özünü şagirdin yerinə qoyub münaqişəyə onların gözü ilə baxa bilir. | Öz fikrini təsdiqləməyi vacib sayır. |
| 8. Aktiv, həmişə şagirdlərlə ünsiyyətdə olur. | Passiv, ünsiyyəti öz axarına buraxan. |

Təklif olunan xüsusiyyətlərdə müəllim ifadənin özünə ən uyğun olan hissəsini vicdanla seçməlidir. Bu ifadənin birinci hissəsidirsə, xarakteristik rəqəmin (+), ikincisi (-) qarşısına qoyulur. Qiymətləndirməni bitirdikdən sonra rəqəmi (+) və rəqəmi (-) sayılır. Sonra şagirdlər də eyni qiymətləndirməni etməyə dəvət edilir. Bu prosedurun anonim qalmalıdır, əks halda təhrif edilmiş bir şəkil alınacaqdır. Hər halda, bu, müəllimin özü haqqında düşünmək üçün materialdır.

Müşahidə praktikasında tez-tez belə olur: bəzən başa düşməkdənsə hiss etmək daha vacibdir, bəzən isə yalnız hiss etməklə başa düşmək olar. Mimika dilini mənimsəmək ünsiyyət sənətinin mühüm tərkib hissəsidir. Mimika və emosiyalar üzrə təqdim olunan material şagirdlərlə fərdi işdə çox faydalıdır. Bununla belə, şagird auditoriyası ilə işləyərkən, qarşılıqlı əlaqə iştirakçılarının vəziyyətlərinin təsnifatından istifadə etmək məqsədəuyğundur:

1. “İşləməyə hazırlıq.” Natiqlə göz təması, bədənin irəli əyilməsi, öskürmənin olmaması, ah çəkmə, diqqəti yayındıran jestlər, sakit mimika, pıçıltı ilə diqqəti yayındıran amillərin olmaması.

2. “Etiraz.” Jestlərin və üstü örtülü aqressiya əlamətlərinin görünüşü (yumruğunu sıxmaq, qollarını sinə üzərində çarpazlaşdırmaq, bədəni arxaya əymək - "uzanıqlı", qəzəb emosiyalarının görünüşü, nifrət).

3.“Təkrarlanan emosional və intellektual reaksiya.” Yaranan təəccüb (dodaqların küncləri qaldırılır, ağız bir az açılır, qaşlar yuxarı qalxır, alnında üfüqi qırışlar görünür), diqqət (xüsusi nəfəs, duruş, baş əyilir və bir az çevrilir).

4. “İntellektual-emosional vəhdət”. Universal diqqət, vahid reaksiya. Əsas emosiya - sakit, sərbəst sevincdir (zərif, yüngül təbəssüm, qaşlar qaldırılmış, işıldayan, parıldayan gözlər, işıqlı və enerjili hərəkətlər, canlı və sürətli iradlar).

5. “Dərin, nüvə təması.” Emosional yüksəliş və sevinc, güc artımı və yaxşı əhval-ruhiyyə. Yorğunluq və xırda narahatlıqlar yox olur. Davamlı dialoq, qarşılıqlı və yeni düşüncələrə səbəb olan qarşılıqlı fikir mübadiləsinin yaranması.

Müəllim öz fəaliyyətinin xarakterinə görə daim qarşılıqlı fəaliyyətin təşkilatçısı kimi çıxış edir. Şagirdlərdə güvəni artırmağın təsirli yolu ardıcıl olaraq “biz” hissi yaratmaqdır. Dinləyicinin natiqi “başqasının” deyil, “özününkü” kimi qəbul etməsi qarşılıqlı əlaqənin uğurunu müəyyən edir. Qarşılıqlı əlaqə alınmırsa, fərdi psixoloji treninqin keçirilməsi nəzərdə tutulmalıdır. Aşağıda təqdim edilən məşqlər A.A. Leontiev tərəfindən işlənilmişdir:

***Televiziya filmi***. Televiziya proqramından görmədiyimiz bir filmi və ya tamaşanı seçin. Sonra isə ailə üzvlərinizin birindən onu əvvəldən axıra kimi izləməsini xahiş edin. Filmin ortasında istənilən vaxt otağa girin və bu filmə 5 dəqiqə baxın, sonra otaqdan çıxıb gördüyünüz personajları, onların münasibətlərini və gələcək taleyini yazılı şəkildə təsvir edin. Film bitdikdən sonra yazılanlar filmə baxanların fikirləri ilə müqayisə edilir. Uyğunsuzluqlar

müəyyənləşdirilir və səbəbləri aydınlaşdırılır. Məşq edərkən filmə baxış vaxtı əvvəlcə 3 dəq, sonra 1 dəqiqəyə qədər azalmalıdır.

***Tanımadığınız insan***. Uzun müddət tanımadığınız insanlarla ünsiyyətdə olmaq məcburiyyətində qaldığınız zaman onlardan birini seçin. Bu şəxsin peşəsini, tərcümeyi-halını, sosial, rəsmi və ailə vəziyyətini "təxmin edin". Bu məşqdə xüsusilə vacib olan, müəyyən bir fərziyyənin ortaya çıxmasına nəyin səbəb olduğu barədə özünə verdiyi hesabatdır.

***Xoşagəlməz həmsöhbət***. Gərgin münasibətdə olduğunuz insanlardan birini seçin. Söhbət üçün əvvəlcədən təbii bir mövzu hazırlayın. Həmin insanla görüşəndə əvvəlcə onunla danışın, yaranan söhbəti mümkün qədər uzun müddət saxlamağa çalışın və antipatiyanızı boğaraq, bir-birinizə qarşılıqlı simpatiyaya keçin.

***Əhval-ruhiyyə***. Əla əhval-ruhiyyədə olduğunuz hallarda elə davranmağa çalışın ki, həmsöhbət sizin xəyali depressiyanızı görüb qiymətləndirsin. Bu işə başlayan kimi məşqin ikinci hissəsinə keçilir: pis əhval-ruhiyyədə özünüzü elə aparmağa çalışın ki, heç kim hiss etməsin.

***Emosiyalar***. Çətin bir emosiya seçin (gizli kədər, şüursuz sevinc, daxili narahatlıq) və bu emosional davranışla tanınmış bir insanla söhbət aparmağa çalışın. Dialoq bitdikdən sonra həmsöhbətinizdən nəyi və necə uğur qazandığını və nəyi bacarmadığını soruşaraq yoxlayın. Sonra birlikdə emosiyanı təhlil edin.

Psixoloq təklif olunan məşqləri həmyaşıdları ilə ünsiyyətdə çətinlik çəkən şagirdlərə də tövsiyə edə bilər. S.L.Rubinşteyn, L.S.Vıqotski, R.S.Nemov, A.A.Leontyev, B.F.Lomov, M.İ.İlyasov, Ə.S.Bayramov, Ə.Ə.Əlizadə, M.Ə.Həmzəyev, S.F.Əmiraslanova, R.İ.Əliyev və b. ciddi şəkildə araşdırmışlar.

Psixoloji təsir problemi yalnız o halda uğurla həll oluna bilər ki, təsir prosesi qarşılıqlı təsir kimi nəzərdən keçirilsin. Hər iki tərəfin dəyişdiyi hər hansı bir hərəkət belə qarşılıqlı əlaqənin əsas vasitəsidir. Bu baxımdan psixoloji pedaqoji qarşılıqlı fəaliyyətin dəstəklənməsi, şagird şəxsiyyətinin formalaşmasına töhfə verməklə müəllimin şəxsiyyətinin təkmilləşdirilməsi pedaqoji ünsiyyət prosesində psixoloji təsir problemi inkişaf etdirən proses və yol kimi çıxış edir.

Müəllimin nitq tonunda, jestlərində, duruşunda, mimikasında öz hisslərini və reallığa münasibətini ifadə etməsi, əhval-ruhiyyəsi təkcə onun nitqinin vəzifə və məzmununa deyil, həm də auditoriyanın xüsusiyyətlərinə, onun gözləntilərinə, maraqlarına uyğun olmalıdır. Dinləyicilərin fərdi suallarına, iradlarına, nidalarına, mimikalarına və dinləmələrinə əsaslanaraq, izahın necə qəbul edildiyini mühakimə etmək, onun tempini və məzmununu dəyişdirmək mümkündür.

**Problemin aktuallığı.** Pedaqoji ünsiyyət prosesində psixoloji təsir vasitələrindən istifadə probleminin öyrənilməsində əsas məqsəd şagirdlər arasında qarşılıqlı ünsiyyət vasitələrinin səmərəliliyinin təhlilini verməkdən ibarətdir.

**Problemin elmi yeniliyi.** Pedaqoji ünsiyyət prosesində psixoloji təsir vasitələrindən istifadənin rolunu müəyyənləşdirmək və problemlə əlaqədar bir sıra faydalı tövsiyələrin irəli sürülməsindən ibarətdir.

**Problemin praktik əhəmiyyəti və tətbiqi.** Məqalədən elmi yaradıcılıq işində bu mövzu ilə maraqlananlar, psixoloq və pedaqoqlar, eləcə də ali və orta ixtisas məktəblərinin tələbə və magistrləri istifadə edə bilərlər.

**Ədəbiyyat:**

1. Bayramov, Ə.S., Əlizadə Ə.Ə. Sosial psixologiya / – Bakı, -2003. - s. 300-302
2. Həmzəyev, M.Ə. Pedaqoji psixologiya. / M.Ə. Həmzəyev – Bakı, -2003. -s. 62-65.
3. Əmiraslanova, S.F. Ünsiyyətdə maneələr və onların aradan qaldırılması haqqında / S.F. Əmiraslanova - Bakı: ADU-nun Elmi xəbərləri, -2003, № 3, -s. 330-334.
4. Qədirova, R.H. Ünsiyyət psixologiyası: Dərs vəsaiti / R.H. Qədirova. -Bakı, -2016. -152 s.
5. Ефимова, Н.С. Психология общения. Практикум по психологии: Учебное пособие / Н.С. Ефимова. -М.: ИД ФОРУМ, НИЦ ИНФРА-М, 2013. - 192 с.
6. Еникеев, М.И. Общая и социальная психология: Учебник. / М.И. Еникеев. - М.: Норма, НИЦ ИНФРА-М, 2013. - 640 с.


**E-mail:** gulnare.alixanova@mail.ru
**Redaksiyaya daxil olub:** 27.11.2024

*UOT 37.015.3*

***Fəridə Oktay qızı Nəbiyeva***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Məktəbəqədər təhsilin pedaqogikası kafedrasının baş müəllimi*
*https: // orcid.org/0000 0002 6397 0886*
*https://doi.org/10.69682/arti.2024.91(6).260-263*

## UŞAQLARIN ƏQLİ İNKİŞAFINDA ƏTRAF ALƏMİN ROLU

***Фарида Октай гызы Набиева***
*старший преподаватель кафедры педагогики дошкольного образования Азербайджанского Государственного Педагогического Университета*

## РОЛЬ ОКРУЖАЮЩЕЙ СРЕДЫ В УМСТВЕННОМ РАЗВИТИИ ДЕТЕЙ

***Farida Oktay Nabiyeva***
*senior lecturer of the department of Preschool education pedagogy of Azerbaijan State Pedagogical University*

## THE ROLE OF THE ENVIRONMENT IN THE MENTAL DEVELOPMENT OF CHILDREN

**Xülasə.** Məqalədə uşaqların zehni inkişafında ətraf mühitin rolundan bəhs edilir. Uşaqlar həmişə təbiətlə bu və ya digər şəkildə təmasda olurlar. Rəngarəng təbiət uşaqları əməyə, yaradıcı fəaliyyətə, müxtəlif oyunlara cəlb edir, onların inkişafı üçün şərait yaradır. Eyni zamanda təbiəti olduğu kimi eşitməyə və anlamağa çalışırlar.
***Açar sözlər:*** *uşaqlar, ətraf aləm, idrak, ünsiyyət, təsəvvür*

**Аннотация.** В статье повествуется о роли окружающей среды в умственном развитии детей. Дети всегда так или иначе соприкасаются с природой. Красочная природа привлекает детей к труду, творческой деятельности, различным играм и создает условия для их развития. При этом они стремятся услышать и понять природу такой, какая она есть.
***Ключевые слова:*** *дети, окружающая среда, познание, общение, воображение*

**Abstract**. The article talks about the role of the environment in the mental development of children. Children are always in contact with nature in one way or another. Colorful nature attracts children to work, artistic activities, various games and creates conditions for their development. At the same time, they strive to hear and understand nature as it is.
**Keywords** *: children, environment, cognition, communication, imagination*

Məktəbəqədər yaşlı uşaqların inkişaf prosesinin əsasını ətraf aləmlə tanışlıq təşkil edir. Belə ki, dünyaya yeni göz açmış uşaq, daxilində olduğu cəmiyyətlə birbaşa əlaqəyə girir, canlı və cansız təbiətlə tanış olur, eyni zamanda, ünsiyyət baş verir. Kiçik yaşlı uşaqlarda ətraf aləm haqqında ilkin təsəvvürlər yaradılır, onlarda canlı təbiətin həyatını öyrənməyə maraq yaranır. Ümumiyyətlə, məktəbəqədər yaşlı uşaqların ətraf aləmlə tanışlıq prosesi bu istiqamətlərdə aparılır:

1) canlı və cansız təbiət haqqında ilkin anlayış;

2) canlı təbiətə sevgi hissini aşılamaq və xeyirxah münasibəti tərbiyə etmək;

3) canlıların həyatını öyrənməyə maraq yaratmaq;

4) ətrafda rastlaşdığı əşyalarla tanışlıq və düzgün istifadəni aşılamaq;

5) təbiət və ictimai hadisələr arasında səbəb-nəticə əlaqəsini yaratmaq;

6) ətrafı müşahidə və müqayisə etmək bacarıqlarının öyrədilməsi;

7) böyüklərin əməyi ilə tanışlıq, əməyə qarşı sevgi yaratmaq;

8) peşələrlə tanışlıq və sair.

"Təbiəti canlı orqanizm adlandıranlar heç də səhv etməmişlər. Doğrudan da insan təbiət ilə ünsiyyətdə olarkən bunun nə qədər düzgün və vacib olduğunu görür. Biz təbiəti özümüz sevdiyimiz kimi, uşaqlara da sevdirməyi bacarmalıyıq. Dövlət başçımızın müvafiq sərəncamlarına əsasən son illər ölkəmizin müxtəlif yerlərində yeni-yeni parklar salınmış, qoruqların əraziləri genişləndirilmişdir. "Ekologiya ili" gələcək nəsillər üçün sağlam mühitin qorunması deməkdir. Hər bir Azərbaycan vətəndaşı öz əməli və əməyi ilə bu işə töhfə verməlidir. Torpağa və Vətənə olan sevgini bu cür işlər görməklə (ağac əkməklə, gül becərməklə, torpağı belləməklə və s.) uşaqlara öyrətmək mümkündür. Bunu əyani olaraq uşaqların muzeylərə, tarixi abidələr və təbiətin gözəl guşələri olan parklara və bağlara gəzintilərini təşkil etməklə həyata keçirmək olar. Bu cür səyahətlərdən sonra uşaqlar arasında çox maraqlı diskussiyalar başlanır və sual-cavablar meydana çıxır. Belə gəzintilər uşaqlar üçün istər televiziyada göstərilən verilişlərdən, istərsə də İnternet və kompüter oyunlarından daha maraqlı və cəlbedici olur. Sadəcə bu həvəsi uşaqlarda oyatmaq lazımdır" (1).

Məktəbəqədər təhsil müəssisələrində uşaqların öz xalqına, Vətəninə məhəbbət hissinin formalaşması üçün onlarda doğulub boya-başa çatdığı, yaşadığı yerə, xalqının tarixinə, adət-ənənələrinə, mədəniyyətinə münasibət hissi tərbiyə edilir. Bu məqsədlə məktəbəqədər təhsil müəssisələrində həyata keçirilən ətraf aləmlə tanışlıq məşğələləri tərbiyə prosesinin əsasını təşkil edir.

Uşağın şəxsiyyətinin inkişafı olduqca mürəkkəb prosesdir. Bu proses xarici və daxili amillərin təsiri altında formalaşır. Xarici amilə sosial mühit (valideynlərin təsir edə biləcəyi) aiddir. Daxili amilə isə biologiya və irsiyyət daxildir, hansı ki, bu, bizim nəzarətimizdən kənardadır.

Uşağın intellektual, psixoloji, əxlaqi inkişafı üçün başlıca olaraq cəmiyyət böyük əhəmiyyət kəsb edir. Uşaq doğulduğu ilk andan etibarən daima ətrafı ilə əlaqədədir. Uşaq gündən-günə böyüyür, böyüdükcə isə sosial əhatə dairəsi genişlənir. Eyni zamanda uşaq ətrafla daim uyğunlaşır və özü üçün daha yaxşı başa düşüləcəyi, hörmət edildiyi və özü kimi qəbul ediləcəyi ən rahat mühiti axtarır. İlk olaraq ailənin psixoloji və maddi rifahı uşağın şəxsiyyətinin inkişafına müsbət təsir göstərir. Belə ki, uşaq özünü təhlükəsiz hiss edir, qorxu və narahatlıq hissi keçirtmir. Daha sonra bağçada uşaq üçün həm sağlamlığını dəstəkləyəcək, həm ümumi inkişafının qayğısına qalınacaq, həm də özünü rahat hiss edəcəyi təhlükəsiz şərait yaradılır: gündəlik rejim, yaradıcı zehni və idman yükü, gəzintilər, balanslaşdırılmış qida rejimi və sair. Eyni zamanda uşaq bağçada böyüklərlə və yaşıdları ilə ünsiyyətə girir, oyunlarda iştirak edir. Beləliklə, uşaqda təhsil və yaradıcılıq fəaliyyətində, öz fəaliyyətinin təzahürü xarakterinin inkişafında ünsiyyət zamanı nitqinin inkişafı özünü göstərir. Məhz uşaq bağçası körpənin böyüdüyü, cəmiyyətlə ünsiyyət qurmağı öyrəndiyi, ünsiyyət təcrübəsini zənginləşdirdiyi mikro mühit kimi ilk yerlərdən birinə gəlir.

Böyüməkdə olan uşaqlar ünsiyyət, fəaliyyət və şüurla inkişaf edir, sosiallaşırlar. Daha sonra bu prosesdə sosial-mədəni mühit həlledici rol oynayır. Bildiyimiz kimi, uşağın şəxsiyyətinin inkişafına ətraf mühitin təsiri böyükdür.

Ətraf aləm nədir? Bir insan üçün ətraf mühit onun həyat fəaliyyətinin zonasıdır. Bu zona bir çox amillərin kompleksidir: təbii, mədəni, sosial, siyasi, məişət və sair. Ətraf mühitin uşağın inkişafına təsiri müxtəlif funksiyaları yerinə yetirən yaxın və uzaq cəmiyyət prizmasından idarə olunur. Ailə maddi şəraiti, təhlükəsizliyi təmin edir, mənəvi münasibətləri aşılayır, uşaqların maraqlarını müəyyən edir. Cəmiyyət sayəsində insan qarşılıqlı əlaqə qurmağı, özünü başqaları ilə müqayisə etməyi öyrənir, davranış qaydalarını qəbul edir.

Hər şeyin təməli ailədən başladığı kimi, ətraf mühitlə tanışlıq prosesinin təməli də ailədə qoyulur. Valideynlər tərəfindən bəzi qaydalar həyata keçirilir ki, bunlar da uşağın həm zehni, həm də fiziki fəaliyyətini inkişaf etdirir. Məsələn, düzgün gün rejimini tətbiq etmək, sağlam və düzgün qidalanmaq, birlikdə aparılan açıq hava gəzintiləri, zehni inkişaf etdirən oyunlar və sair.

“Təbiətlə tanışlıq uşağın idrak prosesinin mühüm bir mərhələsi kimi bu prosesin bir sıra məsələlərini özündə əks etdirir. Təbiətlə fəal ünsiyyət prosesində uşaq özünü canlı təbiətin bir üzvü, parçası kimi dərk edir və təbiətə fəal müdaxiləsinin mümkünlüyünü hiss edir. Ağac əkmək, gülləri sulamaq, heyvanlara qulluq və s. kimi proseslərdə uşaq təbiəti bizim fəaliyyətimizlə dəyişən bir mühit kimi qavrayır. Məktəbəqədər yaşlı uşaqların təbiətlə tanış edilməsi, onları əhatə edən təbiət haqqında realist biliklər alması vasitəsidir və hissi təcrübədə ,ona düzgün münasibətin əsasıdır” (2).

Kiçik yaşda uşaqların intellektual qabiliyyətləri “yaxın inkişaf zonası” yaratmaqla inkişaf etdirilir. Nədir “yaxın inkişaf zonası”? Bu, əqli inkişafın iki səviyyəsindən biridir ki, bu zaman uşaq yaşlıların - müəllimlərin, valideynlərin köməyi ilə bir nailiyyətlər əldə edirlər. Məhz belə inkişaf səviyyəsini “inkişafın yaxın zonası” kimi L.S. Viqotski adlandırmışdır. Deməк belə bir yanaşma vasitəsilə, bir yetkin uşağın formalaşmasının başlanğıcında olan bacarıqlarına diqqət yetirilir. Böyüklərin dəstəyi ilə onlar tədricən “əsl inkişaf sahəsi”nə keçid etmiş olurlar. Bu zaman obyekt - məkan mühiti uşaqların fəaliyyət sahəsini zənginləşdirir.

Araşdırmalar göstərir ki, pedaqogika baxımından uşağa ən yaxın sosial mühit onun uyğunlaşmalı olduğu ilk cəmiyyət modeli kimi qəbul edilir. Beləliklə, gələcəkdə o, bu təcrübəsini oxşar vəziyyətdə istifadə edə biləcək. Uşaq həm ətraf mühitə uyğunlaşır, həm də müxtəlif sosial rolları - oğul, qız, şagird, tələbə, rəhbər və sair kimi yerinə yetirir. Əvvəlcə, uşaq inkişaf prosesində müxtəlif fəaliyyət növlərinin forma və vasitələrini mənimsəyir, genişləndirir. Daha sonra, özündə “mən“ imicini formalaşdırır.

Hər hansısa bir mövzu ətrafında araşdırmalar, müşahidələr aparan uşaq öz fikirlərini deməkdən çəkinmir. Beləliklə, monoloji nitqi inkişaf edir.

Sosiallaşma prosesi 3 sahədə özünü göstərir:

1) Fəaliyyət
2) Ünsiyyət
3) Şüur

Ətraf aləmlə qarşılıqlı münasibətdə olan uşaq daima fəaliyyətdədir. Təbiətdə baş verən hadisələri izləyir, araşdırır, müşahidə edir. Yeni məlumatlarla qarşılaşan uşaq öz yaddaşının məhsulu ilə yeni öyrəndiyi məlumatları bir araya gətirir. Bunlar arasında oxşar və fərqli cəhətləri aydın şəkildə müqayisə edir.

İnsan ruhu şüurun köməyi ilə ətrafdakı reallığı əks etdirə bilməsi qabiliyyətinə malikdir. Uşağın ardıcıl olaraq şüurunun formalaşmasına diqqət yetirək:

1. Oyanmış şüur - 0-1 yaşa qədər olan dövrü əhatə edir. Bu, bioloji ehtiyacların tərifi kimi izah olunur.

2. Obyekt şüuru - 1-3 yaşa qədər uşaqlarda olur. Bu, reallıq haqqında təəssüratların formasını özündə təzahür etdirir.

3. Fərdi şüur - 4-9 yaşa qədər olan dövrləri əhatə edir. Bu, zaman uşağın tam mənalı “mən” anlayışı yaranır.

4. Kollektiv şüur - 9-16 yaşa qədər olan dövrü əhatə edir. Bu dövrdə uşaq reallıq və özü haqqında fikirlərini bildirir, özü ilə ətraf mühit arasındakı əlaqəni dərk edir.

5. Reflektiv şüur - 16-22 yaşa qədər olan dövrü əhatə edir. Bu zaman uşaq özünə diqqət yetirir. Psixi vəziyyətini təhlil etmək bacarığına malikdir.

Həm mühit, həm ekologiya, həm də siyasi sistem uşaqların inkişafina təsir göstərir. Sosial dairədə əsas rol böyüklərə verilir. Böyüklər dəyərlərin daşıyıcısı, sosial təcrübənin tərcüməçisi, uşaqla xarici dünya arasında vasitəçi rolunu oynayır. Qeyd etdiklərimdən belə bir nəticəyə gələ bilərik:

1. Uşağın şəxsiyyəti ətraf mühitin təsiri altında inkişaf edir.

2. Uşağın hansı cəmiyyəti əhatə etməsi böyüklərdən asılıdır.

3. Uşaq fəaliyyət, şüur və ünsiyyət vasitəsilə ictimailəşir.

Uşaqlar həmişə olduqları hər yerdə təbiətlə təmasda olurlar. Yaşıl meşələr, çəmənliklər, rəngarəng çiçəklər, kəpənəklər, göydə hərəkət edən buludlar, uçan quşlar, kiçik həşəratlar, çaylar, yağan qar dənəcikləri, hətta, yağış yağandan sonra yaranan gölməçələr - bir sözlə, bunların hamısı uşaqları cəlb edir, onları sevindirir, inkişafı üçün zəngin qida ilə təmin edir. Bildiyimiz kimi, təbiət tükənməz bilik mənbəyidir: qar yağır, günəş çıxır, yağış yağır, yarpaqlar saralır, quşlar uçur və sair. Bütün bunlar uşaq üçün müəyyən dərəcədə gözəldir. Ətraf aləm onun sehirli dünyasıdır. Hər şeylə ilk dəfə tanış olan balaca uşaq üçün rastlaşdığı hər

şey maraqlıdır. Məhz bu məqsədlə kiçik yaşlı uşaqlar tez-tez suallar soruşurlar. Məktəbəqədər yaşlı bir uşağın anası ilə yolla gedərkən ondan saysız-hesabsız suallar soruşduğu ilə yəqin ki, qarşılaşmısız. Onların nitqinin əsasını "nədir?" sual ədatı tutur. Vacib deyil ki, hər hansısa oyunu təşkil edərək uşağı yeni məlumatlarla silahlandıraq. Təkcə onun suallarını anlayacağı və aydın şəkildə cavablandıraraq ona yeni şeylər öyrədə bilərik.

Göründüyü kimi, uşaqları ətraf aləmlə tanış etmək üçün mütləq deyil ki, hər hansısa didaktik oyun təşkil edək və ya vəsaitlər istifadə edək. Ətrafı, təbiəti öyrəndiyimizdə təbiət özü bizim üçün əyani vəsaitdir.

Kiçik yaşlı uşaqlar bir çox şeyi əlləri ilə toxunaraq anlayırlar. Bu onların "maraq"larının ikinci mərhələsidir. Birinci mərhələ gördükləri əşyalar haqqında soruşduqları suallar idi. Bu mərhələdə isə artıq adını öyrəndiyi əşyaya toxunmağı, duymağı istəyir. Məsələn, şam ağacının adını öyrənən uşaq onun yarpaqlarına toxunaraq digər ağac yarpaqlarından fərqini anlayır. Və ya şam ağacının qozalarını əllərində tutaraq onun sərt və quru olduğunu anlayır. Alimlərin fikrinə görə, uşaqlar əlləri ilə nə qədər öyrənsələr o əşya haqqında bir o qədər çox məlumat əldə edəcəklər. Toxunarkən mütləq emosiyaları müəyyən etməliyik: isti, soyuq, bərk, yumşaq, quru və yaş və sair. Körpələrimizə "gözəllik dünya"sını yavaş-yavaş təqdim etməliyik. Onlara təbiət, bitki və heyvanlar haqqında kitablar oxumalıyıq. Daha sonra böyük rəssamların mənzərələrinin reproduksiyaları ilə uşaqları tanış edə bilərik. Kiçik yaşlı uşaqları bitki dünyası ilə tanış edərkən ilk olaraq uşaqları, ağacların, güllərin adları ilə tanış etməliyik. Bu proses hər gün gəzintiyə çıxan, bitkilər dünyasını kəşf edən uşaq üçün çətin olmayacaq. Bacardığımız qədər bitkiləri onlara təsnif etməyə çalışmalıyıq: ağaclar, kollar, yarpaqlar, otlar, meyvələr, tərəvəzlər, çiçəklər və sair. Bitkilərin tanışlığı zamanı tematik albomlar hazırlaya və təqdim edə bilərik. Kiçik yaşlı uşaqları bitkilərlə tanış edərkən, əvvəlcə, sadə bitkilərlə tanış etməliyik. Yəni uşağın demək olar ki, hər gün gördüyü bitkilərdən bəhs etmək daha məqsədəuyğundur. Uşaqları gördükləri bitkilərə diqqətlərini yönəltməyi, fərqləri ayırd etməyə cəlb etməliyik. Məsələn, yarpaqların forması, çiçəklərin rəngi və qoxusu, ağacın gövdəsinin hündürlüyü, yarpaqların rəngləri və sair.

**Problemin aktuallığı**. Kiçik yaşlı uşaqları heyvan dünyası ilə tanış edərkən bütün yaş dövrlərində uşaqlar üçün heyvanlar daima diqqət mərkəzində olmuşdur. Xüsusilə, uşaqlar ən yaxın dördayaqlı dostları olan it və pişikləri çox sevirlər. Heç düşünmüsünüzmü niyə uşaqların heç biri onlara qarşı belə laqeyd deyillər? Bəlkə də yaxınlıqlarını və ya daxili azadlıqlarını onlarda tapırlar. Artıq yavaş-yavaş müşahidə edərək öyrənməyə başlayırlar.

**Problemin yeniliyi**. Uşaqlar gördükləri heyvanların quyruğunu çəkib, qulaqlarını çıxarmağa çalışırlar. Məqsəd sonradan nə baş verəcəyini görmək istəmələridir. Əslində, bu da bir təcrübədir. Kiçik yaşlı uşaqlarımızı heyvanlar aləmi ilə tanış edərkən onlarda canlılara qarşı qayğı göstərməyi öyrətməliyik.

**Problemin praktik əhəmiyyəti**. Əldə olunmuş nəticələr müxtəlif məşğələlərdə kiçik yaşlı uşaqları heyvanlar aləmi ilə tanış etmənin ən səmərəli yollarından biri onları parklara, gəzintilərə, ekskursiyalara, zooparka aparmaqdır. Bitkilər aləmində olduğu kimi, heyvanlar aləmində də tanışlıq zamanı albomlardan, kartlardan istifadə edə bilərik.

Beləliklə, uşaqların əqli inkişafında ətraf aləmin rolu qeyd etdiyim faktlarla xarakterizə olunur və bu amillərin həyata keçirilməsi mühüm əhəmiyyət daşıyır.

**Ədəbiyyat:**


1. Məktəbəqədər təhsil proqramı (Kurikulum) / Bakı, 2022. – 54 s.
2. Mursaqulova, R.N. Əliyeva Ş.Q. Məktəbəqədər yaşlı uşaqların təbiətlə tanış edilməsi metodikası / R.N. Mursaqulova, Ş.Q. Əliyeva. - Bakı, ADPU nəşriyyatı, - 2008. – 416 s.
3. http://www.anl.az/down/meqale/az_muellimi/2010/noyabr/141489.htm
4. 4.http://zim.az/elm/elmi-meqaleler/5359-sadt-ahplngova-traf-alml-taniliin-mzmunu-v-hmyyt.html



**E-mail:** feridesemedzadə@gmail.com



**Redaksiyaya daxil olub:** 27.11.2024


*UOT 159.9.*

***Ayşən Fəxrəddin qızı İsmayılova***
*Mingəçevir Dövlət Universitetinin*
*pedaqogika və psixologiya kafedrasının müəllimi*
*https://orcid.org/0000-0002-9815-0757*
*https://doi.org/10.69682/arti.2024.91(6).264-267*

***Günel Alim qızı Nəcəfova***
*Mingəçevir Dövlət Universitetinin*
*pedaqogika və psixologiya kafedrasının müəllimi*
*https://orcid.org/0009-0000-3700-9389*

***Zülfiyyə Vaqif qızı Tanrıverdiyeva***
*Mingəçevir Dövlət Universitetinin*
*pedaqogika və psixologiya kafedrasının müəllimi*
*https://orcid.org/0009-0003-0995-1961*

# PSİXOLOJİ VƏ PEDAQOJİ ƏDƏBİYYATDA MƏKTƏBƏQƏDƏR YAŞLI UŞAQLARIN ADAPTASİYA VƏ DESADAPTASİYA PROBLEMİ

***Айшен Фахреддин гызы Исмаилова***
*преподаватель кафедры Педагогики и психологии*
*Мингячевирского Государственного Университета*

***Гюнель Алим гызы Наджафова***
*преподаватель кафедры Педагогики и психологии*
*Мингячевирского Государственного Университета*

***Зульфия Вагиф гызы Танрывердиева***
*преподаватель кафедры Педагогики и психологии*
*Мингячевирского Государственного Университета*

# ПРОБЛЕМА АДАПТАЦИИ И ДЕЗАДАПТАЦИИ ДЕТЕЙ ДОШКОЛЬНОГО ВОЗРАСТА В ПСИХОЛОГО-ПЕДАГОГИЧЕСКОЙ ЛИТЕРАТУРЕ

***Ayshan Fakhraddin Ismayilova***
*lecturer of the Pedagogy and psychology department at Mingachevir State University*

***Gunel Alim Nadzhafova***
*lecturer of the department of Pedagogy and psychology at*
*Mingachevir State University*

***Zulfiya Vagif Tanryverdiyeva***
*lecturer of the department of Pedagogy and psychology*
*at Mingachevir State University*

# THE PROBLEM OF ADAPTATION AND DISADAPTATION OF PRESCHOOL CHILDREN IN PSYCHOLOGICAL AND PEDAGOGICAL LITERATURE

**Xülasə.** Adaptasiya çətinliyi insanlarda, xüsusilə kiçik yaşlı uşaqlar və yeniyetmələr arasında tez-tez rast gəldiyimiz problemlərdən biridir. Məqalə psixoloji və pedaqoji ədəbiyyatda məktəbəqədər yaşlı uşaqların məktəbəqədər müəssisələrə uyğunlaşması və uyğunlaşmaması probleminin nəzərdən keçirilməsinə həsr edilmişdir. "Uyğunlaşma" anlayışının ümumi mənası nəzərdən keçirilir. Bu mövzuda alimlərin və psixoanalitiklərin uşaqların adaptasiya və desadaptasiya haqqında apardıqları araşdırmalar nəzərdən keçirilir.

***Açar sözlər****: məktəbəqədər yaşlı uşaqlar, sosial mühit, sosial uyğunlaşma, uşaq şəxsiyyəti, psixoloji və pedaqoji ədəbiyyat.*

**Аннотация.** Трудности с адаптацией-одна из проблем, с которыми мы часто сталкиваемся у людей, особенно среди детей младшего возраста и подростков. Статья посвящена рассмотрению проблемы адаптации и дезадаптации детей дошкольного возраста к дошкольным учреждениям в психолого-педагогической литературе. Рассмотрен общий смысл понятия «адаптация». В этой теме рассматриваются исследования ученых и психоаналитиков об адаптации и десадаптации детей.
***Ключевые слова:*** *дети дошкольного возраста,социальная среда,социальная адаптация, личность ребенка, психолого-педагогическая литература*

**Abstract.** Adaptation difficulties are one of the problems that we often encounter in humans, especially among young children and adolescents. The article is devoted to the consideration of the problem of adaptation and non-adaptation of children of preschool age to preschool institutions in the psychological and pedagogical literature. The general meaning of the concept of" adaptation " is considered. On this topic, research by scientists and psychoanalysts on the adaptation and desadaptation of children is considered.
***Keywords:*** *children of preschool age, social environment,social adaptation,child personality,psychological and pedagogical literature.*

Psixoloji ədəbiyyatda uyğunlaşmanın öyrənilməsi şəxsiyyətin inkişafı və formalaşmasının ümumi kontekstində nəzərdən keçirilir. Təhsil müəssisələrində və məktəbəqədər təhsil müəssisələrində müəssisələrində də uşaqlar sosiallaşarkən, sosial aktivlik və uyğunlaşma səviyyəsini nümayiş etdirir. Alimlərin dediyi kimi, sosial uyğunlaşma şəxsiyyətin sosiallaşmasının mexanizmlərindən biridir [1].

Adaptasiya çətinliyi insanlarda, xüsusilə kiçik yaşlı uşaqlar və yeniyetmələr arasında tez-tez rast gəldiyimiz problemlərdən biridir. Adaptasiya sözü latınca olan "*adaptatio*" uyğunlaşdırıram sözündən götürülüb və uyğunlaşma deməkdir. Yəni uşağın, yeniyetmənin tanımadığı bir mühitdə düşərkən ora uyğunlaşma mərhələsidir. Burada bəzi valideynlərin də etdiyi yanlışlıqlar vardır ki, onlar uşaqlardan yeni bir mühitə düşərkən qısa zaman ərzində ora uyğunlaşmasını, ətrafdakı insanlarla, həmyaşıdları ilə ünsiyyət qurmasını istəyirlər. Ancaq bu doğru yanaşma üsulu deyil. Çünki, belə olduqda valideyn fərqində olmadan uşağın özgüvənini aşağı salır, onu utandırır, bunun özündə əskiklik kimi hiss etməsinə səbəb olur. Həmçinin, belə vəziyyətlərdə uşağın adaptasiya problemi nəinki həll yolunu tapır, əksinə bu proses daha da çətinləşir və uzanır. Adaptasiya müddəti normalda uşaqlarda, 5-15 dəqiqə arasında davam edə bilər. Bu dönəmdə uşaq yeni düşdüyü mühiti, insanları dərk etməyə, mühitin onun üçün əlverişli olub-olmadığını anlamağa çalışır. Əgər uşaqların adaptasiya müddəti qeyd edilən zamandan artıqdırsa, bu bir neçə saatı, hətta günü əhatə edirsə deməli, belə uşaqlarda adaptasiya problemi var. Bəzi uşaqlarda bu problem nəinki tanımadıqları mühitə və insana qarşı olur, həmçinin tanıdıqları, davamlı qonaq getdikləri yerlərə və ya yaxınlarına qarşı da ola bilir. Belə uşaqlar bağçada və irəli dönəmdə məktəbdə də adaptasiya problemi yaşayırlar. Əslində bağça və məktəb müddətinin də öz adaptasiya dönəmi var ki, bu 6 həftə, yəni 2 aya yaxın müddəti təşkil edir. Bu zaman aralığında uşaqların bağçaya, məktəbə getmək istəməmələri, ağlamaları, uyğunlaşa bilməmələri normal bir prosesdir. Lakin, bu müddət qeyd edilən zamandan uzun olarsa bu da uşaqda adaptasiya probleminin olmasına işarədir. Bəzən belə uşaqları özgüvənsiz uşaqlarla qarışdırırlar. Ancaq, belə yanaşma doğru deyil, bunlar oxşar görünsə də tamamilə fərqli problemlərdir. Əksinə, hiperaktiv uşaqlarda isə demək olar ki, belə bir çətinlik olmur. Ümumiyyətlə, hiperaktiv uşaqlarda adaptasiya probleminə demək olar ki, təsadüf olunmur və onlarda mühitə uyğunlaşma prosesi sürətli gedir.

"Uyğunlaşma" termini XVIII əsrin sonlarında fizioloqlar tərəfindən təqdim edilmişdir. Müasir psixologiya lüğətində deyilir ki, sosial-psixoloji uyğunlaşma fərdi inkişafın müxtəlif dövrlərində sosial şəxsiyyətin strukturunun formalaşması mexanizmidir. Bu, şəxsiyyətlərarası münasibətlər sistemində müşahidə oluna bilər və şəxsiyyətin inkişafında müəyyən meyarlarla əlaqələndirilir [3].

Uyğunlaşma problemi cəmiyyətdə müstəqil həyata hazırlaşarkən ən mühüm vəzifələrdən biri hesab olunur. Uyğunlaşma, məlum olduğu kimi, bir-biri ilə əlaqəli və bir-birinə təsir edən üç

*UOT 159.9.*

***Könül Akif qızı Xuda-Zadə***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin müəllimi*
*orcid.org/0000-0002-0374-6911*
*https://doi.org/10.69682/arti.2024.91(6).279-283*

# MÜƏLLIM HAZIRLIĞINDA ŞƏXSİ – PSİXOLOJİ KEYFİYYƏTLƏRİN NƏZƏRƏ ALINMASI VƏ FORMALAŞDIRILMASI

***Кенуль Акиф гызы Худа-Заде***
*преподаватель Азербайджанского Государственного Педагогического Университета*

# УЧЕТ И ФОРМИРОВАНИЕ ЛИЧНОСТНО-ПСИХОЛОГИЧЕСКИХ КАЧЕСТВ В ПОДГОТОВКЕ УЧИТЕЛЕЙ

***Konul Akif Khuda-Zadeh***
*teacher of the Azerbaijan State Pedagogical University*

# CONSIDERATION AND DEVELOPMENT OF PERSONAL-PSYCHOLOGICAL QUALITIES IN TEACHER PREPARATION

**Xülasə.** Məqalədə müəllim şəxsiyyətinin formalaşmasının pedaqoji fəaliyyətin səmərəliliyindəki rolu araşdırılır. Müəllimin özünüifadə, özünüinkişaf və özünütəhlil bacarıqlarının inkişaf etdirilməsi, onun peşəkar və şəxsi keyfiyyətlərinin təkmilləşdirilməsi üçün əsas şərtlər kimi təqdim olunur.

Müəllimlərdən tələb olunan əsas bacarıqlar barəsində ətraflı psixopedaqoji şərh verilir. Müəllimlərin bilik səviyyəsi və bu bilikləri inteqrasiya etmə qabiliyyəti onların səriştəlilik və mükəmməllik dərəcəsini müəyyən edir. Səriştəli müəllim bilikləri qismən kombinə edə bilirsə, mükəmməl müəllim bu bilikləri bütöv şəkildə tətbiq edərək daha yüksək nəticələr əldə edir.
***Açar sözlər:*** *müəllim, hazırlıq, psixoloji, formalaşma, peşəkar.*

**Аннотация.** В статье исследуется роль формирования личности учителя в эффективности педагогической деятельности. Развитие у учителя навыков самовыражения, саморазвития и самоанализа представлено как основные условия для улучшения его профессиональных и личностных качеств.

Предоставляется подробный психолого-педагогический анализ ключевых навыков, требуемых от учителей. Уровень знаний учителей и их способность интегрировать эти знания определяют их компетентность и степень совершенства. Компетентный учитель может частично комбинировать знания, в то время как совершенный учитель применяет эти знания целостно, достигая более высоких результатов.
***Ключевые слова:*** *учитель, подготовка, психологический, формирование, профессиональный*

**Abstract.** The article explores the role of the formation of the teacher's personality in the effectiveness of pedagogical activity. It presents the development of the teacher's self-expression, self-development, and self-analysis skills as essential conditions for improving their professional and personal qualities.

A detailed psycho-pedagogical analysis is provided regarding the key skills required of teachers. The level of knowledge of teachers and their ability to integrate this knowledge determine their competence and degree of excellence. A competent teacher can partially combine knowledge, while an excellent teacher applies this knowledge as a whole, achieving higher results.
***Keywords:*** *teacher, preparation, psychological, formation, professional.*

Gələcək müəllimlərin hazırlanmasında onların şəxsi psixoloji keyfiyyətlərinin nəzərə alınması və formalaşdırılması, tədrisin effektivliyini təmin etmək baxımından mühüm əhəmiyyət daşıyır. Müəllimlik peşəsi üçün tələbələrin psixopedaqoji hazırlığı, yalnız peşə fəaliyyətinə başlamazdan əvvəl deyil, həm də onların gələcəkdə şagirdlərin şəxsiyyət kimi inkişafına təsir göstərmələri üçün vacib mərhələdir.

Müəllimlər öz peşələrini uğurla icra etmək üçün yalnız pedaqoji biliklərə deyil, eyni zamanda psixoloji tələblərə də cavab verməlidirlər. Bu səbəbdən, psixopedaqoji hazırlıq müəllim hazırlığının əsas istiqamətlərindən biri hesab edilir və bu proses tələbələrdə həm nəzəri, həm də praktik biliklərin formalaşdırılmasını nəzərdə tutur.

Müəllim hazırlığı üç əsas istiqamətdə həyata keçirilə bilər: fənn biliklərinin mənimsənilməsi, pedaqoji və didaktik tədqiqatların aparılması və praktik tədris təcrübəsinin əldə edilməsi. Lakin bu sahələrdə nəyin daha çox önəm daşıdığını və hansı biliklərin prioritet olduğunu müəyyənləşdirmək mühüm məsələdir. Məsələn, "peşə bilikləri" anlayışı altında, müəllimlərin hansı pedaqoji və didaktik fəaliyyətlə məşğul olacağını, bu fəaliyyətlər üçün hansı biliklərə ehtiyac duyulduğunu anlamaq vacibdir.

Şulmanın təklif etdiyi kimi, pedaqoji fəaliyyətin başa düşülməsi və həyata keçirilməsi prosesini bir neçə mərhələyə bölürlər: qavrama, dəyişiklik, tədris, qiymətləndirmə, rəy və düşünmə. Bu proseslərin öhdəsindən gəlmək üçün müəllimlərin pedaqoji məzmun, tədris proqramları və vəsaitləri barədə geniş biliklərə sahib olması lazımdır. Turner-Bisset isə müəllimlər üçün zəruri biliklərin bir siyahısını təqdim edir, bu biliklər arasında fənn bilikləri, kontekst və məqsədlər haqqında biliklər, didaktik hazırlıq və şagirdlərə dair biliklər yer alır. [9].

Beləliklə, müəllimlərin şəxsi təcrübəsi, inancları və ehtiyacları ilə birgə onların bilik bazasının inkişafı, peşəkar səriştənin təmin olunması üçün mühüm rol oynayır. Tədris edilən fənn bilikləri yalnız müvafiq elmi məlumatların öyrənilməsini deyil, həm də onların tədris prosesinə uyğunlaşdırılmasını tələb edir. Bu, müəllimlərin biliklərini həm nəzəri, həm də praktik səviyyədə effektiv şəkildə tətbiq etmə qabiliyyətini artırır.

Müəllimin öz peşəkar fəaliyyətində uğur qazanması üçün ilk növbədə nəyi hədəfləməli olduğunu və öz qabiliyyətlərinin hansı səviyyədə olduğunu anlaması vacibdir. Qabiliyyətlər, şəxsiyyətin ən mühüm və dəyərli cəhətlərindən biri olub, inkişaf etdirilə bilən xüsusiyyətlərdir. [5]. Əgər tələbələrin müəllim olmaq arzusu və motivasiyası varsa, onların peşə qabiliyyətlərini inkişaf etdirmək mümkündür. Qabiliyyətlər daha çox şəxsiyyətyönlü yanaşmaya malik insanlar arasında təzahür edir və zamanla güclənir.

Müəllimin peşəkar pedaqoji özünüdərki vacib amildir. [2] Əgər müəllim özünü peşəkar kimi tam və dəqiq təsəvvür etmirsə, onun pedaqoji fəaliyyətində uğurdan danışmaq çətindir. Bu özünüdərk prosesi, müəllimin peşə normalarını, qaydalarını və tələblərini mənimsəməsi və şəxsi keyfiyyətlərini qiymətləndirərək onları etalona çevirməsindən başlayır. Əgər müəllim, ideal müəllimin necə olmalı olduğu barədə təsəvvürə malik deyilsə, bu, onun özünü qiymətləndirməsini və inkişafını çətinləşdirir. Nəticədə, müəllimin peşə davranışını istiqamətləndirən şəxsi konsepsiya formalaşmır.

Bununla yanaşı, müəllimin yalnız öz keyfiyyətlərini tanıması yetərli deyil. O, həm də ətrafdakılara – şagirdlərə, iş yoldaşlarına və rəhbərliyə münasibətdə necə qəbul edildiyini başa düşməlidir. Müəllimin həm abstrakt, həm də konkret səviyyədə özünü digər peşəkarlarla müqayisə etməsi və başqalarının ona verdiyi dəyəri anlaması fəaliyyətin effektivliyini artırır. Şagirdlərin və iş yoldaşlarının rəyini nəzərə almaq müəllimdə peşəkar əminlik yaradır və inkişafına dəstək olur.

Tədqiqatlar göstərir ki, müəllim şəxsiyyətinin strukturunda özünüqiymətləndirmə mühüm yer tutur. Özünü adekvat qiymətləndirə bilməyən müəllim, həm öz fəaliyyətini, həm də başqalarının gözləntilərini düzgün idarə edə bilmir. Bu proses, adətən, pedaqoji təcrübə zamanı tədricən formalaşır və müəllimin peşəkar fəaliyyətində sabit "Mən – konsepsiyası"nın yaranmasına səbəb olur. Bu konsepsiya, müəllimin özünü və fəaliyyətini qiymətləndirməsində əsas rol oynayır.

Tədqiqatlar göstərir ki, müəllimin pozitiv "Mən-konsepsiyası" şagirdlərin də özləri haqqında müsbət təsəvvürlər formalaşdırmasının əsasını təşkil edir. Müəllim özünü inamlı və rahat hiss etdikdə, şagirdlərə qarşı daha xeyirxah və anlayışlı yanaşır. Öz peşə fəaliyyətində zəif tərəflərini başa düşmək və onları təkmilləşdirmək istəyi ümumi müsbət özünüqiymətləndirməni pozmur. Bunun əksinə, aşağı peşə özünüqiymətləndirməsinə malik olan müəllimlər müdafiəsizlik hissi keçirir, stress və narahatlıqdan irəli gələrək ətraf mühiti neqativ şəkildə qəbul edir və avtoritar üsluba yönəlirlər. Bu, onların psixoloji özünümüdafiə mexanizmi kimi çıxış edir. [6]

Müəllimin şəxsiyyətinin digər əsas xüsusiyyəti onun fərdi üslubudur. Fərdi üslub, pedaqoji fəaliyyətin və ünsiyyətin müəllim üçün

səciyyəvi olan üsullarını, ritmini və iş metodlarını əhatə edir. Bu üslub müəllimin psixoloji və fizioloji xüsusiyyətləri, keçmiş təcrübəsi və pedaqoji vəzifələri həll etmə tərzi ilə formalaşır. Optimal fərdi üslub, daha az vaxt və enerji sərf etməklə yüksək nəticələr əldə etməyə imkan verir. Müəllim öz fərdi üslubunda çalışdıqda daha az yorulur və işindən daha çox zövq alır.

Fərdi üslub müəllimin nüfuzunu da müəyyənləşdirir. Nüfuz, müəllimin şagirdlərə təsir etmək bacarığını, məsləhət vermək və qərarlar qəbul etmək hüququnu göstərir. Bununla belə, müəllimlik vəzifəsi nüfuz üçün şərait yaratsa da, onu avtomatik şəkildə təmin etmir.

Müəllimin başqa bir inteqral xüsusiyyəti onun yaradıcılıq potensialıdır. Pedaqoji məsələlərin qeyri-standart həlli yaradıcılığın əsas göstəricisidir və hər müəllim sinfə daxil olduqda bu prosesin iştirakçısına çevrilir. Pedaqoji fəaliyyətin standart metodlarının müəyyən vəziyyətlərdə qeyri-adekvatlığı müəllimi təbii şəkildə yaradıcılığa yönəldir.

Pedaqoji ustalıq da müəllim hazırlığında mühüm tələblərdən biridir. Bu, müəllimin öz peşəsinin əsaslarına yüksək səviyyədə yiyələnməsi və təcrübədə müasir metodların və layihələrin uğurla tətbiq edilməsindən ibarətdir. Usta müəllim öz biliklərini və metodlarını elmi və praktiki səviyyədə peşəkar şəkildə həyata keçirir. Bu, həm müəllimin fərdi inkişafını, həm də ümumi tədris prosesinin keyfiyyətini artırır.

Müəllimin pedaqoji ustalığı və yaradıcılığı onun tədris fəaliyyətində və şagirdlərə təsirində mühüm rol oynayır. Ustalıq müəllimin yalnız fənni dərindən bilməsi deyil, həm də bu biliyi effektiv şəkildə ötürmə bacarığıdır. [7]

Müəllimin peşəkar ustalıq səviyyəsinin xüsusiyyətləri

1. ***Dərin fənn bilikləri***: Müəllim yalnız öz fənnini yaxşı bilmək deyil, həm də fənlərarası əlaqələr quraraq digər sahələrdən əldə edilmiş məlumatları tədris prosesinə inteqrasiya etmək bacarığına malik olmalıdır. Bu yanaşma şagirdlərdə biliklərin vahid sistem kimi formalaşmasına kömək edir və onların analitik düşünmə qabiliyyətini artırır.

2. ***Fənlə bağlı inanclar***: Müəllimin tədris etdiyi fənnə dair inancları onun tədris strategiyalarına və şagirdlərlə münasibətlərinə əhəmiyyətli dərəcədə təsir edir. Tədqiqatlar göstərir ki, fənn haqqında "hərtərəfli" baxışlara sahib olan müəllimlər daha effektiv tədris metodları seçir və şagirdlərdə motivasiya yaradırlar.

3. ***Şagirdlər haqqında biliklər***: Şagirdlərin bioloji, sosial, psixoloji və koqnitiv inkişafı ilə bağlı biliklər müəllimə onların fərdi ehtiyaclarını daha yaxşı anlamasına və uyğun tədris metodlarını tətbiq etməsinə kömək edir.

4. ***Tədris metodologiyası***: Müəllimin pedaqoji metodların müxtəlifliyinə bələd olması, bu metodları adaptasiya etmək bacarığı təlimin effektivliyini artırır. Ətraflı və sistematik metodoloji yanaşma müəllim fəaliyyətinin keyfiyyət göstəricisidir.

Pedaqoji yaradıcılıq və novatorluq. Müəllimin pedaqoji yaradıcılığı onun peşəkar inkişafının ali səviyyəsidir. Pedaqoji yaradıcılıq şagirdlərə daha yaxşı öyrənmə imkanları yaratmaq üçün mövcud metodların təkmilləşdirilməsi və yeni yanaşmaların tətbiqidir. Novator müəllimlər təhsil prosesində innovativ üsullar tətbiq etməklə fərqlənirlər.

Novatorluğun xüsusiyyətləri**:**

- Problemləri təhlil etmək və orijinal həll yolları tapmaq bacarığı;
- Yeni ideyalar irəli sürmək və onları praktikada həyata keçirmək qabiliyyəti;
- Fərdi üslub və müəllif konsepsiyasının formalaşdırılması;
- Pozitiv və konstruktiv “Mən-konsepsiyası”, peşəyə olan sabityönlülük.

Novatorluq, həm də təhsil prosesində mövcud problemlərə fərqli yanaşma tətbiq edərək onların həllində əhəmiyyətli dəyişikliklər etməkdir. Bu, müəllimin öz şəxsi inkişafına və bütövlükdə təhsil sisteminin yenilənməsinə töhfə verir.

Usta və yaradıcı müəllimlər:

- Şagirdlərin təhsil nəticələrini yaxşılaşdırır;
- Tədris prosesini daha maraqlı və motivasiyaedici edir;
- Təhsil sisteminin ümumi inkişafına töhfə verir.

Bu xüsusiyyətlərin inkişaf etdirilməsi müasir təhsil prosesinin qarşısında duran əsas vəzifələrdən biridir. Müəllimlər yalnız öz bilik və bacarıqlarını təkmilləşdirməklə deyil, həm də yeniliklərə açıq olaraq təhsilin keyfiyyətini yüksəldə bilərlər.

Müəllimin şəxsiyyətinin formalaşması və inkişafı onun pedaqoji fəaliyyətində uğurlu və səmərəli olmasının əsasını təşkil edir. Bu

prosesdə müəllimin özünüifadə, özünüinkişaf və özünütəhlil bacarıqlarının inkişafı xüsusi əhəmiyyət kəsb edir.

Müəllim şəxsiyyətinin inkişafında vacib bacarıqlar

1. Peşəkar Sabitlik: Müəllim çətinliklərə qarşı möhkəm durmaq, öz peşəsinin sosial və ümumbəşəri əhəmiyyətini dərk etmək qabiliyyətinə malik olmalıdır. Bu, onun pedaqoji fəaliyyətinə sabitlik gətirir.

2. Pedaqoji qabiliyyətlər: Müəllim yalnız fənn üzrə deyil, həm də perseptiv (qavrayış), idarəetmə və motivasiya bacarıqlarını inkişaf etdirməlidir.

3. Emosional idarəetmə: Öz emosiyalarını dağıdıcı deyil, konstruktiv şəkildə idarə etmək qabiliyyəti müəllimin peşəkar münasibətlərinin müsbət istiqamətdə inkişafını təmin edir.

4. Pozitiv Mən-Konsepsiyası: Müəllim öz pozitiv və güclü tərəflərini dərk etməli, həmçinin şagirdlərinin imkanlarını dəstəkləməlidir.

5. Pedaqoji yaradıcılıq: Yaradıcılıq yeni və səmərəli tədris üsulları axtarışı və tətbiqidir. Novatorluq müəllimdən daimi inkişaf etməyi və innovativ düşüncəni tələb edir.

Müəllim şəxsiyyətinin psixoloji keyfiyyətləri

- Digərlərinə maraq və hörmət: Şagirdlərin təkrarsızlığını dərk etmək və bu fərqliliyə hörmətlə yanaşmaq qabiliyyəti müəllimin empatiyasını göstərir.
- Fərdi üslub: Müəllimin öz fərdiliyini başa düşməsi və ona uyğun fəaliyyət göstərməsi onun peşə mövqeyini möhkəmləndirir.
- Adekvat özünüqiymətləndirmə: Müəllimin öz fəaliyyətinə obyektiv yanaşması, konstruktiv tənqidi qəbul etməsi və bu yolla inkişaf etməsi onun peşəkar effektivliyini artırır.
- Motivasiya və yaradıcılıq meyli: Motivasiya müəllimin fəaliyyətinin əsas hərəkətverici qüvvəsidir, yaradıcılıq isə onun tədris prosesinə yenilik gətirir.

Səriştəli və mükəmməl müəllim fərqi

Müəllimlərin bilik səviyyəsi və bu bilikləri inteqrasiya etmək bacarığı onların peşəkarlıq dərəcəsini müəyyən edir:

- Səriştəli müəllim: Ayrı-ayrı bilik növlərini qismən kombinə edə bilir.
- Mükəmməl müəllim: Bütün bilik növlərini bütöv, effektiv bir sistem şəklində istifadə edir.

Peşə hazırlığında çətinliklər

Müəllim hazırlığında qarşıya çıxan əsas çətinliklərdən biri məktəb təcrübəsi ilə pedaqoji təhsilin inteqrasiyasının zəif olmasıdır. Psixoloji və pedaqoji biliklərin praktikaya tətbiqini təmin edəcək mexanizmlərə yiyələnmək müəllim hazırlığının ayrılmaz tərkib hissəsidir. [10]

Müəllimlərin şəxsiyyət keyfiyyətləri və özünütəhlil bacarıqları onların peşəkar fəaliyyətinin effektivliyinə birbaşa təsir edir. Özünüadekvat qiymətləndirmə və daimi özünütəhlil peşəkar yetkinliyə çatmaq üçün vacibdir. Əgər müəllim özünü yaxşı başa düşmürsə, başqalarının motivlərini və hisslərini də tam qavramaqda çətinlik çəkəcəkdir. Buna görə də, pedaqoji hazırlıq prosesində müəllimin şəxsiyyət keyfiyyətlərinin inkişafına diqqət yetirmək müasir təhsilin əsas prioritetlərindən biridir.

**Problemin elmi yeniliyi**. Müəllim hazırlığında şəxsi – psixoloji keyfiyyətlərin nəzərə alınması və formalaşdırılmasının psixopedaqoji məsələləri xüsusi prinsiplər nəzərə alınaraq müəyyənləşdirilmiş və tədqiqat istiqamətləri araşdırılmışdır.

**Problemin praktik əhəmiyyəti.** Müəllim peşəsinə hazırlığın səmərəliliyini təmin etmək üçün müəyyən edilmiş zəruri şəxsi psixoloji keyfiyyətlərin nəzərə alınması və formalaşdırılması gələcəkdə müəllim hazırlığında daha yüksək nəticələr əldə etməyə imkan verəcəkdir.

**Problemin aktuallığı.** Müəllimlər, tədris prosesində ən mühüm rolu oynayan şəxslərdən biridir və onların şəxsi və psixoloji keyfiyyətləri tədrisin effektivliyini birbaşa təsir edir. Bu baxımdan, müəllim hazırlığında şəxsi-psixoloji keyfiyyətlərin nəzərə alınması və formalaşdırılması məsələsi son dərəcə aktualdır.

**Ədəbiyyat:**


1. Bayramov Ə.S., Əlizadə Ə.Ə. Psixologiya: Ali məktəblər üçün dərslik / -Bakı: Maarif, -1989, -540 s.
2. Cabbarov R.V. Gerçəklik terapiyası və yaşamaq sənəti. / -Bakı: Zərdabi LTD, -2017, -216 s.
3. Həmzəyev M.Ə. Pedaqoji psixologiya / -Bakı: Maarif, -1991. -196 s. S. 170).
4. Əliyev B.H., Əliyeva K.R., Cabbarov R.V. Pedaqoji psixologiya: Dərslik / -Bakı: Təhsil, 2011, 256 s.,
5. ASKEW, M., BROWN, M., RHODES, V., WILIAM, D. & JOHNSON, D. (1997). *Effective teachers of numeracy.* Final report of a study carried out for the Teacher Training Agency, 1995-96 by the School of Education, King’s College, and London.

6. BEYER, L. (2002). The politics of standards and the education of teachers. *Teaching Education*, *13*, *3*, pp. 305-316.
7. BIRMAN, B.F., DESIMONE, L., PORTER, A. C. & GARET, M. S. (2000). Designing professional development that work. *Educational Leadership,* 57, *8,* pp. 28-33.
8. BROUWER, N. (2005). Can teacher education make a difference? *American Educational Research Journal*, *42, 1,* pp. 153-224.
9. CHEN, W. & ROVEGNO, I. (2000). Examination of expert and novice teachers' constructivist-oriented teaching practice using a movement approach to elementary physical education, *Research Quarterly for Exercise and Sport*, 71, pp. 357-372.
10. CONZI, A., HAGER, P. & OLIVER, L. (1990). *Establishing competency-based standards in the professions*. NOOSR Research paper No1. Department of employment, education and training: Canberra.

**E- mail:** konul.akbar.31@gmail.com
**Redaksiyaya daxil olub:** 02.12.2024.

*UOT 159.9.2.316.37*

***Улькер Узеир гызы Гасанова***
*диссертант по программе доктора философии*
*кафедры социальной и педагогической психологии*
*Бакинского Государственного Университета*

# ГЕНДЕРНЫЕ СТЕРЕОТИПЫ И ПРОФЕССИОНАЛЬНЫЙ ВЫБОР: ПЕРСПЕКТИВЫ СОЦИАЛЬНОЙ ПСИХОЛОГИИ

***Ülkər Üzeyir qızı Həsənova***
*Bakı Dövlət Universitetinin*
*Sosial və pedaqoji psixologiya kafedrasının*
*fəlsəfə doktoru proqramı üzrə dissertantı*
*https://orcid.org/0009-0006-6727-7647*
https://doi.org/10.69682/arti.2024.91(6).284-287

# GENDER STEREOTİPLƏRİ VƏ PEŞƏ SEÇİMİ: SOSİAL PSİXOLOGİYANIN PERSPEKTİVLƏRİ

***Ulkar Uzeyir Hasanova***
*doctorial student in the program of doctor of philosophy*
*of the department of Social and pedagogical psychology*
*at Baku State University*

# GENDER STEREOTYPES AND PROFESSIONAL CHOICE: PERSPECTIVES OF SOCIAL PSYCHOLOGY

**Аннотация.** В данной статье исследуется влияние гендерных стереотипов на профессиональный выбор с точки зрения социальной психологии. Анализируются различные теории и подходы, объясняющие, как социально сконструированные ожидания и предубеждения в отношении гендерных ролей влияют на карьерные решения индивидов. Особое внимание уделяется механизмам формирования гендерных стереотипов, их закреплению в обществе и влиянию на самооценку и мотивацию людей при выборе профессии.
***Ключевые слова:*** *гендерные стереотипы, профессиональный выбор, социальные предубеждения, самооценка.*

**Xülasə.** Bu məqalədə gender stereotiplərinin peşə seçiminə təsiri tədqiq edilir. Sosial olaraq qurulmuş cinsiyyət rollarına dair gözləntilərin və qərəzlərin fərdlərin karyera qərarlarına necə təsir etdiyini izah edən müxtəlif nəzəriyyələr və yanaşmalar təhlil edilir. Xüsusi diqqət gender stereotiplərinin formalaşma mexanizmlərinə, onların cəmiyyətdə möhkəmlənməsinə və insanların peşə seçimi zamanı özünüqiymətləndirmə və motivasiyasına təsirinə yönəldilir.
***Açar sözlər:*** *gender stereotipləri, peşə seçimi, sosial qərəzlər, özünüqiymətləndirmə.*

**Abstract.** This article examines the influence of gender stereotypes on professional choice from the perspective of social psychology. Various theories and approaches are analyzed to explain how socially constructed expectations and prejudices regarding gender roles affect individuals' career decisions. Particular attention is paid to the mechanisms of gender stereotype formation, their consolidation in society, and their impact on people's self-esteem and motivation when choosing a profession.
***Keywords:*** *gender stereotypes, professional choice, social prejudices, self-esteem.*

Гендерные стереотипы – глубоко укоренившиеся в обществе представления о том, какие качества, интересы и профессии являются типичными для мужчин и женщин. Эти

стереотипы, формирующиеся под влиянием семьи, образования, СМИ и культуры в целом, оказывают значительное влияние на наши представления о себе и окружающем мире, в том числе на выбор профессионального пути.

Профессиональный выбор – это один из важнейших жизненных решений, который во многом определяет качество жизни человека. Однако, этот выбор часто оказывается под влиянием социальных норм и ожиданий, в том числе и гендерных стереотипов. Традиционно сложившиеся представления о "мужских" и "женских" профессиях ограничивают возможности как мужчин, так и женщин, направляя их на определенные карьерные траектории.

Актуальность исследования обусловлена тем, что гендерные стереотипы продолжают оказывать существенное влияние на профессиональную ориентацию молодежи, несмотря на значительные социальные изменения и расширение прав женщин. Изучение этой проблемы позволит выявить механизмы, через которые гендерные стереотипы влияют на выбор профессии, а также разработать рекомендации для преодоления гендерных барьеров в профессиональной сфере.

Многочисленные исследования подтверждают, что гендерные стереотипы оказывают значительное влияние на профессиональные выборы. Женщины чаще выбирают традиционно "женские" профессии, такие как учитель, медсестра, а мужчины – "мужские" профессии, такие как инженер, программист [1; 5].

Для объяснения феномена гендерных стереотипов и их влияния на профессиональный выбор используются различные теоретические подходы.

Социальное научение: Согласно этой теории, люди усваивают гендерные роли и стереотипы путем наблюдения и подражания значимым взрослым [6]. Дети видят, какие профессии считаются подходящими для мужчин и женщин, и формируют соответствующие ожидания. В другом исследовании, ученые продемонстрировали, что дети склонны искажать информацию, чтобы она соответствовала их гендерным схемам. Например, если ребенку показать картинку женщины, занимающейся нетрадиционной для женщин профессией, он может переинтерпретировать эту информацию таким образом, чтобы она соответствовала его представлениям о женских ролях [8].

Когнитивная теория подчеркивает роль когнитивных процессов в формировании гендерной идентичности и стереотипов. Люди организуют информацию о мире в когнитивные схемы, которые включают в себя гендерные стереотипы. Эти схемы влияют на восприятие информации и принятие решений, в том числе и профессиональных. Исследования показывают, что люди склонны замечать и запоминать информацию, которая подтверждает их существующие убеждения, и игнорировать или искажать информацию, которая противоречит им [9]. Это явление, известное как подтверждение собственных убеждений, может привести к усилению гендерных стереотипов. Гендерные стереотипы могут влиять на внутреннюю мотивацию и самоэффективность.

Теория социального сравнения: Люди сравнивают себя с другими, чтобы оценить свои способности и возможности. Гендерные стереотипы влияют на то, с кем люди сравнивают себя и какие ожидания они формируют относительно своей будущей профессии. Как отмечает Вуд, гендерные стереотипы могут ограничивать представления о собственных возможностях. Например, если девочка постоянно слышит, что она не способна к математике, это может снизить ее уверенность в себе и уменьшить ее стремление заниматься этой наукой.

Теория ролевых ожиданий дополняет наше понимание того, как гендерные стереотипы влияют на профессиональные выборы. Согласно этой теории, социальные роли, связанные с гендером, формируют определенные ожидания и требования. Эти ожидания могут ограничивать профессиональные выборы, особенно для женщин. Например, стереотип о том, что женщины должны быть заботливыми и эмоциональными, может подталкивать их к выбору профессий, связанных с уходом за другими людьми (например, медсестры, воспитатели). В то же время, стереотип о том, что мужчины должны быть сильными и независимыми, может нап-

равлять их к профессиям, требующим физической силы или лидерских качеств (например, инженер, менеджер).

Эти ожидания могут влиять на:

1)Самооценку и самоэффективность: Если люди чувствуют, что их выбор профессии не соответствует гендерным ожиданиям, это может снизить их самооценку и уверенность в своих способностях [2].

2) Социальное давление: Окружающие люди, включая родителей, учителей и сверстников, могут оказывать давление на молодых людей, чтобы они соответствовали гендерным ролям. Это может ограничить их профессиональные выборы [3].

3) Дискриминация: Женщины, которые выбирают нетрадиционные для своего пола профессии, могут сталкиваться с дискриминацией со стороны работодателей и коллег.

Исследования показывают, что гендерные стереотипы могут влиять на профессиональные выборы даже на уровне образования. Девочки и мальчики могут выбирать разные учебные предметы в школе, что впоследствии может ограничить их выбор профессии [4].

Теория интерсекциональности подчеркивает, что гендерные стереотипы пересекаются с другими социальными категориями, такими как раса, класс и сексуальная ориентация, что может усиливать или ослаблять их влияние на профессиональный выбор. Исследования показывают, что интерсекциональность может усиливать негативное влияние гендерных стереотипов на профессиональные выборы. Например, женщины из низших социальных классов могут сталкиваться с дополнительными барьерами, такими как недостаток ресурсов и возможностей, что может ограничить их выбор профессии [7].

Теория социального конструирования гендера предлагает уникальную перспективу на взаимосвязь между гендером и профессиональным выбором. Она утверждает, что гендер не является биологическим фактом, а скорее социально и культурно сконструированным понятием. Это означает, что наши представления о том, что значит быть мужчиной или женщиной, формируются в процессе социализации и зависят от конкретного исторического и культурного контекста. Как теория социального конструирования гендера объясняет влияние гендерных стереотипов на профессиональные выборы?

Социальные ожидания: С самого раннего детства дети подвергаются воздействию социальных ожиданий, связанных с их полом. Игрушки, одежда, мультфильмы и даже манера общения с мальчиками и девочками формируют у них определенные представления о том, какие профессии и виды деятельности являются более подходящими для мужчин, а какие для женщин.

Ролевые модели: Родители, учителя, сверстники и представители других социальных групп служат для детей важными ролевыми моделями. Если мальчики видят, что их отцы занимаются преимущественно физическим трудом, а матери – домашними делами, то они склонны воспринимать такую модель поведения как норму. Институциональные факторы: Школы, университеты, компании и другие социальные институты часто воспроизводят и укрепляют гендерные стереотипы. Например, в некоторых учебных заведениях могут существовать неявные правила, направленные на разделение студентов по половому признаку при выборе специальностей.

Медиа и культура: СМИ, литература, кино и другие формы культуры играют важную роль в формировании гендерных стереотипов. Часто в этих источниках женщины представлены в традиционных ролях домохозяек или эмоциональных и заботливых сотрудниц, а мужчины – как сильных и решительных лидеров.

Хотя все эти теории сходятся во мнении, что гендерные стереотипы оказывают значительное влияние на выбор профессии, каждая из них предлагает уникальную перспективу на этот вопрос. Комбинируя их, мы можем получить более глубокое понимание этого сложного социального явления и разработать более эффективные стратегии для его преодоления.

Преодоление влияния гендерных стереотипов на выбор профессии требует комплексных усилий на различных уровнях. Важно создавать среду, в которой дети будут иметь возможность развивать свои таланты и интересы, независимо от пола.

**Актуальность.** Гендерные стереотипы оказывают существенное влияние на жизнь людей, ограничивая их возможности и формируя неравенство. Изучение этой связи позволяет лучше понять причины гендерной дискриминации и разработать меры для ее преодоления.

**Научная новизна статьи**. Современное общество переживает значительные изменения в отношении гендерных ролей и ожиданий. Исследование того, как эти изменения влияют на профессиональные выборы, позволяет адаптировать образовательные программы и политику рынка труда к новым реалиям.

**Теоретическая и практическая значимость статьи.** Исследование углубляет понимание процессов формирования и функционирования гендерных стереотипов, их влияния на когнитивные процессы, мотивацию и поведение индивидов. Результаты исследования могут быть использованы для разработки и реализации программ, направленных на преодоление гендерной дискриминации и создание равных возможностей на рынке труда.

**Литература:**


1. Бирман, Б. А. Гендерные стереотипы и профессиональная ориентация молодежи. // – Москва. Вестник Московского университета. Психология, – 2007. № 3, - 114-120 с.
2. Бим-Бад, Б. М. Психология пола: гендерные различия в поведении. / Б. М. Бим-Бад. – СПб.: Питер – 1997. – 320 с.
3. Кон, И.С. Психология ранней юности: проблемы становления личности. — Москва: Просвещение, 1987. — 256 с.
4. Мид, М. Культура и мир детства. — Москва: Издательство иностранной литературы, 1950. — 320 с.
5. Савинская, О. Б., & Лебедева, Н. В. Гендерные стереотипы и выбор инженерно-технического направления подготовки. // – Москва. Молодой ученый, - 2020, №29, - 101-105 с.
6. Crenshaw, K. Demarginalizing the Intersection of Race and Sex: A Black Feminist Critique of Antidiscrimination Doctrine // – Feminist Theory, - 1989. № 19(1), - p. 139-167.
7. Martin, C. L., & Halverson, C. F. A schematic processing model of sex typing and sex-related information // – Child Development, - 1981. № 52(3), - p. 1119-1134.
8. Nickerson, R.**S.** Confirmation bias: A ubiquitous phenomenon in many guises // – Review of General Psychology, - 1998. № 2(2), - p. 175-220.
9. Wood, J.V. Gender and social comparison: A sociocultural perspective // – American Psychologist, - 1989. № 44(2), - p. 171-177.



**E-mail:** ulkar.h.u@gmail.com



**Redaksiyaya daxil olub**: 02.12.2024

**MÜNDƏRİCAT**
**ОГЛАВЛЕНИЕ**
**CONTENTS**

***TƏRBİYƏ TEXNOLOGİYALARI***
***ВОСПИТАТЕЛЬНЫЕ ТЕХНОЛОГИИ***
***UPBRINGING TECHNOLOGIES***



***TƏHSİLDƏ MONİTORİNQ VƏ QİYMƏTLƏNDİRMƏ***
***МОНИТОРИНГ И ОЦЕНИВАНИЕ В ОБРАЗОВАНИИ***
***MONITORING AND EVALUATION IN EDUCATION***

***BİOLOGİYANIN TƏDRİSİ METODİKASI***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ БИОЛОГИИ***
***METHODOLOGY OF TEACHING BIOLOGY***



***COĞRAFİYANIN TƏDRİSİ METODİKASI***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ ГЕОГРАФИИ***
***METHODOLOGY OF TEACHING GEOGRAPHY***



***FİZİKANIN TƏDRİSİ METODİKASI***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ ФИЗИКИ***
***METHODOLOGY OF TEACHING PHYSICS***



***İNGİLİS DİLİNİN TƏDRİSİ METODİKASI***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ АНГЛИЙСКОГО ЯЗЫКА***
***METHODOLOGY OF TEACHING ENGLISH***



***FİZİKİ TƏRBİYƏNİN, İDMAN TƏLİMİNİN NƏZƏRİYYƏSİ VƏ METODİKASI***
***ТЕОРИЯ И МЕТОДИКА ФИЗИЧЕСКОГО ВОСПИТАНИЯ,***

*PSİXOLOGİYA*
*ПСИХОЛОГИЯ*
*PSYCHOLOGY*

## TƏQDİM OLUNAN MƏQALƏLƏRƏ TƏLƏBLƏR

1. Digər redaksiyalara təqdim olunmamış məqalələr qəbul edilir.
2. Məqalələr son tədqiqatların nəticələrini əks etdirməli, yeni ideyalarla zəngin olmalı, elmi məqalələrin yazılışına qoyulan tələblər gözlənilməlidir.
3. Məqalələrdə öz əksini tapan fikirlər müəlliflərə aid olmalıdır. İstifadə edilmiş fotolar açıq mənbələrdən götürülməlidir. Antiplagiat və digər tədqiqat etikasının tələblərinin təmin olunması məqalə müəlliflərinin məsuliyyətindədir.
4. Plagiatlıq faktları aşkar edildikdə həmin məqalənin nəşri dayandırılır.
5. Təqdim olunan məqalələrdə müəlliflərə aid Orcid öz əksini tapmalıdır.
6. Məqalələr Azərbaycan, rus və ingilis dillərində qəbul edilir Hər məqaləyə adları çəkilən dillərdə xülasələr və açar sözlər yazılır.
7. Məqalələr Azərbaycan. dilində latın əlifbası (Times New Roman), rus dilində krill əlifbası və ingilis dilində ingilis (ABŞ) əlifbası ilə Times New Roman - 14 şrift ilə 1,5 intervalla yığılmalı, elektron variantı ilə birlikdə (filəşkartda) təqdim olunmalıdır.
8. Məqalələr üç dildən - Azərbaycan, rus və ingilis dillərindən birində çap olunur. 3 dildə (Azərbaycan, rus və ingilis) məqalənin xülasəsi təqdim edilir. Xülasədə irəli sürülən başlıca elmi müddəalar, tədqiqatdan alınan nəticələr, problemin nəzəri və praktik əhəmiyyəti öz əksini tapmalıdır.
9. Məqalə aşağıdakı ardıcıllıqla yazılır: birinci sətirdə müəllif(lər)in adı, atasının adı və soyadı; ikinci sətirdə elmi dərəcəsi və elmi adı (yaxud doktorant də dissertant olması və s.); üçüncü sətirdə iş yeri, vəzifəsi; dördüncü sətirdə böyük hərflərlə məqalənin adı. Daha sonra bu qaydada həmin məlumatlar rus və ingilis dillərində təkrar edilir.
10. Həmmüəlliflərin üç nəfərdən artıq olması məqsədəuyğun deyildir.
11. Redaksiya məqalədə zəruri dəyişiklər və ixtisarlar, redaktə aparrmaq hüququna malikdir. Məqalələrə iki mütəxəssisin rəyi, şöbə və ya kafedranın, həmçinin ali məktəbin Elmi Şurasının və ümumtəhsil, yaxud orta ixtisas təhsili müəssisəsinin pedaqoji şurasının iclas protokollarından çıxarışlar əlavə olunur.
12. Məqalədəki faktların, məlumatların dürüstlüyünə müəlliflər cavabdehdir. İrəli sürülən elmi müddəalar müəllifin özünə məxsus olmalı, istifadə edilmiş nəzəri fikirlərin mənbəyi göstərilməlidir.
13. Məqalədə son 5-10 ildə çap olunan əsərlərə istinadlara üstünlük verilməlidir. Məqalənin sonunda verilən ədəbiyyat siyahısı əlifba ardıcıllığı ilə deyil, istinad olunan ədəbiyyatların mətndə rast gəlindiyi ardıcıllıqla nömrələnməli və məsələn, (1) və ya (1, s. 119) kimi işarə olunmalıdır. Eyni ədəbiyyata mətndə başqa bir yerdə təkrar istinad olunarsa, onda istinad olunan həmin ədəbiyyat əvvəlki nömrə ilə göstərilməlidir.
14. Jurnal öz profilinə uyğun məqalələri dərc edir.
15. Elmi məqalələrin sonunda elm sahəsinin və məqalənin xarakterinə uyğun olaraq aktuallıq əsaslandırılmalı, elmi yeniliyi, tətbiqi əhəmiyyəti, iqtisadi səmərəsi və s. aydın şəkildə verilməlidir.
16. Daha sonra istinad olunmuş ədəbiyyatın siyahısı verilir.
17. Məqalə müəlliflərinin hüquqları qorunur.
18. Jurnalda “ardı növbəti nömrədə” adı altında seriya məqalələr dərc olunmur.
19. Məqalələrin müxtəlif dillərdə olan xülasələri bir-birinin eyni olmalı və məqalənin məzmununa uyğun gəlməlidir.
20. Məqalənin sonunda rəyçilərin adı, atasının adı və soy adı, elmi dərəcəsi və elmi adı; sonrakı sətirdə məqalə müəllifinin elektron ünvanı (E-mail) göstərilməlidir.
21. Məqaləyə müəllif haqqında aşağıdakı məlumatlar əlavə olunur: məqalə müəllif (lər)inin adı, atasının adı soyadı, işlədiyi müəssisə (hansı müəssisədə doktorant və dissertant olması) və müəssisənin ünvanı, müəllif(lər)in vəzifəsi, elmi dərəcəsi və adı, iş və ev telefonları, ev ünvanı, elektron poçt ünvanı (Email).

## ТРЕБОВАНИЯ К ПРЕДСТАВЛЕННЫМ СТАТЬЯМ

1. Принимаются статьи, не представленные в других редакциях.
2. Статьи должны отражать результаты последних исследований, быть богатыми новыми идеями, в них должны быть соблюдены требования, предъявляемые написанию научных статей.
3. Məqalələrdə öz əksini tapan fikirlər müəlliflərə aid olmalıdır. İstifadə edilmiş fotolar açıq mənbələrdən götürülməlidir. Antiplagiat və digər tədqiqat etikasının tələblərinin təmin olunması məqalə müəlliflərinin məsuliyyətindədir.
4. При обнаружении фактов плагиата публикация статьи прекращается.
5. Текст статьи должен составлять около 6-8 страниц. Ключевые слова для статьи должны быть представлены на трех языках: азербайджанском, русском и английском.
6. Текст статьи должен быть представлен на филэш-карте вместе с электронным вариантом, с интервалом 1,5; шрифтом 14 Times New Roman - латинского алфавита на азербайджанском языке, кириллицы на русском языке, и английским алфавитом (США) на английском языке.
7. Статьи публикуются на одном из трех языков - азербайджанском, русском и английском. Резюме статьи предоставлено на 3 языках (азербайджанском, русском и английском). В статье должны быть отражены основные научные положения, изложенные в резюме, выводы, сделанные из исследования, должна быть представлена теоретическая и практическая значимость проблемы.
8. Статья должна быть написана в следующем порядке: на первой строке имя, фамилия и отчество автора (авторов); вторая строка содержит ученую степень и ученое звание (диссертант или докторант и т. д.); третья строка указывает место работы, должность; на четвертой строке представлено название статьи прописными буквами. Затем эта же информация повторяется на русском и английском языках.
9. Нежелательно иметь более трех соавторов.
10. Редакция имеет право вносить изменения и сокращения в статью.
11. Вместе со статьей должно быть предоставлено два отзыва специалистов: заведующих кафедрой или отделом, а также выписка из протокола Ученого совета вузов и педагогического совета общеобразовательного или среднего специального образования.
12. Авторы статьи несут ответственность за достоверность приведенных в статье фактов и информации. Предлагаемые научные положения должны принадлежать автору и должен быть указан источник используемых теоретических идей.
13. Ссылки следует давать на работы, опубликованные за последние 5-10 лет. Список литературы, приведенный в конце статьи, должен быть пронумерован не в алфавитном порядке, а в том порядке, в котором указанная литература появляется в тексте, например (1) или (1, стр. 119). Если та же самая литература повторяется в другом месте в тексте, то эта же литература должна быть указана под предыдущим номером.
14. Журнал публикует статьи, имеющие отношение к его профилю.
15. В конце научной статьи должна быть обоснована актуальность в соответствии с характером статьи и областью науки, четко указана научная новизна, важность ее применения, экономическая эффективность и т.д.
16. Затем предоставляется список использованной литературы.
17. Права авторов статьи защищены.
18. Журнал не публикует серии статей под заголовком «продолжение в следующем номере».
19. Резюме статей на разных языках должны быть одинаковыми и соответствовать содержанию статьи.
20. В конце статьи должно быть указано имя, отчество и фамилия рецензентов, их ученая степень и ученое звание; следующая строка должна содержать адрес электронной почты автора статьи.
21. В статью добавляется следующая информация об авторе: имя, фамилия, отчество автора (авторов), учреждение, где он работает (докторантом или диссертантом которого является) адрес учреждения, должность, ученая степень и звание автора(ов), домашний и рабочий телефоны, домашний адрес, электронная почта (E-mail).

**REQUIREMENTS FOR SUBMITTED ARTICLES**

1. Submitted articles should not be published or accepted for publication in other editions.
2. Articles should reflect the results of recent research, be rich in new ideas and they must comply with the requirements for writing scientific articles.
3. The opinions reflected in the articles should belong to the authors. The used photo materials must be taken from open sources. Ensuring compliance with anti-plagiarism and other research ethics requirements is the responsibility of the article authors.
4. When the facts of plagiarism are discovered, the publication of the article is stopped.
5. The text of the article should be about 6-8 pages. Keywords for the article should be presented in three languages: Azerbaijani, Russian and English.
6. The text of the article should be presented on the flash card together with the electronic version, with an interval of 1.5; 14 point Times New Roman font - Latin alphabet in Azerbaijani, Cyrillic in Russian, and English alphabet (USA) in English.
7. Articles are published in one of three languages - Azerbaijani, Russian and English. A summary of the article is provided in 3 languages (Azerbaijani, Russian and English). The article should reflect the main scientific provisions presented in the summary, the conclusions drawn from the study, the theoretical and practical significance of the problem should be presented.
8. The article is written in the following order: on the first line the name, surname and patronymic of the author (s); the second line contains the academic degree and academic title (doctoral student or candidate for a degree, etc.); the third line indicates the place of work, position; the fourth line represents the title of the article in capital letters. Then in this order the same information is repeated in Russian and English.
9. It is undesirable to have more than three co-authors.
10. The Editorial Board has the right to make changes and reductions in the article.
11. Two expert reviews should be provided together with the article: heads of department or chair, as well as extract from the protocol of Academic Council of the higher school and the Pedagogical Council of general or secondary special education institutions.
12. The authors of the article are responsible for the accuracy of the facts and information provided in the article. The proposed scientific provisions should belong to the author and the source of used theoretical ideas must be indicated.
13. The articles should refer to works published in the last 5-10 years. The list of references given at the end of the article should not be numbered in alphabetical order, but in the order in which the indicated literature appears in the text, for example (1) or (1, p. 119). If the same literature is repeated elsewhere in the text, then the same literature should be indicated under the previous number.
14. The journal publishes articles related to its profile.
15. At the end of a scientific article, the relevance should be justified according to the nature of the article and the area of science, scientific novelty, importance of its application, economic efficiency, etc. should be clearly indicated.
16. Then a list of references is provided.
17. The rights of the authors of the article are protected.
18. The journal does not publish a series of articles under the heading “continued in the next issue”.
19. Summary of articles in different languages should be the same and consistent with the content of the article.
20. At the end of the article the name, patronymic and last name of the reviewers, their academic degree and academic title should be indicated; the next line should contain the email address of the author of the article.
21. The following information about the author is added to the article: name, surname, patronymic of the author (authors), the institution where he works (doctoral student or candidate for a degree), address of the institution, position, academic degree and the title of the author (s), home and work phones, home address, email address.

